Elmi redaktor: **Məsud Mahmudov**
*filologiya elmləri doktoru, professor*

Rəyçilər: **Nadir Məmmədli**
*filologiya elmləri doktoru, professor*
**İlham Tahirov**
*filologiya elmləri doktoru*

Ön sözün müəllifi: **Nizami Cəfərov**
*AMEA-nın müxbir üzvü, filologiya elmləri doktoru, professor*

**Nağdəli Zamanov**
**Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (II kitab).**
**Bakı, "Elm və təhsil", 2014, 496 səh.**

Monoqrafiyada Azərbaycan nitq mədəniyyətinin inkişafında, təşəkkül tapmasında Ulu Öndər Heydər Əliyevin nitq və çıxışları kompleks şəkildə araşdırılmışdır. Heydər Əliyevin nitqində frazeologizmlər, ədatlar, neologizmlər, ritorik suallar, təkrarlar kimi elementlər, eləcə də əsas və köməkçi nitq hissələrinin üslubiyyat yaratması dərindən tədqiq olunmuşdur.

Monoqrafiya siyasət, dilçilik, diplomatiya, jurnalistika, ədəbiyyat və digər sahələrdə fəaliyyət göstərən və təhsil alanlar üçün dəyərli vəsaitdir.

**ISBN 978-9952-8176-8-3**

# ÖN SÖZ

Nitq mədəniyyəti hər bir xalqın əsrlərlə formalaşdırıb bu günə çatdırdığı mədəniyyətin ən vacib, ən mühüm tərkib hissələrindən biridir. Bu baxımdan ulu öndərimiz Heydər Əliyevin XX əsr Azərbaycan siyasi natiqliyinin, ümumiyyətlə Azərbaycan nitq mədəniyyətinin təşəkkül tapmasında rolu birmənalı şəkildə yüksək qiymətləndirilir. Azərbaycan nitq mədəniyyətinin inkişafında Heydər Əliyevin fəaliyyətinin öyrənilməsinə keçən əsrin 90-cı illərindən diqqət yetirilir. Bu sahədə akademik Bəkir Nəbiyev, akademik Ağamusa Axundov, professor Nizami Xudiyev, professor Məsud Mahmudov, professor Müseyib Məmmədov, professor Nizaməddin Şəmsizadə, professor Məhərrəm Qasımlı və digər dəyərli elm adamlarımız öz töhfələrini verərək, Heydər Əliyev nitqlərinin gələcəkdə kompleks şəkildə öyrənilməsinin əsasını qoymuşlar.

Bu gün ön söz yazdığım "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" kitabının (II cild) müəllifi Azərbaycan Tibb Universitetinin dosenti, tibb elmləri üzrə fəlsəfə doktoru, Azərbaycan Jurnalistlər Birliyinin üzvü Nağdəli Tapdıq oğlu Zamanov ulu öndərin nitqlərinin öyrənilməsinə kompleks şəkildə yanaşmışdır.

Kitabın I cildindəki fəsillər ciddi elmi-tədqiqat təsiri bağışlayır. "Heydər Əliyev Azərbaycan dilinin müdafiəsində" fəsli ilə müəllif Heydər Əliyevin Azərbaycan dilinin müdafiəsi ilə bağlı, eləcə də bu gün ölkə başçısı prezident İlham Əliyevin dilimizin qorunması və inkişafı ilə bağlı verdiyi sərəncamları işıqlandırmaqla dil barəsində dövlət siyasətini açıqlaya, dövlət və dil dialektik vəhdətini ortaya qoya bilib.

Bir sıra fəsillər – "Heydər Əliyevin nitqində məntiqi ardıcıllıq", "Heydər Əliyevin nitqində fəlsəfi fikirlər", "Heydər Əliyevin nitqində səmimiyyət", "Heydər Əliyevin nitqində

qətiyyət", "Heydər Əliyevin nitqində poetik duyğular", "Heydər Əliyevin nitqində üslublar" – ilk dəfə olaraq müəllif tərəfindən qələmə alınıb. Araşdırmalarına novatorcasına yanaşan müəllif fikirlərini oxucuları ilə qətiyyətlə bölüşdürə bilir. O, "Heydər Əliyevin nitqində poetik duyğular" fəslini yazırsa, ulu öndərin poeikcəsinə deyilmiş fikirlərini, sitatlarını çoxcildlik "Müstəqilliyimiz əbədidir" kitabından dəqiqcəsinə seçə bilir. Auditoriyaları fəth edə biləcək poetik ovqatı dinləyicilərə yerindəcə çatdıra bilir, oxucuya poetik düşüncəli dövlət xadimini daha yaxşı görməkdə kömək edir. Müəllif mənəvi rahatlıq tapdığımız, sabahkı günlərə inam yaranmasında sığındığımız islam dininin imperiya əsarətindən xilas olduqdan sonra Heydər Əliyevin timsalında dini üslubda çıxış edən siyasi natiqi oxucuya tanıda bilir ki, bu öz əksini "Heydər Əliyevin nitqində dini üslub" fəslində tapır.

Nağdəli Zamanov apardığı elmi-tədqiqat işini AMEA-nın Dilçılık İnstitutu ilə uzlaşdıra bilmişdir. Kitabın elmi redaktoru, elmi məsləhətçiləri dil problemləri ilə məşğul olan alimlərdir ki, bu bir daha müəllifin apardığı tədqiqat işinə məsuliyyətindən xəbər verir. İstifadə olunan ədəbiyyat, vətən və xarici ölkə alimlərinə istinadlar da müəllifin bu işə ciddi yanaşmağını göstərir. Heydər Əliyev irsinə sevgidən qaynaqlanan 17 fəsil və yarımfəsildən ibarət "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" kitabının II cildinin yaranmasına gətirib çıxaran məqalələr də bu qəbildəndir.

Nağdəli Zamanovun "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" kitabının AMEA-nın Mərkəzi Kitabxasının Heydər Əliyev irsinin təbliği şöbəsində, eləcə də Aşıq Şəmşir Mədəniyyət Ocağı İctimai Birliyində təqdimatları keçirilmişdir. Təqdimatlarda çıxış edən dilçi alimlərin, mütəxəssislərin çıxışları, eləcə də rəsmi dövlət qəzetlərində, elmi jurnallarda,

ictimai-siyasi qəzetlərdə I hissə ilə bağlı dəyərli rəylərin çapı da müəllifin gördüyü işə verilən qiymətdir.

İkinci cilddə əsas nitq hissələrinin (say, əvəzlik, fel, zərf) və köməkçi nitq hissələrinin (ədat, qoşma, bağlayıcı, modal söz) Heydər Əliyevin nitqində üslubiyyat yaratma xüsusiyyətləri çox dəqiqliklə öz əksini tapmışdır.

"Heydər Əliyevin nitqində say" fəsli böyük natiqin dilində quru rəqəmlərə, ilk baxışda cansıxıcı görünən rəqəmlərə can vermək məziyyətlərini özündə əks etdirir.

"Heydər Əliyevin nitqində əvəzlik" fəslində müəllif maraqlı nitq situasiyalarını seçməklə böyük natiqin əvəzlik əsas nitq hissəsinə ekspressivlik qazandırmağın sirlərini açır. Müəllif yazır: "Birinci şəxsin təki olan "mən" əvəzliyini qətiyyətli dövlət başçısı ölkənin məsuliyyətini təkbaşına öhdəsinə götürdüyü məqamlarda işlədir. Birinci şəxsin cəmi olan "biz" şəxs əvəzliyini isə xalq-rəhbər vəhdətinin tələb olunduğu anlarda daha çox istifadə edir".

"Heydər Əliyevin nitqində fel" fəslində böyük natiqin nitqlərində özünə ən çox yer alan fel şəkilləri, felin qəti gələcək zamanı dərindən-dərinə işıqlandırılmışdır.

Eləcə də fellərin lüğəvi növlərinin hansılarının üstünlük təşkil etdiyi öyrənilmişdir ki, müəllif bu fellər içərisində təfəkkür fellərinin çəkisinin çox olduğunu göstərir. Nağdəli Zamanov haqlı olaraq qeyd edir ki, Heydər Əliyevin nitqlərində köməkçi adlanan nitq hissələri üslubiyyat yaratmaq baxımından əsas nitq hissələri səviyyəsinə yüksəlir. "Heydər Əliyevin nitqində ədatlar" fəslində ədatların nitqdə işlənmə tezliyi faizlərlə verilmişdir. Bu bir daha müəllifin öz işinə elmilik verməsini sübut edir. Ədatlar içərisində qüvvətləndirici və dəqiqləşdirici xüsusiyyətə malik olanların üstünlük qazanması diqqətəlayiqdir.

Kitabın II hissəsində müəllifin qələmə aldığı Heydər Əliyevin nitqində Azərbaycan elmi, mədəniyyəti, dövlətçiliyi qarşısında görkəmli yer tutan şəxsiyyətlərin sıralanması kimi özünü göstərən "Heydər Əliyevin nitqində antroponimik sıralanmalar" fəsli heç də az maraq doğurmur. Tarixi şəxsiyyətlərimizin xalqa tanıdılması yolunda bu fəslin oxucular tərəfindən yüksək səviyyədə qarşılanacağı bəri başdan məlum olur.

Müasir inteqrasiya dövründə dildə baş verən dəyişikliklər "Heydər Əliyevin nitqində neologizmlər" fəslində öz əksini tapır. İmperiya süqutundan sonra "əsarətdə qalmış" sözlərimizi ulu öndər sıraya qaytarır, bir qisim neologizmləri isə ilk dəfə işlədir və bu zaman neologizmlərə yeri gəldikcə dolğun izahlar verir.

Müəllif statistik göstəricilər əsasında ulu öndərin nitqlərinə münasibətdə ciddi elmi baxışlar formalaşdıra bilmişdir. Belə ki, Heydər Əliyevin 1993-cü (Elmlər Akademiyasında) və 1997-ci (Yeni Azərbaycan Partiyasının yaranmasının 5-ci ildönümündə) illərdəki iki çıxışını tədqiq edərək müstəqilliyə gedən yolda ictimai-siyasi proseslərin gərgin olduğu 1993-cü il çıxışında modal sözlərdən çox istifadə etdiyini diqqətə çatdırmışdır.

Auditoriyaları inandırmaq gücü müqayisələrlə həyata keçirilir ki, müəllif "Heydər Əliyevin nitqində müqayisələr" fəslini bu nitq vasitəsinə həsr etmişdir. Şifahi nitqdə işlədilməsi az-az natiqlərə müyəssər olan əlavələri böyük natiqin nitqində statistik şəkildə araşdıran kitab müəllifi bununla bağlı "Heydər Əliyevin nitqində əlavələr" fəslini yazmışdır. Nitq və çıxışları izahedicilik funksiyası daşıyan Heydər Əliyevin əlavələri necə işlətməsi dilçilik nöqteyi-nəzərdən maraq doğurur. Dosent N.Zamanov ritorik sualların, eləcə də mürəkkəb cümlənin şifahi nitqdə yaratdığı üslubi-semantik xüsusiyyətlərini

araşdırmışdır. Bütün bu araşdırmalar elmi, kütləvi mətbuat səhifələrində işıqlandırılaraq öz əksini tapmışdır.

Ümidvaram ki, dosent N.Zamanovun "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının II hissəsi də dilçi alimlərimiz tərəfindən dəyərli elmi-tədqiqat işi kimi qəbul ediləcək. İnanıram ki, bu kitab Azərbaycan nitq mədəniyyətinin inkişafında qiymətli bir monoqrafiya kimi müxtəlif ixtisas sahiblərinin – dilçilik, ədəbiyyat, diplomatiya, siyasət, tibb və başqa sahələrdə çalışanların stolüstü kitablarına çevriləcək. Müəllifin ciddiyyətlə qələmə aldığı bu iki cildlik monoqrafik tədqiqat əsəri Heydər Əliyevin nitqinin daha da dərindən araşdırılması yolunda mütəxəssislər üçün mühüm vəsait olacaq.

**Nizami Cəfərov**
***AMEA-nın müxbir üzvü***
***filologiya elmləri doktoru, professor***

## MÜƏLLİFDƏN

Salam, möhtərəm oxucu!

Salam, sözün qədrini bilən, sözə qiymət verən, sözü sözdən seçməyi bacaran Azərbaycan oxucusu!

Salam, bu gün Azərbaycan vətəndaşlarını dünyagörüşlərindən asılı olmayaraq birləşdirmək gücündə olan Heydər Əliyev nitqlərinin pərəstişkarı olan oxucu!

İki hissədən ibarət "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasını çapa təqdim edərək sizlərlə kiçik bir söhbətə ehtiyac duydum. Necə deyərlər, ürəyin yükünü boşaltmağa, ürəyi yenidən yükləməyə yönələn səmimi bir söhbətə ehtiyac duydum. Söhbətə elə mövzunun nə dərəcədə aktual olduğundan başlamaq istədim. İstənilən elmi məqalədən başlamış irihəcmli monoqrafiyalaradək həm müəlliflər özlərinə, həm də kənardan müəlliflərə belə bir sual verilir: – Üzərində işlədiyiniz mövzunun elmi yeniliyi nədən ibarətdir?

– Bu ciddi suala elə ulu öndərin öz sözləri ilə cavab vermək yerinə düşər: ***"...İndi isə, şübhəsiz bizdə təhsilin tam əksəriyyəti Azərbaycan dilində gedir. Ancaq bir var ki, Azərbaycan dilində oxuyursan, bir də var ki dilin incəliklərini bilirsən, Azərbaycan dilində yüksək səviyyədə söz deyə bilirsən, fikrini ifadə edə bilirsən, nitq edə bilirsən. Bu, hələ bizdə çatışmayan bir sahədir".***

Yazılarıma hörmət edərək rəğbətlə – "Həkimlik hara, dilçiliyin mühüm bir sahəsi sayılan nitq mədəniyyətinin, xüsusilə də siyasi natiqliyimizin zirvəsi hesab olunan Heydər Əliyevin nitqləri ilə Azərbaycan nitq mədəniyyəti arasındakı uyğunluğun araşdırılması hara" – deyə soruşan oxucularıma cavabımı Heydər Əliyevin 30 oktyabr 1997-ci ildə Azərbaycan yazıçılarının X qurultayındakı nitqindən bir parça ilə çatdırıram: ***"Bizim xalqımız birincisi, öz istedadına görə şair, yazıçı, söz***

***ustası olubdur. İkincisi, bizim xalqımız çoxəsrlik tarixində böyük şairlər, yazıçılar, mütəfəkkirlər yetişdiribdir".***

Tibbdə həkim-xəstə münasibətlərini əhatə edən deontologiya sahəsi var ki, bu sahə sırf psixoloji məqama-sözə söykənir. Universitetdəki fəaliyyətim isə mühazirə və təcrübi məşğələlərdə tələbə auditoriyası ilə əlaqədardır ki, bu prosesləri də nitqsiz təsəvvür etmək mümkünsüzdür. Müasir dövrümüzdə kompyuter texnikasının gündəlik həyatımıza olan nüfuzu nitqə diqqət yetirilməsini gündəmə gətirir. Bir də, əziz oxucu, doğulub boya-başa çatdığım, ulu öndərimiz tərəfindən yüksək dəyərləndirilən Kəlbəcər amili də bu yazıların meydana gəlməsində mühüm rol oynadı. Ulu öndər deyirdi: ***"Böyük əraziyə malik olan Kəlbəcər Azərbaycanın gözəl və qiymətli guşələrindən biridir. ...Allah Kəlbəcərə hər cür nemətlər, gözəl təbiət, zəngin sərvətlər veribdir. Kəlbəcər məğrur dağları, gözəl meşələri, otlaqları, çəmənləri, obaları, bulaqları olan, vətənimizin təbiət gözəlliyini və zənginliyini əks etdirən bir parçasıdır. Kəlbəcərdə yaşayan insanlar da o gözəl təbiətin, məğrur qayaların, dağların təsiri altında daim cəsur olublar, qəhrəman və rəşadətli olublar. Eyni zamanda zəkalı olublar, elmə, biliyə, mədəniyyətə həmişə böyük maraq göstəriblər".***

"Vətənimizin bir parçası olan Kəlbəcər" bu gün yağı tapdağı altındadır. Bütövündən – Azərbaycanından ayrı düşmüş bu parça söz diyarıdır. Bu parçanın adamları söz adamlarıdır. Elə böyük söz adamı Heydər Əliyevin nitqlərinin də müəyyən hissəsini araşdırmaq bu diyarın insanının – mən bəndənin bəxtinə düşdü. Bu da bir tale!

Əsası Aşıq Alı, Aşıq Ələsgər, Ağdabanlı Şair Qurban, Aşıq Şəmşir tərəfindən qoyulan, bu gün yüzlərlə yazarı ətrafında birləşdirən Kəlbəcər ədəbi mühitinin yetirməsi kimi mən də çalışdım ki, monoqrafiyanı bu ədəbi mühitə layiq yazım.

Monoqrafiyanın elmi qiymətini filologiya, jurnalistika, diplomatiya və s. sahələrin mütəxəssisləri vermişlər və verəcəklər. Bircə onu qeyd edə bilərəm ki, monoqrafiya ulu öndərə böyük sevgi ilə, böyük ilhamla yazıldı. Azərbaycan qaçqın ədəbiyyatının görkəmli nümayəndələrindən şair Bəhmən Vətənoğlu demiş:

*İlhamın gəlməsə alma qələmi,*
*Havayı zəhmətə salma qələmi.*
*İlhamla yazılan əsər gərəkdi,*
*Əsərdə kəsərli kəsər gərəkdi.*

Heydər Əliyevin nitqlərinin araşdırılması ideyasının necə dəstəklənməsi haqqında verilən suallara da aydınlıq gətirmək istərdim. Düşünürəm ki, bütün ideyalar öz dəstəyini müəyyən əqidə və fikir uyğunluqlu insanlardan, yaxın adamların dairəsindən alaraq kollektiv və ictimai-siyasi qurumlara qədər genişlənir. Bu ideya da öncə dil-ədəbiyyat müəllimlərinə, jurnalist həmkarlarıma açıqlandı. Daha sonra mətbu orqanlarda – “Azərbaycan”, “Təbib”, “Kaspi” qəzetlərində, “Təhsil” jurnalında məqalələrimin çapı monoqrafiyalara gedən yolda özümə inamımı artırdı. Çalışdığım Tibb Universitetinin professor-müəllim heyəti, ayrı-ayrı ictimai-siyasi xadimlər, Prezident Administrasiyasının ictimai-siyasi şöbəsinin əməkdaşları ideyanın reallaşmasına ciddi dəstək oldular.

Kitabın ərsəyə gəlmə dövründə bəzi maraqlı məqamları dəyərli oxucularımızla bölüşmək maraqlı olardı. Müasir Azəbaycan dili ilə XIV-XVI əsr Azərbaycan dili arasındakı varisliyin öyrənilməsi baxımından dilçilərimizə təşəkkür edərək mütəfəkkir şairlərimiz – Bürhanəddin Qazi, Nəsimi, Füzuli əsərləri ilə XX əsrin sonu, XXI əsrin əvvəli Azərbaycanın dövlət və siyasi xadimi Heydər Əliyevin nitqləri arasında apa-

rılan müqayisələrdən duyduğum zövqü sizlərlə paylaşmaq qərarına gəldim.

Klassiklərin yaradıcılığında şərt budaq cümləli mürəkkəb cümlələrin araşdırılması ilə Heydər Əliyevin nitqindəki mürəkkəb cümlələrin müqayisəsi müasir Azərbaycan dili ilə XIV-XVI əsr dilimiz arasındakı varisliyin – dil tariximizin öyrənilməsi baxımından çox mühümdür.

Qazi Bürhannədində: Analitik şərt budaq cümlələri ***əgər/gər, əgərçi, kimdi ki***, bağlayıcısı, “ki” ədatı vasitəsi ilə baş cümləyə bağlanmışdır.

Şəha, xəttin yazar, gül səfhəsində,
***Əgər*** bir nöqtə şərhindən yazaram.

Məhəmməd Füzulidə:

***Gər*** basıb əl nəbzimə təşxis qıl***sa***n dərdimi,
Al əmanət qılma hər bidərdə izhar, ey həkim.

Heydər Əliyevdə: “Amma bir halda, ***əgər*** dünyada 40 milyon azərbaycanlı yaşayır***sa***, onlar azərbaycanlı adı daşıyırlar***sa***, onlarda azərbaycanlı qəlbi, qanı var***sa,*** bu, hamımızın fəxridir”. Elə buradaca “əgər” bağlayıcısının ədəbi dilimizdə rolunun azalmasını qeyd edənlərin əksinə olaraq Heydər Əliyevin dilində bu nitq hissəsinin zənginliyinin şahidi oluruq.

Klassiklərin yaradıcılığında nitq hissələrini araşdıran müəlliflərin elmi-tədqiqat işlərinə hörmətlə yanaşaraq Nəsimi divanında və Heydər Əliyevin nitqlərində “üçün” qoşmasının müqayisəli öyrənilməsi bir daha “dili Allah yaşadır, dili böyük sənətkarlar, görkəmli dövlət və siyasi xadimlər yaşadır” müddəasının doğruluğunu sübuta yetirir.

“Üçün” qoşması Nəsimi dilində:

Yoxdur vəfası zərrəcə könlümdə dünyanın,
Ol bivəfaya ***aninçün*** bivəfa derəm.

yaxud

***Gər*** aşiq isəm sidq ilə şol dilbər ***üçün*** gəl,
Can ilə cahan ortaya qoy, tərki-sər ilə.

“Üçün” qoşması Heydər Əliyev nitqində: “Gələcəkdə sizin çox böyük imkanlarınız olacaqdır. Siz müxtəlif arzularınızı, istəklərinizi yerinə yetirmək ***üçün,*** cəmiyyətdə layiqli yer tutmaq ***üçün***, ölkəyə, vətənə, millətə faydalı olmaq ***üçün*** oxuduğunuz dövrlərdə ali məktəblərin bütün imkanlarından istifadə edib gərək yüksək bilik toplayasınız, özünüzü gələcəyə hazırlayasınız”.

Əks, ziddiyyət mənalı “amma”, “lakin” bağlayıcılarının Nəsimi yaradıcılığında dilçilər tərəfindən öyrənilməsi və bu öyrənilmə ilə Heydər Əliyev nitqi arasında aparılan parallellər keçən bu əsrlərin, viranedici müharibələrin, keşməkeşli dövrlərin dilimizə təsirinin cüzi olduğunu, Azərbaycan dilinin möhkəm dayaqlar üzərində bərqərar olmasını göstərir. “Amma” bağlayıcısı Nəsimi dilində:

Anca kişilər dəviyi-islam edər, ***əmma***
Tək orda bir, xaçilə zünhar olmaz.
Hər kişidə bir cübbəvü dəstar olur, ***əmma***,
Min başda bir layiqi-dəstar bulunmaz!

Heydər Əliyevin dilində: “Azərbaycanda heç bir tarixi şəxsiyyətə məqbərə yoxdur, ***ancaq*** şairə, yazıçıya var. ***Amma*** gəlin açıq danışaq, bu xalqı yaşadanlar tək şairlər, yazıçılar ol-

mayıblar. Azərbaycanın padşahları da, sərkərdələri də, xanları da olubdur". Nəsimi dilində cavabı özündə olan yüksək emosional mənalı ritorik suallı şeirlərdə "mı, -mi, -mu, -mü" ədatları işlədilir:

Yüzündür gülüstan, billah değil***mi***?
Sözündür, gün-fəkan, billah, değil***mi***?
Saçındadır Xətavü Çinü Rumə,
Səba ənbərəfşan, billah, değil***mi***?

Heydər Əliyevin dilində: "İndiki dövrümüzdə vətənpərvərlik ən aktual məsələdir. ***Məgər*** Azərbaycan xalqı bu qədər acizdir***mi***, məgər Azərbaycan gəncləri bizə təcavüz edən qüvvələrdən, həm fiziki, həm mənəviyyat, həm vətənpərlik cəhətdən zəifdir***mi***? Hesab edirəm ki, yox".

"Heydər Əliyevin nitqində say" fəsli üzərində işləyərkən Nəsimi əsərlərində "bir" miqdar sayının yerini müəyyənləşdirmək maraqlı oldu:

***Bir*** əcayib dilbərə düşdü könül,
***Bir*** əli yetməz yarə düşdü könül.

yaxud

Ol jalə ki, düşdü gül rüxsarımız üzrə,
***Bir*** qətrə yağış damdımı min lalə tər oldu.

Məlum oldu ki, "bir" sayı Heydər Əliyevin nitqində də məhsuldar sözyaratma funksiyası daşıyır: "Ancaq eyni zamanda mən bu gün onu da ***bir daha*** bəyan etmək istəyirəm ki, heç vaxt, ***heç bir*** zaman Azərbaycan torpaqlarının ***bir qarışı*** belə ***başqa bir*** ölkənin əlində ola bilməz!" Təkcə bu müqayisələr

göstərir ki, dilimiz bu qədər keşməkeşlərə davam gətirə bilib. Bunun kökündə Azərbaycan insanının, Azərbaycanın görkəmli şəxsiyyətlərinin dilə olan sevgisi dayanır. Dilimizin belə davamlılığının başqa cür izahı düşünürəm ki, uğurlu olmayacaq.

Kitabın ərsəyə gəlmə dövründə Heydər Əliyevə olan ümumxalq məhəbbətini əks etdirən bir məqama ayrıca toxunmaq istərdim. Yazılarımla bağlı mütəmadi olaraq, necə deyərlər, hesabat verdiyim Kəlbəcər rayon 58 saylı tam orta məktəbin müəllimi Famil Tapdıq oğlu Zamanovun “Kitab neçə səhifədən ibarət olacaq sualına” təxminən 700 səhifə cavabını verdim. Bu yerdə Famil müəllim: “Belədirsə dizini bərkit elə hər biri 500 səhifədən ibarət iki hissəli, hələ bir az da çox Heydər Əliyev adına layiq kitab yaz”. Mənim “bəs çap xərcləri necə olacaq” zarafatıma o, “çap xərci mənim boynuma!” – cavabını verir. Və bu məqamda Heydər Əliyevin poetik ruhlu sözləri yada düşür: ***“Qaçqın olasan, evini, eşiyini, obanı, varını-yoxunu itirəsən, qohum-əqrəbanın bir hissəsini itirəsən, şəhidlər verəsən. Və bu cür nikbin vəziyyətdə yaşayasan – bu, məhz Azərbaycan xalqına xas olan bir xüsusiyyətdir”.*** Bu məqam “Heydər-Xalq”, “Xalq-Heydər” dialektik vəhdətinin bu gün də, sabah da var olacağının sübutu kimi səslənir.

Monoqrafiyanın oxucularımızın ixtiyarına verilməsində mənəvi dəstəyini əsirgəməyən ATU-nun rəhbərliyinə, ATU-nun Tədris Terapevtik Klinikasının professor-müəllim heyətinə, elm məbədi sayılan kitabxanalarımıza – Axundov adına Milli Kitabxanaya, Prezident Kitabxanasına, AMEA-nın Mərkəzi Elmi Kitabxanasına və Heydər Əliyev irsinin təbliği şöbəsinə, Azərbaycan Tibb Universitetinin Əsaslı Kitabxanasının əməkdaşlarına, tədqiqatla bağlı məqalələrin çap olunduğu elmi jurnalların redaksiya heyətlərinə, monoqrafiyanın I hissəsinə rəy verən ziyalılarımıza, kitabın işıq üzü görməsində dəyərli tövsiyələrini verən Prezident Administrasiyası ictimai-

siyasi şöbəsinin və AMEA-nın Dilçilik İnstitutunun əməkdaşlarına, elmi redaktora, rəyçilərə, ön söz müəllifinə, texniki heyətə, "Elm və təhsil" nəşriyyatının kollektivinə və nəhayət bu kitabların formalaşmasında mənəvi dəstəklərini əsirgəməyən doğma insanlara minnətdarlıq edir, həmin kollektiv və şəxslərə möhkəm cansağlığı, səadət arzulayıram.

Hörmətli oxucu, nəhayət sizlərdən həm kövrək, həm də nikbin notlarla ayrılmaq anı yetişdi. Elə bu anda da Heydər Əliyevin Azərbaycanın görkəmli bəstəkarı Tofiq Quliyevin 80 illik yubileyində dediyi kövrək ifadələr yada düşür: ***"Biz hamımız bu dünyadan gedəcəyik. Ancaq mahnı, musiqi yaşayacaq. Tofiq Quliyevin mahnıları, musiqisi daim yaşayacaqdır".***

Bax, elə bu məqamda Heydər Əliyevin həyatda ən çox sevdiyi şairin – Seyid Məhəmmədhüseyn Şəhriyarın bir sözü də xatırlanır: "Bizdən də bir söz qalacaq dünyada". Bəli, bu gün bizlərə ulu öndərin nitqlərinin, çıxışlarının, bəyanatlarının toplandığı 40 cilddən yuxarı "Müstəqilliyimiz əbədidir" kitabları qaldı.

Təskinliyimiz odur ki, yurd yeri boş deyil. Bu gün türk dünyasının liderləri – Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev, Türkiyə Cümhuriyyətinin Prezidenti Rəcəb Tayyib Ərdoğan, Qazaxıstan Respublikasının Prezidenti Nursultan Nazarbayev və digər türk dövlətlərinin başçıları Heydər Əliyevin təbirincə desək "ümumi türk dili ağacının müxtəlif şaxələrində" nitqlər söyləyir, türk dünyasının malik olduğu dəyərləri dünyaya bəyan edir, türk xalqlarının taleyüklü problemlərini yüksək tribunalardan dünyaya car çəkirlər. Sonda ümidvar olduğumu bildirirəm ki, Heydər Əliyevin nitqləri əsasında XXI əsr türk dünyası liderlərinin nitqlərinin araşdırılmasını milli təəssübkeş ziyalılarımız özlərinə qələm borcu sayacaqlar.

# I FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ ƏSAS NİTQ HİSSƏLƏRİ

## 1.1. Heydər Əliyevin nitqində saylar

Əsas nitq hissəsindən sayılan, əşyanın miqdarını və ya sırasını bildirən, neçə? nə qədər? neçənci? neçə hissə suallarına cavab verən say Heydər Əliyevin nitqlərində araşdırılmamışdır. Saylardan bütün üslublarda istifadə olunur. Lakin onların istifadə məqamı fərqlidir. Elmi və ictimai-siyasi üslubda konkretlik bildirən, bədii üslubda isə mücərrədlik ifadə edən saylar daha çox işlənir.[1] Böyük natiqin dilində şifahi şəkildə çoxsaylı rəqəmlərin auditoriyalara çatdırılması say nitq hissəsinin öyrənilməsini zəruri edir. Bu baxımdan sayları qruplar üzrə (miqdar sayları, sıra sayları), eləcə də hər qrupu da növlərinə görə Heydər Əliyevin nitqində tədqiq etmək fikrinə düşdük. Sayların tədqiqini aşağıdakı ardıcıllıqla öyrənmək qərarına gəldik; Heydər Əliyevin nitqlərində müəyyən miqdar sayları → təqribi miqdar sayları → kəsr sayları → sıra sayları → sayların müxtəlif auditoriyalarda işlənməsi → sayların müxtəlif üslublarda öyrənilməsi → sayların digər nitq hissələri və öz aralarında əlaqələsi → sayların sözyaratmada rolu.

Kəmiyyətin ifadə vasitəsi olan say kateqoriyası qədim tarixə malikdir. Türk dillərinin hələ Orxon-Yenisey inkişafı dövründə yüksək dərəcədə inkişaf etmiş say sistemi olmuşdur. Qədim türkdilli abidələrdə öz əksini tapmış say sisteminin inkişaf səviyyəsi bu kateqoriyanın türk dillərinin daha erkən təşəkkül dövründə formalaşmağa başlaması fikrini söyləməyə əsas verir.[2]

---

[1] Həsənova S. "Nitq mədəniyyəti və üslubiyyat", Bakı, 2005. 192 səh.

[2] Rəcəbli Ə. Qədim türk yazılı abidələrinin dili. I cild, Bakı, Nurlan, 2006

Heydər Əliyevin bir sıra çıxış və nitqləri rəqəmlərin zənginliyi ilə seçilir. Belə nitqlərdən birini – 27 noyabr 1996-cı ildə Azərbaycan Respublikası Nazirlər Kabinetinin iclasındakı nitqi araşdırmaq yerinə düşər. Bu iclasdakı nitqinə böyük natiq Artur Rasizadənin baş nazir vəzifəsinə təyini ilə başlayır. O baş nazirin fəaliyyətini sıra sayları ilə auditoriyaya çatdırır: "Rasizadənin həyat yolu sizə məlumdur. 6 ildən çox Azərbaycan Nazirlər Soveti sədrinin müavini vəzifəsində işləyibdir. 1992-ci ildə bu vəzifədən azad olunubdur və 1996-cı ildə yenidən artıq sizə məlum olan vəzifələrə təyin edilibdir.

Rasizadəni mən 1970-ci illərdən bir yerdə işlədiyimiz zamandan işgüzar, öz işini, sənətini bilən bir adam kimi tanıyıram" [VIIIc.s.75].[1]

Sonrakı nitq mərhələsində 1996-cı ildə Azərbaycan iqtisadiyyatının vəziyyəti müxtəlif növ sayların köməyi ilə açıqlanır. Auditoriya çoxsaylı rəqəmlərin sadalanması işığında iqtisadiyyatımızın vəziyyətini görür, gələcəyə tuşlanan nikbin fikirlərin şahidi olur: "Məsələn, əgər keçmiş vaxtlarda sənaye istehsalı 20-25 faiz aşağı düşürdüsə, indi onun aşağı düşmə sürəti azalıb. Verilən məlumatlara əsasən sənaye istehsalı 10 ayın yekunlarına görə ***8 faiz*** aşağı düşübdür. Əlbəttə, aşağıdüşməni müsbət hal kimi qeyd etmək olmaz. Ancaq hər şey müqayisə ilə ölçülür. Təəssüf ki, müqayisəyə görə bu belədir. Vaxt var idi, yadımdadır, ***1970-ci*** illərdə, ***1980-ci*** ıllərin birinci yarısında da respublikada iqtisadiyyatın artım sürəti ***6, 7, 8, 9, 10*** faiz olurdu. Əgər bir ayda, rübdə biz əvvəlkinə nisbətən 1 faiz geri qalmış olsaydıq bu, fövqəladə bir vəziyyət, faciə olardı. Respublikamızda sənaye istehsalı hər il orta hesabla ***7-8*** faiz, kənd təsərrüfatı istehsalı da təxminən o qədər artırdı, milli gəlir də artırdı" [VIIIc.s.80].

---

[1] Bu və bundan sonrakı bu tip sitatların hamısı "Müstəqilliyimiz əbədidir" kitablarından götürülmüşdür.

"Artım sürəti 6, 7, 8, 9, 10 faiz olurdu" ifadəsini eşidən auditoriya böyük natiqin hər bir rəqəmə – iqtisadiyyatımızla bağlı hər bir rəqəmə ciddi yanaşmasını izləyir. Elə bu nitqdə sayların təkrarlanmasını müşahidə etmək mümkündür. Belə ki, eyni bir say təkrarlanaraq nitqin təsir gücünü artırmaqla yanaşı onu daha da yaddaqalan edir: "Ancaq ***1997-ci*** ildə qarşımızda çox böyük vəzifələr durur. Bu günlərdə biz ***1997-ci*** ilin büdcəsinə baxıb, Milli Məclisə təqdim edəcəyik. Milli Məclis qəbul edəndən sonra onun həyata keçirilməsi ilə məşğul olmaq lazımdır. Yenə də deyirəm, ***1997-ci*** ildə qarşımızda çox böyük vəzifələr durur və bu vəzifələrin həyata keçirilməsində Nazirlər Kabineti və iqtisadiyyatla məşğul olan bütün orqanlarımız ciddi iş görməlidirlər" [XIIIc.s.82].

Daha sonra qəti gələcək zamanla rəqəmlərin harmoniyasından ibarət olan qətiyyətli nitq auditoriyanı səfərbər edir. "Maaşların yenə də artırılmasına çalışacağıq", "biz mütləq edəcəyik" ifadələri insanların sabahkı günə inamını artırır: "Bildiyiniz kimi bu ilin əvvəlindən indiyədək biz büdcədən maliyyələşdirilən sahələrdə kontingentin məvacibini bir dəfə ***20 faiz***, sonra isə ***40 faiz*** artırmışıq. Demək, büdcədən maliyyələşdirilən idarələrdə maaş ***60 faiz*** artırılıbdır. Mən bu gün sizə bildirmək istəyirəm ki, biz hazırlaşırıq, büdcəyə baxırıq və gələn ildən maaşların yenə də artırılmasına çalışacağıq. Bu, bizim planlarımızda var. Bunu nəzərdə tutmuşuq və biz bunu mütləq edəcəyik" [VIIIc.s.82-83].

Böyük natiqin dilində rəqəmlər gah təkrarlanır, gah qətiyyətli ifadələrlə çulğalaşır, gah da səmimi ifadələrlə qoşalaşaraq dinləyicilərin qəlbini riqqətə gətirir: "Siz Moskva televiziyasına baxırsınız, görürsünüz ki, maaşların ***3 ay, 4 ay, 5 ay*** verilməməsi, pulun ordan götürülüb buraya, burdan götürülüb oraya göndərilməsi haqqında hər gün danışırlar. Mən demək istəmirəm ki, bizdə hər şey yaxşıdır. Mən daim ma-

raqlanıram, – bizdə maaşlarla, pensiyalarla əlaqədar borc bir aylıqdır” [VIIIc.s.83].

Müəyyən miqdar sayları böyük natiqin dilində auditoriyada qürur hissi yarada bilir: “Amma Osmanlı İmeratorluğu nə olubdur? O, dünyaya ***700 il*** hökm oxuyan imperatorluq olubdur. ***700 il*** Osmanlı imperatorluğu olubdur, bu dövlət olubdur” [XIIIc.s.54].

Elə bu cümlədə 700 müəyyən sayının iki dəfə təkrarlanması bu rəqəmi auditoriyanın yaddaşına həkk edir.

Müəyyən saylar təkrarlanaraq ritorik suallarla çulğalaşaraq auditoriyada yüksək nitq effekti yaradır: “Biz ***altı ildir*** müstəqilik. Amma bu ***altı ili*** gözünüzün qabağına gətirin. Biz nə yollardan keçmişik?” [XIIIc.s.57].

Müəyyən miqdar sayları böyük natiqin dilində ədalət mücəssəməsi olan hakim nitqi kimi səslənir. Auditoriya Heydər Əliyevin işlətdiyi hər bir müəyyən miqdar sayında bir insan taleyini görür və belə bir parlaq nitqin rəqəmlər cazibəsindən çıxa bilmir: “Mənim təşəbbüsümlə Milli Məclis oktyabr ayının 17-də “Amnistiya haqqında” böyük bir qərar qəbul etdi. Bu qanun hərbi cinayət etmiş və yaxud başqa cinayətlər etmiş gənclər haqqındadır. Bu qərar ilə ***7 min*** adam – onların əksəriyyəti gəncdir – cəzadan azad olunacaqdır. ***1700*** nəfəri hazırda cəza yerlərindədir. Onlar azad ediləcəkdir. ***1300*** nəfərin işi məhkəmədədir – onların işi xətm ediləcək, azad olunacaqdır. ***3000*** nəfər fərarilik etdiklərinə görə axtarışdadır. ***100*** nəfəri isə yoxlamadadır. Beləliklə, onlar cəzadan azad ediləcəklər. Buraya gələrkən məlumat aldım ki, artıq ***460*** nəfər azad olunubdur” [XIIIc.s.131].

Defislə işarə olunan qeyri müəyyən miqdar saylarına da Heydər Əliyevin nitqində tez-tez rast gəlməsinin şahidi oluruq: “Gələn il “Çıraq” neft yatağından ***2 milyon*** ton neft çıxarılacaqdır. Ancaq bir neçə ildən sonra ***5-6*** milyon ton, ***5-6***

ildən sonra ***40-50 milyon*** ton neft hasil olunacaqdır. Ondan sonra daha da çox neft çıxarılacaqdır” [XIIIc.s.195].

Bu cür saylarla bəzən təxminlik ifadə olunursa, bir sıra hallarda isə dəqiqlik ifadə olunur: “Orada oktyabrın 21-22-də türkdilli ölkələrin dövlət başçıları növbəti görüş keçirdilər” [VIIc.s.451].

Bəzən də eyni bir mətndə təqribi (təxmini) saylar həm təxminlik, həm də dəqiqlik bildirir: “Yadımdadır, ***39-40-cı*** illərdə mən Sənaye İnstitutunda oxuyarkən mənimlə bir alman oxuyurdu. O, bakılı idi. O vaxtlar mənim ***16-17*** yaşım vardı. O da təxminən bu yaşda idi. Biz dostluq edirdik” [VIIc.s.45].

Bu kiçik məişət üslublu parçada qeyri-müəyyən (təqribi) saylar sadə cümlələrlə nitqi gözəlləşdirə bilir.

Digər saylar kimi kəsr sayları da müəyyən aditoriyalarda Heydər Əliyevin nitqlərində səslənir. Bu saylar onun problemə incəliklərinə qədər bələd olduğunu göstərir və auditoriyanı da bu incəlikləri görməyə səfərbər edir: “Ancaq bu müqavilədə Türkiyənin yeri nə idi? ***1.75 faiz***. Ancaq sonradan Türkiyə dövlət başçılarının xahişinə görə Azərbaycanın öz hissəsindən, müqavilə imzalanandan sonra respublikamıza qalmış hissədən ***beş faiz*** də Türkiyə dövlətinə, şirkətinə orada yer ayırdıq. Artıq burada Türkiyənin yeri ***6.75 faiz*** olur. Bax biz bu addımı atdıq ki, ölkəmizə Türkiyənin sərmayəsi gəlsin” [VIc.s.360].

Ritorik sualla qarşıya qoyulan problemə kəsr sayı ilə konkret cavab verilir. Qüvvətləndirici “bax” ədatı ilə fikir dinləyicilərə yönəlir.

Gələcəyə tuşlanan Heydər Əliyev fikirləri təxmini, defislə yazılan müəyyən miqdar sayları ilə ifadə olunur. Bu cür saylarla auditoriyalar gələcək günlərə hazırlanır: “İndi isə biz, neft müqavilələri ilə, – “Əsrin müqaviləsi” – ***1995-ci*** ildə imzalanmış neft müqaviləsi, ***1996-cı*** ilin iyununda imzalanmış neft müqaviləsi ilə Azərbaycan xalqının ***30-40*** illik gələcəyi üçün çox gözəl bir iqtisadi əsas yaratmışıq. Yəni biz bu mü-

qavilələri bu gün üçün yox, hətta ***5 il*** üçün yox, ***10, 15, 20*** il bundan sonra Azərbaycan Respublikasının müstəqil yaşaması üçün və Azərbaycan vətəndaşlarının rifah halının lazimi səviyyədə olması üçün imzalamışıq" [VIIc.s.121].

Sıra sayları Azərbaycanın görkəmli sənətkarlarının xalqa tanıdılması yolunda Heydər Əliyevin dilində mühüm vasitədir: "Üzeyir Hacıbəyov ***1949-cu*** ildə vəfat etmişdir, amma onun ev-muzeyini biz ***1974-cü*** ildə yaratdıq. Yaxud Səməd Vurğun ***1956-cı*** ildə vəfat etmişdir, biz onun ev muzeyini ***1982-ci*** ildə yaratdıq" [XIIIc.s.297].

Şifahi şəkildə korifeylərin vəfat etmələri tarixlərini, onların ev-muzeylərinin yaradılma tarixlərini sıralamaqla sıra saylarının nitqdə ekspressivlik yaratmaq gücünü bir daha ortaya qoyur.

Saylar Azərbaycanın görkəmli şəxsiyyətlərinin həyat tarixçələrinin auditoriyalara çatdırılmasında mühüm nitq vasitəsinə çevrilir. Bu zaman biz sayların publisistik üslubda işlənməsinin şahidi oluruq: "***1945-ci*** ildə Azərbaycanda Elmlər Akademiyası yaranarkən Yusif Məmmədəliyev Elmlər Akademiyasını təsis edən ***15*** görkəmli şəxsiyyətdən biri olubdur. Yusif Məmmədəliyev ***1947-ci*** ildən ***1950-ci*** ilə qədər, sonra da ***1958-ci*** ildən ***1961-ci***ilədək akademiyanın prezidenti olmuşdur. Akademiyanın prezidenti vəzifəsinə bu görkəmli alimin ***ikinci*** dəfə dəvət edilməsi onu göstərmişdir ki, Yusif Məmmədəliyev 1950-ci ildə subyektiv səbəblərə görə vəzifədən azad olunmuşdur. O, Akademiyanın tərkibində öz işini davam etdirmiş, sonra universitetin rektoru işləmiş və Elmlər Akademiyası Yusif Məmmədəliyevə yenidən ehtiyac duymuşdur. O, ***1958-ci*** ildə Elmlər Akademiyasına prezident seçilmiş və ömrünün sonuna qədər prezident kimi yaşamışdır" [VIIc.s.293-294].

Sıra saylarının köməyi ilə böyük natiq bütöv bir əsrə – XX əsrə qiymət verir. Sıra sayları XX əsrdə Azərbaycan tarixini gənc nəslə çatdırmaq vasitəsinə çevrilir: "Ümumiyyətlə,

elə başlanğıcdan sonadək çox çətin bir əsr, ağır bir dövr olubdur. Doğrudur, ***XX*** əsrin sakit dövrləri də olubdur. Amma qalmaqallı, çətin, ağır dövrləri ***daha çox*** olubdur. Bizim qismətimizə nə düşübdür? Biz bunun bir çox hissəsini görmüşük. Məsələn, bizim nəsil – mən öz nəslimi deyirəm, – biz ***30-cu*** illərin ağırlıqlarını da görmüşük, ***40-cı*** illərin, müharibə illərinin çətinliklərini də görmüşük, sonrakı illərin çətinliklərini də. Eyni zamanda ***1960-1970-1980-ci*** illərdə yaranmış müsbət şəraiti də görmüşük. ***1980-ci*** illərin sonundan başlayaraq Azərbaycan üçün ağır bir dövr başlanıbdır. Bu, bir tərəfdən Ermənistanın Azərbaycana etdiyi təcavüz nəticəsində meydana gəlibdir" [XIIIc.s.83].

"Daha" ədatının birləşdiyi "çox" qeyri-müəyyən sayı XX əsrin Azərbaycan üçün keşməkeşli, ulu öndər demiş qalmaqallı olduğunu bir daha auditoriyalara ünvanlayır.

Sıra sayları Heydər Əliyevin nitqində XX əsr Azərbaycan ədəbiyyatını yaradan şəxslərin antroponimik sıralanması ilə vəhdətdə verilir. Sıra sayları və bu sıra sayları ilə zaman vəhdətində görkəmli Azərbaycançılar auditoriyalara tanıdılır: "Mən son vaxtı deyirəm, bəli, Məmməd Səid Ordubadi, Hüseyn Cavid, Cəfər Cabbarlı – bunlar şübhəsizdir. Mən ***40-cı, 50-ci*** illəri, yəni ***1937-38-ci*** illərdən sonra yaranmış ədəbiyyatı sayıram. Əsrin əvvəlində ***1910-cu, 1920-30-cu*** illərdə bizim böyük şairlərimizin, yazıçılarımızın əsərləri ancaq millilik, vətənpərvərlik, millətçilik hissləri ilə yazılmışdır" [XIIIc.s.125-126].

Ancaq sonrakı dövrü mən ona görə xüsusi vurğulayıram ki, ***1937-38-ci*** illərdə bizim ədəbiyyatımıza böyük zərbə vuruldu, böyük itkilərimiz oldu. Hüseyn Cavid, Mikayıl Müşfiq, Əhməd Cavad, Çəmənzəminli və başqaları. Anar dedi ki, ***27*** şair və yazıçı ***1937-38-ci*** illərin qurbanları oldu" [XIIIc.s.126].

Qeyri-müəyyən saylar arasında əksər hallarda “çox” sayı sözyaratmada məhsuldar olmuşdur: “Bundan başqa seçkilər ilk dəfə olaraq ***çoxpartiyalı*** əsasda keçirildi” [Vc.s.109].

Əşyanın miqdarını qeyri-müəyyən şəkildə bildirən saylara qeyri-müəyyən miqdar sayları deyilir ki, buraya “az”, “çox”, “xeyli”, “çoxlu” aid edilə bilər: “Azərbaycan Silahlı Qüvvələrinin bir hissəsi, ***üç mindən*** artıq hərbçi, ***xeyli*** tank, piyada döyüş maşını toplar, digər silahlar və döyüş ləvazimatı cəbhədən ayrıldı” [IIc.s.282].

Larla, *-larca* şəkilçilərinin köməyi ilə yaranan yuvarlaq qeyri-müəyyən saylar da böyük natiqin çıxışlarında xüsusi yer tutur: “Müharibə nəticəsində Azərbaycan xalqına ***milyardlarla*** Amerika dolları məbləğində çox böyük maddi ziyan vurulmuşdur. İnsan taleyinə vurulmuş mənəvi ziyan, xalqın dərd-bəlası isə heç nə ilə ölçülməzdir” [IIc.s.309].

“Çox”, “çoxlu” qeyri-müəyyən miqdar sayları mövcud hadisələrin miqyasını göstərmək baxımından vacibdir: “Altı il əvvəl Dağlıq Qarabağda başlanmış münaqişə müharibəyə çevrilmiş və Azərbaycan Respublikasına, Azərbaycan xalqına ***çox*** böyük zərər vurmuşdur. Bu müharibə, təbii ki, erməni xalqına da ***çoxlu*** müsibətlər və bəlalar gətirmişdir” [IIc.s.298].

Böyük natiqin nitqində “bir neçə” qeyri-müəyyən sayı ikili xarakter daşıyır: “Mən sizin qarşınızda bir neçə məlumat verə bilərəm. Ancaq o qədər vaxt yoxdur. Ona görə də qısa olaraq ***bir neçə*** kəlmə demək istəyirəm” [IIc.s.469].

Əgər birinci variantda (bir neçə saat) ***bir neçə*** çox mənasındadırsa, ikinci variantda (bir neçə kəlmə) az mənasında işlədilir. Başqa bir məqamda isə “bir neçə” qeyri-müəyyən sayı nə aza, nə də çoxa işarədir: “Mən ***bir neçə*** saat bundan əvvəl burada iş adamları ilə görüşdüm” [IIc.s.471].

Qeyri-müəyyən saylar, xüsusən də “az”, “çox” Heydər Əliyevin dilində miqyas kimi götürülür. Fərqli mövqeləri auditoriyalara anladır: “Azərbaycan Türkiyə üçün ən yaxın bir

ölkə olduğu halda, Türkiyənin iş adamları indi Azərbaycanda ***az iş*** görürlər. Amma keçmiş Sovet İttifaqının digər republikalarında daha ***çox iş*** görürlər" [IIc.s.471].

Qeyri-müəyyən miqdar saylarına Heydər Əliyevin nitqində "artıq" da əlavə olunur: "...Ermənistan tərəfindən səkkiz il bundan əvvəl başlamış təcavüz nəticəsində Azərbaycan ərazilərinin 20 faizini Ermənistan silahlı birləşmələri işğal etmiş, Azərbaycanın bir milyondan ***artıq*** vətəndaşı zəbt olunmuş torpaqlardan didərgin salınmışdır. Azərbaycanın ərazi bütövlüyü pozulmuşdur, öz yaşayış yerlərini tərk edən, dediyim kimi bir milyondan ***artıq*** vətəndaşımız isə çadır şəhərçiklərində çox ağır şəraitdə yaşayır" [VIIIc.s.261].

Müəyyən miqdar sayları ilə yanaşı qeyri-müəyyən saylardan da Heydər Əliyev söz yaradıcılığında məharətlə istifadə edir. Bu sözlər elə Heydər Əliyevin öz üslubuna da aid olur: "Ömrümün əsas hissəsi Azərbaycanda keçib, Azərbaycan öz ***çoxmillətliliyi*** ilə səciyyəvidir... Bütün svilizasiyalı ölkələr ***çoxmillətlidir***" [Ic.s.120]. Deyərdik ki, yuxarıdakı parçada böyük natiqin işlətdiyi "çoxmillətlilik" və "çoxmillətli" ifadələri Heydər Əliyev nitqinə xasdır.

"Çox", "çoxlu" qeyri-müəyyən və müəyyən miqdar saylarının köməyi ilə azərbaycanlıların dünyada məskunlaşmasını müəyyən dairələrə anladır. 24 avqust 1993-cü ildə "Nezavisimaya qazeta"ya verdiyi müsahibədə olduğu kimi: "Yetmiş ildən artıq bir müddətdə biz öz cənub qonşularımızdan demək olar tamamilə ayrı düşmüşdük, indi, birləşmə, inteqrasiya əhval-ruhiyyəsi bütün dünyaya hakim kəsildiyi bir vaxtda nəyə görə də bizim qonşularımızla normal münasibətlərimiz olmasın? ...Azərbaycanı Türkiyə və İranla qədim tarix birləşdirir. Lakin təxminən 200 il Azərbaycan Rusiyanın tərkibində olmuşdur. Bu isə dərin iz buraxmışdır. Azərbaycanın həm Rusiya, həm Türkiyə, həm də digər dövlətlərlə yaxşı dostluq münasibətləri olmalıdır. Misal üçün Qazaxıstanda, Özbəkistanda,

Türkmənistanda ***çoxlu*** azərbaycanlı yaşayır. Rusiyada onlar təqribən ***2 milyon*** nəfərdir. Onların sayı Şimali Qafqazda xüsusilə daha ***çoxdur".*** "Yetmiş ildən artıq", "təxminən 200 il", "2 milyon nəfər" müəyyən miqdar sayları, "çoxlu", eləcə də "daha" ədatı ilə güclənən "çox" qeyri-müəyyən sayları ilə çulğalaşaraq "Nezavisimaya"qazeta"nın müxbirinin "son vaxtlar Azərbaycan İrana və Türkiyəyə güclü meyl göstərir" sualına cavab kimi dəyərləndirilir. Auditoriya bu cür rəqəm-faktlara söykənən nitqi ürəkdən dinləyir.

Heydər Əliyevin nitqində müəyyən və qeyri-müəyyən miqdar, eləcə də sıra sayları ilə aydınlıq gətirilən situasiya sonda ritorik sualların köməyi ilə yaddaqalan olur: "Eyni zamanda sizin verdiyiniz arayışlardan məlum oldu, özünüz də burada məlumat verdiniz ki, ***1993-cü*** ildə qərar qəbul etmisiniz ki, bu məhsulları ancaq Dövlət Neft Şirkəti satsın. ***1993-cü*** ildə zavodlar cəmi ***4*** faiz satdı, ***1994-cü*** ildə ***10*** faiz satdı, amma ***1995-ci ildə 30 faiz*** satdı. Əgər siz qərar qəbul etmişdinizsə, öz qərarınıza riayət edəydiniz. Əgər qərar qəbul etmişdinizsə, niyə zavodlar sizə tabe olmayaraq nefti özbaşına satırlar və haraya, hansı qiymətə satırlar, nə üçün satırlar – bunu siz bilmirsiniz? Bu sizin səhviniz və günahınızdır. Mən siz çıxış edərkən dedim və bir də deyirəm. Neft Şirkəti ***1 milyon 500*** min dolları ayrı-ayrı xeyriyyəçilik işlərinə sərf etmişdir. Xeyriyyəçilik işləri nədir, məlum deyil. Birincisi, nə ixtiyarınız var xeyriyyəçiliklə məşğul olasınız? Xeyriyyəçilik işini o adam görə bilər ki, onun şəxsi mülkiyyəti var, o, şəxsi mülkiyətindən kimə isə kömək edir" [VIIc.s.135].

Sayların bəzən bütün növlərinin ***3-4*** ardıcıl cümlədə işlənməsinin şahidi oluruq: "Məsələn, iqtisadiyyatın göstəricilərinin bir neçəsini sizə deyim. ***1989-1990-cı*** illərdən ümumidaxili məhsul istehsalı ilbəil ***15-20*** **faiz** aşağı düşürdü. ***1995-ci*** ildə biz bunu dayandırmışıq. 1996-cı ildə ümumidaxili məhsul

istehsalı ***1.3*** faiz, ***1997-ci*** ilin doqquz ayında ***5 faiz*** artıbdır. Bu çox yaxşı göstəricidir" [XIIIc.s.115].

Böyük natiq bu kiçik mətndə həm müəyyən (5 faiz, doqquz ay) həm qeyri-müəyyən (bir neçə, çox), həm sıra (1989-1990-cı, 1995-ci ildə, 1996-cı ildə, 1997-ci ilin) həm də kəsr (1.3 faiz) saylarını harmoniik şəkildə uzlaşdıraraq iqtisadçı alim təkin auditoriyanı rəqəmlərin sehrinə salır.

Heydər Əliyev müəyyən və qeyri-müəyyən sayların köməyi ilə beynəlxalq tribunalardan Azərbaycana olan Ermənistan təcavüzünü açıqlayır. 29 sentyabr 1994-cü ildə BMT Baş Məclisinin 49-cu sessiyasındakı çıxış bu qəbildəndir: "Təcavüz nəticəsində Azərbaycan ərazisinin ***20*** faizindən çoxu Ermənistan Respublikasının silahlı qüvvələri tərəfindən işğal edilmişdir. Mən Azərbaycan tərəfinin dəhşətli itkilərini sizə deməliyəm: ***20*** mindən çox adam həlak olmuşdur, ***100 minə*** yaxın adam yaralanmış və xəsarət almışdır. ***6 min*** adam əsir düşmüşdür, ***bir milyondan*** çox azərbaycanlı – ölkə əhalisinin təxminən ***15 faizi*** qaçqın vəziyyətinə düşmüşdür və çadır şəhərçiklərində yaşayır. Onlar öz vətənlərində evsiz-eşiksiz qalmışlar, yayın istisindən, qışın soyuğundan, epidemiyalardan əzab çəkirlər, ən zəruri şeylərə ehtiyac duyurlar. Azərbaycanın işğal edilmiş ərzilərində ***700 şəhər*** və kənd dağıdılmışdır" [IIc.s.309].

Azərbaycan insanının başına gətirilən dəhşətli vəziyyətin rəqəmlərin dili ilə auditoriyaya çatdırılması fenomenal Heydər Əliyev nitqinə xas ola bilər.

Kənd təsərrüfatına həsr olunmuş müşavirələrdə rəqəmlərin dili ilə böyük natiq həmin sahənin aparıcı mütəxəssisi kimi mahiyyəti açıqlayır. Auditoriya sayların müxtəlif növlərinin müqayisəli harmoniyasının sehrinə düşür: "Yaxud elə üzümçülüyü götürək. Biz ***1970-ci ildə 250*** min ton üzüm toplamışdıq. Bu, mənim yaxşı yadımdadır. Sonra qalxdı ***2 milyon*** tona, ***1 milyon 800 min***, ***1 milyon 700 min*** tona. İndi ***192 min***

ton üzüm toplanıb. Belə şey olarmı? Tutaq ki, bəzi səbəblər olub. ***1985-ci*** ildə şərxoşluğa qarşı mübarizə adı ilə üzüm bağlarını qırdılar, dağıtdılar. Amma indi mövcud olan bağlardan ***2-3 dəfə*** bundan artıq üzüm götürə bilərdik" [IIc.s.491].

Böyük natiq felin əmr şəklindən istifadə edərək auditoriyanın diqqətini rəqəmlərə yönəldir. Rəqəmləri şifahi şəkildə dinləyən auditoriyanın nitqə marağı daha da artır: "***Diqqət verin***, Neftçala rayonunda ***100 hektar*** sahədə İsraildən gətirilən pambıq toxumu sortları əkilib. Deyirlər ki, hər hektardan ***40 sentner*** pambıq götürüləcək" [IIc.s.268].

Fellərin əmr şəklində təkrarlanması yolu ilə rəqəmlərin müqayisəsini verməklə göstəricilər arasında paralel aparmaq hər bir natiqə müyəssər olmur. Ölkəmizin kənd təsərrüfatının inkişafına xüsusi önəm verən Heydər Əliyevin nitqlərində yuxarıdakı xüsusiyyətlər öz əksini tapır: "***Təsəvvür edin***, vaxtilə ildə ***1 milyon 700*** min, ***1 milyon 800*** min, hətta ***2*** milyon ton üzüm istehsal edən Azərbaycan torpağında bu il ***350-400*** min ton üzüm istehsal etmək nəzərdə tutulur. ***Görün*** biz nə qədər geri düşmüşük. ***Görün*** son illər gedən proseslər, xüsusilə ***1985-ci*** ildə üzümçülüyə vurulan zərbələr Azərbaycan xalqına nə qədər böyük zərər gətirir" [IIc.s.271].

Qeyri-müəyyən sayları qüvvətləndirici ədatlarla birgə işlətmək Heydər Əliyevin nitqləri üçün xarakterikdir. Qüvvətləndirici ədatlarla güclənmiş nitq yaddaşlarda öz izini daim saxlayır: "Ona görə də biz bu nöqsanları aradan qaldırmalıyıq. Bir tərəfdən dövlət, hökumət proqramları bu sahəyə ***daha da çox*** vəsait ayırmaq və bu sahədə ***daha çox*** işlərin görülməsi üçün lazımi tədbirlər görməliyik" [XIIIc.s.163].

Heydər Əliyevin nitqlərinə xas olan təkrarlar saylardan da yan keçmir: "***XX*** əsr bir çox səbəblərə görə əlamətdardır. Bu əsrin əvvəlki əsrlərdən fərqi bir də ondan ibarətdir ki, ***XX*** əsrdə iki dünya müharibəsi baş vermişdir. ***XX*** əsrə qədər bəşər tarixində heç vaxt bu qədər müharibələr olmamışdır" [VIc.s.266].

Burada sıra sayı kimi ***XX*** əsr üç yerdə təkrarlanaraq dinləyicinin yaddaşında müharibələr əsri kimi qalır.

“Kimi” qoşmasının önündə bir sayı isimlərlə yanaşı işlənərək qüvvətləndirici ədat funksiyasını alır: “Ona görə də Bakının gözəl guşələrindən birində yüksələn, azad Azərbaycan qadınına həsr olunmuş abidə – mərhum heykəltəraş Fuad Əbdürrəhmanovun əsəri bizim üçün ***bir heykəl kimi*** yox, tarixi nailiyyətimizi əks etdirən ***bir amil kimi*** yaşayır və yaşayacaqdır” [Xc.s.11].

Rəqəmlər bir çox məqamlarda auditoriya üçün mahiyyətin dəqiqcəsinə açıqlanmasında istifadə olunur. Heydər Əliyevin 4 dekabr ***1995-ci*** ildə Parisdə “Mond” qəzetinin müxbirinə verdiyi müsahibə bu sıradandır: “Bax indi təsəvvür edin: seçicilərin ***86*** faizi səsvermədə iştirak etdi. Onların ***91.9 faizi***, yəni ***92 faizi*** konstitusiyaya səs verdi. Təqribən ***8 faiz*** konstitusiyaya səs vermədi. İndi deyin görək bu demokratiyadır, ya yox?” [Vc.s.108].

1995-ci ildəki parlament seçkilərinə münasibətini müəyyən və qeyri-müəyyən miqdar saylarının vasitəsilə bildirən böyük natiq gözəl bir nitq parçası yaradır: “Beləliklə, seçkilər keçirildi. Birinci turda ***125*** nəfərdən ***96-sı*** seçildi. ***25*** adam partiya siyahısı üzrə keçdi. ***100*** nəfərdən ***71*** nəfər majoritar prinsip üzrə keçdi. Deməli, ***29*** nəfər üçün seçkilər baş tutmadı. Bu, məgər demokratiya deyilmi? Demokratiyadır. Majoritar prinsip üzrə qalan ***20*** dairədə təkrar səsvermə oldu. Orada bir dairədə ***5-6-7-8***, yaxud ***10-12*** namizəd var idi Onların hərəsində iki namizəd daha çox səs topladı. Onlar təkrar səsverməyə getdilər. Noyabrın ***26-da 20*** dairədə təkrar səsvermə keçirildi. Bu, məgər demokratiya deyilmi? Noyabrın ***26-da 20*** dairədən ***13*** deputat seçildi. ***7*** dairədə isə seçkilər yenə də baş tutmadı. Ya yetərsay olmadı, ya da müəyyən pozuntulara yol verildi. Mərkəzi seçki komisiyyası həmin dairələrdə seçkiləri baş tutmamış hesab etdi. Deməli, bu da demokratiyadır” [Vc.s.110].

Bu kiçik nitq parçasında 16 yerdə müəyyən və qeyri-müəyyən sayları işlənmişdir. İki yerdə "bu məgər demokratiya deyilmi" ritorik sualına böyük natiq məhz rəqəmlərin dili ilə cavab verir və sonluğu "deməli, bu da demokratiyadır" ifadəsi ilə qurtarır. "Beləliklə", "deməli" modal sözləri, saylar və ritorik suallar bir mətndə harmoniya yaradaraq, nitqin auditoriya tərəfindən dəqiq dərk olunmasına gətirib çıxarır.

Rəqəmlər Heydər Əliyevə Azərbaycan həqiqətlərini dünya ictimaiyyətinə təqdim üçün kəsərli silahdır. Rəqəmlər auditoriyaları inandırmaq, tərəddüddən çıxarmaq yolunda ciddi vasitədir. Rəqəmlər müstəqilliyimizin ilk illərində informasiya blokadasında olduğumuz illərdə bu blokadanı aradan qaldırmaq yolunda Heydər Əliyevin dilində Azərbaycan həqiqətlərini dünyaya car çəkir. 11 iyul 1994-cü ildə Səudiyyə Ərəbistanının Ciddə şəhərində mətbuat konfransında olduğu kimi: "Mən burada səfərdə olarkən bir daha hiss etdim ki, Azərbaycanın indiki vəziyyəti, ümumiyyətlə, ölkəmiz haqqında və Azərbaycanın Ermənistan tərəfindən hərbi təcavüzə məruz qalması haqqında Səudiyyə Ərəbistanında, Azərbaycandan uzaqda yerləşən bütün ölkələrdə çox az məlumat var, bəzi məlumatlar isə ayrı-ayrı dövlətlərin informasiya kanallarından alındığına görə obyektiv xarakter daşımır. Bildiyiniz kimi, Azərbaycan Qafqazda yerləşir, əhalisi ***7 milyon*** nəfərdir, müsəlman ölkəsidir. Sovetlər İttifaqının tərkibində olduğu ***70 il*** ərzində müsəlman ölkəsi kimi onun dini qadağan edilmişdi...

Əsl vəziyyət bundan ibarət idi ki, ***29 min*** kvadrat kilometr ərazisi və ***3,5-4*** milyon əhalisi olan Ermənistan Respublikası kimi kiçik bir dövlət 86 min kvadrat kilometr ərazisi və bayaq dediyim kimi, ***7 milyon*** əhalisi olan Azərbaycana hücum edərək onun ərazisinin bir qismini zəbt etmişdir. Azərbaycan ərazisinin 20 faizi indi Ermənistan silahlı qüvvələrinin işğalı altındadır" [IIc.s.68].

"Heydər Əliyevin çıxış etdiyi hər bir auditoriyanın öz rəqəmlər dili var" desək yanılmarıq. 21 sentyabr 1993-cü ildə Elmlər Akademiyasında ziyalılarla görüşdə söylədiyi nitq ölkə həyatında ciddi rol oynayan, tariximizdə araşdırılmağa layiq olan rəqəmlərlə zəngin bir nitqdir. Bu rəqəmlər alimlər auditoriyasını düşündürməyə, düşdüyümüz tarixi situasiyadan çıxmağa sövq edir: "Bəli, 1918-ci il may ayının 28-də Azərbaycan Demokratik Respublikasının yaranması Azərbaycan tarixində böyük ictimai-siyasi hadisədir. Tarixçilər yaxşı bilirlər ki, ***23 ay*** ərzində bu dövlətin tərkibi ***beş dəfə*** dəyişib, bu dövlətdə bu parlamentdə ***beş*** partiya iştirak edib: Müsavat Partiyası, İttihad Partiyası, Əhrar Partiyası, Sosialist Partiyası, hətta Daşnaksütyun Partiyası. Bu parlament sistemi dövlətin yaşamasına imkan vermədi və ayrı-ayrı qruplar, partiyalar arasında gedən çəkişmələr, çarpışmalar, intriqalar özü-özündə bu dövlətin adına ləkə vurdu. Mən bunu nə üçün deyirəm? Ona görə ki, biz bundan ibrət dərsi almalıyıq" [Ic.s.154].

Elə həmin görüşdə Heydər Əliyevin rəqəmlərlə antroponimik sıralanmaların harmoniyasını verir, Azərbaycanın görkəmli şəxsiyyətlərini xalqa bir daha tanıdır: "Gələn il Abbasqulu Ağa Bakıxanovun ***200 illiyi***, bu il Abbas Mirzə Şərifzadənin ***100 illiyi***, Ülvi Rəcəbin ***90 illiyi***, Əliağa Vahidin ***100 illiyi*** tamam olur. Bunlar Azərbaycanın böyük şəxsiyyətləridir. Mən böyük şəxsiyyətlərimizin hamısını yada salmaq fikrində deyiləm. Yalnız bəzilərinin adlarını çəkərək öz fikirlərimi ifadə etmək istəyirəm" [Ic.s.158].

Sonra isə akademik tərkib qarşısında milli memarlığımızın böyük təəssübkeşi kimi çıxış edərək rəqəmlərin köməyi ilə Azərbaycanın memarlıq, rəssamlıq ənənələrini dilə gətirir, sonda isə millilikdən kənaraçıxmaları ritorik sualla ittiham edir: "Axı Azərbaycanın böyük rəssamlıq, memarlıq məktəbi var. ***800-900 il*** bundan əvvəl Azərbaycan memarları bütün Şərqdə məşhur olan abidələr yaratmışlar. Əcəmi Naxçıvaninin

yaratdığı abidələr təkcə Naxçıvanda deyil, Şərq ölkələrində indi də qalmaqdadır. Şirvanşahlar sarayını tikən memarlar öz işlərinə əsl milli təfəkkürlə yanaşmışlar. Bəs indikilər? Yeni tikilməkdə olan teatr binasında Azərbaycan memarlığının bir nümunəsini də görə bilmədim. Musa Nağıyevə Allah rəhmət eləsin, bu binanı qoyub getmişdir. Gözəl binadır. Azərbaycan xalqı ondan istifadə edir. Memarlıq baxımından burada da qarmaqarışıqlıq çoxdur, mən bunu təhlil etmək istəmirəm. Ancaq Azərbaycan xalqının memarlıq incəsənət nümunələri burada çoxdur. Bu bina səhv etmirəmsə ***1913-cü*** ildə tikilmişdir. Əgər Musa Nağıyev, binanı tikdirərkən bu məsələyə fikir vermişsə, indi ***1992-1993-cü*** illərdə tikilən yeni bina niyə milli memarlıq üslubunda olmasın?" [Ic.s.161].

Akademiyadakı çıxışdan bir gün sonra – 22 sentyabr 1993-cü ildə Heydər Əliyev Respublika Ali Sovetində gənclərin nümayəndələri ilə görüşür. Bu görüşdə böyük natiqin fenomenal yaddaşı işə düşür. XX əsrin 70-ci illərində Azərbaycan gənclərinin təhsil yollarındakı uğurları, o dövrün problemləri, o dövrün çətinlikləri bir-bir gənclər auditoriyasına rəqəmlərlə çatdırılır: "Eyni zamanda xatirinizdədir, o zaman ***1972-1973-cü*** illərdə Azərbaycandan gənclər böyük çətinliklə Moskva, Leninqrad, Kiyev şəhərlərinin, Rusiyanın, Ukraynanın, Belorusiyanın, Baltikyanı respublikaların, Orta Asiya respublikalarının ali məktəblərinə göndərilirdi.

Bəlkə siz gənclər bunu bilmirsiniz, lakin mən bunu sizə çatdırmalıyam ki, ildə ***400-500-600*** tələbəni – sonra isə biz bunu ***800-900-ə*** qaldırdıq – keçmiş Sovet İttifaqının ali məktəblərinə müsabiqədənkənar göndərmək hüququ almaq üçün respublikanın rəhbəri kimi mənə nə qədər böyük çətinliklər törədildi" [Ic.s.171].

Gənclərlə görüşündə də auditoriyanı "xatirimdədir" modal sözünün ardınca düzülən rəqəmlərin mahiyyti açmağa kömək edən sehrinə salır: "Xatirimdədir, Moskva Universitetinə ildə

təxminən ***150*** nəfər, Leninqrad Universitetinə ***100*** nəfər azərbaycanlı tələbə göndərilirdi. Təkcə Moskvada ***30-dək*** ali məktəbə tələbələr yollayırdıq. Keçmiş SSRİ-nin ***46-dək*** şəhərinin ***50-yə*** qədər ali məktəbində bizim tələbələr təhsil alırdılar” [Ic.s.171].

Böyük natiqin elmi üslublu çıxışlarında say nitq hissəsi mahiyyətin auditoriyalara rəqəmlərin dili ilə çatdırılması yolunda mühüm vasitəyə çevrilir. 20 sentyabr 1994-cü ildə “Gülüstan” sarayında Xəzər şelfində yataqların birgə işlənməsi haqqında Bakıda Azərbaycan Dövlət Neft Şirkəti ilə xarici neft şirkətlərinin konsorsiumu arasında müqavilə imzalanması mərasimindəki nitq dediklərimizə əyani parlaq misaldır: “Beləliklə, XIX əsrin ikinci yarısında bir sıra dünya ölkələri, inkişaf etmiş ölkələrin firmaları Azərbaycanda, Bakıda neft çıxarılmasına böyük maraq göstərmişlər. Həmin əsrin sonundan etibarən Bakı neftinin çıxarılması üçün bir çox xarici ölkələrin şirkətləri fəaliyyətə başlamışlar. ***1872-ci*** ildə Azərbaycanda ***26*** min ton neft çıxarılmışdır. Cari əsrin əvvəlində, ***1900-cü*** ildə Azərbaycanda artıq ***10*** milyon ton neft hasil olunmuşdur ki, bu da Rusiyada çıxarılan neftin ***95*** faizini, dünyada çıxarılan neftin isə ***50*** faizini təşkil etmişdir. XX əsrin birinci ***20*** ilində də Azərbaycanda xarici ölkələrin neft şirkətləri və yerli sahibkarlar Bakı neftinin çıxarılması, emalı üçün çox böyük fəaliyyət göstərmişlər və Azərbaycanda neft sənayesi inkişaf etmişdir” [IIc.s.256].

Bu mətndə xarici konsorsium auditoriyası Azərbaycanda neft sənayesinin təşəkkülü ilə bağlı elmi çıxışın şahidi olur. Böyük natiq burada “ton” numerativ sözündən bir neçə dəfə istifadə edir (Numerativ sözlər müəyyən miqdar sayları ilə aid olduqları isim arasında işlənən sözlərdir). Elə həmin mərasimdə Heydər Əliyevin sıra saylarının köməyi ilə Bakının şöhrətini konsorsiuma daxil olan şirkətlərə çatdırır: “Təsadüfü deyildir ki, onların səyləri və əməyi sayəsində Sovet İttifaqı ərazisində

aşkara çıxarılan yeni neft yataqları "***İkinci*** Bakı", "***Üçüncü*** Bakı" və "***Dördüncü*** Bakı" adlandırılmışdır" [IIc.s.257].

Və yenidən numerativ sözlərin (ton, kubmetr) işləndiyi müəyyən miqdar sayları ilə neft və qaz istehsalını müqavilə iştirakçılarının nəzərinə çatdırır: "Azərbaycanda neftin sənaye üsulu ilə istehsalına başladığı vaxtdan indiyədək ölkəmizin ərazisində yerin təkindən – quruda və suda ***1 milyard 325 milyon*** ton neft çıxarılmışdır. Xəzərin Azərbaycana aid hissəsində ***45 ildə 400 milyon*** ton neft hasil edilmişdir. Bu müddətdə eyni zamanda ***400 milyard*** kubmetrədək qaz çıxarılmışdır" [IIc.s.258].

Rəqəmlər Heydər Əliyevin fikirlərinin təsdiqi kimi səslənir. Müqayisəli rəqəmləri eşidən auditoriya mahiyyətin açıqlanmasının şahidi olur: "Bizdə üzüm, tərəvəz, meyvə, çay, tütün istehsalı da aşağı səviyyədədir" [VIc.s.57].

Elə bu cümlə öz təsdiqini rəqəmlərin köməyi ilə tapır: "Əgər respublikamız ***70-ci*** illərdə, ***80-ci*** illərin əvvəllərində ildə orta hesabla ***800 min ton*** pambıq istehsal edirdisə, istər ***93-cü*** ildə, istər ***94-cü*** ildə, istərsə də ***95-ci*** ildə heç ***300 min*** tona da çata bilmir" [VIc.s57].

Heydər Əliyevin kənd təsərrüfatında istehsalla bağlı keçirdiyi müşavirələrin nitq baxımından tədqiqi, xüsusən də kənd təsarrüfatı göstəriciləri oxucuya ilk baxışda cansıxıcı görünə bilər. Nitq hissəsi saylar digər nitq elementləri ilə harmoniyada öz rəqəmliliyini itirərək canlılıq xüsusiyyətləri qazanır: "Taxıl indi bizim üçün ən zəruri ərzaq məhsuludur. Çünki necə olursa-olsun biz əhalimizi taxıl, çörək ilə təmin etməliyik. Taxıl istehsalı da o illərə nisbətən çox aşağı düşübdür. Əgər ***1994-cü*** ildə ***1 milyon 100 min*** ton taxıl istehsal olunmuşdursa, ***1995-ci*** ildə ***900 min*** ton taxıl məhsulu götürülmüşdür" [VIc.s.57].

Yuxarıdakı nitq parçasında öncə taxılın "ən" qüvvətləndirici ədatının köməyi ilə zəruri ərzaq olması yada salınır. Dövlətin qarşısında "çörək ilə təmin etməliyik" öhdəliyini qo-

yur və taxıl istehsalının aşağı düşməsini rəqəmlərlə dinləyicilərə çatdırır. Elə bu nitq ilə də auditoriyanı taxıl probleminin həllinə qoşa bilir. Rəqəmlər auditoriyanı düşündürmək vasitəsinə çevrilir.

Saylar Heydər Əliyevin nitqində ictimai-siyasi prosesləri düzgün əks etdirmək baxımından mühüm vasitədir. Ölkədaxili vəziyyət rəqəmlərin – müəyyən miqdar və sıra saylarının köməyi ilə auditoriyalara izah olunur: "***Üç*** il əvvəl, ***1995-ci ilin*** iyununda isə Azərbaycanda vətəndaş müharibəsi başlanmışdı, ölkə böyük fəlakət qarşısında idi. Ölkənin daxilində isə qanlar axıdılırdı...Bütün bu illərdə təxminən ***1989-1990-cı*** illərdən başlayaraq ***1993-cü*** llədək Azərbaycanın daxilində çox mürəkkəb proseslər gedirdi. Əgər onlar normal proseslər olsaydı, bu başqa məsələ. Amma müxtəlif qanunsuz silahlı qruplar hakimiyyət uğrunda mübarizə aparırdılar. Azərbaycanda hakimiyyət üç ildə üç dəfə dəyişmişdir. Mən ***1990-cı, 1992-ci və 1993-cü*** illəri nəzərdə tuturam" [VIIc.s.425].

Aydınlaşdırma xüsusiyyəti burada da özünü göstərir. Üç ildə üç dəfə hakimiyyət dəyişikliyini qeyd edən böyük natiq növbəti mərhələdə həmin illəri auditoriya üçün sadalayır.

İctimai-siyasi hadisələrin insanlarda yaratdığı pessimist ovqat rəqəmlərin dili ilə izah oluna bilir: "Mən dedim ki, ötən ***üç ildə*** müstəqil Azərbaycan Respublikasında müəyyən dəyişikliklər olub, üç dəfə hakimiyyət dəyişib. Bu isə insanlarda ümidsizlik yaradıb. Adamların bəzilərində biganəlik əmələ gəlib. Ancaq siz əmin ola bilərsiniz ki, biz bunlara da son qoymuşuq" [IIc.s.471].

Azərbaycanın iqtisadiyyatının yüksəlməsi, ölkə vətəndaşlarının rifahının artması naminə bağlanan neft-qaz müqavilələrindən irəli gələn göstəricilər Heydər Əliyevin nitqində çox rəvan və səlisliklə işlənir. 14 yanvar 1997-ci ildə Parisdə Fransa Ticarət-sənaye Palatasında keçirilən görüşdəki kimi: "Son iki ildə Azərbaycan ***11*** ölkəni təmsil edən transmilli şir-

kətlərlə, cəmi ***16*** şirkətdə beş iri neft müqaviləsi imzalamışdır. Bu müqavilələr üzrə investisiyaların ümumi məbləği ***15 milyard*** dollardan artıqdır. Bu müqavilələr təxminən ***25-30 il*** müddətinə imzalanmışdır. Lakin mən əminəm ki, əməli iş onları daha uzun müddətli müqavilələrə çevirəcəkdir. Belə düşünürəm ki, bütün XXI əsr Azərbaycan iqtisadiyyatının, ən əvvəl neft və qaz sənayesinin coşqun inkişafı əsri olacaqdır" [VIIIc.s.261].

Saylar auditoriyaya keçmiş dövrləri xatırlatmaq baxımından da böyük natiqin nitqlərində mühüm yer tutur. Keçmişi bu günlə əlaqələndirmək, rəqəmlərin köməyi ilə müqayisələr aparmaq, məntiqi nəticələrə gəlmək Heydər Əliyevin nitqlərinə xasdır: "***Xatirimdədir***, biz üzümçülüyü inkişaf etdirən illərdə orada bir ildə 120 min ton üzüm istehsal olunurdu. Orada nə qədər emal zavodları yarandı, nə qədər böyük-böyük binalar tikildi...

Bir Füzuli deyil, burada Cəbrayıl haqqında da danışdılar. ***Xatirimdədir***, Cəbrayıl rayonu pambıq əkirdi, hər il də mən oranın rəhbərlərini tənqid edirdim ki, onlar ***2 min*** tondan artıq pambıq yığa bilmirlər. Sonra biz müayinə apardıq və müəyyən etdik ki, orada çox böyük üzüm bağları salmaq olar. Üzüm bağları saldıq və burada deyildiyi kimi bir neçə ildən sonra rayonda ***50 min ton*** üzüm istehsal olundu. İnsanlar nə qədər zənginləşdi" [VIIc.s.279-280].

Rəqəmlərin dili ilə keçmişə səyahət etmək, auditoriyanı keçmiş tarixə aparmaq Heydər Əliyevin nitqində mühümdür: "***Xatirimdədir***, mən Moskvada Nazirlər Soveti sədrinin birinci müavini işləyərkən bir neçə sahəyə rəhbərlik edirdim. O zaman ***çoxlu*** daş kömür, ildə ***620 milyon*** ton neft çıxarılırdı" [IIc.s.166]. "Çoxlu" qeyri-müəyyən, "620 milyon" müəyyən və "birinci" sıra sayları harmonik şəkildə verilmişdir.

Böyük natiqin dilində saylar tarixi hadisələr və bu hadisələrlə bağlı məsələlərə aydınlıq gətirir: "***1941-45-ci*** illər mü-

haribəsi zamanı fəhlələrə adambaşına gündə ***600 qram***, qulluqçulara ***500 qram*** qara çörək verirdilər. Uşaqların, işləməyən qadınların və başqalarının isə çörək norması ***400 qram*** idi. Adamlar dörd il bu vəziyyətə dözərək yaşadılar" [IIc.s.167].

Ölkələrin mövcud coğrafi göstəricilərini auditoriyalarda səsləndirməklə Heydər Əliyev həmin auditoriyaların rəğbətini qazanır: "Çünki görün, belə bir qüdrətli imperatorluğun üzərində qurulmuş, bundan sonra ***74 il*** yaşayan, böyük bir qüdrətə malik olan ölkə – yenə də dostum Süleyman Dəmirəlin dediyi rəqəmləri xatırlayıram – əhalisinin sayına görə Türkiyə dünyada ***16-cı*** yeri tutur, ərazisinə görə dünyada ***32-ci*** yeri tutur. Bilirsiniz, bu, böyük bir dövlətdir. Əhalisi ***65 milyondur***" [XIIIc.s.56].

Polemik tipli çıxışlarda rəqəmlərin dili ilə danışan böyük natiq fenomenal yaddaşı ilə qarşı tərəfi səfərbər edir: "Bunlar hamısı mənim yadımdadır ki, ***2 milyard*** kubmetr qaz alınmalı idi. O, vaxt ***1994-1995-ci*** illərdə siz bunu mənə deyəndə biz bunsuz ***6 milyard*** kubmetr qaz çıxardırdıq. İndi nə təhər oldu ki, bu ***2 milyard*** kubmetr artan kimi, siz başqa sahələrdə qazı ***2 milyard*** kubmetr az aldınız" [XIIIc.s.429].

Müxtəlif üslublu çıxışlarda Heydər Əliyevin nitqində rəqəmlər özünəməxsus tərzdə səslənir. Əliağa Vahidin ***100 illik*** yubileyində olduğu kimi: "İnsanın xoşbəxtliyi nədir? Xoşbəxtlik təkcə o demək deyil ki, o necə yaşayıb. Xoşbəxtlik odur ki, insan ***70*** yaşında vəfat edib, amma ***30 il*** də ondan sonra yaşayır. Özü də necə yaşayır! O, xalqına necə gözəl xidmət edib. Xalqını bu ağır vəziyyətdən çıxarmaq üçün görün nə qədər gözəl töhfələr irs qoyub gedib..." [VIIc.s.259].

Say nitq hissəsi Azərbaycanın görkəmli şairlərinin yubileyləri ilə bağlı keçirilən tədbirlərdə səslənir. Müəyyən miqdar sayları müxtəlif dövrlərdə yaşamış Azərbaycan poeziyasının yaradıcılarını sadalamaqda böyük natiqin dilində mühüm yer tutur: "Məhəmməd Füzulinin ***500 illik*** yubileyi bir çox dost

ölkələrin nümayəndələrini Azərbaycana topladı. Biz Azərbaycanda böyük Nizaminin ***800 illik*** yubileyini də qeyd etmişik. Nizaminin ***840 illik*** və ***850 illik*** yubileyləri də qeyd olunubdur. Böyük Azərbaycan şairi Nəsiminin ***600 illik*** yubileyini də qeyd etmişik. Deyə bilərəm ki Məhəmməd Füzulinin ***500 illik*** yubileyi Azərbaycanın böyük şəxsiyyətlərinin indiyə qədər keçirilmiş bütün yubiley mərasimlərindən öz məzmununa, mənasına görə və tədbirlərin əhatəliliyinə görə hamısından yüksəyə qalxmışdır" [VIIIc.s.32].

Həmişəki kimi rəqəmlərə keçməzdən öncə Heydər Əliyev auditoriyaları bu rəqəmlərin dinlənilməsinə hazırlayır. 9 may qələbə günündə II Dünya müharibəsinin dəhşətlərini yada salır, müharibənin insanlara gətirdiyi bəlalardan danışır və sonda bu fikirlər rəqəmlərlə, necə deyərlər, yaddaşlarda möhkəmlənir: "İkinci dünya müharibəsi çox dəhşətli bir müharibə – motorlar, tanklar, təyyarələr, böyük toplar, raketlər müharibəsi olubdur. Nə qədər insan tələf olubdur. Bu müharibədə tələf olanların sayını indi dəqiqləşdirirlər. Keçmiş illərdə belə bir rəqəm məlum idi ki, bu müharibədə Sovet İttifaqından ***20 milyon*** adam tələf olub. İndi isə məlumat verirlər ki, bu rəqəm ***27 milyon*** olub. Amma bəzi tarixçilər, tədqiqatçılar deyirlər ki, tələf olanların sayı bundan da çoxdur. Hər halda ***20 milyon*** da çoxdur, ***27 milyon*** da dəhşətli bir rəqəmdir" [VIc.s.266].

Bəzi saylar söz yaradıcılığında çox məhsuldardır ki, bunların arasında "bir" sayının xüsusi rolu var. S.Həsənova[1] "bir" sözü ilə bağlı yazır: "Saylar içərisində "bir" sözünün üslub rəngi digərlərindən xeyli tünddür. Professor Ə.Dəmirçizadə "bir" sözünün on beş ədəd üslub çalarlığını qeyd etmişdir. Üslub rənginə boyananda "bir" sözü çox zaman say olmaq keyfiyyətini itirir, tamamilə yeni keyfiyyətlər qazanır və hətta digər nitq hissələrinin funksiyasını da yerinə yetirir". "Bir"

[1] Həsənova S. "Nitq mədəniyyəti və üslubiyyat", Bakı, 2005. 192 səh.

müəyyən sayı müstəqillik ideyaları ilə bağlı Heydər Əliyevin nitqində bütövlüyə, monolit birliyə, tama işarədir: "Ona görə indi ən ümdə vəzifəmiz, ən şərəfli borcumuz hüquqi, dünyəvi, demokratik dövləti yaratmaqdır.

Bu işdə hamımız çalışmalıyıq, ***bir olmalıyıq***. Siyasi dünyabaxışından asılı olmayaraq – kim hansı partiyaya mənsubdur, hansı siyasi dünyabaxışı var – bundan asılı olmayaraq, bu məqsəddə biz hamımız ***bir olmalıyıq***" [XIIIc.s.114].

Azərbaycan dilində "bir" miqdar sayından söz yaradıcılığında – söz yaratmaq işində geniş istifadə olunur. "Bir" sözü təklikdə bir neçə mənaya malik olduğu kimi, müxtəlif şəkilçilər və sözlərlə birlikdə müxtəlif mənalı ayrı-ayrı nitq hissələrinin əmələ gətirilməsində də əsas amil kimi özünü göstərir. Sözyaratmada "bir" sayının rolunu nəzərə alıb Heydər Əliyevin nitqlərində bu məsələni aydınlaşdırmaq qərarına gəldik. Məsələn, Respublika Günü münasibətilə etdiyi çıxışda "bir" sayı ədat kimi işlənir: "Bu, xalqımızın tarixində əlamətdar ***bir*** hadisədir və tarixi əhəmiyyət kəsb edir" [Xc.s.5].

Sonra "bir" sayı qüvvətləndirici ədat olaraq sifətlə isim arasında təyinlik dərəcəsini artırır: "Ancaq onlar (Azərbaycan Demokratik Respublikası hökumətinin üzvləri – red.) öz üzərlərinə düşən tarixi missiyanı yerinə yetirmişlər və Azərbaycan xalqının tarixinə parlaq ***bir*** səhifə yazmışlar" [Xc.s.7]. "Bir" sayının frazeoloji birləşmə yaradıcılığındakı rolundan dilçi alimlərimiz bəhs etmişlər.[1,2] Elə buradaca "bir səhifə yazmaq" frazeologizmi böyük natiqin "bir" sayından böyük ustalıqla istifadə etməsini diqqətə çatdırır.

---

[1] Tağıyeva E.İ. Müasir Azərbaycan dilində frazeologizmlərin formalaşmasında "bir" sayının rolu və mövqeyi // Bakı Universitetinin Xəbərləri, Bakı, 2011. №3, səh. 28-35.

[2] Xəlilov R.Y. Saylar. Bakı, Azərnəşr, 1978. 278 səh.

Ədəbi dilimizdə çox işlədilən işarə əvəzlikləri "bir" sayı ilə birgə işlədilir. Heydər Əliyevin nitqində də "elə bir", "belə bir" ifadələri işarə əvəzliyi timsalında nitqdə istifadə olunur: "Xalqımıza dəyən ən böyük zərbə 1988-ci ildən Ermənistan tərəfindən Azərbaycana qarşı başlamış təcavüzdür. Azərbaycanın dövlət müstəqilliyinin əldə olunması və inkişaf etməsi prosesi ***belə bir*** şəraitdə gedib və indi də gedir" [Xc.s.13].

"Bir" sözü müasir Azərbaycan dilində olduğu kimi, XIII-XIV əsrlər anadilli abidələrin dilində də konkret kəmiyyəti bildirməklə yanaşı, qeyri-müəyyənlik anlayışını da ifadə etmişdir.[1]

Saylardan sözyaratmada istifadə Heydər Əliyevin də nitqlərində özünü aşkar büruzə verir: "Xalqımızın birliyini, dostluğunu təmin edən amillərdən ***biri*** də odur ki, bizim adət-ənənələrimiz ***birdir***, mənəvi dəyərlərimiz ***bir-birinə*** bənzərdir. Biz ***bir*** dinə mənsubuq" [XIIIc.s.146].

"Bir" sayından başqa digər saylar da Heydər Əliyevin nitqində söz yaradıcılığı prosesində tez-tez təsadüf olunur: "Bu məqsədlə Azərbaycan Respublikası dünyanın bütün ölkələri ilə ***ikitərəfli***, qarşılıqlı surətdə faydalı əlaqələr qurur" [VIIc.s.55].

Böyük natiqin dilində "bir" sayı ilə sözdüzəltməyə çox yer verilir. Bu zaman nitqin əlvanlığı həddindən çox yüksəlir. Auditoriya heç bir yorğunluq hiss etmir: "Sözü ona gətirirəm ki, Naxçıvan Muxtar Respublikasında da sosial problemlər var, ***70 minə*** qədər işsiz var. ***Bir*** zavod işləmir. ***Bir*** fabrik işləmir. ***Heç bir*** tikinti getmir. Niyə? Çünki dəmir yolu bağlıdır, avtomobil yolu bağlı, təyyarə ilə nə daş gətirmək olar, nə sement, nə taxta, nə də dəmir. Heç ***bir şey*** gətirmək mümkün deyil. Sadəcə olaraq orada insanların yaşamasını təmin etmək haqqında söhbət gedir" [Ic.s.79].

---

[1] Mirzəzadə H. Azərbaycan dilinin tarixi qrammatikası. Bakı, Azərbaycan Universiteti nəşriyyatı, 1990

Bölüşdürmə bağlayıcıları, ritorik sual, "bir" sayından düzələn ifadələr kompleks şəklidə bu kiçik, lakin xəlqiliyə – "sözü ona gətirərəm ki..." – gətirib çıxaran parça mükəmməl nitq ustalığından xəbər verir.

Saylar arasında Azərbaycan dilində ən çox sözyaratma funksiyası "bir" sayının payına düşür ki, böyük natiq "bir" sayı ilə formalaşan sözləri yerli-yerində səlis şəkildə işlədir: "Mən, ***bir*** dövlət başçısı kimi, ***hər bir*** partiyanın tam sərbəst, azad, müstəqil fəaliyyət göstərməsinin təminatçısıyam" [XIIIc.s.278].

"Ancaq bizim Konstitusiyamız, qanunlarımız ***hər bir*** siyasi partiyanın, ***hər bir*** siyasi qurumun, ***hər bir*** təşkilatın Azərbaycanın qanunları çərçivəsində fəaliyyət göstərməsini tələb edir" [XIIIc.s.278].

"Ona görə də artıq bunlara son qoyduğumuz üçün bundan sonra ***heç bir*** təşkilata, ***heç bir*** partiyaya ***heç bir*** silahlı dəstə saxlamağa imkan verə bilmərik" [XIIIc.s.281].

"Yeni Azərbaycan Partiyası sizin üçün, mənim üçün doğma bir partiyadır. Mən çıxışımın əvvəlində bu partiyanın yaranması prosesini ona görə ***bir daha*** yada saldım ki, hamı bilsin, bu partiyaya hər kəs könlü, vicdanı, qəlbi ilə gəlməlidir. Hamı bilsin ki, bu partiya saflıq, saf mənəviyyat üzərində qurulmuş ***bir partiyadır***" [XIIIc.s.291].

"Biz bu mövqelərdə möhkəm dayanmış və heç zaman, ***heç bir*** halda ***bir daha*** yol verməyəcəyik ki, suverenliyimiz pozulsun" [XIIc.s.46].

Azərbaycanın müstəqillik dövründən sonra atdığı uğurlu addımlar "***bir çox***" ifadəsi ilə öz təsdiqini tapır: "Azərbaycanın ***bir çox*** ölkələrdə səfirlikləri var və bir çox ölkələrin də səfirlikləri Azərbaycanda normal fəaliyyət göstərir. Azərbaycanın ***bir çox*** ölkələrdə qarşılıqlı surətdə faydalı əlaqələri var, dövlətlərarası, hökumətlərarası müqavilələri, sazişləri var" [Xc.s.17].

Ümumiyyətlə, Azərbaycanın beynəlxalq miqyasda uğurlarının nəzərə çarpdırılması məqamlarında "bir çox" ifadəsi nitqdə yerli-yerində işlədilir: "Dünyanın ***bir çox*** ölkələrində, dövlət dairələrində, dünyanın cürbəcür tədqiqat mərkəzlərində, mətbuat mərkəzlərində Azərbaycan haqqında dolğun, düzgün fikir formalaşır və formalaşmaqdadır... İndi artıq təkcə özümüzdə yox, dünyanın ***bir çox*** mötəbər siyasi mərkəzlərində, mətbuat mərkəzlərində Azərbaycanın öz dövlət müstəqilliyini nə qədər cəsarətlə qoruması xüsusi qeyd olunur" [Xc.s.18].

"Bir çox" ifadəsi qeyri-müəyyən say kimi Heydər Əliyevin çıxışlarında müxtəlif situasiyalarda səslənir. Neqativ halların mövcudluğu bu ifadə ilə auditoriyalara yol açır: "Ayrı-ayrı qruplara, siyasi partiyalara, ayrı-ayrı şəxslərə mənsub olan ***bir çox*** silahlı dəstələr Azərbaycanda daxili sabitliyi daim pozur, dövlətçiliyimizə qarşı hərəkətlər edir, öz şəxsi mənafeləri naminə Azərbaycan vətəndaşlarına çox böyük zülmlər edir" [Xc.s.15].

Böyük natiqin nitqlərində tez-tez səslənən "bir çox" ifadəsi ardıcıl cümlələrdə təkraralanaraq sadalanan məsələləri auditoriya üçün yaddaqalan edir: "Bilirsiniz ki, biz Azərbaycana xarici investisiya gətirilməsi sahəsində ***bir çox*** işlər görmüşük. İndi Azərbaycanda, Bakıda dünyanın bir çox şirkətlərinin ofisləri açılıbdır, hər gün də açılır. ***Bir çox*** şirkətlər artıq burada fəaliyyətdədirlər, ***bir çox*** şirkətlər də respublikamızda fəaliyyət göstərmək üçün bizə müraciət edirlər" [Xc.s.27].

"Bir" sözü "çox", "az", "xeyli" sözləri ilə işlənərək qeyri-müəyyənlik məzmununu daha da artırır[1]: "Azərbaycan Demokratik Respublikası ***bir çox*** dəyərli işlər görmüş və Azərbaycanı bir müstəqil demokratik respublika kimi yaşatmağa çalışmışdır" [Xc.s.6].

---

[1] Hüseynzadə M. Müasir Azərbaycan dili (morfologiya). Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

“Bir çox” ifadəsi ölkənin həyatındakı neqativ hallara da işarədir: “Bilirsiniz ki, Milli Ordunun yaranması da böyük təxribatlarla, böyük bəlalarla rastlaşmışdır. Məhz buna görə də Azərbaycan xalqı ***bir çox*** məğlubiyyətlərə uğramış və Azərbaycan torpaqlarının ***bir qismi*** işğal olunmuşdur” [Xc.s.23].

Yuxarıdakı cümlədə qeyri-müəyyənliyi artıran “bir çox” ifadəsi qeyri-müəyyən kəmiyyət bildirən “bir qisim” ifadəsi ilə uzlaşır.

“Bir qisim” ifadəsi büdcə, gəlirlər, əhalinin əmək haqqısı kimi anlayışlarla birgə işlənir: “Bu ilin dörd ayında da dövlət büdcəsi yerinə yetirilib və əminəm ki, cari ilin birinci yarısının yekunlarına görə biz dövlət büdcəsinin yerinə yetirilməsi ilə əlaqədar müəyyən müsbət nəticələr əldə edəcəyik və bunlar da əhalinin ***bir qisminin*** əmək haqqının artırılması və ümumiyyətlə əhalimizin rifahının yaxşılaşması üçün yeni qərarlar qəbul edilməsinə imkan verəcəkdir, şərait yaradacaqdır” [Xc.s.26].

“Bir” sayı Heydər Əliyevin nitqində “daha” sözü ilə birləşərək qüvvətləndiricilik xassəsi qazanır: “Bu gün – bu bayram günü biz Azərbaycanda ilk demokratik respblikanın qurulmasında, yaranmasında göstərdiyi xidmətlərə görə Məmmədəmin Rəsulzadəyə, Əlimərdan bəy Topçubaşova, Fətəlixan Xoyskiyə, onların silahdaşlarına ***bir daha*** öz minnətdarlığımızı, təşəkkürümüzü bildiririk” [Xc.s.7].

“Bir daha” ifadəsi qüvvətləndirici ədat kimi işlənərək həmin çıxışda nəyi bilməliyik sulaına cavab verir: “Bəli, həmin bu 70 il müddətində bizim xalqımızın böyük itkiləri olubdur. Biz bunları bilməliyik, gələcək nəsillər də bunları bilməlidirlər. Bilməliyik və gələcək nəsillər də bilməlidirlər ki, Azərbaycana qarşı ***bir daha*** belə xəyanətlərin, tədbirlərin, belə təcavüzlərin qarşısı alına bilsin” [Xc.s.11].

Nitqin sonluqlarında “bir daha” ədatı yenidən səslənir, auditoriya toplaşmağın səbəbini yaddaşında təzələyir. “Bir

daha" ədatı nitq sonluqlarını yaddaqalan edərək, dinləyiciləri nitq finalına səsləyir: "Hörmətli dostlar!

Mən bu böyük bayram münasibətilə sizi ***bir daha*** təbrik edirəm. Siz də, biz də bu gün bütün bayram təbriklərimizi birinci növbədə, Azərbaycan torpaqlarının müdafiəsi uğrunda şəhid olmuş insanların ailələrinə göndəririk. Bu gün – bu bayram günü (Respublika Günü – red.) mən ***bir daha*** bəyan edirəm ki, Vətən, torpaq uğrunda canlarını qurban vermiş, şəhid olmuş insanların xatirəsi bizim qəlbimizdə daim yaşayacaqdır" [Xc.s.28].

Qüvvətləndirici ədat kimi "bir" sayı böyük natiqin dilində tez-tez səslənir: "1949-cu ildə Azərbaycan neftçiləri, alimləri Xəzər dənizində ilk dəfə Neft Daşları kimi ***böyük bir*** neft yatağını açaraq dənizin dibindən neft çıxarılmasının əsasını qoymuşlar" [Xc.s.12].

"Bir" sayının "daha" ədatına qoşulub "bir daha" qüvvətləndirici ədatı yaradaraq təkrarlanması Heydər Əliyevin nitqlərində tez-tez – təsadüf edir. Belə təkrarlar nitqi şüurlara həkk etdirmək baxımından əvəzsizdir: "İndi, artıq dörd il keçəndən sonra biz hamımız ***bir daha, bir daha*** o illəri, o ayları, o günləri xatırlamalıyıq və Azərbaycanın 1993-cü ilin may-iyun aylarında və sonrakı aylarda nə qədər təhlükəli vəziyyətdə olduğunu dərk etməliyik, ondan sonra görülən işlərə ədalətli, obyektiv qiymət verməliyik" [Xc.s.14].

"Bir" və "daha" qüvvətləndirici ədatlarının Heydər Əliyevin nitqində birgə işlənməsinin şahidi oluruq. Böyük natiqin ciddi önəm verdiyi məsələlərdə "bir daha" ədatı təkrarlanaraq mahiyyəti dinləyicilərin diqqətinə çatdırır: "Bunlar hamısı ***bir daha, bir daha*** təsdiq edir ki, Azərbaycan müstəqil dövlət, demokratik, hüquqi, dünyəvi dövlət kimi yaşayır, Azərbaycanın dövlət müstəqilliyi, Azərbaycanda demokratik prinsiplər dönməzdir, dəyişməzdir və sarsılmazdır" [Xc.s.16].

"Bir daha" ədatı sənaye və kənd təsərrüfatında, eləcə də torpaqların xalqın istifadəsinə verilməsi kimi ciddi məsələlərdə öz işlənmə yerini tapır: "Bu gün ***bir daha*** qeyd etmək lazımdır ki, "Torpaq islahatı haqqında" qəbul etdiyimiz qanun nə qədər cəsarətli qanundursa, o qədər də əhəmiyyətli qanundur" [Xc.s.26].

"Heç bir" inkar əvəzliyinin də bir sayından formalaşmasını qeyd etsək bu əvəzlik də Heydər Əliyevin nitqində geniş işlənir: "Mən bu gün böyük iftixar hissi ilə deyə bilərəm ki, dövlət təhlükəsizliyi orqanlarında rəhbər vəzifələrdə işlədiyim zaman, bu orqanın başçısı olduğum zaman Azərbaycan xalqının milli mənafeyinə əks olan ***heç bir*** tədbir görülməmişdi. Biz ***heç bir*** dissident həbs etməmişdik, ***heç bir*** zaman, ***heç bir*** adamı antisovet təbliğat, yaxud millətçi təbliğat üstündə həbs etməmişik" [Xc.s.342].

Heydər Əliyevin nitqində "bir hissə" ifadəsi tamın qeyrimüəyyən ya böyük, ya da kiçik hissəsini göstərmək üçün işlənir: "Azərbaycan xalqı 70 il sovet sosialist sistemi rejimində yaşamışdır. Bu, XX əsrdə bizim xalqımızın həyatının böyük ***bir hissəsidir***" [Xc.s.8].

"Bir" sayı Heydər Əliyevin nitqində əksər hallarda tərəf sözünün əvvəlində işlənərək bölgü məzmunu yaradır.[1] "Əgər dünyanın üç böyük dövləti Minsk qrupunun həmsədrlik məsuliyyətini öz üzərinə götürübsə, demək, bu, ***bir tərəfdən***, dünya ictimaiyyəti tərəfindən, həmin böyük dövlətlər tərəfindən həmin məsələyə böyük qayğının, diqqətin təzahürüdür və ikinci tərəfdən də bu məsələnin sülh yolu ilə həll edilməsi üçün yaranan ***yaxşı bir şərtdir***" [Xc.s.20].

"Yaxşı bir şərtdir" ifadəsində "bir" sayı ədat qismində işlənir. Heydər Əliyevin nitqlərində "bir tərəfdən" ifadəsi müx-

---

[1] Hüseynzadə M. Müasir Azərbaycan dili (morfologiya). Bakı, "Şərq-Qərb", 2007. səh.88

təlif məqamlarda, müxtəlif auditoriyalarda işlənir: "Azərbaycanda ***bir tərəfdən*** ordumuzun peşəkarlığını artırmaq, ikinci tərəfdən də Azərbaycan gənclərini orduda xidmətə hazırlamaq lazımdır" [Xc.s.24].

Klassiklərin əsərlərində say nitq hissəsini araşdıran müəllif fikirlərinin Heydər Əliyev nitqləri ilə uzlaşdırılması çox maraqlıdır. Dil varisliyi baxımından "bir" miqdar sayının Nəsimi əsərlərindəki yeri mühümdür:

***Bir*** əcayib dilbərə düşdü könül,
***Bir*** əli yetməz yarə düşdü könül.

Yaxud

Ol jalə ki, düşdü gül rüxsarımız üzrə,
***Bir*** qətrə yağış damdımı min lalə tər oldu.[1]

Məlum oldu ki, "bir" sayı Heydər Əliyevin nitqində də məhsuldar sözyaratma funksiyası daşıyır: "Ancaq eyni zamanda mən bu gün onu da ***bir daha*** bəyan etmək istəyirəm ki, heç vaxt, ***heç bir*** zaman Azərbaycan torpaqlarının ***bir*** qarışı belə ***başqa bir*** ölkənin əlində ola bilməz" [Xc.s.23].

Bu cümlədə "bir" və "daha" ədatının birləşib fikri qüvvətləndirməsinin, "heç bir" inkar əvəzliyi ilə Azərbaycan dövlətinin prinsipial mövqe nümayiş etdirməsinin, "ola bilməz" qətiyyətli ifadəsinin formalaşmasında "bir qarış" və "başqa bir ölkə"ifadələrindən uğurla istifadə olunmasının şahidi oluruq.

"Bir" sayı "hər" sözü ilə birləşib "hər bir" təyin əvəzliyi formalaşdırır ki, bu əvəzlik də Heydər Əliyevin nitqlərində mühüm yer tutur: "***Hər bir*** Azərbaycan vətəndaşı bərabər hü-

---

[1] Əlizadə Afina. Nəsimi əsərlərində kəmiyyət bildirən söz və ifadələr // AMEA-nın humanitar və ictimai elmlər seriyası, 2002. №1-2, s.117-126.

quqlara malikdir və öz hüquqlarından istədiyi kimi istifadə etmək imkanına malikdir" [Xc.s.16].

"Bir" sayının işləndiyi "hər bir" təyin əvəzliyi böyük natiqin nitqlərində "bir daha" ədatı ilə harmonik şəkildə istifadə olunur: "***Bir daha*** deyirəm, ***hər bir*** gənc, ***hər bir*** ata-ana, ***hər bir*** valideyn öz oğlunu böyüdərkən ona ən əvvəl nəsihət verməlidir ki, sənin birinci borcun orduda xidmət etməkdir, vətəni müdafiə etməyə hazır olmaqdır, döyüş qabiliyyəti əldə etməkdir və döyüşə hazır olmaqdır" [Xc.s.24].

"Belə" işarə əvəzliyi və "bir" ədatından əmələ gələn "belə bir" ifadəsi ilə Heydər Əliyev dinləyicilərin diqqətini müəyyən məsələyə yönəldir: "Məhz ***belə bir*** dövlət, yəni öz vəziyyətini idarə edən, sabit saxlaya bilən ***bir dövlət*** başqa dövlətlərlə qarşılıqlı surətdə faydalı əlaqələr yarada və bundan faydalana bilər" [Xc.s.17].

"Yəni" aydınlaşdırma sözünün köməyi ilə böyük natiqin izahedici nitqi burada da auditoriyanı düşündürə bilir**.**

"Bir" sayı sıra sayı ilə isim arasında ədat rolunda işlənərək situasiyaları auditoriyanın nəzərində canlandırır: "1995-ci ilin martında yenə də, ***ikinci bir*** silahlı çevriliş cəhdinin qarşısı alındı. O qüvvələr zərərsizləşdirildi, ***bir hissəsi*** xarici ölkələrə qaçıb səpələndi" [Xc.s.15].

İkinci cümlədəki "bir hissəsi" ifadəsi bölgü bildirən qeyri-müəyyən say kimi işlədilir.

Heydər Əliyev çıxışlarında "belə bir" ifadəsi ilə fərqli situasiyalara işarə vurur: "İndi Azərbaycanda əmin-amanlıq, rahatlıq şəraiti yaranıbdır. ***Belə bir*** şəraitdə bu illərdə respublikamızda müstəqillik prinsipləri əsasında dövlət quruculuğu prosesi ardıcıl surətdə həyata keçirilir" [Xc.s.16].

Beləliklə, Heydər Əliyevin nitqində say nitq hissəsi mahiyyətin rəqəmlərin dili ilə dinləyicilərə açıqlanmasında, nitqin ekspressivliyini yüksəltməkdə mühüm rol oynayır.

Bu mühüm rol bir sıra məqamlarla şərtlənir:

− Saylar Heydər Əliyevin elmi üslublu çıxışlarında, iqtisadiyyat və kənd təsərüffatı ilə əlaqədar müşavirələrdə tez-tez səslənir;

− Heydər Əliyevin nitqində saylar tarixi həqiqətlərin xalqa çatdırılmasında mühümdür;

− Heydər Əliyevin saylarla bağlı nitqlərinin bir xüsusiyyəti də ondan ibarətdir ki, auditoriya rəqəmlərin dinlənilməsinə hazırlanır;

− Rəqəmlərin sadalanmasından öncə auditoriyalara yönələn ritorik suallar tez-tez işlənir. Saylar bu suallara verilən cavablar kimi ortaya çıxır;

− Qeyri-müəyyən saylar içərisində böyük natiqin nitqində "çox", "çoxlu", "artıq", "az" daha çox işlədilir. Bu qeyri-müəyyən saylardan Heydər Əliyevin nitqində söz yaradıcılığında geniş istifadə olunur;

− "Bir" sayı Heydər Əliyevin nitqində məhsuldar sözyaratma funksiyası daşıyır;

− Sıra sayları Heydər Əliyevin nitqlərində XX əsri və bu əsrdə yaşayıb-yaratmış böyük azərbaycanlıların həyat və fəaliyyətlərini əks etdirmək baxımından mühümdür;

− Saylar böyük natiqin çıxış və nitqlərində digər əsas və köməkçi nitq hissələri ilə dərin, dialektik vəhdətdədir.

## 1.2. Heydər Əliyevin nitqində əvəzliklər

Heydər Əliyevin nitqlərinin dərindən araşdırılması əvəzlik nitq hissəsinin onun nitq və çıxışlarının məna tutumunun yüksəlməsindəki böyük rolunu üzə çıxarır.

Müxtəlif nitq məqamlarında auditoriyaların fəthində əvəzliklər də ekspressivlik xüsusiyyətləri daşıyır. Araşdırmalar hansı növ, eləcə də hansı quruluşlu əvəzliklərin böyük natiqin nitqində çox işlənməsini, ictimai-siyasi məsələlərin həllindən asılı olaraq əvəzliklərin Heydər Əliyevin nitqində yerli-yerində əks olunmasını göstərmişdir.

Əvəzliklərin böyük natiqin nitqində üslubiyyat yaratması məsələlərini tədqiq etməzdən öncə bu barədə "Heydər Əliyevin nitqində əvəzlik" fəslində yararlandığımız müəlliflərə[1,2] minnətdarlıq edirik.

Birinci şəxsin təki olan "mən" əvəzliyi Heydər Əliyevin nitqində ölkənin birinci şəxsinin sözü təkin səslənir. "Mən" müəyyən şəxs əvəzliyini eşidən auditoriya səfərbər olunur. Xalqın mandat verdiyi prezidentin dilində "mən" əvəzliyi təminat rolunda çıxış edir: "Hərbi komissarlıqların işi bu gün də qeyri-qənaətbəxşdir. Orada hərc-mərclik davam edir. ***Mən*** bunu müdafiə nazirinə dəfələrlə demişəm və bu gün də sizin hüzurunuzda deyirəm. Orduya gedən ancaq yoxsulların uşaqlarıdır. Varlıların uşaqları orduya getmirlər. Nə üçün? Nəhayət, ***mənə*** siyahı veriblər. ***Mən*** onu burada elan etmək istəmirəm, lakin hərbi komissarlığa, prokurorluğa, başqa inzibati orqanlara verəcəyəm. ***Mən*** icra hakimiyyəti başçılarından, hərbi komissarlardan, polis rəislərindən, prokurorlardan, bu işlərlə məşğul olan nazirlərdən tələb edirəm ki, ordu sıralarını komp-

---

[1] Əliyeva Sitarə. İşarə əvəzliklərinin üslubi xüsusiyyətləri // AMEA-nın xəbərləri. Humanitar elmlər seriyası, 2006. №2-4, səh.181-186.

Şahbazova Z.Ə. Şəxs əvəzliklərinin söz birləşməsi və sadə cümlələri vəzifələri. Bakı Universitetinin xəbərləri. 2006, №2 səh 91-101.

[2] Həsənova S. "Nitq mədəniyyəti və üslubiyyat". Bakı, 2005. 192 s.

lektləşdirmək üçün verilən tapşırıqları qısa müddət ərzində yerinə yetirsinlər" [IIc.s.37].

Əgər "mən" müəyyən şəxs əvəzliyi ölkənin birinci şəxsinin dilində ciddi məqamlarda işlənirsə, "biz" birinci şəxsin cəmi isə xalqla birgə fəaliyyət, birgə çalışmaq məqamında işlənir: "***Biz*** müstəqil dövlətik. ***Bizim*** güclü ordumuz olmalıdır. Güclü ordu ona görə lazımdır ki, ***biz*** sülh danışıqlarını cəsarətlə apara bilək. ***Bizim*** qüdrətli, möhkəm ordumuz olmalıdır, ona görə ki, müstəqil Azərbaycan dövləti daim qüdrətli olsun. O müqəddəs yerlərdə mənim Allahdan arzum bu olub ki, müstəqil Azərbaycan dövlətinin qüdrətini daha da artırsın (Yerdən səslər: Amin). ***Biz*** bu işə bütün səylərimizi qoymuşuq və qoyacağıq. Ancaq ***bizə*** ilahinin gücü lazımdır. Güman edirəm ki, ***bizdə*** bu güc olacaqdır. Allah ordumuzu gücləndirsin, onun qüdrətini artırsın (Yerdən səslər: Amin)" [IIc.s.84].

"Biz" müəyyən şəxs əvəzliyi hallanarkən həm isimlərdən, həm də digər şəxs əvəzliklərindən fərqli olaraq yiyəlik halda – ***im*** şəkilçisi qəbul edir.

"Bizim" şəxs əvəzliyi müxtəlif auditoriyalarda nəyisə müəyyən etməkdə böyük natiq tərəfdən yüksək nitq ustalığı ilə işlədilir, problemlərin çözülməsində auditoriyaları inandırmaq gücündə olur. Türk dünyası yazıçılarının III qurultayındakı nitq "bizim" müəyyən şəxs əvəzliyi ilə zəngindir. Məhz "bizim" şəxs əvəzliyi Türk dünyasına aid məsələləri, problemləri, onların gələcəkdə aradan qaldırılması yollarını müəyyən edir: "Bunlar ***bizim*** keçmiş uzaq tariximizdir. XX əsr dünya tarixində çox mürəkkəb, ziddiyyətli, gərgin proseslər dövrü olmuşdur. ***Bizim*** əksəriyyətimiz, demək olar hamımız bu əsrdə doğulmuşuq və artıq bu əsri başa çatdırırıq. Xalqlarımızın – türkdilli xalqların, ölkələrin mədəniyyəti, ədəbiyytaı XX əsrdə ziddiyyətli, eyni zamanda çox şərəfli və müvəffəqiyyətli yol keçmişdir. Beləliklə, milli mədəniyyətimizin, ədəbiyyatımızın inkişafının qarşısını almaq cəhdləri nə qədər çox olmuş-

dursa da, milli ədəbiyyatımızda, mənəviyyatımızda, mədəniyyətimizdə olan bir o qədər, bəlkə ondan da çox olan güclər özünə cürbəcür yollar açmış və ümumbəşəri dəyərlərdən istifadə edərək daha da yüksək səviyyələrə çatmışdır. Bunu ***bizim*** türkdilli xalqların, türk dünyasına mənsub olan ölkələrin XX əsr ədəbiyyatında, mədəniyyətində yaranmış əsərlərdə çox açıq-aydın görmək olar. ***Bizim*** hamımız bu əsərlərlə fəxr edirik" [VIIIc.s.6-8].

Sonrakı nitq mərhələsində "bizim" müəyyən şəxs əvəzliyi türkdilli xalqların qurultaylarının gələcəkdə nə etməli olduğunu müəyyən edir: "***Bizim*** bu təşkilatın, görüşlərin əsas mənası, məqsədi aydındır. ***Biz*** birinci növbədə ölkələrimiz arasında olan iqtisadi əməkdaşlığı genişləndirməyə çalışırıq" [VIIIc.s.16].

"Bizim" şəxs əvəzliyi məsələlərə müəyyənlik, aydınlıq gətirməklə yanaşı "bir olmaq", "özününküləşdirmək", "yaxınlaşmaq" mənasında da işlənərək auditoriyada doğmalıq hissləri yaradır: "***Bizim*** tarixi köklərimiz xalqlarımızın ***öz*** iradəsi ilə bir dilə, bir mənəviyyata, bir dinə bağlı olduğuna görə çox dərindir və qeyd etdim – mənəvi dəyərlərimizin inkişafı tarixin bütün mərhələlərində nə qədər çətinliklərlə, keçilməz yollarla rastlaşıbsa da dayanmayıb, inkişaf edib, qalxıbdır" [VIIIc.s.10].

"Biz" müəyyən şəxs əvəzliyi Heydər Əliyevin xalqla bir olduğunu auditoriyalara bəyan etdiyi məqamlarda işlənir. Prezident "biz" deməklə Prezident-xalq vəhdətini ortaya qoyur: "Bu, ***bizim*** sülhsevər siyasətimizin böyük nəticəsidir, böyük nailiyyətidir və əmin ola bilərsiniz ki, ***biz*** öz sülhsevər siyasətimizi bundan sonra da davam etdirəcəyik. ***Bizim*** məqsədimiz bu vasitədən, bu imkandan, yaranmış bu şəraitdən istifadə etmək, böyük, uzunmüddətli, etibarlı sülh əldə etmək, məsələni sülh yolu ilə həll etmək, Azərbaycan xalqını bu ağır bəladan, bu müharibədən, döyüşlərdən xilas etməkdən ibarətdir. Bunlara nail olmaq üçün ***biz*** bütün imkanlardan istifadə edirik. ***Bizim*** bu

sahədə gördüyümüz işlər mətbuat, informasiya orqanları vasitəsilə sizə çatdırılmışdır, məlumdur” [IIc.s.375].

“Sən” müəyyən şəxs əvəzliyini Heydər Əliyev özünə doğma hesab etdiyi görkəmli elm, mədəniyyət, ictimai-siyasi xadimləri ilə görüşlərdə tez-tez işlədir. 19 noyabr 1997-ci ildə görkəmli bəstəkar, Azərbaycanın xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxışda “sən” ikinci şəxsin təki olan müəyyənlik əvəzliyi təkrarlanaraq nitqdə doğmalıq hissləri yaradır: “***Sən*** böyük işlər görmüsən. Bugünkü bu mərasim sənin üçün bəlkə də azdır. ***Sən*** bundan da böyük şöhrətə və hörmətə layiqsən. Azərbaycan xalqı 60 ildir ki, ***sənin*** mahnılarının təsiri altında yaşayır. ***Sənin*** mahnıların bizim xalqımıza, təkcə bizim xalqımıza yox, bəşəriyyətə, dünyaya böyük töhfələrdir. ***Sənin*** mahnıların, musiqin bizim xalqımıza sevinc gətirir, ilham verir, hər bir insan üçün yaşamağa, yaratmağa güc verir” [XIIIc.s.215].

İkinci şəxsin cəmi olan “siz” əvəzliyi Heydər Əliyevin nitqlərində xüsusilə Prezident Sarayında ciddi məsələlərin müzakirəsi zamanı tez-tez təkrarlanaraq auditoriyaları səfərbər edir: “***Siz*** sentyabrın 22-də bu barədə mənə məlumat verdiniz. Əgər bu müddətdə pambığın yığım sürəti aşağı düşübsə, istənilən səviyyəyə qalxa bilməmişsinizsə, bu, ***sizin*** günahınızdır. ***Siz*** işi təşkil edə bilməmisiniz. Bundan əlavə, həmin rayonların hamısında xeyli qaçqın və işsiz adamlar vardır. Onları da səfərbər edə bilməmisiniz. Bu ***sizin*** günahınızdır və buna görə ***sizə*** xəbərdarlıq edirəm, ***sizdən*** tələb edirəm ki, bu gündən həmin məsələlərdə dönüş yaranmalıdır” [IIc.s.382].

Dövlət xadimləri ilə, xarici ölkə rəhbərləri ilə görüşlərdə “siz” müəyyən şəxs əvəzliyindən daha çox istifadə olunur: “Mən ***sizi*** çoxdan, 1970-ci ildə burada, Bakıda ilk dəfə görüşdüyümüz vaxtdan və sonralar ***siz*** artıq Moldovada deyil, Moskvada, Tacikistanda olandan, ***öz*** xalqı, ***öz*** ölkəsi üçün çox iş görmüş fəal insan kimi tanıyıram. ***Sizin*** taleyiniz Sovet döv-

rünün sayca çox olmayan – zamanın sınağından çıxa bilən, ***öz*** xalqının etimadını itirməyən və yenidən onun etimadını qazanan siyasi xadimlərin taleyidir. Belələri az olubdur. Çoxları elə ***o*** tayda da qalmışdır. ***Siz***, sayca az olanlardan birisiniz, bu da ona görədir ki, ***siz*** öz xalqınıza, vətəninizə ***öz*** doğma torpağınıza ***bütün*** dövrlərdə vicdanla və sədaqətlə xidmət etmisiniz. Bu, böyük səadətdir" [XIIIc.s.234]. Bu kiçik mətndə 5 yerdə "siz" ikinci şəxsin cəmi kimi istifadə olunursa da, "öz" təyin əvəzliyi 4 yerdə, "bütün" təyin əvəzliyi, "o" iki yerdə "bu", "elə" işarə əvəzlikləri işlənmişdir. Əvəzliklərin nitqdə rolunun yüksək yer tutması bir daha məlum olur.

Üçüncü şəxsin təki olan "o", cəmi olan "onlar" əvəzlikləri Heydər Əliyevin nitqlərində müstəqilliyimizə qənim kəsilən qüvvələrə qarşı, eləcə də xarici təcavüzkarlara qarşı münasibətdə çox işlədilir. Elə həmin qüvvələri təmsil edən şəxslərin öz ad və soyadları ilə yox, tez-tez "o" əvəzliyi ilə auditoriyalara təqdimi həmin şəxsləri xalqa bir daha tanıdır.

Müəyyən şəxs əvəzlikləri içərisində üçüncü şəxsin təki olan "o" əvəzliyi Heydər Əliyevin nitqlərində hörmətli şəxsləri auditoriyalara tanıtmaq baxımından istifadə olunur. 27 noyabr 1997-ci ildə "Gülüstan" sarayında Moldova Respublikasının prezidenti Petru Luçinskinin şərəfinə verilən ziyafətdə olduğu kimi: "Biz bir-birimizi çoxdan tanıyırıq. Mən ***onunla*** ilk dəfə 1970-ci ildə burada, Bakıda görüşmüşəm, sonralar bizim iş prosesimizdə Moldovada və Azərbaycanda, Moskvada da görüşlərimiz olmuşdur. Buna görə də ***onun*** haqqında kifayət qədər tam təsəvvürümüz var. ***O***, hələ 30 il bundan öncə Moldovada yüksək vəzifədə olmuşdur. Bu illər ərzində öz bacarığı, biliyi, xalqına, torpağına sədaqəti sayəsində böyük uğurlar qazanmışdır. ***O***, bir çox sınaqlardan, çətinliklərdən keçmiş, yenidən Moldavaya qayıdaraq parlamentin sədri seçilmişdir. Sonra isə xalq ***ona*** böyük etimad göstərərək prezident seçmişdir" [XIIIc.s.261].

Hər birimizin gündəlik həyatda danışıq prosesində işlətdiyimiz şəxs əvəzlikləri böyük natiqin nitqində təkrarların köməyi ilə xüsusi bir məna çalarları qazanır: "İşğal olunmuş torpaqlarımızdan didərgin düşmüş qaçqınlarımız, ***sizə*** üzümü tuturam. ***Sizin*** nə qədər ağır vəziyyətdə yaşadığınızı bilirik. ***Sizin*** yaşayışınız üçün əlimizdən gələni edirik və bundan sonra da edəcəyik. ***Sizin*** dözümünüz, dəyanətiniz bütün Azərbaycan xalqı üçün nümunədir. Əziz həmvətənlər, bayram münasibətilə ***sizi*** təbrik edir və əmin olduğunu bildirmək istəyirəm ki, öz evinizə, obanıza qayıdacaq və doğma yurdumuzun sahibi olacaqsınız" [IIc.s.12]. İkinci şəxsin cəmini təmsil edən "siz" əvəzliyi yuxarıdakı parçada beş yerdə təkrarlanaraq qaçqınlarımıza müraciət olunur, qaçqınlarda sabahkı günlərə əminlik yaradır.

Cümlə daxilində konkret olmayan şəxsin və ya başqa əşyaların adlarını bildirən sözlərin əvəzində işlənən qeyri-müəyyən əvəzliklər içərisində "hər kəs" böyük natiqin nitqində tez-tez işlənir: "Güman edirəm ki, bugünkü görüşümüz öz nəticələrini verməlidir. Burada gedən müzakirələrdən, çıxışlardan ***hər kəs*** özü üçün nəticə çıxarmalıdır" [IIc.s.139].

Nitqində təkrarların sıx şəkildə təsadüf etdiyi böyük natiq təyin əvəzliklərini də yeri gəldikcə təkrarlayır: "Yeni Azərbaycan Partiyası beş il müddətində ***öz*** proqramına, ***öz*** prinsiplərinə, ***öz*** amallarına sadiq olduğunu sübut edibdir və Azərbaycan Respublikasının həyatında görkəmli yer tutaraq ölkəmizin həyatının bütün sahələrinə ***öz*** təsirini göstəribdir" [XIIIc.s.262].

Heydər Əliyevin çıxışlarında "hər kəs" əvəzliyi, "öz" əvəzliyi, "qoy" əmr ədatı ilə çulğalaşaraq göstəriş xarakterli nitq yaranır: "Orderləri təqdim edin, ***qoy hər kəs*** keçib ***öz*** mənzilini tutsun, yaşasın, yerini-yurdunu düzəltsin. Ondan sonra bir bayram günü qonaq çağırarsınız, gəlib sizin bu evi qeyd edərik. Sağ olun" [XIIIc.s.211].

"Hər bir" əvəzliyinin köməyilə böyük natiq auditoriyaları səfərbər edir. Müstəqil Azərbaycan Respublikası gənclərinin 1-ci Forumunun birinci ildönümü münasibətilə etdiyi çıxışdakı kimi: "***Hər bir*** ölkədə o ölkənin ordusunda xidmət etmək ***hər bir*** gəncin vətəndaşlıq borcudur. Ancaq bizim ölkədə gəncin borcu başqa ölkələrin gənclərinə nisbətən bir neçə dəfə artıqdır" [VIIIc.s.389].

Yenə də həmin çıxışın başqa bir məqamında "hər bir" əvəzliyi "öz" əvəzliyi ilə birgə işlədilərək fikri qüvvətləndirir: "***Hər bir*** gənc Azərbaycanın dövlət müstəqilliyini möhkəmləndirmək, inkişaf etdirmək, yaşatmaq üçün çalışmalıdır və ***öz*** xidmətlərini göstərməlidir" [VIIIc.s.388].

"Hər bir" qeyri-müəyyən əvəzliyi böyük natiqin məişət üslublu nitqlərini də tərk etmir: 28 dekabr 1996-cı ildə Azərbaycan-Türkiyə müştərək müəssisəsinin – çay paketləmə fabrikinin açılış mərasimindəki çıxışda olduğu kimi: "***Hər bir*** azərbaycanlı çörək yeyəndən sonra mütləq çay içir. Bu, bizim əsrlərdən-əsrlərə keçmiş ənənəmizdir. Beləliklə, mən bu çay istehsalını, yaradılan çay fabrikini həm iqtisadi, insanların tələbatının ödənilməsi nöqteyi-nəzərindən, həm də milli ənənələrimizin inkişaf etdirilməsi üçün ***hər bir*** evdə, ***hər bir*** çayxanada yüksək keyfiyyətli çay hazırlanması baxımından müsbət qiymətləndirirəm" [VIIIc.s.206].

Heydər Əliyevin nitqində müxtəlif növ əvəzliklər harmonik şəkildə çulğalaşır: "Onu da bilmək lazımdır ki, bizim ***hər birimiz*** elmi dərəcəmizdən, biliyimizdən, təhsil səviyyəmizdən, tutduğumuz vəzifədən asılı olmayaraq bütün nailiyyətlərimizə görə birinci növbədə məktəbə, müəllimə borcluyuq. ***Hər birimizin*** müəllimi olmuşdur. Bu gün yaşayan adamlar – yaşlı nəsil, orta nəsil, gənc nəsil – ***heç kəs*** müəllimsiz bu səviyyəyə gəlib çatmayıb. Ona görə də ***hər bir*** vicdanlı adam, vətəninə, xalqına bağlı olan ***hər bir*** adam, qədirbilən adam müəllimini həmişə qəlbində saxlayır, onu daim hörmətlə

yad edir" [IIc.s.171]. Bu parçada bir neçə dəfə təkrarlanan "hər bir" təyin əvəzliyi "heç kəs" inkar əvəzliyi ilə harmonik şəkildə müəllimin cəmiyyətdəki rolunu təyin edir, eləcə də müəllimsiz cəmiyyətin formalaşmasının çətinliyini anladır.

Cümlədə isimlərdən əvvəl gələrək onları təyin edən bu əvəzliklər içərisində "hər bir" əvəzliyi böyük natiqin nitqində tez-tez işlədilir: "Bir dəfə Azərbaycanın müstəqilliyi heç də o vaxt ölkəyə rəhbərlik edən şəxslərin günahı ucbatından deyil, həmin dövrdəki proseslərin nəticəsində əldən getmişdir. İndi yenə də Azərbaycanın müstəqilliyi çox təhlükə altındadır. Bunu ***hər bir*** vətənpərvər adam, millətini, xalqını sevən ***hər bir*** azərbaycanlı bilməli, dərk etməli və Azərbaycanın müstəqilliyinin daimi, dönməz olması üçün səy göstərməlidir" [IIc.s.8].

"Həmin" işarə əvəzliyinin köməyi ilə Demokratik Cümhuriyyətin süqutu illərinə qayıdır, "hər bir" təyin əvəzliyini iki dəfə təkrar etməklə xalqın nə etməli olduğunu bəyan edir.

Təyin əvəzlikləri içərisində ən çox işlənən "hər bir" əvəzliyi böyük natiqin dilində hər kəsin vəzifəsini, necə deyərlər, təyin edir: "Bununla yanaşı onu da demək istəyirəm ki, ***hər bir*** icra hakimiyyəti başçısı, ***hər bir*** müəssisə, ***hər bir*** imkanlı şəxs orduya yardım etməyə borcludur. Lakin bunu elə etmək lazımdır ki, həmin yardım doğrudan da orduya, əsgərlərə, səngərdə olan döyüşçülərə çatsın" [IIc.s.37].

"Öz" təyin əvəzliyi Heydər Əliyevin nitqlərində də mühüm yer tutur: "Polyak xalqı ***öz*** tarixinin bütün mərhələlərində ***öz*** müstəqilliyi, milli azadlığı, dövlətçiliyi uğrunda mübarizə aparmışdır. Odur ki, biz, Azərbaycan prezidenti kimi mən də çox böyük sevinc hissi keçiririk ona görə ki, indi Polşa tamamilə azad ölkədir, müstəqil dövlətdir və Polşa xalqı ***öz*** qəlbinin hökmü ilə istədiyi yolla gedir" [XIIc.s.33]. "Öz" təyin əvəzliyi Polşa xalqının müstəqillik yolundakı uğurlarını əks etdirir.

"Öz" əvəzliyi bütün şəxslər üzrə mənsubiyyət şəkilçisi qəbul edərək substantivləşə bilir. Substantivləşdikdən sonra hallana və cümlədə müxtəlif cümlə üzvləri vəzifəsini daşıya bilir.[1] "Öz" təyin əvəzliyinin belə formaları Heydər Əliyevin nitqlərində özünə yer tapır: "Bir halda ki, sizin burada belə bir cəmiyyətiniz var, gərək siz ***özünüz*** də, cəmiyyətiniz də azərbaycanlıların əxlaqı, mənəviyyatı haqqında çox ciddi düşünəsiniz, bu işlərə fikir verəsiniz, çalışasınız ki, azərbaycanlılar hər yerdə ***özlərini*** yüksək əxlaqlı, mədəniyyətli, mənəviyyatlı, dövlət qayda-qanunlarına riayət edən insanlar kimi göstərsinlər. Azərbaycanlılar həqiqətən belə insanlardır. Bizim xalqımız ***belə*** xalqdır" [IXc.s.76]. "Öz" təyin əvəzliyi ilə Azərbaycan xalqını təyin edən böyük natiq "belə" işarə əvəzliyi ilə təsdiq anı yaradır.

"Öz" təyin əvəzliyindən Heydər Əliyev məsələlərə fəlsəfi tərəfdən yanaşdıqda tez-tez istifadə edir. Xüsusən də inkar əvəzlikləri ilə fəlsəfi təhlillər aparır: "İnsan müstəqildir, insan azaddır. İnsanı heç bir şeyə vadar etmək lazım deyil. Xüsusən, məcbur etmək də lazım deyil. İnsan gərək hər bir şeyi ***özü*** istədiyi kimi etsin, ***öz*** istədiyinə görə etsin və ***özünün*** mənəviyyatına uyğun etsin. Hərə ***özü öz*** tarixini təhlil etməlidir, hərə ***özü öz*** işinə qiymət verməlidir" [XIIIc.s.271-272].

Bəzən sadə sual əvəzliklərinin köməyilə yüksək nitq effektinə nail olunur: "Dedilər ki, burada yaşayan azərbaycanlıları bəzən incidirlər. Onları kim, necə incidir? Bu gün mən Ukrayna prezidenti ilə görüşəcəyəm, ona ***nə deməliyəm***? Deməliyəm ki, ***kimi***, ***necə*** incidiblər" [IXc.s.72]. Sual əvəzliklərinin (kim, necə, nə, kimi) iştirak etdiyi bu üç cümlə ilə Ukraynada yaşayan soydaşlarımızın problemlərinə Heydər Əliyev yanaşması ortaya qoyulur.

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

Əvəzliklərin bir növü kimi sual əvəzlikləri danışana məlum olmayan şəxsləri, əşyaları və onların keyfiyyətini xəbər almaq üçün işlədilir və danışanın adresata müraciətini göstərir.[1]

Heydər Əliyevin nitqində sual əvəzlikləri ritorik suallar tipində işlənir. Azərbaycan dilində “nə” sözü vasitəsilə “nə vaxt”, “nə zaman”, “nə cür”, “nəyə görə”, “nədən ötrü”, “nə təhər”, “nə üçün”, “nə qədər”, “nə səbəbə” və s. mürəkkəb sual əvəzlikləri əmələ gəlir ki,[2] böyük natiqin çıxışlarında ən çox “nə üçün”, “nəyə görə” sual əvəzlikləri işlənir: “Xalqımız dövri-qədimdən bu mənfi meyllərdən uzaq olmuşdur. Keçmişdən bizim millətimizdə spirtli içkilər istifadə olunmayıbdır. Bu, bizim dini, milli ənənələrimizə uyğun deyil. ***Nəyə*** lazımdır ki, indi gənclər araq içsinlər? ***Nə*** üçün, ***nəyə*** görə öz səhhətlərini korlasınlar və bunun da nəticəsində müxtəlif yollara getsinlər?” [VIIIc.s.393].

Bu mətndə sual əvəzlikləri həm bir ağsaqqal öyüdü təkin, həm də qətiyyətli dövlət başçısının nitqi kimi səslənir, gəncləri düzgün yola sövq edir.

“Nə üçün” mürəkkəb sual əvəzliyi “axı” qüvvətləndirici ədatı ilə birgə təsadüf edərək problemin aktuallığını auditoriya qarşısında qabardır, nitqi yaddaqalan edir: “Cabir Novruz bizim gözəl şairimizdir, o danışanda düzü mən çox məyus oldum. ***Belə*** bir şair öz kitabını nəşr etdirə bilmir, onun başqa problemləri də var. Axı ***nə üçün*** belə olmalıdır?” [IIc.s.99].

“Belə” işarə, “öz” təyin əvəzliyinin də “nə üçün” sual əvəzliyinə qoşulduğu nitq nümunəsi Heydər Əliyevin nitqlərində saysız-hesabsızdır.

---

[1] Əsədova M.N. Azərbaycan və ingilis dillərində “kim” və “nə” sual əvəzliklərinin leksik-semantik xüsusiyyətləri // Bakı Universitetinin xəbərləri Humanitar elmlər seriyası, №3, 2012. səh.16-21.

[2] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, “Şərq-Qərb”, 2007. səh. 280.

İşarə əvəzlikləri Heydər Əliyevin nitqlərində keçmiş günlərə bir tarixi baxışdır. İşarə əvəzliklərinin də ədat və bağlayıcılarla birgə işlədilməsi nitqin auditoriyalara təsir gücünü artırır: “Azərbaycanda 1993-cü illə indiki günü müqayisə edin. Respublikamızda daxili ictimai-siyasi vəziyyət tam sabitləşibdir. Bəlkə də 1993-94-cü illərdə bunu təsəvvür etmək mümkün deyildi ki, Azərbaycan bu gün ***belə*** sakit, rahat, əmin-amanlıq şəraitində, sabitlik şəraitində yaşayacaqdır. ***Bəli***, bunu ***o vaxt*** təsəvvür etmək mümkün deyildi. ***Amma*** biz buna nail olmuşuq. ***Bu***, bizim gərgin əməyimizin nəticəsidir. ***Bu***, bizim düzgün, doğru daxili siyasətin nəticəsindədir. ***Bu***, Azərbaycan dövlətinin qüdrətinin nəticəsindədir” [XIIIc.s.275]. “Belə sakit...”, “o vaxt”, üç yerdə təkrarlanan “bu” işarə əvəzliklərinin “bəli” təsdiq ədatı, “amma” qarşılaşdırma bağlayıcısı ilə birgə işlənməsi yüksək nitq effekti yaradır.

Müasir Azərbaycan ədəbi dilində işarə əvəzlikləri semantik məna zənginliyi və funksional cəhətdən isə sintaktik rolunun müxtəlifliyi ilə əvəzliyin digər növlərindən fərqlənir. İşarə əvəzliklərinin formalaşmasında semantik əlaqələr mühüm rol oynayır[1]. Bu əvəzliklərin əsasında iki semantik əkslik durur: Məsafə-yaxın, görünən-uzaq, görünməyən; zaman-məlum-naməlum: “Ümumi məzmuna görə işarə əvəzliklərinin bir qismi isə (“bu”, “belə”, “həmin”) yaxın, hazır, əyani varlıqları göstərmək üçün, digər qismi isə (“o”, “elə”, “haman”) uzaq, qaib varlıqlara işarə etmək üçün işlənir”.[2] İşarə əvəzlikləri ilə də nitqin auditoriyalara olan təsir gücünü artırmaq yenə də Heydər Əliyev natiqliyinə xasdır: “Güman edirəm ki, bu gün, bu bayramı qeyd edərkən, ilk Azərbaycan Demokratik Res-

---

[1] Əliyeva Sitarə. İşarə əvəzliklərinin üslubi xüsusiyyətləri, AMEA-nın xəbərləri, Humanitar elmlər seriyası, 2006. №2-4, səh.181-186.

[2] Dəmirçizadə Ə.M. Azərbaycan dilinin üslubiyyatı, Bakı, Azərtədrisnəşr, 1962. səh.236

publikasının yaranmasına və fəaliyyətinə hörmət və ehtiramımızı bildirərkən bir daha və bir daha ***o*** dövrü təhlil etməli, ***o*** dövrün nailiyyətlərindən istifadə etməli, bəhrələnməli, ***o*** zaman buraxılan səhvlərə yol verməməliyik. ***O*** dövrdə Azərbaycan Demokratik Respublikasını zəiflədən amillərin indi də mövcud olduğunu görərək, mütləq onları aradan qaldırmalıyıq" [IIc.s.12].

"O" işarə əvəzliyi bu mətndə təyin funksiyası yerinə yetirdikdə işarə əvəzliyi sayılır ki, burada da şəxs əvəzliyi kimi yox, işarə əvəzliyi kimi işlənmişdir.

Heydər Əliyevin nitqlərində "o" işarə əvəzliyi cümlədə ədat və bağlayıcılarla harmonik şəkildə birgə işlənərək fikrin qüvvətlənməsinə gətirib çıxarır: "Bax, ***o*** dövrdə, ***o*** illər mübarizəyə qalxanların əksəriyyəti gənclər idi. Ona görə də mən gənclərin ***o*** illərdə fəaliyyətini, onların qəhrəmanlığını həmişə yüksək qiymətləndirmişəm və bu gün də yüksək qiymətləndirirəm" [VIIIc.s.387].

"Həmin" işarə əvəzliyi Heydər Əliyevin nitqində hadisələri tarixi mərhələlərə bölərkən istifadə olunur. "Həmin" işarə əvəzliyini eşidən auditoriya böyük natiqlə birgə tarixə sanki ekskursiya edir, nitqin cazibəliliyi güclənir: "Çünki, 1920-ci ildə Azərbaycan demokratik dövləti süquta uğramışdır. ***Həmin*** il Azərbaycanda Sovet Sosialist hakimiyyəti qurulmuşdur. Bundan sonra 70 il ərzində Azərbaycan ***həmin*** quruluş şəraitində, Sovet İttifaqının tərkibində olmuşdur. Azərbaycan xalqınının ən böyük sərvəti olan neftdən Sovet İttifaqının mənafeyi naminə istifadə edilmişdir. ***Həmin*** dövrü Azərbaycanın neft sənayesinin həyatında ikinci dövr adlandırmaq olar" [IIc.s.256].

Təyin və işarə əvəzlikləri vasitəsilə böyük natiq nitqlərinə əminlik verə bilir: "Keçmişdə respublikalarımız arasında iqtisadiyyat sahəsində də yaxşı əməkdaşlığın olduğunu söyləməyə əsasımız var. Şübhəsiz ki, bütün ***bunlar*** bizi yaxınlaşdırmış, xalqlarımız arasında dostluğu möhkəmləndirmiş, elə şərait

yaratmışdır ki, Azərbaycanda Moldovanı çox yaxşı tanıyırlar, Moldovada isə Azərbaycanı yaxşı tanıyırlar" [XIIIc.s.257].

"Bu" işarə əvəzliyi Heydər Əliyevin nitqlərində tez-tez təsadüf edən əvəzliklərdəndir. Əksər nitq məqamlarında "bu" əvəzliyi təkrarlanaraq ana fikrin auditoriyaya yönəldilməsində mühüm rol oynayır: "Biz müsəlmanlar Allah-təalanın buyruğu, peyğəmbər Məhəmməd əleyhissəlamın bizə göstərdiyi yolla, müqəddəs kitabımız Qurani-şərifin verdiyi tövsiyələr yolu ilə əsrlər boyu getmişik, bu gün də ***bu*** yolla gedirik. ***Bu*** yol sülh yoludur, ***bu*** yol mehribanlıq, dostluq, əmin-amanlıq yoludur. ***Bu*** yol insanlara səadət gətirən yoldur. Mən fəxr edirəm ki, Azərbaycan müsəlmanları ***öz*** müqəddəs dininə itaət etmək, dini ayinlərə, qanun-qaydalara riayət etmək üçün indi geniş imkanlar əldə ediblər" [VIIIc.s.156].

"Bu" işarə əvəzliyi yol sözünə qoşularaq, bir neçə dəfə təkrar olunaraq Məhəmməd peyğəmbərin yolunu auditoriyalara izah edir.

Başqa bir çıxış məqamında isə böyük natiq ölkəmizin tutduğu yola işarə edir və bu zaman "bu" işarə əvəzliyindən yerindəcə yararlanır: "Ancaq mən bu gün məmnuniyyət hissi ilə qeyd edirəm ki, xalqımızın tam əksəriyyəti, millətimizin, respublikamızın vətəndaşlarının tam əksər hissəsi Azərbaycanın ***bu*** doğru, düzgün yolunu, dövlətçilik, müstəqillik prinsiplərimizə, yüksək milli-mənəvi, dini amallarımıza uyğun olan ***bu*** yolu bəyənir, dəstəkləyir və ***bu*** yolda hamımızın bir yerdə getməsi üçün əlindən gələni edir" [VIIIc.s.160].

Heydər Əliyevin dilində inkar əvəzlikləri böyük natiqin qarşısına qoyduğu fikir və ideyaların açıqlanması yolunda aydın bir nitq yaradır, auditoriya üçün situasiyanı yaddaqalan edir: "Mən bu respublikanın başçısıyam, prezidentəm. Sizə açıq deyirəm: ***heç kəs heç nədən*** qorxmasın, ***heç kəsdən*** çəkinməsin. Fikrə, sözə görə ***heç kəs*** nəinki cəza ala bilməz, ***heç kəs*** töhmətlənə də bilməz, ***heç kəs heç kəsi*** incidə bilməz. Biz

demişik ki, söz azadlığıdır. ***Heç kəs*** heç bir iddiada olmamalıdır ki, o hər şeyi bilir. Mən şəxsən belə bir iddiada deyiləm. Ona görə də sizi buraya dəvət edib müşavirə keçirməkdə məqsəd o deyil ki, sonra kim isə desin ki, yaxşı, təsirli çıxış etdim. Məqsəd odur ki, ***hər kəs*** sərbəst fikir söyləsin, sərbəst söz söyləsin" [IIc.s.490-491]. İnkar əvəzlikləri bir-birinin ardınca söylənərək felin əmr şəkli ilə yekunlaşaraq qətiyyətli bir nitq nümunəsi yaranır.

İnkar əvəzlikləri dilimizdə böyük işlənmə tezliyinə malik olub heç sözünün kim, kəs, nə, bir, şey sözləri ilə birləşməsindən əmələ gəlir: *heç kim, heç kəs, heç biri, heç nə, heç bir şey, heç bir kimsə, heç kim* mənasında işlənir.[1]

Heydər Əliyevin nitqində "heç kəs" inkar əvəzliyi xalqı səfərbər etmək məqamlarında səslənir: "Bu hadisə bizim üçün nə qədər ağır olsa da, mən istəyirəm ki, xalqımız bilsin. ***Heç kəs*** sarsılmamalıdır, ***heç kəs*** sınmamalıdır, ***heç kəs*** narahat olmamalıdır. Dediyim kimi, Azərbaycan xalqı, müstəqil respublikamız çox sınaqlardan çıxmışdır, bu sınaqdan da keçəcəkdir" [IIc.s.281].

"Heç kəs" inkar əvəzliyi qanunların qorunması yolunda böyük natiqin qətiyyətli nitqlərini tərk etmir. Bu zaman "heç kəs" inkar əvəzliyi felin lazım şəkli ilə qətiyyətliliyi yüksəltməyə xidmət edir: "Lakin hər bir xidmət nə qədər yüksək olsa da, heç vaxt heç kəsə bəraət qazandıra bilməz ki, kimsə belə xidməti olduğuna görə gedib qanunsuz əməl tutsun, yaxud cinayət törətsin. Vəzifəsindən, xidmətindən, ad-sanından asılı olmayaraq, ***heç kəs*** qanunsuz hərəkət etməməlidir. ***Hər bir*** şəxs qanun çərçivəsində yaşamalı, qanun çərçivəsində işləməlidir" [IIc.s.341].

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

“Heç kəs” inkar əvəzliyi Heydər Əliyevin nitqində fikrin qüvvətlənməsinə yönəlir: “Bu gün bizim dövrümüzdə yaşayanlardan söhbət açsaq, Bəxtiyar Vahabzadə də belədir. İkinci bir Bəxtiyar Vahabzadə yoxdur. O, başqasına bənzəmir və onu ***heç kəs*** əvəz edə bilməz. Sabah başqa bir şəxs yaranacaqdır, onun bəlkə də başqa xüsusiyyətləri olacaqdır” [VIIIc.s.339].

Bəzən də Heydər Əliyevin nitqində inkar və təyin əvəzlikləri birgə işlənir: “Azadlıq meydanına toplaşmış bakılılar və Azərbaycanın bütün guşələrindən – bütün rayonlarından, şəhərlərindən gəlmiş vətənpərvər insanlar bir daha qeyd etdilər ki, ***heç bir*** qüvvə Azərbaycanın müstəqilliyini, dövlətçiliyini sarsıda bilməz, yıxa bilməz və buna cəhd edən ***hər bir*** qüvvə öz layiqli cəzasına çatacaqdır” [IIc.s.379].

Təyin və inkar əvəzlikləri birgə çulğalaşaraq nitqdə əminlik, qətilik yaradır: “Odur ki, biz ***öz*** müstəqilliyimizi və azadlığımızı heç vaxt və ***heç kimə***, heç bir ölkəyə, ***heç bir*** dövlətə güzəştə getməyəcəyik” [XIIc.s.73].

İnkar əvəzliyi Heydər Əliyevin nitqində məsuliyyətli dövlət başçısının nitqini yaradır: “Ancaq nə o vaxt, nə də 1994-cü ilin oktyabrında mən hakimiyyəti qoyub ***heç yerə*** qaçmadım və televiziya ilə bəyan etdim ki, Azərbaycan xalqı qarşısında məsuliyyət daşıyıram” [XIIc.s.92].

İnkar əvəzlikləri böyük natiqin çıxışlarında müstəqilliyimizin təsdiqi kimi səslənir və bu zaman müəyyən şəxs əvəzliyi ilə, eləcə də təyin əvəzliyi ilə harmoniya yaradır: “Milli azadlığın, sərbəstliyin, müstəqilliyin xalqlarımıza bəxş etdiyi töhfələr göz qabağındadır. Ancaq ***biz*** bunun böyük gələcəyini də görürük. Bunlardan da biri ondan ibarətdir ki, ***biz*** sərbəst, müstəqil olaraq, ***heç bir kəsdən***, ***heç bir*** dövlətdən asılı olmayaraq, ***öz*** istədiyimiz kimi əlaqələrimizi qururuq və əməkdaşlıq edirik, milli ənənələrimizi, milli dəyərlərimizi, mədəniyyətimizi birlikdə inkişaf etdirməyə çalışırıq” [VIIIc.s.9].

Beləliklə, Heydər Əliyevin nitqində əvəzliklərin yaratdığı üslubi-semantik xüsusiyyətləri aşağıdakı kimi qiymətləndirmək mümkündür:

– Müəyyən şəxs əvəzliyi “mən” Heydər Əliyevin nitqində ölkənin birinci şəxsinin məsuliyyəti təkbaşına üzərinə götürdüyü məqamlarda daha çox işlədilir;

– “Biz” şəxs əvəzliyi böyük natiqin dilində məsələlərə müəyyənlik, aydınlıq gətirməklə yanaşı “bir olmaq”, “yaxınlaşmaq”, mənalarında işlənərək auditoriyalarda doğmalıq hissləri yaradır;

– “Sən” müəyyən şəxs əvəzliyi Heydər Əliyevin özünə doğma hesab etdiyi görkəmli elm, mədəniyyət, ictimai-siyasi xadimlərlə olan görüşlərdə tez-tez işlədilir;

– İkinci şəxsin cəmi “siz” əvəzliyi Prezident Sarayındakı ciddi məsələlərin müzakirəsində, eləcə də dövlətlərarası münasibətlərin çözülməsində auditoriyaları səfərbər edir;

– Üçüncü şəxsin təki “o”, cəmi “onlar” əvəzlikləri Heydər Əliyevin nitqlərində müstəqilliyimizə qənim kəsilən qüvvələrə qarşı, xarici təcavüzkar dövlətlərin rəhbərlərinə qarşı münasibətdə cox işlədilir;

– “O” müəyyən şəxs əvəzliyi Heydər Əliyevin nitqlərində hörmətli şəxsləri, ölkəmizə xoş münasibətdə olan şəxsləri auditoriyalara təqdim etmək baxımından da istifadə edilir;

– “Hər bir” əvəzliyinin köməyilə böyük natiq auditoriyaları səfərbər edir;

– “İşarə” əvəzlikləri Heydər Əliyevin nitqlərində keçmiş günlərə bir tarixi baxışdır;

– Heydər Əliyevin nitqlərində “o” işarə əvəzliyi cümlədə ədat və bağlayıcılarla harmonik şəkildə birgə işlənərək fikrin qüvvətlənməsinə gətirib çıxarır;

– “Heç kəs” inkar əvəzliyi qanunların qorunması yolunda böyük natiqin qətiyyətli nitqlərini tərk etmir;

– İnkar əvəzlikləri böyük natiqin çıxışlarında müstəqilliyimizin təsdiqi kimi səslənir və bu zaman müəyyən şəxs əvəzlikləri ilə, eləcə də təyin əvəzlikləri ilə harmoniya yaradır;

Monoqrafiyanın bu fəsli ilə böyük natiqin dilində əvəzliklərin üslub yaratma gücünə qısa bir səyahət etdik. Gələcəkdə əvəzliklərin Heydər Əliyevin nitqində daha da dərindən araşdırılması nitq mədəniyyətimizə böyük töhfə sayılar.

**1.3. Heydər Əliyevin nitqində fellər**

Heydər Əliyev nitqlərinin üslubi morfologiya baxımından tədqiqi maraq doğuran məsələlərdəndir. Üslubi morfologiya müxtəlıf nitq hissələrinin müxtəlif üslubi məqamlarda istifadə edilməsi yolu ilə əldə edilən ekspressivlik, ifadəlilik məsələlərini öyrənir. Zənginliyi ilə seçilən fel nitq hissəsinin Heydər Əliyevin nitqində araşdırılması bu baxımdan maraqlı xüsusiyyətləri üzə çıxarmağa imkan verir. "Əvvəla, bir müstəqil dövlət kimi Azərbaycan heç vaxt öz müstəqilliyini bir daha əldən verib başqa ittifaqa ***girməyəcəkdir***. Bu qətidir, buna şəkk-şübhə olmasın" [IIc.s.115].

"Başqa ittifaqa girməyəcəkdir" qəti gələcək zamana aiddir ki, elə bu özü "bu qətidir" ifadəsi ilə birbaşa anlaşılır. Növbəti cümləyə fikir versək felin vacib şəkil şəkilçiləri olan – *malı, məli* aydınca görünür: "Təsadüfi deyildi ki, 1980-85-ci illərdə yeni yollar axtarmağa başladılar. Bu da yeganə bir yola gətirib çıxardı: iqtisadi islahatlar ***aparmalı***, bazar iqtisadiyyatı yolu ilə ***getməli***, bazar iqtisadiyyatı prinsiplərini tətbiq ***etməli***" [IIc.s.115].

Heydər Əliyevin nitqləri araşdırılarkən onun dövlət başçısı olması faktı həmişə diqqət mərkəzində saxlanılmalıdır. Məhz buna görə də felin əmr və vacib şəkilləri əksər hallarda onun nitqində birgə təsadüf edərək tapşırıqları yerinə yetirməli olan şəxsləri səfərbər edir: "Burada bir mərkəz var. Mən Prezident Aparatının müvafiq şöbəsini nəzərdə tuturam. Onun müdiri Fatma Abdullazadədir. Bütün məsələlərin əlaqələndirilməsini mən Fatma xanıma tapşırır və tələb edirəm ki, hamı ona tabe olsun. Fatma xanım bu məsələlərlə ciddi məşğul ***olmalı*** və bütün təşkilatların fəaliyyətini ***əlaqələndirməlidir***" [IIc.s.106].

Heydər Əliyev nitqlərini araşdırarkən məlum olur ki, bu nitqə şərh vermək çətindir. Çətinlik nədən ibarətdir? Bu onunla izah olunur ki, böyük natiq şərhləri yeri gəldikcə auditoriyalara özü verir: "İqtisadiyyatda vəziyyəti yaxşılaşdırmaq

üçün isə son vaxtlar verilmiş fərmanlar ardıcıl surətdə icra ***olunmalıdır***” [IIc.s.119].

Gəlin felin vacib şəklinin tərifinə diqqət yetirək: Felin vacib şəklində hərəkətin icrasının zəruriliyi ifadə olunur.[1] Və qayıdaq Heydər Əliyev nitqinə – “fərmanlar ardıcıl surətdə icra olunmalıdır”. Məhz buna görə də Heydər Əliyev nitqlərinə şərh vermək çətindir. Bu izahedici nitqə şərh vermək çətindir.

Böyük natiqlərin nitqinin əsasında duran nitq felləri Heydər Əliyevin nitqlərində də özünə yer alır: “Ancaq mən Azərbaycan dili haqqında ***danışarkən*** deyə bilərəm ki, bizim Azərbaycan dilimiz XX əsrdə çox inkişaf etmiş, çox zənginləşmişdir” [VIIIc.s.11]. Bu cümlədə danışmaq nitq feli feli bağlama şəklində işlədilmişdir.

Nitq felləri ya böyük natiqin özünə aid olur, ya da haqqında danışdığı şəxslərə aid olur: “O (Məhəmməd Füzuli – red.), yaşadığı dövrdə gedən ictimai-siyasi prosesləri, insan cəmiyyətini, insan həyatını təhlil edərək insanlar, cəmiyyət üçün ölməz fikirlər ***söyləmiş***, ölməz tövsiyələr vermişdir” [VIIIc.s.25].

“Çıxış etmək” felinin böyük natiqin nitqlərində tez-tez işlədilməsi təbiidir. Bu fel bütün auditoriyalarda, bütün üslublarda, müxtəlif üslublarda Heydər Əliyevin işlətdiyi nitq felidir: “Azərbaycan parlamentinin sədri seçilərkən mən parlamentin iclasında ***çıxış etdim*** və bəyanat verdim. Sizin sualınızın cavabında da ***deyə bilərəm*** mən belə hesab edirəm ki, Azərbaycan müstəqil dövlətdir və indən belə heç vaxt hər hansı başqa dövlətin tərkibinə daxil olmamalı, kiminsə vassalı, yaxud müstəmləkəsi olmamalıdır” [Ic.s.30].

“Demək” feli də üstünlük təşkil edən fellərdəndir: “Mən sözlərimi ***dedim***. Təsvir etdim, təfsilati ilə ***dedim***, istərdim ki, birinci növbədə deputatlar və onlarla yanaşı iştirak edən, bu

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, “Şərq-Qərb”, 2007. səh. 280.

bölgə ilə əlaqədar olan şəxslər öz fikirlərini ***desinlər***, kimin nə sözü var, buyursun. Mən birinci növbədə deputatlara ***müraciət edirəm***” [Ic.s.73]. Bu kiçik mətndə “demək” feli bir dəfə keçmiş zamanda, ikinci dəfə təfsilatı ilə deməkdən söhbət gedir, sonra isə felin əmr şəklində təklif formasında səslənir. Elə burada nitq feli kimi “müraciət etmək” də işlənir.

Bu fellərdən biri də “demək” felidir ki, böyük natiqin nitqində çox işlədilir: “Azərbaycana gəlmiş hörmətli qonaqlarımız bu günlərdə keçirilən elmi simpoziumda, yazıçıların qurultayında, TÜRKSOY-un toplantısında və nəhayət, bu gün yubiley mərasiminin zirvə tədbirində Füzuli haqqında, onun yaradıcılığı, irsi haqqında, Azərbaycan xalqı, müstəqil Azərbaycan Respublikası haqqında çox xoş sözlər ***dediniz***” [VIIIc.s.33].

Əşyanın bir vəziyyətdən digər vəziyyətə salınması iş fellərinə aiddir.[1] Bu baxımdan Heydər Əliyevin Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədəki nitqində “gözəlləşmək”, “zənginləşmək”, “səlisləşmək”, “şirinləşmək” fellərini işlətməsi maraqlıdır: “Bizim hazırkı dilimiz 70, 80, 90 il bundan əvvəl olan dil deyil. İndiki dilimiz – türk dilləri qrupuna məxsus olan Azərbaycan dili, türk dillərinin kökündən gələn Azərbaycan dili məhz Səməd Vurğun kimi şəxsiyyətlərin yaradıcılığı nəticəsində, onların şeirlərinin, əsərlərinin nəticəsində bu qədər ***gözəlləşib***, bu qədər ***zənginləşib***, ***səlisləşib***, ***şirinləşibdir***” [IXc.s.20].

Heydər Əliyevin nitqləri təfəkkür felləri ilə zəngindir. Bu fellər müxtəlif çeşidli auditoriyalarda, xüsusən də təfəkkür sahibli görkəmli şəxsiyyətlərin yubileylərində işlədilir: “Hesab edirəm ki, Məhəmməd Füzuli yaradıcılığı, onun irsi elə bir dəryadır ki, onun dərinliklərinə nüfuz etmək üçün, o dərin qatlardakı fikirləri, tövsiyələri ***mənimsəmək*** üçün, ***öyrənmək***

---

[1] Azərbaycan dili. Qəbul imtahanlarına hazırlaşanlar, yuxarı sinif şagirdləri və müəllimlər üçün vəsait. Bakı, TQDK, 2013, 640 səh.

üçün hələ çox işlər görülməlidir" [VIIIc.s.28]. Bu cümlədə "mənimsəmək", "öyrənmək" felləri təfəkkür felləri sırasına daxil edilə bilər.

Böyük natiqin təfəkkürə söykənən şəxsiyyət olduğunu nəzərə alsaq onun nitqlərində təfəkkür fellərinin mühüm yer tutması qənaətinə gələ bilərik: "Böyük şairimiz Molla Pənah Vaqif XVIII əsrdə şeir dilini xalq dilinə daha da yaxınlaşdırdı. Onun yazdığı şeirləri xalqın bütün təbəqələri həm ***anlaya***, həm ***qavraya*** bildi, həm də ***sevdi***" [IXc.s.17]. Bu cümlədə "anlamaq", "qavramaq" təfəkkür felləridirsə, "sevmək" hal-vəziyyət bildirən feldir.

Təfəkkür və nitq felləri bir-biriylə harmoniya yarada bilir: "Və mən burada başqa bir fikir ***duymadım***, başqa bir fikir meydana çıxmadı. Biz fikir mübadiləsi apardıq. Özümüz üçün hər şeyi ***aydınlaşdırdıq***. Çıxış edənlərin əksəriyyəti bizə irad tutdular ki, indiyə qədər biz bu məsələyə öz münasibətimizi bildirməmişik... Ancaq indi məsələlərin hamısı açıldı və ***aydın oldu***. Hamı ***danışandan*** sonra mən də öz fikirimi ***deyə bilərəm***" [Ic.s.76-77]. Burada "duymaq", "aydınlaşdırmaq", "aydın olmaq" felləri təfəkkür, "danışmaq", "deyə bilmək" isə nitq felləridir ki, bunlar da harmonik bir şəkildə çulğalaşır.

Təfəkkür felləri içərisində böyük natiq "dərk etmək" felini daha tez-tez işlədir: "Mən sadəcə bir neçə məqamı ***yada salıram*** ki, Nazirlər Kabinetinin məsuliyyətini bir daha ***xatırlatdım***, Nazirlər Kabineti, onun rəhbərliyi – baş nazir, onun müavinləri, Nazirlər Kabinetinin aparatı üzərlərinə düşən məsuliyyəti daha da ciddi ***dərk etsinlər***" [VIIIc.s.85]. "Xatırlatmaq", "yada salmaq" sinonim fellər, eləcə də "dərk etmək" feli təfəkkürlə bağlı fellərdir ki, bunların da tez-tez Heydər Əliyevin nitqində işlənməsi təbiidir.

Bəzən bir cümlədə bütün zamanlar əhatə olunur: "Azərbaycan demokratik, hüquqi, dünyəvi dövlətdir. Biz müstəqilliyimizi əldə edəndən sonra bu yolu ***tutmuşuq***, bu yolla ***gedirik***

və bu yolla da ***gedəcəyik***... Biz bu siyasəti ***aparırıq*** və bu siyasəti də ***aparacağıq***" [XXIIc.s.170-171].

***Felin zaman kateqoriyası. Keçmiş zaman.***

Şühudi keçmiş əvvəlcə (keçmişdə) icra olunmuş bir iş barədə indi onun haqqında şahidlik yolu ilə xəbər verilən zaman arasındakı vaxta deyilir.

Şühudi keçmişin şəkli əlaməti *-dı (-di, du, dü)* şəkilçisidir.[1]

"Yaxın keçmişdə bu sahədə az iş görməmişdik. Xatirinizdə olmalıdır, Azərbaycanda ali təhsilin inkişafı üçün 70-ci illərdə çox işlər ***gördük***. Həmin müddətdə beş yeni ali məktəb yaradıldı. Ali məktəblərin maddi-texniki bazasının inkişafı üçün çox işlər ***görüldü***: Universitet, Neft-kimya İnstitutu, Tibb İnstitutu və başqa institutlar üçün binalar ***tikdik***. Gəncədə Texnologiya İnstitutu ***açıldı***. Həmin institut Azərbaycan Respublikasında bir çox sahələr üçün mütəxəssislər hazırlamaqdan ötrü nə qədər böyük imkanlar yaratdı. Tələbələr üçün yataqxanalar ***tikildi***, universitet, başqa ali məktəblər üçün cihazlar, başqa müxtəlif ləvazimat alınıb gətirildi. Bütün bunlar Azərbaycanda ali təhsilin səviyyəsini yüksəltməyə ***imkan verdi***" [Ic.s.170].

Qəti gələcək zamana Heydər Əliyevin müstəqillik yolunda geri çəkilməyin mümkünsüz olduğu çıxış və nitqlərində daha çox təsadüf edilir: "Azərbaycan xalqı artıq öz taleyinin, öz sərvətlərinin, öz torpaqlarının və öz ölkəsinin sahibidir. Bu məsuliyyəti aydın duyan Azərbaycan xalqı bundan sonra öz həyatını, öz dövlətini demokratik prinsiplər əsasında ***quracaqdır***. Azərbaycanda hər bir vətəndaşın hüquqları qorunur və ***qorunacaqdır***. Azərbaycanda bütün vətəndaşlar bərabər hüquqa malikdir-

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

lər. Respublikamızda çoxpartiyalı sistem artıq bərqərar olmuşdur. Sözlərim eləcə də fikir müxtəlifliyinə, siyasi plüralizm prinsiplərinə aiddir. Bu prinsiplər gələcəkdə daha da ***gücləndəcəkdir***. Yəni Azərbaycan dövləti, Azərbaycan hökuməti tam demokratiya yolu ilə, hüquqi dövlət quruculuğu yolu ilə ***gedəcək*** və beləliklə də, Azərbaycan dünya demokratik dövlətlər birliyinin üzvü kimi bu yoldan ***dönməyəcəkdir***" [Ic.s.377].

Qəti gələcək – işin gələcəkdə icra olunub – olunmayacağını indi qətiyyətlə xəbər vermək deməkdir. Bunun şəkli əlaməti *-acaq (-əcək)* şəkilçisidir:[1] "Xalqımızın gücü və iradəsi var və əmin ola bilərsiniz ki, xalq gücünü ***toplayacaq***, ***birləşəcək***, öz torpaqlarını ***qaytaracaq***, işğal olunmuş torpaqlardan erməni silahlı qüvvələri ***qovulacaq*** və Azərbaycan Respublikasının ərazi bütövlüyü təmin ***ediləcəkdir***. Biz nəyin bahasına olursa-olsun, bu məqsədə çatmalıyıq. Əmin olun ki, həyatımın son dəqiqəsinə qədər, son nəfəsimədək bu yoldan ***dönməyəcəyəm***" [Ic.s.187].

Felin qəti gələcək zamanı yuxarıdakı parçada hərəkətin icrasının zəruriliyini ifadə edən vacib şəkli ilə birgə işlənir.

*İb (-ib, -ub, -üb)* şəkilçisi vasitəsi ilə düzələ bilir.[2]

"Bu müddətdə minlərlə həmvətənimiz həlak ***olub***. Onların çoxu döyüşərək, cəsarət, qəhrəmanlıq göstərərək, xalqına, torpağına sədaqətli olaraq dünyasını ***tərk edib***" [Ic.s.149].

Heydər Əliyev nitqində nəqli keçmiş Azərbaycan xalqının Vətən yolunda göstərdikləri mübarizəni nəql edir.

Heydər Əliyev nitqində keçmiş zamanın şühudi və nəqli formaları özünəməxsus çalarlar qazanır: "Qeyd etdim ki, Azərbaycanda bir milyon nəfərdən çox qaçqın var. Son vaxt-

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

[2] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

lar onların sayı artıb. Qaçqınların bir hissəsi İmişli rayonunun ərazisində yerləşdirilib, İran İslam Cümhuriyyətindən oraya yardım, çadırlar və sair şeylər göndərilib. Qaçqınların bir hissəsi başqa rayonlarda yerləşdirilib, bir hissəsi də Bakıya gəlib, onların hamısına mütləq qayğı göstərilməlidir. Lakin lazımi qayğı yoxdur. Mən yenə də əlli il bundan əvvəlki müharibəni yada salıram. O vaxtlar Sovetlər İttifaqı ərazisinin xeyli hissəsi faşist qoşunları tərəfindən zəbt ***edilmişdir***. Çox adam öz yerlərini tərk etmiş, qaçqın vəziyyətinə ***düşmüşdü***. Ancaq o vaxtlar həmin adamları ayrı-ayrı ailələr öz himayəsinə götürürdülər" [Ic.s.236].

### *Qəti gələcək zaman*

Gələcəkdə icra olunacaq və ya olunmayacaq bir işlə onun haqqında indi xəbər verilən iş arasındakı zamana gələcək zaman deyilir. Yaxud gələcək zaman sonradan icra olunacaq və ya olunmayacaq bir işin əvvəlcədən xəbər verilməsindən ibarətdir. Qəti gələcək zaman Prezidentin andiçmə mərasimində (10 oktyabr 1993-cü il) daha çox istifadə olunmuşdur:

"And içirəm ki, Azərbaycan Respublikasının Konstitusiyası və qanunlarının həyata keçirilməsinin təminatçısı ***olacaq***, milliyətindən, dini etiqadından və siyasi əqidəsindən asılı olmayaraq Azərbaycan vətəndaşlarının hüquqlarının və azadlıqlarının qorunmasının, müdafiə edilməsinin təminatçısı ***olacağam***. Azərbaycan Respublikasında azadlığın, demokratik dəyişikliklərin, Azərbaycan Respublikasının demokratik, hüquqi dövlət kimi inkişaf etdirilməsinin təminatçısı ***olacağam***.

Əlimi Qurani-Şərifə basaraq and içirəm ki, Azərbaycan xalqının milli və mənəvi ənənələrinə daim ***sadiq olacaq*** və bu ənənələrin müstəqil dövlətimizdə bərqərar olmasını, yaşamasını və inkişaf etməsini ***təmin edəcəyəm***" [Ic.s.208].

Heydər Əliyevin nitqində "xatirimdədir" modal sözü felin keçmiş zamanı ilə çox gözəl harmoniya yaradır, bu modal

sözün arxasınca auditoriya böyük natiqə qoşularaq keçmişə qayıdır, nitq böyük həvəslə qəbul olunur.

Böyük natiqin dilində qəti gələcək zaman "güman edirəm ki," "əminəm ki" modal sözləri ilə başlayan cümlələrlə başlayır: "Güman edirəm ki, bizim bugünkü iqtisadiyyatımızda müəyyən dəyişiliklər ***olacaq***. Mən tam əminəm ki, biz mövcud istehsal fondlarından, istehsal imkanlarından, iqtisadi potensialdan səmərəli istifadə edərək, vəziyyətimizi xeyli ***yaxşılaşdıracağıq***" [IIc.s.119].

Heydər Əliyevin nitqlərində felin bütün zamanları yanaşı işlədilir. Bu da böyük natiqin zaman uzlaşmalarına ciddi diqqət yetirməyi ilə bağlıdır: "Azərbaycan heç bir ölkənin torpağına göz ***dikməmişdir***, heç vaxt qəsbkarlıq yoluna ***düşməyəcəkdir***, işğalçılığı, qəsbkarlığı həmişə ***pisləmişdir*** və bundan sonra da ***pisləyəcəkdir***" [IIc.s.51].

Müasir Azərbaycan dilində nəqli keçmişin ikinci və üçüncü bir başqa şəkli əlamətlə də ifadə olunur: yəni *-mış (-miş, -muş, müş)* şəkilçisinə müraciət etmədən, başqa şəkilçidən istifadə edərək ikinci və üçüncü şəxslər üzrə nəqli keçmişi ifadə etmək mümkün olur.

Qeyd etmək lazımdır ki, nəqli keçmişin bu ikinci şəkli təkcə müasir dilimizə deyil, klassiklərimizin dilinə də aiddir: yəni *-ıb (-ib, -ub, -üb)* şəkilçisi ilə felin nəqli keçmişinin ifadəsi dilimizə aid bütün bədii əsərlərdə müəyyən yer tutur:

Heydər Əliyevin nitqlərində bu tip keçmiş zaman şə kilçiləri çox işlənməsi ilə üslubi xüsusiyyət qazanır: "Azərbaycan xalqı əsrlər boyu öz milli azadlığı, müstəqilliyi uğrunda ***vuruşub, döyüşüb, mübarizə aparıb***, qurbanlar, ***şəhidlər verib***. Doğrudur, belə də olub ki, Azərbaycan müvəqqəti olaraq məğlubiyyətlərə ***uğrayıb***. Ancaq bütün bunlar müvəqqəti ***olub***. Bundan sonra Azərbaycan xalqı yenə də ayağa ***qalxıb, yüksəlib***, öz qamətini ***düzəldib***, yenə də öz müstəqilliyini,

azadlığını ***əldə edibdir.*** Güman edirəm ki, bundan sonra da ***edəcəkdir***" [IIc.s.49].

"Əmin ola bilərsiniz", "ümidvarıq ki" söz birləşmələri ilə başlayan cümlələr sonluqda qəti gələcək zamanla yekunlaşır: "Tam əmin ola bilərsiniz ki, İranla Azərbaycan arasındakı dostluq, qardaşlıq əlaqələrinin inkişaf etməsi üçün biz bütün səyləri ***göstərəcəyik***" [IIc.s.47].

Heydər Əliyevin qətiyyətli çıxışlarında felin vacib şəkli ilə qəti gələcək zaman çox vaxt birgə təsadüf olunur: "Biz başqa ölkələrin, xüsusən də Ermənistanın bir qarış da olsun torpağını istəmirik, ancaq öz torpaqlarımızın hamısını geri ***qaytarmalıyıq***. Bu, bizim müqəddəs vəzifəmizdir və bu yolla axıra qədər ***gedəcəyik***" [IIc.s.43].

Felin qəti gələcək zamanı gələcəyə tuşlanan nikbinliklə dolu çıxışlarda özünü bariz şəkildə göstərir: "***Ümidvar olmaq*** istədiyimi bildirirəm ki, işıqlı gün uzaqda deyil, Azərbaycan bu qaranlıqdan, bu bəladan ***çıxacaq***, xalqımız daha da ***ucalacaq*** və müstəqil Azərbaycan Respublikası dünya birliyində öz layiqli yerini ***tutacaqdır***" [IIc.s.13].

Felin əmr şəkli əmr, buyruq, sərəncam, xahiş, nəsihət, məsləhət, təklif, yalvarış və s. bildirir[1].

Böyük natiq öz dili ilə buraya arzu və istəyi də qoşur: "Mən həmin məqsədlərə çatmaq üçün bu müqəddəs yerlərdə dua etdim, öz arzularımı bildirdim.

O müqəddəs yerlərdə arzularımdan biri də bu oldu ki, vətən, torpaq yolunda, Azərbaycanın müstəqilliyi yolunda şəhid olanlara Allah bir daha rəhmət ***eləsin*** (Yerdən səslər: Amin). Bir arzum da bu oldu ki, şəhidlərin ailələrinə, qohum-əqrabasına Allah səbir ***versin***, onlara bundan sonra da edəcə-

---

[1] Azərbaycan dili. Qəbul imtahanlarına hazırlaşanlar, yuxarı sinif şagirdləri və müəllimlər üçün vəsait. Bakı, TQDK, 2013, 640 səh.

yimiz köməyin daha çox olmasına şərait ***yaratsın*** (Yerdən səslər: Amin). Mən o müqəddəs yerlərdə Allah-təaladan arzu etdim ki, Azərbaycan xalqını hifz ***etsin***, xalqımızın bundan sonra heç vaxt heç bir bəlaya düçar olmasına yol ***verməsin*** (Yerdən səslər: Amin). Azərbaycan xalqı öz ölkəsində, öz müstəqil dövlətində daim şən və firavan yaşaya ***bilsin*** (Yerdən səslər: Amin)" [IIc.s.83].

Felin şərt şəkli Heydər Əliyevin nitqində qəti gələcək zamanla birgə daha çox təsadüf edir. Qəti gələcək zaman sanki öncədən qoyulan şərtlərin ödənilməsini təmin edir: "Biz nə qədər bir ***olsaq***, bir-birimizin əllərindən nə qədər möhkəm ***tutsaq***, bir-birimizə nə qədər yaxın ***olsaq***, müstəqil Azərbaycanın yaşamasına o qədər çox ***nail olacaq***, xalqımız onun başına gələn bugünkü bəlalardan ***xilas olacaq***, torpaqlarımız Ermənistanın işğalından ***azad olacaq***, Azərbaycanda əsrlərdən-əsrlərə keçmiş milli, mənəvi dəyərlərimiz ***möhkəmlənəcək***, daha dərin ***kök salacaq***, ***inkişaf edəcək*** və Azərbaycan xalqı dünya xalqları içərisində ləyaqətli səviyyəyə ***qalxacaqdır***" [IIc.s.85]. Üç yerdə felin şərt şəkli işlənmişdir ki, bu şərtlərin yerinə yetiriləcəyi təqdirdə yeddi yerdə qəti gələcək zamanla auditoriyada inam yaradılır.

### *Felin vacib şəkli*

Elə bu şəklə dilçi alimlərimizin verdiyi tərif, – felin vacib şəklində hərəkətin icrasının zəruriliyi ifadə olunur – kifayət edər ki, Heydər Əliyevin nitqlərində bu şəklə çox yer verildiyi aydın olsun. Felin vacib şəkli böyük natiqin dilində həyatımızın bütün sahələrində, çıxışların bütün üslublarında tez-tez səslənir. Mədəniyyətimizin inkişafı ilə bağlı felin vacib şəkli mədəniyyət sahəsi işçilərini səfərbər edir: "Biz bütün bunları nəzərə alaraq Məhəmməd Füzulinin 500 illik yubileyinə hazırlıq işlərini layiqincə aparmalı və yüksək səviyyədə ***keçirməliyik***. Yubiley Komissiyasının vəzifəsi bundan ibarətdir. Gü-

man edirəm ki, komissiyanın hər bir üzvü bu vəzifəni həvəslə yerinə yetirəcəkdir. Bayaq dediyim kimi, biz bu gün hazırlanmış tədbirləri ***müzakirə etməli***, onların həyata keçirilməsi üçün lazımi ***tədbirlər görməli*** və bundan sonra aparılan işlərin planını və vaxtını müəyyən ***etməliyik***” [IIc.s.91].

Böyük natiqin dilində felin şərt şəkli qəti gələcək zamanla və felin əmr şəkli ilə çulğalaşaraq qətiyyətli dövlət başçısının – Heydər Əliyevin nitqini yaradır: “Başqa sahələrdə də işlərimiz çoxdur. Ona görə də kim bizə mane olmaq ***istəyirsə***, Azərbaycanın belə ağır vəziyyətində kimlərsə yenə öz şəxsi mənafeyi naminə hər hansı çirkin yolu tutmağa ***çalışırsa***, onların qarşısı ***alınacaqdır***. Odur ki, qoy heç kəs cürbəcür şayiələrə, Azərbaycanın əleyhinə olan hər cür məqalələrə ***fikir verməsin***” [IIc.s.111].

Vacib şəkil çox vaxt felin əmr şəkli ilə harmonik bir formada auditoriyaları səfərbər edir. Bu cür çulğalaşmalardan Heydər Əliyev xüsusilə müstəqilliklə, dövlətçiliklə bağlı çıxışlarında müvəffəqiyyətlə istifadə edir: “Bu ağır vəziyyətdən çixmaq üçün 1919-1920-ci illərdə Azərbaycan Demokratik Respublikasının fəaliyyətində olmuş proseslərdən hamımız ibrət dərsi ***götürməliyik***. Hamımız. Çünki o, bizim üçün çox əyani bir ibrət dərsidir və biz bunu mütləq ***etməliyik***. Azərbaycan müstəqilliyini təmin etmək üçün gərək öz daxili imkanlarını ***möhkəmləndirsin***. Gərək Azərbaycan xalqı daha da sıx ***birləşsin***, Azərbaycan xalqının vətənpərvərlik hissi ***yüksəlsin***. Vətənini müdafiə etmək, Vətən yolunda şəhid olmaq, Vətən naminə özünü fəda etmək duyğuları, hissləri indi bütün Azərbaycanda hökm ***sürməlidir***” [IIc.s.11]. Yuxarıda “ibrət dərsi götürməliyik”, “etməliyik”, “hökm sürməlidir” felin vacib şəkli “möhkəmləndirsin”, “birləşsin”, “yüksəlsin” şəklində əmr şəkli ilə harmoniya yaradır.

Felin vacib şəkli – felin bu şəkli böyük natiqin müxtəlif çeşidli auditoriyalarda ən çox istifadə etdiyi şəkillərdəndir.

Dövlətçiliklə bağlı felin vacib şəkli özünü tez-tez göstərir: "Yəni Azərbaycanda demokratiya prinsipləri bərqərar ***olmalı***, hər yerdə insan azadlığı təmin ***edilməli***, insan haqqları ***qorunmalı***, vicdan azadlığı, dil azadlığı təmin ***olunmalıdır***. Dinindən, dilindən, irqindən asılı olmayaraq Azərbaycanın bütün vətəndaşları eyni hüquqlara malikdirlər və bu hüquqlar ***qorunmalıdırlar***" [IIc.s.9].

Heydər Əliyevin nitqində qəti gələcək zamanın reallaşması felin şərt şəklindən keçir. Bu təfəkkür insanı olan Heydər Əliyevin nitqləri üçün xarakterikdir: "Mənim idrakım var, iradəm var və xalq mənə ümid ***bəsləyirsə***, xalq mənə bu səlahiyyəti ***vermişdirsə***, xalqı bu ağır vəziyyətdən çıxarmağı öhdəmə ***götürmüşəmsə***, ***güman edirəm ki***, xalq məni müdafiə ***edəcəkdir***" [Ic.s.98]. "Güman edirəm ki" modal sözü ilə qəti gələcək zamana – "müdafiə edəcəkdir" yönələn fikir şərt şəkillərindən keçir.

Felin vacib şəklində hərəkətin icrasının zəruriliyi ifadə olunur. Felin vacib şəkli xüsusi əlamətlə *-malı (-məli)* şəkilçisi ilə düzəlir.

Heydər Əliyev nitqində felin vacib şəkli müstəqilliyin ilk dövrlərində, ölkə iqtisadiyyatının ağır, böhranlı anlarında daha çox istifadə olunur. "Bu vəziyyətdən çıxmaq üçün şübhəsiz ki, birinci növbədə müharibəyə son ***qoyulmalıdır***. Bilirsiniz ki, bu sahədə biz ciddi addımlar atmışıq. Ancaq bunlar hələ nəticə verməyib, müharibə davam edir. Biz bundan sonra da lazımi tədbirlər görmək əzmindəyik. Müharibə nə qədər davam etsə, respublikanın iqtisadiyyatında olan bu vəziyyəti normal hala salmaq çox çətin olacaq" [Ic.s.445]. Felin vacib şəkli çox vaxt "şübhəsiz ki" modal sözü ilə müştərək işlənir. Vacib şəklinin köməyi ilə irəliyə sürülən qətiyyətli ifadələr bu modal söz ilə şübhəyə yer qoymur:

"Yenə də qeyd edirəm, vəziyyət ağırdır, çətindir. Bu da xalqın həyat səviyyəsinin aşağı düşməsinə gətirib çıxarmışdır,

əhalinin kasıblaşmasına səbəb olmuşdur. Ancaq respublikamızın daxili potensialı böyükdür. Bu potensialdan səmərəli istifadə ***olunsa***, vəziyyət tədricən ***yaxşılaşa bilər*** və ***yaxşılaşmalıdır***. Azərbaycan bu vəziyyətdən tədricən ***çıxa bilər*** və ***çıxmalıdır***" [Ic.s.445]. Azərbaycanın iqtisadi cəhətdən çətin vəziyyətdən çıxması "çıxmalıdır" felin vacib şəkli ilə ortaya qoyulur. Vacib şəklindən öncə gərəklilik və arzu şəkli işə düşür. "Çıxa bilər", "yaxşılaşa bilər" bunlardan da qabaq "ancaq" bağlayıcısının köməyi ilə ölkənin potensialı araşdırılır. Bu potensialdan şərt şəkli olan "istifadə olunsa" ortaya qoyulur, onun ardınca vacib şəklində qətiyyətli ifadələr gəlir.

Heydər Əliyevin ölkə problemləri ilə bağlı keçirdiyi müşavirələrdə çatışmazlıqlar və nöqsanların yaranma şərtlərini felin şərt şəkli vasitəsilə ortaya qoyur, sonda isə felin əmr şəkilləri ilə vəziyyətdən çıxmağın yollarını göstərir: "Hər halda, bu son üç ilin təcrübəsi onu göstərir ki, Nazirlər Kabinetinin işi yaxşı ***qurulsa***, biz iqtisadiyyatda çox şeylər əldə edə bilərik. Əgər biz bütün obyektiv səbəblərlə yanaşı, iqtisadiyyatda bir çox məsələri həll edə, vəzifələri yerinə yetirə ***bilməmişiksə*** və bəzi nöqsanları, gerilikləri aradan qaldıra ***bilməmişiksə*** bunun əsas səbəblərindən biri də Nazirlər Kabinetinin işi yaxşı təşkil ***edilsin***, ahəngdar, operativ ***olsun***" [VIIIc.s.78].

### *Felin arzu şəkli*

İşin icrasında gərəklik, arzu məzmunu bildirən felin arzu şəklil feldən əvvəl ***gərək***, ***barı, təki*** ədatları da əlavə edildikdə arzu məzmunu daha da güclənir:[1] "Ona görə də birinci növbədə Nazirlər kabinetinin işinin təşkilində ***gərək*** ciddi dəyişikliklər əmələ ***gəlsin***" [VIIIc.s.78].

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

Feli isim (məsdər) zaman və şəxslə əlaqədar olmayan, xüsusi -*maq*, -*mək* şəkilçiləri ilə yalnız fellərin adını göstərən felin təsriflənməyən formalarından biridir.[1] Heydər Əliyev felin bu formasından yeri gəldikcə geniş istifadə edir. Bəzən bir cümlədə çox sayda məsdər işlətmək və bu məsdərləri məntiqi ardıcıllıqla düzmək böyük natiqə xasdır: "Kəbəni ***görmək***, müqəddəs Qara Daşı ***öpmək***, ona ***toxunmaq***, onu ziyarət ***etmək***, Kəbənin içərisinə daxil ***olmaq***, orada namaz ***qılmaq***, dua ***etmək*** mənə nəsib oldu" [IIc.s.82].

Mədəniyyətimizlə bağlı felin vacib şəkli – həm təsdiqdə, həm inkarda, şərt şəkli və feli sifət birgə işlənilir: "Bütün bunlar nədən irəli gəlir və mən bu mövzuya nə üçün toxundum? Ona görə ki, mədəniyyətimizin bugünkü vəziyyəti ilə bağlı burada ***ürək ağrıdan*** sözlər deyilirdi. Bu, Vətənini sevən hər bir azərbaycanlını, o cümlədən məni qəlbən incidir. Mədəniyyət ocaqlarına başçılıq edən adamlar indiyədək yaradılanları daha da ***artırmalı***, əgər bunu ***bacarmırlarsa***, heç olmasa, qoruyub ***saxlamalıdırlar***" [IIc.s.101].

Mədəniyyətimizin qorunması ilə bağlı "ürək ağrıdan" feli sifət, "artırmalı və saxlamalı" felin vacib şəkli, eləcədə şərt şəkli kimi "bacarmırlarsa" bir yerdə auditoriyaları səfərbər edir.

Böyük natiqin dilində feli bağlama da öz yerini alır, felin digər şəkilləri və qəti gələcək zamanla harmoniya yaradır: Feli bağlama ilə yanaşı felin öncə şərt, sonra qəti gələcək zaman, nəhayətdə isə felin vacib şəkli ilə həllini tapmalı olan məsələ yekunlaşır: "Bilirsinizmi, əgər biz hamımız respublikanın qayğısı ilə ***yaşayırıqsa***, hər birimiz onu bu ağır vəziyyətdən çıxarmaq ***istəyiriksə***, onda hərə öz sahəsində bütün imkanlardan istifadə ***edərək***, var qüvvə ilə səy ***göstərərək***, bütün bilik və təcrübəsini səfərbərliyə ***alaraq*** müəyyən bir iş ***görməlidir*** ki, ümumi işimiz ***irəliləsin***. Belə ehtiyat mənbələri var. Buna

[1] Yenə orada

görə də ümidvaram ki, bugünkü müşavirəmizdən sonra müəssisə, şirkət, birlik rəhbərləri, nazirlər öz işlərindəki nöqsanları aradan ***qaldıracaq*** və lazımi tədbirlər ***görəcəklər***. Bunun üçün Nazirlər Kabineti də öz fəaliyyətini ***gücləndirməli***, işini ***təkmilləşdirməlidir***" [IIc.s.117].

Felin təsriflənməyən formalarından sayılan feli isimlər Heydər Əliyevin nitqlərində tez-tez istifadə olunur. Və bu istifadə müxtəlif auditoriyalarda özünü göstərir. 6noyabr 1996-cı ildə Türk Dünyası yazıçılarının III qurultayında feli isimlərə çox yer verilir: "Amma eyni zamanda xalqlarımızın böyük tarixini yenidən ***təhlil etmək***, yenidən ***qiymətləndirmək***, ona düzgün, ədalətli ***qiymət vermək*** və hər bir xalqın tarix boyu yaratdığı mənəvi dəyərləri, ədəbiyyat, mədəniyyət abidələrini bütün xalqlar üçün *doğma etmək* bizim bu görüşlərin mərkəzində duran prinsiplərdir, vəzifələrdir. Bu sahədə yenə də mədəniyyətin, ədəbiyyatın, yazıçıların rolu böyükdür" [VIIIc.s.10].

İsimlər kimi hallanmaq xüsusiyyətini feli isimlər böyük natiqin nitqlərində də göstərir: "Ümumiyətlə, türkdilli ölkələrin dövlət başçılarının görüşlərinin əsas məqsədi iqtisadi əməkdaşlığı ***inkişaf etdirməkdən***, ölkələrimiz arasında olan bütün başqa əlaqələri ***genişləndirməkdən*** ibarətdir" [VIIIc.s.17].

Aşağıdakı cümlədə isə beş yerdə feli isim adlıq halda, bir yerdə isə isimin çıxışlıq halında verilmişdir: "Belə bir şəraitdə, şübhəsiz ki, bütün fəaliyyətimizin əsas hissəsi Azərbaycanı bu ağır vəziyyətdən ***çıxarmaq***, ölkəmizin ərazi bütövlüyünü ***bərpa etmək***, işğal olunmuş torpaqlarımızı ***azad etmək***, yerindən-yurdundan *didərgin düşmüş* vətəndaşlarımızı öz *evlərinə, ellərinə-obalarına* ***qaytarmaq*** və bununla yanaşı, iqtisadi islahatları ***həyata keçirmək***, əhalinin sosial-iqtisadi vəziyyətini ***yaxşılaşdırmaqdan*** ibarətdir" [VIIIc.s.17].

Böyük natiqin nitqində təkcə bu cümlədə feli isimlərin köməyi ilə qarşıya qoyulan məsələlər məntiqi ardıcıllıqla düzülmüşdür. Ağır vəziyyətdən çıxmaq – sonda sosial-iqtisadi

vəziyyətini yaxşılaşdırmaq. "Şübhəsiz ki" modal sözü ilə başlayan cümlədə ortada feli sifətdən (didərgin düşmüş) və sinonim cərgədən (evlərinə, ellərinə-obalarına) istifadə etməklə cümlə – mətn vəhdətini yaratmışdır.

Feli bağlama da bir nitq vahidi kimi böyük natiqin çıxışlarında az təsadüf etmir: "İndi hansı düzdür, hansı əyridir, mən bilmirəm, bizə gələn məlumatlar belə idi, ancaq sual verən də belə dedi. Ona görə mən hesab etdim ki, bu gün kimin nə sözü var qoy hamısı lentə yazılsın ki, sonra daha heç kəs heç nəyi dəyişdirə bilməsin, inkar eləyə bilməsin" [Ic.s.72].

Hal-vəziyyət bildirən feli bağlamalara böyük natiqin nitqində tez-tez təsadüf olunur: "Verilən məlumatlara görə sərgidə çoxsaylı iş adamları iştirak edirlər. Şübhə etmirəm ki, onlar bu sərgidə iştirak ***edərkən***, bir-biri ilə ***görüşərkən***, sərgidə nümayiş etdirilən eksponatlarla tanış ***olarkən*** yeni-yeni işgüzar əlaqələr yaradacaqlar" [VIIc.s.270].

Qeyri-qəti gələcək, indiki və nəqli keçmiş zaman şəkilçiləri ilə "ikən" ədatından əmələ gəlmiş *-arkən (-ərkən); -ırkən (-irkən, -urkən, -ürkən); -mışkən (-mişkən, -muşkən, -müşkən)* şəkilçilərini fel köklərinə əlavə etdikdə zaman və hal-vəziyyət məzmunu ifadə edən feli bağlamalar əmələ gəlir:[1] "Qeyd edim ki, müşavirəni ***başlayarkən*** mən bu proseslərin gedişi haqqında və qarşımıza çıxan məsələlərə baxışımız haqqında geniş məlumat verdim" [Ic.s.76].

Başqa bir məqamda böyük natiq əlaqə qurarkən feli bağlamadan da tez-tez istifadə edir: "Ona görə də biz yeni mərhələdə xarici neft şirkətləri ilə əlaqə ***qurarkən*** bu əsas məsələni unutmamalıyıq" [Ic.s.86].

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

Zaman və hal-vəziyyət məzmunu ifadə edən feli bağlamalardan böyük natiq tez-tez istifadə edir: “Bu gün mən sizinlə ***görüşərkən***, biz məktəblərdə yeni dərs ilinin başlanması gününü bir yerdə ***qeyd edərkən*** düşünürəm ki, o çadır şəhərciklərimizdə qurulan məktəblərdə də insanlar, balalarımız sinfə girirlər, dərslərə başlayırlar” [VIIc.s.266].

Felin bu təsriflənməyən forması böyük natiqin dilində əsasən insanlara yönəlir: “Ona görə də bu gün türk dünyası yazıçılarının III qurultayında mən bütün xalqlarımızın bütün dövrlərdə ***yaşayıb-yaratmış*** yazıçılarına və bu gün həyatımızda ***yaşayıb-yaradan*** yazıçılara təşəkkürümü, minnətdarlığımı bildirirəm” [VIIIc.s.10].

Dilçilikdə feli sifətlərə, feli bağlamalara son illər xüsusi yer ayrılır[1] ki, bunlar böyük natiqin nitqində yüksək nitq ustalığı ilə öz əksini tapır.

Feli sifətlər Heydər Əliyevin nitqində görkəmli şəxsləri xarakterizə etmək baxımından maraqlıdır. 30 avqust 1996-cı ildə Respublika Sarayında görkəmli Azərbaycan şairi Əliağa Vahidin anadan olmasının 100 illik yubiley gecəsindəki çıxışda olduğu kimi: “Yenə də deyirəm, o qədər ağır vəziyyətdə ***yaşayan***, o qədər çətinliklər ***keçirmiş***, ***qayğısız, diqqətsiz qalmış*** insan gərək dünyadan küsəydi, nə gələcək, nə də başqa şey haqqında düşünməyəydi. Amma görün nə qədər gözəl sözlər deyib” [VIIc.s.258].

Bu nitq parçasında “yaşayan insan”, “çətinliklər keçirmiş insan”, “qayğısız qalmış insan”, “diqqətsiz qalmış insan” kimi feli sifətlərdən istifadə olunmuşdur. Və bu feli sifətlər *-an (-ən),* eləcədə *-mış (-miş, -muş, -müş)* şəkilçiləri vasitəsilə düzəlmişdir.

---

[1] Bağırova Sevinc. İngilis və Azərbaycan dillərində feli sifətlərin müqayisəli xarakteristikası və bəzi qrammatik xüsusiyyətləri. №2, 2008. s. 121.

Feli sifət böyük natiqin dilində insanların xarakterini açmağa kömək edən felin təsriflənməyən formalarından biridir: "O cümlədən müəllimlərimiz də. Ancaq müəllim, həqiqi müəllim adını daşıyan insan həmişə, tarixin ən çətin dövrlərində dəyanətli, dözümlü olubdur və öz mənəviyyatını hər şeydən yüksək tutubdur" [VIIc.s.262].

Digər feli sifətlərlə vətəndaşlarımızın bir hissəsi düşdüyü vəziyyətə görə xarakterizə *olunur*: "Ümumiyyətlə, yerindən-yurdundan didərgin düşmüş, qaçqın və köçkün vəziyyətində yaşayan vətəndaşlarımızın hamısına bir daha hörmət və ehtiramımı bildirirəm" [VIIc.s.267].

Felin təsriflənməyən forması olan feli sifətdən böyük natiqin dilində əsasən insanları xarakterizə etmək üçün istifadə olunur: "Ancaq məlumdur ki, yerindən-yurdundan didərgin ***düşmüş***, var-yoxunu itirmiş insanlar ağır şəraitdə – həm mənəvi, həm də maddi çətinliklər içərisində yaşayırlar" [VIIc.s.271].

Əksər təsadüflərdə 3-4 cümlədə felin şəkillərini, təsriflənməyən formalarını modal sözlərlə bəzənmiş qəti gələcək zamanın hamısını görmək mümkündür: "Yəni mən həmişəki kimi, indi də bəzi mənfi halları burada ***yada salaraq***, bununla əlaqədar öz fikrimi, ***tələblərimi deyərək***, əvvəllər olduğu kimi, yenə də tam nikbinəm və hesab edirəm ki, xalqımız dəyanətli, dözümlü xalqdır, əsrlərlə böyük ***çətinliklərdən keçərək yaşamış***, ***yaşayan*** xalqdır. Biz bu çətin mərhələni də ***yaşayacağıq***, bundan da keçib ***gedəcəyik***. Azərbaycanın iqtisadi potensialı, geopolitik – coğrafi vəziyyəti respublikamız, xalqımız üçün *böyük, gözəl, xoşbəxt* gələcək təmin edir. Güman edirəm ki, biz bu gələcəyi ***görəcəyik***" [IIc.s.124].Feli bağlamalar ("yada salaraq", "tələblərimi deyərək", "çətinliklərdən keçərək"), feli sifətlər ("yaşamış xalq", "yaşayan xalq"), qəti gələcək zaman ("yaşayacağıq", "keçib gedəcəyik") sinonim cərgə ilə – böyük, gözəl, xoşbəxt gələcəklə – çulğalaşır.

Əsas nitq hissələri arasında mühüm yer tutan fel Heydər Əliyevin nitqində araşdırılmaq baxımından çox vacibdir.

Felin bütün parametrlərini – quruluşca növlərini, kateqoriyalarını (növ, zaman, şəxs), təsriflənən (felin zaman, şəxs və şəkil əlamətlərinə görə dəyişməsi) və təsriflənməyən formalarını (feli isim (məsdər), feli sifət, feli bağlama) – böyük natiqin çıxışlarında araşdırmaq diqqətəlayiqdir.

Heydər Əliyevin 30 oktyabr 1997-ci ildə Prezident Sarayında Azərbaycan Yazıçılarının X qurultayındakı nitqində yuxarıdakı parametrləri işıqlandırmaq fikrinə düşdük. Öncə felin növ kateqoriyasını bu çıxışda araşdırdıq. Müasir Azərbaycan dilində felin növləri aşağıdakılardan ibarətdir: 1) məlum növ; 2) məchul (passiv); 3) qayıdış; 4) qarşılıqlı; 5) müştərək; 6) icbar.

Məlum növ böyük natiqin dilində bütün çıxış boyu səslənir: "Çünki bizim xalqımız birincisi, öz istedadına görə şair, yazıçı, söz ustası olubdur. İkincisi, bizim xalqımız çoxəsrlik tarixində böyük şairlər, yazıçılar, mütəfəkkirlər yetişdiribdir" [XIIIc.s.97].

Məlum növün təmsil olunduğu cümlələr Heydər Əliyevin nitqində ardıcıllıqla düzülür: "Məhəmməd Füzuli xalqların keçdiyi tarixi yolu təhlil edərək çox yüksək fəlsəfi ümumi bəşəri fikirləri, dəyərləri öz əsərlərində ***əks etdirmişdir***. O, yaşadığı dövrdə gedən ictimai-siyasi prosesləri, insan cəmiyyətini, insan həyatını təhlil edərək insanlar, cəmiyyət üçün ölməz fikirlər söyləmiş, ölməz ***tövsiyələr vermişdir***. Onun əsərlərinin hamısı insanı, cəmiyyəti, insanların bir-birinə münasibətini, insanlarda bütün müsbət keyfiyyətləri tərənnüm etməkdən, insanlarda, cəmiyyətdə olan mənfi hallara öz etirazını, nifrətini bildirməkdən ***ibarət olmuşdur***" [VIIIc.s.25].

İşi görən məlum növ feldə qrammatik cəhətdən məlumdur ki, bu böyük natiqin dilində III şəxsin təki və cəminin hallan-

ması ilə həyata keçirilir. Yuxarıdakı cümlələrdə "o", "onun" əvəzlikləri ilə Füzulinin Azərbaycan ədəbiyyatındakı rolu necə deyərlər, məlum olur.

Bu fel forması tariximizin, keçmişimizin bu günə çatdırılmasında Heydər Əliyevin nitqlərində mühümdür.

Məlum növ fellər subyektin (iş görənin) müstəqil söz şəklində cümlədə iştirak edib-etməməsindən asılı olmayaraq, görülən işə qarşı münasibətinin fəal olduğunu, yəni işin icrasında subyektin fəal iştirakı ilə zahirdə olmasını, yaxud istənilən zaman zahirə çıxa bilməsini göstərir.[1]

"Mən fəxr edirəm ki, türk dillərinə mənsub olan Azərbaycan dili bu qədər zəngindir, bu qədər bədii ifadələrlə doludur və biz həyatın bütün sahələrinə aid olan fikirlərimizi öz ana dilimizdə ifadə ***edə bilirik***. Burada mən Azərbaycan yazıçılarının, dilçilərinin, ədəbiyyatşünaslarının xidmətlərini xüsusi ***qeyd edirəm***" [VIIIc.s.10].

Heydər Əliyevin nitqində felin məchul növü məlum növü ilə birgə təsadüf edir: "Burada çıxışların çoxunda keçmiş qurultaylar və o qurultayda deyilən sözlər, baş vermiş hadisələr ***xatırlandı***. Mən də onları ***xatırlayıram***" [XIIIc.s.98].

Təbii ki, böyük natiqin dilində məlum növ məchul növlə müqayisədə üstünlük təşkil edir.

Heydər Əliyevin nitqlərində felin növləri və şəkilləri ardıcıllıqla düzülür: "Burada fondun yaradılması haqqında da fikir ***söyləndi***. Bir neçə ildir ki belə təkliflər ***alıram*** ki, bir fond yaransın – "Heydər Əliyev fondu" – və bu fonddan mədəniyyətin, istedadlı adamların, ədəbiyyatın inkişafına və başqa sahələrə yardım üçün istifadə ***olunsun***" [XIIIc.s.119].

Felin bu növündə subyektin felə qarşı münasibəti göstərilir, subyektin heç bir obyekt üzərinə təsiri olmur.

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

Fellərin qarşılıqlı növündə iştirak edən şəxsin kəmiyyəti heç bir rol oynamır, yəni fellərin şəxsinin çoxluğu və ya azlığı onun qarşılıqlı məna daşıyıb-daşımamasını həll etmir: "Çox sevindirici haldır ki, məhz o vaxt, o çətin zamanda, dövrdə siz yazıçılar öz sənətinizə sadiq qalaraq o qurultaya ***toplaşmışdınız***" [XIIIc.s.102].

Müstəqil mənaya malik sadə fel köklərinə *-ış (-iş, -uş, üş); -aş (-əş);* şəkilçiləri əlavə olunmaqla qarşılıqlı növdən olan fellər əmələ gətirilir. Bu qarşılıqlı növ fellər içərisində Heydər Əliyevin nitqində ən çox görüş işlədilir: "Mən Naxçıvanda ağır bir dövrdə yaşadığım zaman onunla ***görüşmüşdüm***. O, oraya "literaturnaya qazeta" üçün məndən müsahibə almağa ***gəlmişdi***" [XIIIc.s.102].

Felin icbar növü – felin bu növündə işin icrası bilavasitə birinci subyektə aid olmur. İşi birinci subyektin ya xahişi, ya əmri, ya da tapşırığı ilə başqası icra edir, lakin işin həqiqi icraçısı subyekt kimi zahirə çıxa bilmir:[1]

"Mən bundan sonra ürəkləndim, dedim ki, əgər belədirsə, pis olmaz, gedim görüm yazıçılar necədirlər. Gəldim. Bunu burada ***xatırlatdılar*** – siz məni hörmətlə rəyasət heyətinə dəvət etdiniz" [XIIIc.s.103].

Başqa bir nitq məqamında "işlətmək" icbar növ ortaya çıxır: "Amma eyni zamanda onların özlərinin xüsusi mütəxəssisləri var, onları buraya gətirməli, ***işlətməlidirlər***, bunsuz öz işlərini apara bilməzlər" [XIIIc.s.103].

Kadrlar qarşısında vəzifələr qoymaq və bu vəzifələrin yerinə yetirilməsi yolunda icbari üsulların tətbiq olunduğu prezident idarə üsulunda Heydər Əliyevin nitqlərində felin icbar növü heç də az işlənmir.

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

Felin şərt şəkli – felin bu şəkli işin icra olunub-olunmamasını müəyyən şərtə bağlayır: "Çünki, bu respublikalar bir-birilə çox bağlıdırlar. Əgər bunlar ***ayrılsalar***, bu iqtisadi əlaqələr ***pozulsa***, bu respublikalar müstəqil yaşaya bilməyəcəklər" [XIIIc.s.106].

Bir cümlədə iki yerdə şərt şəklinin işlənməsi yenə də böyük natiqin nitqinin zənginliyinə bir işarədir. Felin şərt şəklinin inkarı da Heydər Əliyevin nitqində eyni qayda ilə gözlənilir: "Şübhəsiz ki, indi Azərbaycanın iqtisadi potensialı, ərazisi, təbii sərvətləri, başqa imkanları ***olmasaydı***, müstəqil yaşaya bilməzdi" [XIIIc.s.106].

Heydər Əliyevin nitqində felin şərt şəkli auditoriyanın gözlədiyi əsas fikri, ana fikri qabaqlayır: "Əgər indi bu şirkətlərdə 15 min azərbaycanlı ***işləyirsə***, onların hər biri bizim başqa yerlərdə olan maaşa nisbətən yüksək maaş ***alırsa***, bu, insanların həyat səviyyəsini nə qədər artırır" [XIIIc.s.117].

Felin şərt şəkli ilə qəti gələcək zaman arasında nitq əlaqəsi və bu zaman şərt bağlayıcılarının da nitq prosesinə qoşulması Heydər Əliyevin nitqində belə bir sxem yaratmağa imkan verir: şərt bağlayıcısı – felin şərt şəkli – felin qəti gələcək zamanı: "Təsəvvür edin, əgər işğal olunmuş altı rayon azad ***edilsə***, insanlar oraya ***qayıtsa***, orada həyat ***başlasa***, bu, ümumiyyətlə, məsələnin həlli üçün böyük bir hadisə olacaqdır. Ondan sonra ikinci mərhələni həll edə ***bilsək***, bu, tamamilə məsələnin sülh yolu ilə həllinə gətirib ***çıxaracaqdır***" [XIIIc.s.123].

Felin vacib şəkli – bu şəkildə hərəkətin icrasının zəruriliyi ifadə olunur. Məsuliyyətli dövlət başçısı kimi Heydər Əliyevin nitqlərində felin vacib şəkli əsas yer tutur. Ölkə həyatının ciddi məqamları üçün vacib və əmr şəkilləri işə düşür: "Türk əsgəri 74 illik cümhuriyyət içində, hürriyyət içində, demokratiya içində yenilməzdir. Biz bundan ***öyrənməliyik***, bu örnəkdən də istifadə ***etməliyik***. Azərbaycanın əsgəri də elə ***olmalıdır***. Yenə də deyirəm ki, bizim dost, qardaş ölkənin or-

dusunda olan qanun-qaydaya, intizama, orada Türkiyə Cümhuriyyətinə, Türkiyənin bayrağına, Türkiyənin Konstitusiyasına olan sədaqətə ***baxın***" [XIIIc.s.132].

Heydər Əliyevin nitqlərinin bir mühüm gözəlliyi və məziyyəti ondadır ki, bu nitqin vasitəsilə orta və ali məktəblərdə Azərbaycan dilini tədris etmək çox asan və məqsədə uyğundur: "Biz bu gün də bu bayramı belə şən əhval-ruhiyyədə, gözəl, çox yüksək səviyyədə ***qeyd edərkən*** dünyasını ***dəyişmiş*** əzizlərimizi, Vətən, torpaq yolunda canlarını qurban ***vermiş*** şəhidlərimizi xatırlayırıq. Bu gün buraya ***toplaşan***, Gülüstan Sarayının bu salonunda bu bayramı ***qeyd edən*** balalarımızın bir çoxunun valideynləri Vətən, torpaq yolunda şəhid olublar. Biz onların xatirəsini xüsusi yad edirik. Güman edirəm ki, bu gün sizin belə şən, gözəl, xoşbəxt, ***çalan***, ***oxuyan*** əhval-ruhiyyəniz dünyasını ***dəyişmiş*** bütün şəhidlərin hamısının ruhunu şad edir. Mən bu gün bu bayrama, yəni sizin yanınıza, bu bayramı sizinlə birlikdə ***qeyd etməyə*** çox yüksək hisslərlə gəlmişəm" [IXc.s.35]. Fel bölməsinin tədrisində yuxarıdakı nitq parçasında "qeyd edərkən", "dünyasını dəyişmiş", "qurban vermiş", "toplaşan", "qeyd edən" feli bağlamaları, "çalan", "oxuyan" feli sifətləri, "qeyd etməyə" feli isimi yığcam şəkildə oxuculara çatdırmaq mümkündür.

Heydər Əliyevin təkcə bu nitqi feli bağlamalarla zəngindir: "Ancaq biz tariximizin qədim dövrlərini ***xatırlayarkən***, yaxud onları cəmiyyətə, dünyaya daha geniş çatdırmaq ***istəyərkən***, birinci növbədə və bəzən də yalnız mədəniyyətimizə, mədəniyyət, ədəbiyyat xadimlərinin yaratdığı əsərlərə, tarixi-memarlıq abidələrimizə və böyük şairlərimizin, mütəfəkkirlərimizin yazdığı əsərlərə istinad edirik" [XIIIc.s.97].

Qeyri-qəti gələcək, indiki və nəqli keçmiş şəkilçiləri ilə "ikən" ədatından əmələ gəlmiş zaman və hal-vəziyyət məzmunu ifadə edən feli bağlamalar əmələ gəlir.

Feli bağlamaların *-araq (-ərək)* şəkilçiləri vasitəsilə tərzi-hərəkət, hal-vəziyyət, bəzən də səbəb məzmunu ifadə edən feli bağlamalar yaradır: "Biz Nizaminin, Xaqaninin, Nəsiminin, Füzulinin adların böyük iftixar hissi ilə çəkirik və onların əsərlərini ***oxuyaraq*** xalqımızın nə qədər dahi, müdrik və istedadlı xalq olduğunu bir daha dərk edirik" [XIIIc.s.98].

Heydər Əliyevin özünəməxsus nitq fenomenliyi feli bağlamaların işləndiyi çıxışlarda bir daha üzə çıxır: "O zaman mən Azərbaycanın rəhbəri deyildim, başqa vəzifələr tuturdum, ancaq yazıçıların qurultayını daim izləyirdim və ***imkan olanda gəlib*** salonda ***oturub*** yazıçıları dinləyirdim" [XIIIc.s.99]. Yuxardakı cümlədə "imkan olanda", "gəlib" və "oturub" üç feli bağlama birgə işlənərək nitqə xüsusi əlvanlıq verir.

Böyük natiqin ən çox işlətdiyi bir feli bağlama var ki, bu da "məsuliyyəti dərk edərək" feli bağlamasıdır: "Mən o ***məsuliyyəti dərk edərək***, o vəzifəni layiqincə yerinə yetirməyə ***çalışaraq***, həmişə hesab etmişəm, bu gün də hesab edirəm ki, ədəbiyyata, mədəniyyətə diqqət yetirmək, qayğı göstərmək lazımdır, ədəbiyyatdan, mədəniyyətdən həyatın başqa sahələrində işin müvəffəqiyyətlə həyata keçirilməsi üçün istifadə etmək lazımdır" [XIIIc.s.100].

### *Feli bağlama*

Böyük natiqin dilində *-araq (-ərək)* şəkilçisi vasitəsilə tərzi-hərəkət, hal-vəziyyət, bəzən də səbəb məzmunu ifadə edən feli bağlamalar əmələ gəlir: "Xarici ölkələrin nümayəndələri də bizim dili ***bilməyərək***, sadəcə onu ***eşidərək***, dəfələrlə mənə deyiblər ki, sizin nə qədər gözəl diliniz var!" [XIIIc.s.135].

Əksər hallarda bir cümlənin özündə belə bir neçə feli bağlama işlənir: "Bu gün biz azad, müstəqil ölkəmizdə ***yaşayarkən*** keçmiş nəsillərə minnətdar olmalıyıq, bizdən qabaq ***yaşamış***, ***yaratmış*** insanlara daim minnətdarlığımızı bildirməliyik" [IXc.s.21]. Təkcə bu bir cümlədə "yaşayarkən", "yaşa-

mış", "yaratmış" feli bağlamalar, "olmalıyıq", "bildirməliyik" felin vacib şəkli harmonik şəkildə birləşərək gözəl nitq nümunəsi yaradır.

Zaman bildirən -*andan, -əndən* şəkilçisi ilə yaranan feli bağlamalara da böyük natiqin nitqlərində tez-tez rast gəlirik: "Birincisi, şəxsən mən ədəbiyyatı çox sevən adamam və gənc vaxtlarımdan, hətta uşaqlıqdan, məktəbdə ilk ədəbiyyat nümunələrini ***oxuyandan*** ədəbiyyatı sevmişəm" [XIIIc.s.99].

Feli isim (məsdər) də böyük natiqin nitqlərini tərk etmir: "Bizim borcumuz bunu (müstəqilliyi – red.) ***möhkəmləndirmək***, yenilməz ***etmək***, əbədi, dəyişməz etməkdir. Biz müstəqilliyimizi yenidən əldən verə bilmərik. Ona görə də dövlətimizi möhkəm ***qurmaq***, ölkəmizi ***qorumaq***, ***saxlamaq***, hər bir vətəndaşı vətənə ***sadiq etmək*** bizim borcumuzdur" [XIIIc.s.131].

Qəti-gələcək zaman işin gələcəkdə icra olunub-olunmayacağını indi qətiyyətlə xəbər vermək deməkdir. Bunun şəkli əlaməti -*acaq (-əcək)* şəkilçisidir. Qəti gələcək zaman qətiyyətli dövlət başçısı Heydər Əliyevin müxtəlif çeşidli auditoriyalardakı çıxışlarında özünü göstərir: "Bizim iqtisadi islahatlarımız və gördüyümüz dünya miqyaslı qlobal işlərimiz bir neçə vaxtdan, qısa müddətdən sonra iqtisadiyyatımıza böyük dəyişikliklər ***gətirəcəkdir***. Onda bizim ədəbiyyata, mədəniyyətə olan qayğımızı da artırmağa imkanımız ***olacaqdır***. Ancaq yenə də deyirəm, indiki mövcud şəraitdə də əlimizdə olan imkanlardan ***istifadə edəcəyik***" [XIIIc.s.118].

Keçmiş zaman – Azərbaycan dilində -mış (-miş, -muş, müş) şəkilçisi ilə ifadə olunan və "uzaq keçmiş" adlanan fellərə Heydər Əliyevin nitqində az təsadüf olunmur: "Biz o quruluşda, o həyatda, o dövlətdə, o şəraitdə yaşamışıq, ***təhsil almışıq, böyümüşük*** və respublikamızı, xalqımızı ***yaşatmışıq***" [XIIIc.s.101].

Hal-vəziyyət felləri: “Sevinmək” – Mən bugünkü görüşümüzdən ***məmnunam*** və ***sevinirəm***. Çünki gənclərimizlə görüşürəm. Gənclər xalqımızın, millətimizin, ölkəmizin gələcəyidirlər [IXc.s.113].

Həm zaman, həm hal-vəziyyət, həm də davamiyyət məzmunu bildirən *-dıqca (-dikcə, -duqca, -dükcə)* şəkilçisi ilə işlənmiş feli bağlamalar[1] böyük natiqin nitqində yerli-yerində işlənir: “Azərbaycan televiziyası bir neçə gündür ki, respublikamızın müxtəlif şəhərlərində, qəsəbələrində, kəndlərində, ayrı-ayrı yerlərdə Novruz bayramı ərəfəsində keçirilən tədbirləri nümayiş etdirir, göstərir. Onlara ***baxdıqca***, insanların üzlərində olan təbəssümü, gülüşü ***gördükcə***, adamları ***dinlədikcə*** düşünürsən ki, həyatımızda nə qədər böyük dəyişikliklər baş veribdir!” [IXc.s.39].

Felin arzu şəkli işin icrasında gərəklik, arzu məzmunu bildirir: Bu şəkil Heydər Əliyevin məişət üslublu çıxışlarında tez-tez səslənir: “Elə bir şey deyil ki, bu barədə geniş ***danışım***. Geniş danışsam, gərək sizinlə beş saat söhbət ***edək***. Ona görə də vaxtınızı belə şeylərə itirməyin” [VIIIc.s.38].

Felin bu şəkli böyük natiqin çıxışlarında müxtəlif auditoriyalarda buyuruq, öyüd, nəsihət şəklində səslənir 1 iyul 1996-cı ildə Bonn şəhərində Almaniyadakı Azərbaycan cəmiyyətləri federasiyasının nümayəndələri ilə görüşdəki çıxış kimi: “Mən arzu edirəm ki, bu federasiyanız səmərəli işləsin, günügündən möhkəmlənsin və öz təsirini başqa ölkələrə də yaysın, göstərsin. Biz də çalışacağıq ki, yaranmış belə federasiyalarla bilavasitə əlaqə ***saxlayaq*** və sizə əlimizdən gələn ***köməyi edək***, Azərbaycan həqiqətini dünyaya sizinlə birlikdə bəyan edək” [VIIc.s.18].

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, “Şərq-Qərb”, 2007. səh. 280.

### *Felin lüğəvi mənaları*

Təbii ki, Heydər Əliyevin nitqlərində fellər leksik məna baxımından ayrıca yox, frazeoloji birləşmələrin tərkibində daha çox işlədilir. Böyük natiqin nitqlərinin əsasında təfəkkür felləri və nitq felləri mühüm yer tutur.

"Demək" – nitq feli Heydər Əliyevin bütün nitq və çıxışlarında tez-tez səslənir.

"Ona görə də mən neft sənayesinin burada iştirak edən nümayəndələrinə, alimlərimizə və ümumiyyətlə, bütün neftçilərə ***demək*** istəyirəm ki, Azərbaycan neftçiləri öz əməyi, bacarığı, sənətinə sadiqliyi ilə bütün dünyada şöhrət tapıblar" [Ic.s.85].

Başqa bir çıxış məqamında "açıq demək lazımdır" səmimi ifadənin içində bu nitq feli işə düşür: "Açıq ***demək*** lazımdır, neft bəzi rəhbərlərin əlində yalnız kommersiya vasitəsinə çevrilib, beləları ancaq öz mənfəətlərini güdür" [Ic.s.85].

Heydər Əliyevin nitqlərinin əsasında təfəkkür və nitq felləri tez-tez birgə təsadüf edir ki, bu da təfəkkür və nitq proseslərinin vəhdətindən xəbər verir: "Mən bu çıxışımda heç də cəbhədə vəziyyət, yəni Ermənistanla Azərbaycan arasında olan müharibə vəziyyəti haqqında geniş ***danışmaq*** istəmirəm, ona ***təhlil vermək*** istəmirəm, bu barədə əvvəlki çıxışlarımızda və Milli Məclisin iclaslarında bəzi sözlər deyilibdir" [Ic.s.90].

"Hiss etmək" – "Bu gün də, gecənin bu vədəsində qadınların burada olmasını, hətta qucağında körpə ilə buraya gəlmələrini görəndə xalqımızın necə yüksək keyfiyyətlərə malik olduğunu bir daha ***hiss edirəm***" [IIc.s.364].

### *Təfəkkür felləri*

"Düşünmək" – Mən hələ o vaxtdan ölkəmizin gələcəyi barədə ***düşünmüşəm***. Həmin illərdən başlayaraq gələcəyimiz haqqında ***düşünürdüm***. İndi isə sizinlə görüşərək və bu prob-

lemlərlə daim şəxsən məşğul olaraq Azərbaycanın XIX əsri haqqında ***düşünürəm*** [IXc.s.116].

Düşünmək təfəkkür feli böyük natiqin xarakterinə uyğun olaraq həm çox işlənir, həm də tez-tez təkrarlanır.

"Bilmək" – təfəkkür felini Heydər Əliyev dil barəsində daha çox işlədir: "Mən keçmişdə də demişəm və bu gün də deyirəm, şəxsən arzum ondan ibarətdir ki, hər bir azərbaycanlı çox dil ***bilsin***. Ancaq birinci növbədə öz ana dilini, dövlət dilini yaxşı ***bilsin***. Bizim çox gözəl, zəngin, cazibədar dilimiz var. Bəlkə də biz bu dildə danışdığımıza görə öz dilimizin zənginliyini və gözəlliyini hələ tam dərk edə bilməmişik. Ancaq bilin ki, bu həqiqətdir".

"Düşünmək" – Güman edirəm ki, biz düşünməliyik. [IIc.s.349]

"Fikirləşmək" – Qoy Prezident Aparatındakı şəxslər bu barədə ***fikirləşsinlər***, görək biz əməkdaşlıq üçün hansı vasitələrdən və formalardan istifadə edə bilərik [IIc.s.349].

"Bilmək" təfəkkür feli keçmiş tariximizdən nəticə çıxarmaq baxımından Heydər Əliyevin tez-tez müraciət etdiyi təfəkkür fellərindəndir: "Gəncə şəhərinin sakinləri həmin günləri görmüşlər və ***bilirlər*** ki, bu hadisələr təkcə gəncəlilər üçün yox, bütün Azərbaycan üçün necə baha başa gəldi" [IIc.s.359].

"Yada salmaq", "unutmamaq" – "Biz bu gün nə qədər çətin bir dövrdə yaşasaq da, həyatımızda nə qədər ağır proseslər getsə də, bu nailiyyətləri heç vaxt ***unuda*** bilmərik. Əksinə, biz bunları daim ***yada salmalıyıq***" [IIc.s.170].

Təbii ki, böyük natiqin nitqləri nitq felləri ilə zəngindir. Və bu nitq felləri hərəkət felləri, eləcə də, hal-vəziyyət felləri ilə harmonik şəkildə auditoriyalarda səslənir: "Dünən də, bu gün də mən xalqa ***müraciət edərək*** vətəndaşlarımızın bütün təbəqələrini, hamını birliyə, həmrəyliyə dəvət etdim. Bütün siyasi partiyaları, ictimai-siyasi təşkilatları, hər bir vətənpər-

vər insanı birliyə, vətəndaş həmrəyliyinə çağırdım. Çox ***məmnunam*** ki, bu çağırışım əks-səda tapdı. Buraya, bu meydana, Azərbaycan Prezidentinin iqamətgahı qarşısına toplaşanlar respublikamızın çoxrəngli ictimai-siyasi mənzərəsinin, demək olar, bütün təbəqələrini əks etdirirlər. Bu, çox gözəl hadisədir, çox böyük nailiyyətdir. Mən buna ***sevinirəm*** və əmin ola bilərsiniz ki, müstəqilliyimizi təmin etmək naminə bundan sonra da Azərbaycan xalqının bütün təbəqələrini, bütün təşkilatlarını, bütün qüvvələrini birləşdirmək üçün, yaxınlaşdırmaq üçün əlimdən gələni edəcəyəm" [IIc.s.363].

Bu mətndə harmoniyanı "müraciət etmək", "çağırmaq" nitq felləri, "toplaşmaq", "birləşdirmək", "yaxınlaşdırmaq" hərəkət felləri, "sevinmək" hal-vəziyyət feli yaradır.

### *Nitq felləri*

"Qulaq asmaq" – Ağbirçək bir şəhid anası o qədər təsirli danışırdı ki, mən böyük heyranlıqla ona qulaq asırdım [IXc.s.120].

Nitq prosesi danışmaq, eşitmək felləri ilə yanaşı görmək feli olmadan çətin təsəvvür olunduğundan "görmək" felini də nitq felləri sırasına aid etmək mümkündür: "Mən salonda hörmətli alimlərimizi, Azərbaycanın adlı-sanlı neftçilərini ***görürəm***" [Ic.s.85].

"Burada məktəblərin problemlərindən ***danışarkən*** onların maddi-texniki vəziyyətinə, dərs kitablarının hazırlanıb məktəblərə çatdırılması, müəllimlərin maddi təminatı məsələlərinə toxunuldu" [IIc.s.176]. "Danışmaq" nitq feli feli bağlama şəklində verilmişdir.

Nitq felləri də sinonim cərgə şəklində səliscəsinə düzülə, auditoriyaları heyran qoya bilir: "Mən dedim ki, qanunsuz hərəkət etməyinizə, cinayət törətməyinizə baxmayaraq sizi qəbul etməyə və sizinlə ***danışmağa***, məlumatınızı ***dinləməyə***,

eyni zamanda bu cinayətkar yoldan çəkinməyin zəruriliyini sizə izah etməyə hazıram” [IIc.s.337].

Nitq felləri qrupuna “izah etmək” də aid ola bilir: “Mən çalışdım ki, bunu ona ***izah edim*** və o, hərəkətindən əl çəksin” [IIc.s.336].

“Çıxış etmək” – “Mən hər bir məsələnin dinc yolla, qarşılıqlı anlaşma və danışıqlar vasitəsilə həllinə tərəfdar olduğumu bildirmişəm və indi də bu mövqedən ***çıxış etdim***” [IIc.s.336].

“İndi vəziyyət elə gətirdi ki, müraciətlə çıxış etməli oldum və mənim müraciətim geniş əks-səda doğurdu” [IIc.s.349].

Bəzən hal-vəziyyət felləri sinonim cərgə şəklində auditoriyaya açıqlanır: “Əlbəttə, bu hadisələr bizi üzür, sıxır, kədərləndirir”. “Üzmək”, “sıxmaq”, “kədərləndirmək” kimi hal-vəziyyət felləri mühüm yer tutur [IIc.s.335].

### *Hal-vəziyyət felləri*

“Sevmək” – “Xahiş edirəm biləsiniz ki, mən məsləhətləşməyi ***sevirəm*** və bu məsələlərin həlli üçün sizinlə məsləhətləşməyi də böyük bir kömək sanıram” [IIc.s.349].

Böyük natiqin nitqlərində xüsusilə ictimai-siyasi hadisələrin gərgin anlarında hal-vəziyyət və hərəkət felləri birgə səslənir: “Hərəsi bir tərəfə *qaçır* və bu əli silahsız, müharibəyə hazır olmayan sakinlər isə, əlbəttə ki, vətənindən ayrılmaq istəmir, torpağından, evindən-eşiyindən ayrılmaq istəmirlər, amma rəhbərlərin bu təxribatı nəticəsində ***hay-küyə düşürlər, qorxurlar, qaçırlar***” [Ic.s.91]. “Hay-küyə düşmək”, “qorxmaq” hal-vəziyyət felləri “qaçmaq” hərəkət feli ilə çulğalaşır.

### *İş felləri*

İş felləri arasında çox vaxt “pozmaq” feli böyük natiqin dilində işlədilir: “Lakin bir daha demək istəyirəm ki, hər bir

şəxsin nə qədər böyük xidmətləri olsa da, bu xidmətlər heç vaxt qanunu ***pozmağa*** əsas vermir və bəraət qazandırmır" [IIc.s.350].

"Pozmaq" iş feli Heydər Əliyevin nitqlərində ictimai-siyasi vəziyyətin sabitliyinin pozulması, dəyişdirilməsi anlamındadır: "Ancaq yenə də deyirəm, son saatlarda alınan məlumatlar onu göstərir ki, həm o bazada olan bəzi qüvvələr sabitliyi ***pozmağa*** çalışır, həm də bu şəraitdən istifadə edib bəzi məntəqələrdə bizim daxili ictimai siyasətimizi ***pozmağa*** cəhd göstərən ayrı-ayrı qüvvələr fəaliyyətə başlayıblar" [IIc.s.357].

"Burada, Bakıda bizə daxil olan bir neçə siqnallar onu göstərir ki, ayrı-ayrı təxribatçı qüvvələr Bakıda və Azərbaycanın bəzi şəhərlərində, rayonlarında sabitliyi ***pozmaq*** istəyirlər" [IIc.s.457].

Beləliklə, Heydər Əliyevin nitqlərində fel nitq hissəsinin üslubi xüsusiyyətlərini aşağıdakı kimi təsnif etmək olar:

– Heydər Əliyevin nitqlərində felin bütün zamanları yanaşı işlədilir. Bu da böyük natiqin zaman uzlaşmalarına ciddi diqqət yetirməsi ilə bağlıdır;

– Heydər Əliyevin nitqində "xatirimdədir" modal sözü felin keçmiş zamanı ilə çox gözəl harmoniya yaradır, bu modal sözün arxasınca auditoriya böyük natiqə qoşularaq keçmişə qayıdır, nitq böyük həvəslə qəbul olunur;

– Heydər Əliyevin nitqlərinin əsasında təfəkkür və nitq felləri tez-tez birgə təsadüf edir ki, bu da təfəkkür və nitq proseslərinin vəhdətindən xəbər verir;

– Qəti gələcək zamana Heydər Əliyevin müstəqillik yolunda geri çəkilməyin mümkünsüz olduğu çıxış və nitqlərində daha çox təsadüf edir;

– Heydər Əliyevin nitqləri təfəkkür felləri ilə zəngindir. Bu fellər müxtəlif çeşidli auditoriyalarda, xüsusən də təfəkkür sahibli görkəmli şəxsiyyətlərin yubileylərində işlədilir;

– Eləcə də böyük natiqin nitqləri nitq felləri ilə zəngindir. Və bu nitq felləri hərəkət, həm də hal-vəziyyət felləri ilə harmonik şəkildə səslənir;

– Heydər Əliyevin qətiyyətli çıxışlarında felin vacib şəkli ilə qəti gələcək zaman çox vaxt birgə təsadüf olunur;

– Böyük natiqin dilində felin şərt şəkli qəti gələcək zamanla və felin əmr şəkli ilə çulğalaşaraq qətiyyətli dövlət başçısının – Heydər Əliyevin nitqini yaradır;

– Heydər Əliyevin nitqində felin vacib şəkli müstəqilliyin ilk dövrlərində, ölkə iqtisadiyyatının ağır, böhranlı anlarında daha çox istifadə olunur;

– Heydər Əliyevin ölkə problemləri ilə bağlı keçirdiyi müşavirələrdə çatışmazlıqlar və nöqsanların yaranma şərtlərini felin şərt şəkli vasitəsilə ortaya qoyur, sonda isə felin vacib və əmr şəkilləri ilə vəziyyətdən çıxmağın yollarını göstərir;

Felin şərt şəkli ilə qəti gələcək zaman arasında nitq əlaqəsi və bu zaman şərt bağlayıcılarının da nitq prosesinə qoşulması Heydər Əliyevin nitqlərində belə bir sxem yaratmağa imkan verir: şərt bağlayıcısı – felin şərt şəkli – felin qəti gələcək zamanı.

## 1.4. Heydər Əliyevin nitqində zərflər

Bütün nitq hissələrində olduğu kimi, zərfin də başqa nitq hissələri ilə şəkilcə eyniliyi vardır. İş və hərəkətin icra tərzini, zamanını, yerini, miqdarını, eləcə də əlamətin əlamətini bildirən sözlərə zərf deyilir.[1]

Ulu öndərin nitqində tez-tez rast gəlinən söz kateqoriyalarından biri də zərflərdir. Onun nitqində zərflərin semantik qrupları bütünlüklə əhatə olunur. Bu söz kateqoriyasının köməyilə Ulu öndər haqqında danışdığı hadisələri zaman və məkan etibarı ilə lokallaşdırır, onlara özünün münasibətini ifadə edir.

Tərzi-hərəkət zərfləri böyük natiqə fikrini səlis və gözəl ifadə etməyə imkan verir, nitqin dinamikliyini təmin edir: "Amma indi sahibkarlar gətiriblər, satırlar və nə qədər də çox gətirsələr, həmin taxtanın qiyməti o qədər aşağı düşəcəkdir.

Bu rəqabətdir. İndi Bakıda, respublikamızın digər şəhərlərində bir çox ərzaq məhsullarının və yaxud digər malların qiyməti ***get-gedə*** aşağı düşür və düşəcəkdir" [VIIc.s.216]. Burada "get-gedə" zərfi qiymətlərin dinamik olaraq aşağı düşməsini qəti gələcək zamanda auditoriyaya anladır.

"Cəsarətlə" tərzi-hərəkət düzəltmə zərfi böyük natiqin dilində çeşidli auditoriyalarda tez-tez işlədilir: "Ondan sonra biz daha iki böyük müqavilə imzaladıq – 1995-ci ilin noyabr ayında və 1996-cı ilin iyun ayının ***əvvəlində***. Bunlar onu göstərdi ki, biz tutduğumuz yol ilə ardıcıl surətdə və ***cəsarətlə*** gedirik və bu müqavilələr dünyanın bir çox ölkələrindən, bir çox böyük şirkətlərindən Azərbaycana çox böyük məbləğdə kapital qoyuluşuna gətirib çıxaracaqdır və şübhəsiz ki, gələcəkdə böyük işlər görmək imkanı yaradacaqdır" [VIIc.s.119]. Bu mətndə "əvvəlində" – sadə zaman zərfi və "cəsarətlə" – dü-

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 200.

zəltmə tərzi-hərəkət zərfləri çulğalaşaraq nitqə ekspressivlik qazandırır.

Böyük natiqin dilində "diqqətlə" tərzi-hərəkət zərfi də çox yer tutur: "Bildirmək istəyirəm ki, biz hər belə təklifə ***diqqətlə*** yanaşacağıq və əməkdaşlıq üçün əlverişli şərait yaranmasını təmin edəcəyik" [XIIc.s.19].

Mürəkkəb tərzi-hərəkət zərfi "addımbaaddım"da Heydər Əliyevin nitqində az yer tutmur: "Əgər 1988-ci ildə Ermənistan-Azərbaycan münaqişəsi başlayandan Amerikada daim Azərbaycanın əleyhinə təbliğat getmişdisə və əks ictimai fikir yaranmışdısa, dörd ildir ki, biz ***addımbaaddım*** bu ictimai fikri dəyişdirməyə çalışmışıq və dəyişdirmişik" [XIIc.s.94].

Biri şəkilçi qəbul etmiş eyni sözlərin təkrarı ilə yaranan mürəkkəb tərzi-hərəkət zərfləri[1] içərisində Heydər Əliyevin nitqində tez-tez müşahidə etdiyimiz "yan-yana", "üz-üzə"dir. Bu bir daha böyük natiqin xalqı ilə üz-üzə olmaqdan şərəf duyduğunu göstərir: "Ziyalılarla görüşmək həmişə böyük bir bayram təsəvvürü yaradır. Yalnız qəlbim, ürəyim həmişə vətənlə, xalqımla və xalqımızın qabaqcıl dəstəsi olan ziyalılarla onların yaradıcılıq işləri ilə bağlı olmuşdur. Ancaq indi ***yan-yanayıq, üz-üzə*** durmuşuq" [Ic.s.148].

"Mən srağagün xarici dövlətlərin Azərbaycandakı səfirlərini dəvət etməli və bəyanat verməli oldum, ona görə ki, iyunun 12-dən 28-dək fəal döyüş əməliyyatları gedirdi" [Ic.s.28]. "Hesab edirəm ki, biz bu yolla ***addım-addım*** irəliləməliyik" [Ic.s.28].

Bir sıra tərzi-hərəkət zərfləri var ki, bunlar ulu öndərin dilində özünəməxsus şəkildə düzəldilir: "Ancaq dünya təcrübəsini də götürüb ***kor-koranə*** tətbiq etmək, inanın ki, istənilən nəticəni verməz. İndi litsey yaratmaq, kollec yaratmaq modaya çevrilib" [Ic.s.168]. "Kor-koranə" mürəkkəb tərzi-hərəkət

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 204.

zərfi müstəqil ölkə quruculuğunda milli adət-ənənələrimizə sadiq qalmağı tələb edir. Burada "kor-koranə" zərfi eyni sözün ikinci tərəfinə "*-anə*" şəkilçisi əlavə etməklə düzəlir.

Heydər Əliyevin nitqində düzəltmə tərzi-hərəkət zərfləri – "cəsarətlə", "qəhrəmanlıqla" – "daha" qüvvətləndirici ədatları ilə müştərək işlənərək zərfləri gücləndirir. Bu zərfləri vətənpərvərliklə bağlı çıxışlarda böyük natiq tez-tez işlədir": "Şəhidlərimizin ruhu, qəhrəmanlığı hamımızı və birinci növbədə gənclərimizi torpaqlarımızı daha ***cəsarətlə***, daha ***qəhrəmanlıqla*** qorumağa səsləyir" [Ic.s.179].

"Keçdiyimiz ***illərdə*** baş verənlər tarixdə ***açıq-aydın*** öz əksini tapmalıdır" [IXc.s.112]. Təkcə bu bir cümlədə tərzi-hərəkət zərfi "***açıq-aydın***", "***illərdə***" zaman zərfi ilə birgə təsadüf edir. "Açıq-aydın" zərfi ilə tariximizin gələcək nəsillərə necə çatdırılmasını anladır.

Düzəltmə tərzi-hərəkət zərflərinin bir qismi isimlərin sonuna "***-la, -lə***" şəkilçiləri artırmaqla düzəlir: "Bunlara indi də yol vermək olmaz. Hər işi ***təmkinlə, ağılla*** görmək lazımdır" [IXc.s.167]. "Təmkinlə", "ağılla" düzəltmə zərfləri yüksək təfəkkür sahibi olan dövlət başçısı nitqindən xəbər verir.

Sadə tərzi-hərəkət zərfləri böyük natiqin dilində sinonimlər kimi səslənir: "Mən bilirəm, kəlbəcərlilər də, işğal olunmuş, əhalisi zorla çıxarılmış bütün başqa rayonlardan didərgin düşmüş soydaşlarımız-bacılarımız, qardaşlarımız da ağır, çətin vəziyyətdə yaşayırlar. Yerindən-yurdundan didərgin düşmüş soydaşlarımızın ağır vəziyyətdə yaşaması ***gecə-gündüz*** bizim hamımızı incidir" [IXc.s.121]. "Gecə-gündüz" zaman zərfi ulu öndərin problemə necə ciddiyyətlə yanaşdığından xəbər verir.

Düzəltmə tərzi-hərəkət zərflərinin bir qismi "***-sız***", şəkilçisini artırmaqla düzəlir.[1] Bu məqamlarda da zərflər böyük

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 210.

natiqin hadisələrə olan münasibətini bildirir: "Mən bunlardan ***həyəcansız, hiddətsiz*** danışa bilmirəm, öz münasibətimi ancaq bu cür bildirə bilərəm" [IXc.s.116]. Ərazilərimizin erməni qəsbkarları tərəfindən işğalında yol verilən səhvlərdən danışarkən yuxarıdakı düzəltmə tərzi-hərəkət zərfləri yerindəcə işlədilir.

"Sıx" – bu da ondan ibarətdir ki, xalqlarımızın əlaqələri bir-biri ilə daha da ***sıx*** bağlasın" [VIIIc.s.18].

"Cürbəcür" – Çünki hər bir respublikada proseslər ***cürbəcür*** gedibdir [VIIIc.s.11].

"Sürətlə" – Ümidvar olduğumu bildirmək istəyirəm ki, indiyədək əldə etdiyimiz nailiyyətlər əsasında ABŞ ilə Azərbaycan arasında iqtisadi əməkdaşlıq bundan sonra daha da ***sürətlə*** inkişaf edəcəkdir [VIIIc.s.166].

"Açıq-aydın" – Mən Azərbaycanın bu sahədəki mövqelərini onlara ***açıq-aydın*** bildirmişəm. [VIIIc.s.166].

"Cəsarətlə, inamla" – Biz tutduğumuz yolun düzgünlüyünə inanırıq. Ona görə də tutduğumuz bu yolla ***cəsarətlə, inamla*** gedirik [VIIIc.s.176]. obyektiv zaman kateqoriyasının dildə müxtəlif və rəngarəng ifadə vasitələri fərqləndirilmişdir: 1) morfoloji vasitələr (felin zaman formaları); 2) sintaktik vasitələr; 3) leksik vasitələr (temporal isimlər, sifətlər, zərflər, sabit birləşmələr); 4) leksik-qrammatik vasitələr.[1]

Zamanla, vaxtla işini uyğunlaşdıran, zamana və vaxta qiymət qoyan Heydər Əliyevin nitqlərində zaman zərflərinin yeri həmişə var: "***Dünən*** və ***bu gün*** biz respublikamızın həyatı üçün çox böyük əhəmiyyəti olan məsələləri ətraflı müzakirə etdik" [VIIc.s.114].

"Qabaq" sadə zaman zərfi ilə böyük natiq hadisələrin keçmişdə baş verdiyini auditoriyalara izah edir: "Yenə də deyirəm, iki gün bundan ***qabaq*** orada deyirlər ki, biz gərək ya re-

---

[1] Tahirov İlham. Temporal leksika. Bakı, Nurlan, 2008. 142 səh.

ferendum keçirək, ya ayrı-ayrı regionların xüsusiyyətinə uyğun olaraq bu islahatı həyata keçirək" [VIIc.s.129].

Elə həmin çıxışın başqa bir yerində: "1993-cü ili xatırlamaq lazımdır. Üç il bundan qabaq, 1993-cü ilin iyun-iyul aylarında Azərbaycan nə vəziyyətdə idi? Respublika o illərdə o qədər ***ağır*** bir vəziyyətə düşmüşdü ki, həm Ermənistanın hərbi təcavüzü, həm də ki, daxildə gedən ictimai-siyasi proseslər, xaricdən Azərbaycana göstərilən cürbəcür təsirlər ölkəmizdə çox gərgin bir vəziyyət yaratmışdı" [VIIc.s.116].

"Günü-gündən" mürəkkəb zaman zərfi böyük natiqin nitqində tez-tez təkrar olunur. Bu zərfin köməyi ilə dinamik zamanda baş verməli məsələlər izah olunur: "Azərbaycanın nizami ordusu yaranıb, ancaq o, ***günü-gündən*** möhkəmlənməlidir. Nizami ordunun döyüş qabiliyyəti ***günü-gündən*** yüksəlməlidir" [XIIc.s.328].

Hər iki tərəfi şəkilçi qəbul etmiş sözlərin təkrarı kimi "gündən-günə" zərfi hərəkətin tempini bildirmək məqamlarında daha çox işlədilir: "Hiss edirdilər ki, onların nüfuzu ***gündən-günə*** aşağı düşür, xalq onlara olan etibarı itirir və onlar Respublikanı idarə edə bilmirlər" [Ic.s.27].

"Ancaq neft istehsalını ***günbəgün, aybaay, ilbəil*** aşağı salıb gözləsək ki, 2-3 ildən sonra neft şirkətləri ilə bağlanan kontraktlar nəticəsində neftin istehsalı artacaq, sonra nefti satıb valyuta alacağıq, Azərbaycanı inkişaf etdirəcəyik, onda bəs bu 2-3 il ərzində xalqın vəziyyəti nə cür olacaq" [Ic.s.85].

Sadə zaman zərflərindən "həmişə" Heydər Əliyevin nitqlərində tez-tez istifadə edilir: "Əlli il müddətində mən Tamerlanı ***yaxşı*** tanımışam, onun həyatını, fəaliyyətini ***həmişə*** müşahidə etmişəm" [IXc.s.144].

Sadə zaman zərfləri içərisində çox təsadüf olunanlardan biri də "əvvəl" dir: "Mən bir il də, iki il də bundan ***əvvəl*** belə düşünürdüm" [IXc.s.170].

Mürəkkəb zaman zərflərinin bir növü də birincisi adlıq, ikincisi çıxışlıq halda işlənən iki zaman bildirən ismin təkrarı ilə yaranır.[1] Eyni mürəkkəb zərfin böyük natiqin nitqində iki cür deyiminə rast gəlirik: "Eyni zamanda millətimiz, ölkəmiz, müstəqil dövlətimiz də ***günü-gündən*** möhkəmlənə bilər. Mən əminəm ki, Azərbaycanın dövlət müstəqilliyi ***gündən-günə*** möhkəmlənəcəkdir" [IXc.s.123].

Başqa bir mürəkkəb zaman zərfi "gecə-gündüz" böyük natiqin dilində bir sıra həyati vacib məsələlərin həlli yolunda çalışmağı ifadə edir: "Mən çox məmnunam ki, bizim apardığımız işlər müsbət nəticələr verir. Bu rəqəmlər çox asanlıqla əldə olunan rəqəmlər deyildir. Biz bu işlərlə ***gecə-gündüz*** məşğuluq" [IXc.s.170].

"Buraya", "burada" – Eyni zamanda onların burada sizinlə birlikdə əməkdaşlığı Bilkəndin simasının da yüksəlməsinə kömək edibdir. Ona görə də mən keçən dəfələr də ***buraya*** gələrkən Azərbaycan alimlərini, sənətçilərini ***burada*** görüb sevinmişəm ki, onlar sizin ətrafınızdadır.

Heydər Əliyevin nitqində ən çox təsadüf olunan zaman zərflərini aşağıdakı kimi qruplaşdırmaq olar.

Sadə zaman zərfləri***: indi, bayaq, dünən, daim, həmişə, əvvəl, dərhal, səhər, sabah*** və s.

Düzəltmə zaman zərfləri: ***hələlik, tezliklə, bayaqdan, dünəndən, onda, əvvəlcə.***

Mürəkkəb zaman zərfləri ***tez-tez, ilk əvvəl, gecə-gündüz, əvvəl-axır, sonradan-sonraya, gün-gündən, gündən-günə, bu zaman, o vaxt, anbaan, ilbəil***.

"Gündən-günə" – Biz bu əməkdaşlığı son illərdə ***gündən-günə*** gücləndirir, ***gündən-günə*** genişləndiririk. [VIIIc.s.182].

---

[1] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 210-211.

“Gündən-günə” – Ölkəmiz ***gündən-günə*** yüksələcək, müstəqil dövlətimiz yaşayacaq və Azərbaycan xalqı Dünya Birliyində ***daim*** özünə layiq yerini tutacaqdır [VIIIc.s.186].

Sadə zaman zərfləri antonim şəklində böyük natiqin nitqlərində özünə yer alır: “Mən oraya ***dünən*** səhər getdim, ***axşam*** da geri qayıtdım” [IXc.s.241].

“Həmişə” – Məhz bunlar – xalqlarımızın qabaqcıl, mütəfəkkir adamları bizi ***həmişə*** bir-birimizə bağlayıb, bir-birimizə birləşdiriblər. [IXc.s.31].

“Daim” – Ancaq verdiyimiz şəhidlərin qəm-qüssəsi, insanların həm vücudunda, bədənində, həm də qəlbində olan yaralar bizi ***daim*** incidir [IXc.s.314].

“Həyat ***gündən-günə*** rahatlaşacaq, yaxşılaşacaqdır” [IXc.s.36]. “Gündən-günə” mürəkkəb zaman zərfinin köməyi ilə nitqdə nikbinlik yaradır. “İnsanlar ***rahat, sərbəst*** yaşayırlar, onların üzü gülür, insanlarda sevinc, nikbinlik, gələcəyə inam hissi ***gündən-günə*** artır” [IXc.s.39]. Tərzi-hərəkət zərfləri kimi “rahat”, “sərbəst”, zaman zərfi kimi “gündən-günə” böyük natiqin dilində auditoriyada optimal ovqat yaradır.

Heydər Əliyev nitqlərində “gündən-günə”mürəkkəb zaman zərfi tez-tez təsadüf edir: “Pakistan ilə Azərbaycan arasında dostluq, qardaşlıq, əməkdaşlıq əlaqələri ***gündən-günə*** inkişaf etməkdədir” [IXc.s.45].

Antonim sözlərin köməyi ilə yaranan mürəkkəb yer zərfi “ora-bura” müəyyən çıxış məqamlarında sərrastcasına işlədilir: “Anlamalısınız ki, çıxarılan neftin və istehsal olunan neft məhsullarının hər bir litri Azərbaycan xalqı üçün əhəmiyyətlidir və onları ***ora-bura*** paylamaq, satmaq olmaz” [VIIc.s.131]. “Ora-bura” zərfinin vasitəsi ilə böyük natiq Azərbaycan xalqının sərvətini talan etmək, dağıtmaq niyyətinə düşənləri yerində oturdur.

Yer zərfləri də öz növbəsində ulu öndərin nitqlərində yer tapır: “İndi biz bu qədər müqavilə imzalamışıq, gözləyək ki, “Dədə Qorqud” ***burada*** qazsın, ***sonra*** keçib orda, bundan sonra başqa yerdə qazsın” [IXc.s.131].

“Burada”, “orada” sadə yer zərfləri ritorik sualın yaranmasında iştirak edir. Antonim mənşəli mürəkkəb yer zərfi kimi “ora-bura” da Heydər Əliyevin nitqində geniş yer tutur: “Milyonlarla dollar ***ora-bura*** xərclənir” [IXc.s.131]. Elə buradakı “ora-bura” zərfi xalqa məxsus əmlakın necə insafsızcasına xərclənməsini auditoriyalara çatdırır.

Heydər Əliyevin nitqində yer zərfləri içərisində ən çox aşağıdakılar təsadüf edir:

Sadə yer zərfləri: ***irəli, irəliyə, irəlidə, irəlidən, geri, geriyə, geridə, geridən, bura, buraya, burada (burda), buradan (burdan), ora, orada, oradan***.

Düzəltmə yer zərfləri ***ortalıqda, yaxınlıqda***.

Mürəkkəb yer zərfləri: ***ora-bura, orda-burda, sağa-sola, arada-bərədə, o tərəf-bu tərəfə, heç yerdə, hər tərəfdən***.

“Oraya” – Mənim ilk addımlarım o küçəyə oldu, ***oraya*** gedib Türkiyəyə və onun böyük şəxsiyyəti Atatürkə hörmət və ehtiramımı bildirdim” [IXc.s.295].

“Altında” – Məhz belə bir bahar günündə, günəşin gözəl şüaları ***altında***, gözəl əhval-ruhiyyə ilə, insanların sevinci ilə bu caddəyə Azərbaycan caddəsi adının verilməsini məmnuniyyətlə qəbul edirəm və ***buraya*** toplaşanlara, Ankaranın bələdiyyə başkanına və mənim əziz dostum qardaşım, cümhurbaşkanı Süleyman Dəmirələ hörmət və ehtiramımı, təşəkkürümü bildirirəm. [IXc.s.296].

“Buraya”, “burada” – Eyni zamanda onların ***burada*** sizinlə birlikdə əməkdaşlığı Bilkəndin simasının da yüksəlməsinə kömək edibdir. Ona görə də mən keçən dəfələr də buraya gələrkən Azərbaycan alimlərini, sənətçilərini burada görüb sevinmişəm ki, onlar sizin ətrafınızdadır.

Başqa bir məqamda kəmiyyət və zaman zərfləri mətndə birgə səslənir: “Zərifə xanımın həyatdan getməsi bizim ailəmizi, şəxsən məni və mənim övladlarımı çox sarsıtdı. Ümumiyyətlə, ailəmiz çox həssas olduğuna görə Zərifə xanımın vəfatı bizim üçün ***çox*** ağır olmuşdur. Onun xatirəsi bizim

qəlbimizdə, nəinki bizim qəlbimizdə, davamçılarının qəlbində ***daim*** yaşayacaqdır" [IXc.s.154].

Sadə kəmiyyət zərflərindən Heydər Əliyevin nitqində əsasən "çox" zərfi işlənir: "Azərbaycanın müstəqilliyini yaşatmaq, inkişaf etdirmək üçün həm respublikamızın daxilində, həm də ölkəmizdən xaricdə ***çox*** iş görmək lazımdır" [VIIc.s.18]. Burada müstəqillik yolunda görüləcək işlərin kəmiyyəti "çox" zərfi ilə auditoriyaya çatdırılır.

Başqa bir nitq məqamında "çox" zərfi ilə yenə də hal-hərəkət və əlamətin kəmiyyəti bildirilir: "Almaniya beş il bundan öncə, yenidən birləşdikdən sonra ölkənin bütün iqtisadiyyatını vahid səviyyəyə qaldırmaq üçün öz ərazisinin şərq hissəsində iqtisadiyyatının yenidən qurulması istiqamətində ***çox*** mühüm addımlar atmışdır" [VIIc.s.41].

Başqa, bir məqamda "***-la,-lə***" şəkilçiləri ilə düzələn düzəltmə tərzi-hərəkət zərfləri işə düşür, sinonimləşərək nitqin əlvanlığını artırır: "Özəlləşdirmə ***ağılla***, ***kamalla***, ***təmkinlə***, ancaq gecikmədən, ***sürətlə*** həyata keçirilməlidir" [VIIIc.s.82].

"Xırda-xırda" – Bu da ondan irəli gəlir ki, ardıcıl surətdə həyata keçirdiyimiz tədbirlər, iqtisadiyyat sahəsində apardığımız siyasət ***xırda-xırda*** öz nəticəsini verir. [VIIIc.s.80].

"Bu qədər" – Fəxr edirəm ki, Azərbaycanın gələcəyi ***bu qədər*** gözəl təməl əsasında qurulur. [VIIIc.s.186].

"Bütünlüklə" – Üstəlik, onlar Gürcüstan hökumətinin və Gürcüstan prezidenti Eduard Şevardnadzenin siyasi xəttini, dövlət fəaliyyətini ***bütünlüklə*** dəstəkləyirlər [IXc.s.254].

Böyük natiqin çıxışlarında çox səslənən kəmiyyət zərfləri: ***Çox***, ***tamamilə***, ***dəfələrlə, təkrar, təkrarən, nisbətən, təxminən, təqribən, az-çox, bir-bir, o qədər, azdan-çoxdan, qat-qat, təkrar-təkrar.***

"Çox" – Gürcüstanla Azərbaycanın Qafqazda necə böyük əhəmiyyətə malik olduğu barədə ***çox*** danışmaq olar. [IXc.s.255].

"Çox" – Həyatımda belə hadisələri ***çox*** görmüşəm. [IXc.s.306].

"Bir-bir" – O gündən iki ildən çox vaxt keçir və biz onları Rusiyada ***bir-bir*** tapıb gətiririk.

"Bu qədər" – Belə bir halda Ermənistanda ***bu qədər*** hərbi bazaların saxlanmasının nə əhəmiyyəti var?

"O qədər" – Çünki əgər Ermənistana ***o qədər*** silah gətiriblərsə, bu, təkcə Azərbaycanı yox, bütün bölgəni dağıda bilər.

Zaman və tərzi-hərəkət zərfləri elə gözəl çulğalaşır ki, zərflərin nitqə belə bir ekspressivlik verməsi inanılmaz olur: "Bunun hesabına sonrakı illərdə biz qaz hasilatını ***əvvəlcə tədricən***, ***sonra*** da ***sürətlə*** artırmaq fikrindəyik" [VIIc.s.51]. Bu bir cümlədə "əvvəlcə", "sonra" kimi antonim zaman zərfləri "tədricən", "sürətlə" antonim tərzi-hərəkət zərfləri ilə çulğalaşır.

Bir qisim hallarda tərzi-hərəkət zərfləri kəmiyyət və zaman zərfləri ilə uzlaşır: "Mən görürəm ki, siz bütün bunlara çox ***həssaslıqla*** yanaşırsınız, ona görə ki, siz məhz elə adamlarsınız ki, Azərbaycanda Yanvar faciəsindən hələ xeyli əvvəl, bundan 20 il ***qabaq*** belə hadisələrə qarşı öz etiraz səsinizi ucaltmışdınız" [IXc.s.240].

Yuxarıdakı mətndə "***həssaslıqla***" düzəltmə tərzi-hərəkət zərfi "çox" kəmiyyət zərfi ilə birgə işlənərək "əvvəl" və "qabaq" zaman zərfləri ilə çulğalaşır.

Aşağıdakı cümlədə isə "çox" sadə kəmiyyət və "diqqətlə" düzəltmə tərzi-hərəkət zərfləri ilə bir yerdə təsadüf edir: "Biz orada baş verən prosesləri ***çox diqqətlə*** izləyirik" [IXc.s.248].

Zərflər Heydər Əliyevin nitqində frazeoloji birləşmələrlə müştərək işlənərək onun nitqini cazibədar edir: "Biz, Azərbaycan prezidenti kimi ***şəxsən*** mən söz vermişəm və ***indi*** də bunu təsdiq edirəm ki, idmana xüsusi qayğını öz üzərimə götürürəm, Azərbaycan gənclərinə xüsusi qayğını öz üzərimə götürmüşəm və əmin ola bilərsiniz ki, bu qayğını ***daim*** hiss edəcəksiniz". "Şəxsən" tərzi-hərəkət zərfliyi – "söz vermək" frazeoloji birləşməsi, "indi" sadə zaman zərfi – "təsdiq etmək" frazeoloji birləşməsi, eləcə də "daim" – zaman zərfi – "qayğını hiss etmək" frazeoloji birləşməsi harmoniya yaradaraq ölkə başçısının idmana olan qayğısını milyonlara çatdırır.

Heydər Əliyevə məxsus nitqlərin bir məziyyəti də zərflərin sinonim cərgələr şəklində verilməsidir: "Beləliklə, mən hesab edirəm ki, respublikamızda iqtisadi islahatların hamısı həyata keçirilir və 1997-ci il Azərbaycanda iqtisadi islahatların daha da ***sürətlə***, ***dərin***, ***geniş*** həyata keçirilməsi ili olacaqdır" [IXc.s.170].

Heydər Əliyevin həyatda tutduğu mövqe ilə nitqlərində işlətdiyi zərflər arasında dialektik vəhdət mövcuddur: "Ona görə ki, biz əbədi olaraq ***azad***, ***sərbəst***, ***müstəqil*** yaşamaq istəyirik" [VIIIc.s.9]. Azad, sərbəst, müstəqil zərfləri həyatının əsas hədəfi müstəqillik olan Heydər Əliyevin xarakterini açır.

Zərflərin köməyi ilə böyük natiq auditoriyada xüsusi bir canlanma yarada bilir: "Türkiyə ilə Azərbaycan arasında ***indi*** olan əlaqələr bəlkə də tarix boyu bu qədər ***geniş***, ***dərin*** olmayıbdır" [VIIIc.s.15]. Türkiyə ilə Azərbaycan arasındakı münasibətlərin dərəcəsisnin təyini üçün "bu qədər" kəmiyyət, "geniş, dərin" tərzi-hərəkət zərflərindən, eləcə də "indi" zaman zərfindən istifadə olunmuşdur.

Heydər Əliyevin nitqində özünəməxsus tərzi-hərəkət zərfləri işə düşür: "Xeyr, Kommunist sistemi mənə ***tərs*** görünmürdü. Bunu dəfələrlə demişəm – həyatımın bütün mərhələləri mənim üçün əzizdir. Heç bir şeyi yanlış etməmişəm. Nə etmişəmsə hamısını doğru etmişəm. Heç bir şeyə də heyfslən – məmişəm" [VIIIc.s.41].

Böyük natiqin işlətdiyi cümlələr zərflərin zənginliyi ilə seçilir: "Lakin, bununla yanaşı 25 il ***əvvəl*** həmin ongünlükdə iştirak etmiş olan bir çox adamlar o günləri ***indi*** böyük hörmət, məmnunluq hissi ilə xatırlayırlar" [IXc.s.249]. "Əvvəl", "indi" sadə zaman zərfləri və "hissilə" tərzi-hərəkət zərfləri ilə çulğalaşaraq auditoriyalara çatdırılmasında ekspressivlik qazanır.

Bir sıra zərflər böyük natiqin dilində fəlsəfi baxımından işlənir: "Doğrudur, tarixin cürbəcür mərhələlərində ədəbiyyatın çox güclü inkişaf dövrü də, süqut dövrü də olubdur. Biz ***enişli-yoxuşlu*** bir tarix keçmişik, ancaq ədəbiyyatımız yaşayıbdır" [XIIIc.s.81].

Sadə kəmiyyət zərfi "çox" tez-tez təkrarlanaraq nitqə xüsusi çalarlar qazandırır: "Biz hələ ***çox*** işlər görməliyik. ***Çox*** iş görməliyik ki, bütün iqtisadi islahatları axıra çatdıraq, iqtisadiyyatımızda ciddi dəyişikliklər əmələ gətirək, bazar iqtisadiyyatı Azərbaycan iqtisadiyyatının bütün sahələrində bərqərar olsun. ***Çox*** iş görməliyik ki, Azərbaycanda hüquqi demokratik, dünyəvi dövlət quruculuğu prosesini tam axıra çatdıraq. ***Çox*** iş görməliyik ki, 1995-ci ilin noyabrında qəbul etdiyimiz Konstitusiyanın tələbləri Azərbaycanın həyatının, cəmiyyətinin bütün sahələrində tətbiq olunsun və həyata keçirilsin. ***Çox*** iş görməliyik" [IXc.s.173]. "Çox" kəmiyyət zərfi ilə böyük natiq Azərbaycan vətəndaşına hələ qarşıda nələr etməli olduğunu anladır, hər bir ölkə sakinini həyatın bütün sahələrində səfərbər edir.

"Günü-gündən" mürəkkəb zaman zərfi böyük natiqin nitqində tez-tez təkrar olunur. Bu zərfin köməyi ilə dinamik zamanda baş verməli məsələlər izah olunur;

Hər iki tərəfi şəkilçi qəbul etmiş sözlərin təkrarı kimi "gündən-günə" zərfi hərəkətin tempini bildirmək məqamlarında daha çox işlədilir;

Heydər Əliyevin nitqində düzəltmə tərzi-hərəkət zərfləri – "cəsarətlə", "qəhrəmanlıqla" – "daha" qüvvətləndirici ədatları ilə müştərək işlənərək zərfləri gücləndirir. Bu zərfləri vətənpərvərliklə bağlı çıxışlarında böyük natiq tez-tez işlədir;

Başqa bir mürəkkəb zaman zərfi "gecə-gündüz" böyük natiqin dilində bir sıra həyati vacib məsələlərin həlli yolunda çalışmağı ifadə edir;

Zərflər Heydər Əliyevin nitqində frazeoloji birləşmələrlə müştərək işlənərək onun nitqini cazibədar edir;

Heydər Əliyevə məxsus nitqlərin bir məziyyəti də zərflərin sinonim cərgələr şəklində verilməsidir;

Heydər Əliyevin həyatda tutduğu mövqe ilə nitqlərində işlətdiyi zərflər arasında dialektik vəhdət mövcuddur;

Tərzi-hərəkət zərfləri böyük natiqə fikrini səlis və gözəl ifadə etməyə imkan verir, nitqin dinamikliyini təmin edir;

Biri şəkilçi qəbul etmiş eyni sözlərin təkrarı ilə yaranan mürəkkəb tərzi-hərəkət zərfləri içərisində Heydər Əliyevin nitqində tez-tez müşahidə etdiyimiz "yan-yana", "üz-üzə"dir. Bu bir daha böyük natiqin xalqı ilə üz-üzə olmaqdan şərəf duyduğunu göstərir;

Zamanla, vaxtla işini uyğunlaşdıran, zamana və vaxta qiymət qoyan Heydər Əliyevin nitqlərində zaman zərflərinin yeri həmişə var;

Başqa bir mürəkkəb zaman zərfi "gecə-gündüz" böyük natiqin dilində bir sıra həyati vacib məsələlərin həlli yolunda çalışmağı ifadə edir;

Fəsli yekunlaşdıraraq belə bir qənaətə gəlmək olar ki, zərflərin gələcəkdə Heydər Əliyevin çıxışlarında daha da dərindən tədqiqi maraqlı nitq məqamlarını üzə çıxaracaqdır.

# II FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ KÖMƏKÇİ NİTQ HİSSƏLƏRİ

## 2.1. Heydər Əliyevin nitqində qoşmalar

Heydər Əliyevin nitqlərinin tədqiqi belə bir fikir söyləməyə əsas verir ki, ulu öndərin nitqlərində ekspressivlik qazanmaq, əlvanlıq yaratmaq baxımından əsas və köməkçi nitq hissələri arasında xüsusi bir sədd yoxdur. Sözlərə qoşulduqdan sonra müxtəlif məna çalarları qazanmaq xüsusiyyətinə malik olan qoşmaların böyük natiqin dilində yerini müəyyənləşdirməyi qarşımıza məqsəd qoyduq. Qoşmaların Heydər Əliyevin nitqində mövqeyini araşdırmazdan öncə bu köməkçi nitq hissəsinə dair müasir Azərbaycan dilinin qrammatikasında verilmiş məlumatla qısa tanış olaq.

Qoşmalar müasir vəziyyətinə görə dörd qismə ayrılır:

1. Əsas nitq hissəsi ilə omonim olanlar;
2. Bağlayıcı ilə omonim olanlar;
3. Yalnız qoşma kimi işlənənlər (sabit qoşmalar);
4. Şəkilçi ilə oxşar olanlar.[1]

Birinci qrupa "bəri", "qədər", "tərəf", "başqa", "özgə", "ayrı", "əlavə", "qeyri", "qarşı" və s. sözlər daxildir. Bu sözlər cümlədə həm müstəqil mənalı söz kimi, həm də müstəqil mənaya malik olmayan qoşma kimi işlənir.

İkinci qrupa həm qoşma, həm də bağlayıcı kimi işlənən ilə sözü daxildir.

Üçüncü qrupa "üçün", "ötrü", "görə", "kimi", "tək", "sarı", "doğru", "içrə", "aid", "dair", "məxsus", "savayı" qoşmaları daxildir. Bunlar yalnız qoşma kimi işləndiklərindən sabit

---

[1] Hüseynzadə M. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

qoşmalar hesab olunur. “Üçün”, “ötrü”, “görə” qoşmaları müvafiq hallarda işlənən o, bu əvəzliklərinə qoşularaq, mürəkkəb bağlayıcıları formalaşdırırlar. Dördüncü qrupa həm qoşma, həm də şəkilçi kimi işlənən ilə (-la, -lə), -can (-cən), -dək qoşmaları daxildir.

Müasir Azərbaycan dilində qoşmalarla bağlı maraqlı məsələlərdən biri də “qoşma və köməkçi adlar” məsələsidir.[1] Bu problem M.Kazım bəydən bu günə qədər dilçiliyimizdə mövcud olmaqdadır.[2] Qoşmalar haqqında bir çox müəlliflər[3] öz fikirlərini söyləsələr də qoşmaların nitq prosesində ekspressivlik yaratması məsələləri öz həllini tapmamışdır.

Araşdırmalar qoşma köməkçi nitq hissəsinin Heydər Əliyevin nitqlərində mühüm yer tutduğunu göstərir. Böyük natiqin nitqlərində qoşmalar müxtəlif mənalar daşıyaraq nitqin auditoriyalar tərəfdən asan, dəqiq qavranılmasına xidmət edir: “Coğrafi mövqeyinə ***görə*** Azərbaycanın əhəmiyyəti böyükdür. Hesab edirəm ki, onun coğrafi-siyasi mövqeyi təkcə bizim özümüzdən ***ötrü*** deyil, həm də Dünya Birliyi üçün əhəmiyyətlidir. Azərbaycan Avropa və Asiyanın qovuşağında yerləşir. Avropa ölkəsi ***kimi*** isə Avropanın ən ucqarındadır. Azərbaycan Avropa ölkəsi olmaq istəyir. Biz Avropa Birliyi ***ilə*** fəal əməkdaşlıq edirik, ərizə vermiş və Avropa Şurasına qonaq

---

[1] Təhməzov Zamiq. Müasir Azərbaycan dilində qoşma və köməkçi adlar. AMEA-nın xəbərləri. Humanitar elmlər seriyası, 2007, №1, s.159-165.

[2] Казим-Бек М.А. Общая грамматика турецко-татарского языков. СПб., 1948. 457 стр.

[3] Кононов А.Н. Грамматика современного турецкого литературного языка. М-Л., 1956, 569 стр.

Cəfərov S., Abdullayev N. Müasir Azərbaycan dilinin morfologiyası. Bakı, 2004. 173 səh.

Quliyev H. Qoşma və köməkçi adlar. Müasir Azərbaycan dili, II hissə, EA-nın nəşri, Bakı, 1981, 510 səh.

sifəti ***ilə*** qəbul olunmuşuq, yaxın vaxtlarda onun tamhüquqlu üzvü statusunu almağa ümid bəsləyirik" [VIIIc.s.252].

Bu kiçik mətndə ismin yönlük halında işlənən sözlərə qoşulan, səbəb məzmunu bildirən "görə" qoşması, ismin çıxışlıq halında işlənən sözlərə qoşulan, məqsəd məzmunu daşıyan "ötrü" qoşması, eləcə də birgəlik və iştirak məzmunu bildirən "ilə", məkan mənasında "kimi" qoşmaları harmonik şəkildə çulğalaşmışdır.

Heydər Əliyevin nitqlərində qoşmaların işlənmə tezliyini böyük natiqin "Azərbaycan Elmlər Akademiyasının rəhbərliyi, həqiqi və müxbir üzvləri, institut direktorları və aparıcı alimləri ilə görüşdəki" nitqində araşdırdıqda məlum olmuşdur ki, 88 yerdə qoşmalardan istifadə olunmuşdur. Ən çox işlədilən qoşmalar arasında "üçün" – 30.0%, "ilə" – 15.0%, "sonra" – 9.5%, "görə" – 9.0%, "kimi", "öncə", "nisbətən", "haqqında" qoşmaları hər biri – 4.2% təsadüf etmişdir. Eləcə də bu çıxışda "başqa", "əvvəl", "aid", "ötrü", "qədər", "qarşı", "qabaq" qoşmaları işlənmişdir.

Qoşmalar böyük natiqin nitqində gah cümlənin əvvəlində, gah da axırında səslənir: "***Haqqında*** danışdığımız yazılar açıq-aydın fitnəkar xarakter daşıyır" [IIc.s.141].

"Bu sözlər yüksək dövlət vəzifələri tutanlara da ***aiddir***" [IIc.s.141].

Böyük natiqin nitqlərinin araşdırılması sayəsində məlum olur ki, bəzən bir cümlədə 3 və daha çox müxtəlif məna çalarlarına malik qoşmalar işlədilir. Bu zaman həmin qoşmalar harmonik şəkildə uzlaşaraq nitqə xüsusi bir əlvanlıq verir: "Bilməlisiniz ki, prezident ***kimi*** mən müstəqil Azərbaycan dövlətçiliyinin möhkəmlənməsi ***üçün*** bundan ***sonra*** da əlimdən gələni edəcək, dövlətçiliyimizi, müstəqilliyimizi qorumaq ***üçün*** bütün tədbirləri görəcəyəm" [IIc.s.147].

Müxtəlif nitq hissələrinin, xüsusilə köməkçi nitq hissələrinin birgə, yanaşı işlədilməsi vasitəsilə nitqin məna çalarlarını qüvvətləndirmək Heydər Əliyev nitqinin başlıca məziyyətlərindəndir.

"Bunların hamısı indi həyata atılan gənclərimizin ömrünün ***daha da*** xoşbəxt olmasını təmin etmək ***üçün*** lazımdır. ***Qoy*** gənclər bundan sonra bir də qan***la***, müharibə ***ilə***, döyüş***lə*** rastlaşmasınlar" [XIIc.s.121].

"Qoy", "daha da" ədatlarının "üçün", "sonra", "-la, -lə" qoşmaları ilə iki cümlədə birgə istifadəsi Azərbaycan gəncliyinin qorunmasına yönələn bütöv bir çıxışın məzmununu özündə əks etdirir.

Heydər Əliyevin natiqlik məharətinin bir məziyyəti də ekspressivlik yaradılması çətin görünən nitq hissələrini təkrarlamaqla, auditoriyanı nitq cazibəsinə sala bilməkdir: "Amma indi Dağlıq Qarabağ dünyanın bütün ölkələrində məşhurdur. Məşhurdur bu müharibəyə ***görə***, məşhurdur bu münaqişəyə ***görə***. Eyni zamanda, məşhurdur ermənilərin apardıqları təbliğata ***görə***, işlərə ***görə***". Sadə bir qoşmanın, ismin yiyəlik halına qoşulan "görə" qoşmasının köməyi ilə bütöv bir fikir auditoriyaya aşılanır.

Sinonimlərdən istifadə qoşmalara münasibətdə də özünü göstərir. Belə ki, zaman mənasında işlənən "öncə" və "qabaq" qoşmaları bir cümlədə sinonimləşir: "Əgər yeddi il bundan ***öncə*** bizim başımıza gələn bu bəla unudulubsa və sənədlər də itibsə, tapılmırsa, təsəvvür edin, yüz il, iki yüz il bundan ***qabaq*** olan şeyləri bərpa etmək nə qədər çətindir" [VIIIc.s.376].

Müqayisə və bənzətmə mənasına ifadə edən "kimi" qoşması ismin qeyri-müəyyən və müəyyən yiyəlik halında işlədilir: "Ona görə də biz Cəlil Məmmədquluzadəyə sadəcə bir ədəbiyyatçı ***kimi***, yazıçı ***kimi***, publisist ***kimi*** yox, eyni zaman-

da böyük ictimai xadim ***kimi***, böyük siyasətçi ***kimi*** yanaşmalıyıq" [IIIc.s.43].

Bütün çıxışlarında olduğu kimi köməkçi nitq hissələrini bir-biriylə harmonik şəkildə işlətməklə fikrinə əlvanlıq vermək aşağıdakı cümlədə də özünü göstərir: "Buna görə də imkandan istifadə edərək, ədalətli işi dəstəklədiklərinə ***görə*** prezident Kvasnevskiyə, Polşa dövlətinə öz təşəkkürümü bir daha bildirirəm" [XIIc.s.35]. "Bu" işarə əvəzliyinə qoşularaq "buna görə də" mürəkkəb bağlayıcı yaradan "görə" qoşması, bilavasitə "görə" qoşması və "bir" sayının daha ədatı ilə birləşib qüvvətləndirici ədat kimi işləndiyi "bir daha" ədatı bir cümlədə işlənmişdir.

Qüvvətləndirici ədatlar içərisində "da", "də" qoşmalarla birgə işlənərək nitqin təsir gücünü artırır: "Əmin ola bilərsiniz ki, respublikamızda sərbəstlik, sabitlik, əmin-amanlıq, sülh bundan ***sonra da*** təmin ediləcəkdir" [XIIc.s.120].

Gələcəyə tuşlanan, sabahkı günə inam yaradan "sonra da" ifadəsi buna misaldır.

"Qədər" qoşması böyük natiqin dilində başlanğıc vaxtla son vaxt arasında zaman hüdudunu göstərir: "Ermənistan tərəfindən də bu təşəbbüs olmuşdu və 1994-cü il mayın 12-də atəşkəs haqqında saziş imzalanıbdır. O vaxtdan indiyə qədər, – bir neçə gündən ***sonra*** üç il tamam olacaqdır, – atəş yoxdur, yəni savaş yoxdur, müharibə getmir" [IXc.s.369].

"Qədər" qoşması ismin yönlük halında işlənən sözlərə qoşulduqda zaman və məkana görə ölçü miqyası bildirir: "Əlbəttə, müstəqil Azərbaycanda fizika, riyaziyyat, biologiya, kimya yaxud başqa fənlərin hamısı inkişaf etməlidir. Amma tarix hər bir insan üçün yeniyetməlikdən başlayaraq ömrünün sonuna ***qədər*** lazımdır" [VIIIc.s.367].

"Qədər" qoşması bir sıra hallarda böyük natiqin nitqində poetikcəsinə olaraq auditoriyanı əfsunlayır: "Heç bir peşədə

Hippokrat andı kimi and yoxdur. Hippokrat andı içən hər bir həkim o anda sona ***qədər*** sadiq olmalıdır" [XIIc.s.172].

Bu cümlədə "qədər" qoşması "sona" sözünə qoşularaq həkim andının davam müddətini səhiyyə işçilərinin auditoriyasına ünvanlayır.

Bu qoşma zaman anlamında olaraq frazeoloji birləşmələrin yaratdığı sinonim cərgənin hissələri arasına düşə bilir: "Xalqımız əsrlər boyu böyük sınaqlardan çıxıb və öz torpağını öz mənliyini qoruyub indiyə ***qədər*** saxlaya bilibdir".

Bu cümlədə "mənliyini qorumaq", "saxlaya bilmək" frazeoloji birləşmələrinin ortasında "qədər" qoşması özünə yer alır.

Heydər Əliyevin nitqində xüsusiləşmə və seçilmə məzmunu daşıyan "savayı" qoşması ismin çıxışlıq halında işlənən sözlərə qoşulur: "Bəxtiyar Vahabzadəyə bir hörmətli şair ***kimi*** həmişə hörmət etmişdim və işlədiyim zaman bizim işgüzar əlaqələrimiz olmuşdur. Bəxtiyar Vahabzadə şair idi, şair olaraq da qalıbdır, indi də şairdir. Onun şairlikdən ***savayı*** bir vəzifəsi yoxdur" [XIIIc.s.104]. Bu cümlədə "savayı" qoşması ilə Bəxtiyar Vahabzadəni məhz bir şair kimi auditoriyaya təqdim edir.

İsmin yönlük halında işlənən sözlərə qoşulan qoşmalar içərisində "qarşı" qoşması böyük natiqin dilində müxtəlif mənalarda işlədilir. "Qarşı" qoşması böyük siyasi liderin nitqində əksər vaxtlarda tam ziddiyyət məzmunu bildirir: "Dünən mən prezident Kvasnevskiyə də demişəm ki, 1990-cı ilin yanvarında Azərbaycana ***qarşı*** böyük bir təcavüz olmuşdur. Bu, xalqımıza ***qarşı*** olan təcavüz idi" [XIIc.s.89].

Azərbaycanla bağlı, Azərbaycan xalqı ilə bağlı ciddi məsələlərdə "qarşı" qoşması ittiham kimi səslənir: "Mən o vaxt Moskvada ağır bir vəziyyətdə yaşadığım zaman mitinqdə çıxış etdim, Azərbaycana ***qarşı*** bu cür ədalətsiz hərəkət etdiyinə görə kommunist rejimini ittiham etdim. Qanlı Yanvar,

Yanvar faciəsi xalqımızın tarixində həmişə yaşayacaqdır, – Azərbaycan xalqının azadlığa, müstəqilliyə olan cəhdi və eyni zamanda bu cəhdə ***qarşı*** edilmiş hərbi təcavüz kimi yaşayacaqdır” [XIIc.s.89].

“Qarşı” qoşması böyük natiqin çıxışlarında tam ziddiyyət bildirir: “Əlbəttə, bu gün də qanunları pozanlar, cinayət edənlər var. Ancaq bunlar bir neçə il bundan öncə olduğu kimi kütləvi və təhlükəli xarakter daşımır. Onlara ***qarşı*** da mübarizə aparılır” [XIIc.s.120].

“Qarşı” qoşmasının tam ziddiyyət xarakterində olması qüvvətləndirici ədatlarla daha da güclənir. Yuxarıdakı cümlədə “da” qüvvətləndirici ədatı buna sübutdur.

“Başqa” qoşması “əlavə”, “savayı” qoşmaları ilə sinonimləşə bilən qoşma olub Heydər Əliyevin nitqlərində fikirlər arasına körpü salmaq məqsədi güdür: “Bu yaxınlarda mənim Amerika Birləşmiş Ştatlarına rəsmi səfərim zamanı Vaşinqtonda Ağ evdə üç müqavilə və bir saziş imzalanmışdır. Bundan ***başqa***, Xəzər dənizinin Qazaxıstan sektorunda da, Türkmənistan sektorunda da, Qazaxıstan və Türkmənistan ərazilərində də ehtiyatlar var. Bunların hamısı bütün bu yataqların birgə işlənməsi ***üçün*** ilkin zəmin yaradır” [XIIc.s.37].

Burada Azərbaycanda olan neft yataqları ilə Qazaxıstan və Türkmənistandakı neft yataqları arasında “başqa” qoşması əlaqə yaradaraq sonda məqsəd mənası daşıyan “üçün” qoşması ilə “yataqların birgə işlənməsi” və iqtisadi qənaətə gətirib çıxarır: “Mən bunu bəlkə də başqalarından daha çox təsəvvür edirdim ki, bu belə olacaq, çətin olacaq” [XIIIc.s.89].

Burada, bu cümlədə, “başqalarından” ifadəsi əvəzlik kimi gözəl səslənir.

İsmin yönlük halında işlənən “aid” və “qədər” qoşmaları ardıcıl şəkildə xüsusilə məişət üslublu, söhbətvarı çalarlı nitqlərdə işlənir: “Keçən görüşümüzdə də çox geniş söhbət oldu.

Son günlər Azərbaycan televiziyasında o dövrə ***aid*** sənədli verilişlər nümayiş etdirilir, mətbuatda yazılar dərc olunur. Kəlbəcərin başına bu faciənin gəlməsinin səbəbləri araşdırılır".

Yönlük hala qoşulan "qədər" qoşması Heydər Əliyevin nitqində özünəməxsusluqla seçilir:

"Dünən cənab Helmut Kol ilə danışıqlarımız əvvəldən axıra qədər üstünlük verdiyimiz məsələlərlə əlaqədar olmuşdur". Burada "əvvəldən axıra" ifadəsi məsafə bildirərək yönlük hala qoşulan söz kimi çıxış edir. İzahedici nitq mexanizmi burada da işə düşür.

"Üçün" qoşması böyük natiqin fikrini yekunlaşdırmaq məqamlarında da istifadə olunur: "Mənə göstərdiyiniz diqqət ***üçün***, bugünkü görüş ***üçün*** sizə təşəkkür edirəm, hamınızı Azərbaycana dəvət edirəm, siz Azərbaycanda bizim məkanlarımız haqqında daha dolğun təsəvvür əldə edə bilər və eyni zamanda xalqımızın, respublikamızın qonağı olmaq imkanı qazana bilərsiniz" [VIIIc.s.262].

"Üçün" ismin adlıq halında işlənən qoşma Heydər Əliyevin nitqində məqsəd məzmunu daşıyır. Bu məqsədlər çeşidli auditoriyalarda "üçün" qoşmasının köməyi ilə açılır: "İqtisadiyyatda bu qədər ciddi dəyişiliklər aparmaq, insanların psixologiyasında dəyişiliklər aparmaq, onlara yeni prinsiplər əsasında işləməyi öyrətmək, sahibkarlıq əhval-ruhiyyəsi yaratmaq – bunlar asan məsələlər deyil. Bunlar hamısı yalnız və yalnız iqtisadiyyatın inkişafı ***üçündür*** və iqtisadiyyatın inkişafı, istehsalın inkişafı, maliyyə sisteminin inkişafı şübhəsiz ki, respublikanın bütün sakinlərinin, bütün vətəndaşlarının rifahı halının yaxşılaşdırılması ***üçündür***" [VIIc.s.229].

Böyük natiqin dilində qoşmalar da təkrarlanır. Belə ki, "üçün" qoşması üç yerdə təkrar olaraq natiqin auditoriyaya olan təsir gücünü artırır: "Bu, çox əhəmiyyətlidir, bu bizim ***üçün*** xüsusi əhəmiyyətlidir, eyni zamanda Türkiyə ***üçün*** də

əhəmiyyətlidir. Çünki Azərbaycan ***üçün*** Türkiyədən yaxın dost, qardaş dövlət yoxdur" [IXc.s.385].

Burada "üçün" qoşması Türkiyə və Azərbaycanın bir-birinə bağlılığını göstərir.

"Üçün" qoşması məsdərlərə qoşularaq əsasən məqsəd, qismən də səbəb məzmunu ifadə edir: "Gələcəkdə sizin çox böyük imkanlarınız olacaqdır. Siz müxtəlif arzularınızı, istəklərinizi yerinə yetirmək ***üçün***, cəmiyyətdə layiqli yer tutmaq ***üçün***, ölkəyə, Vətənə, millətə faydalı olmaq ***üçün*** oxuduğunuz dövrlərdə ali məktəblərin bütün imkanlarından istifadə edib gərək yüksək bilik toplayasınız, özünüzü gələcəyə hazırlayasınız" [XIIc.s.118].

"Üçün" qoşması böyük natiqin dilində müqayisə məzmunu kəsb edə bilir. Müqayisələrin müxtəlif məsələlərin məzmununu açmaqda ciddi nitq amili olduğunu gözəl anlayan böyük natiq bundan tez-tez istifadə edir: "Bir milyard dollar bəlkə də hansısa dövlət üçün xırda bir məbləğ hesab olunur. Ancaq bizim region ***üçün***, Azərbaycan ***üçün*** bu üç il müddətində burada bir milyard dollar məbləğində müştərək iş görülməsi çox böyük və sevindirici bir hadisədir" [XIIIc.s.188].

"Üçün" qoşmasının Nəsimi dilində araşdırılması bir daha "dili Allah yaşadır, dili böyük sənətkarlar, görkəmli dövlət və siyasi xadimlər yaşadır" müddəasının doğruluğunu sübuta yetirir:[1] Bu qoşma müasir Azərbaycan dilində olduğu kimi klassiklərin dilində də fəal olmuş, sözlərə bitişik ***içün, çün,*** sözlərdən ayrı ***üçün*** şəklində formalaşmışdır:

Yoxdur vəfası zərrəcə könlümdə dünyanın,

[1] Mehdiyeva Sevil. Nəsimi "Divanı"nda köməkçi nitq hissələri və köməkçi adlar, AMEA Humanitar və ictimai elmlər seriyası, 2002. №1-2, səh.127-137

Ol bivəfaya aninçün bivəfa derəm.[1]

Gər aşiq isən sidq ilə şol dilbər ***üçün*** gəl,
Can ilə cahan ortaya qoy, tərki-sər eylə.[2]

Heydər Əliyevin nitqlərində "görə" qoşması sabit qoşmalardan hesab edilsə də, çox vaxt "o", "bu" əvəzliklərinə qoşularaq mürəkkəb bağlayıcı kimi işlədilir: "Həkimlər öz peşələrinə ***görə*** müharibənin əleyhinədirlər. Onlar öz peşələrinə ***görə*** qan tökülməsini, hərbi münaqişə olmasını istəmirlər. Ona görə də həkimlərin, səhiyyə işçilərinin fəaliyyəti həm cəmiyyətimizin sağlamlığı, səhhəti naminə, həm də insanlar arasında sülh, əmin-amanlıq yaradılması üçün çox əhəmiyyətli və dəyərlidir" [XIIc.s.171].

"Görə" qoşması Heydər Əliyevin nitqində səbəb bildirir: "Biz bu günümüzə ***görə*** – xalqımızın mədəniyyətinin, ədəbiyyatının, elminin, təhsilinin ümumi səviyyəsinin bu mərtəbəyə qalxmasına ***görə*** Səməd Vurğuna minnətdarlığımızı bildirməliyik" [IXc.s.21].

"Görə" qoşmasını böyük natiq səbəb kimi işlədir: "Azərbaycan qadınları da öz ağıllarına, zəkalarına ***görə***, biliklərinə, istedadlarına ***görə*** dünya qadınları içərisində özünəməxsus və çox yüksək yer tuturlar. Ona görə də biz qadınlarımızla fəxr edirik" [IXc.s.25].

Görə qoşması ismin yönlük halına qoşularaq böyük natiqin nitqində səbəb mənası qazanır: "Bizə göstərdiyiniz bu hörmət və ehtirama, qayğıya, diqqətə ***görə*** sizə təşəkkür edir və sizi əmin edirəm ki, Azərbaycan xalqı bunların hamısını yüksək qiymətləndirir" [IXc.s.362].

---

[1] Nəsimi. Seçilmiş əsərləri I cild, Bakı, 1973. səh.547
[2] Nəsimi. Seçilmiş əsərləri II cild, Bakı, 1973. səh.179

"Görə" qoşması Heydər Əliyevin nitqində milli-dini mənsubiyyətimizi auditoriyalara tanıdır. "Görə" qoşmasını eşidən dinləyicilər bu "görə"nin mənasını, məzmununu eşitmək istəyirlər: "Öz kökümüzə ***görə*** biz Şərq, İslam ölkəsiyik... Ancaq Azərbaycan öz kökünə, dini mənsubiyyətinə, ənənələrinə ***görə*** Şərq aləminə, İslam, türk dünyasına daxil olubdur" [XIIIc.s.107]. İki yerdə təkrar olunan "görə" qoşması ilə böyük natiq soy-kökümüzü bizlərə xatırladır.

Başqa bir nitq məqamında "görə" qoşması Azzərbaycanın dünyadakı mövqeyini göstərir: "Bunu ona görə deyirəm ki, Azərbaycan təbii sərvətlərinə ***görə***, coğrafi vəziyyətinə ***görə*** çox dairələrin maraq mərkəzinə dönübdür. Ona görə də dövlətimizi möhkəm qurmaq, ölkəmizi qorumaq, saxlamaq, hər bir vətəndaşı vətənə sadiq etmək bizim borcumuzdur" [XIIIc.s.131].

Böyük natiq elə yuxarıdakı iki cümlədə "görə" sözünün iki yerdə qoşma, iki yerdə isə "o" işarə əvəzliyinə qoşularaq mürəkkəb bağlayıcı kimi işlədərək Azərbaycanın dünyada yeri və Azərbaycanın qorunması prinsiplərini məhək daşı təkin hər birimizə anladır.

"Görə" qoşması böyük natiqin nitqlərinin sonluqlarında təşəkkür etmək məqamlarında təkrarlanaraq nitqin auditoriyalara təsir gücünü artırır: "Cənab mer, bizə göstərdiyiniz qayğı və diqqətə ***görə***, buradan Romanın geniş bir sahəsini seyr etməyə imkan yaratdığınıza ***görə***, əsası hələ 2500 il bundan əvvəl qoyulmuş bu tarixi binada olmağımıza ***görə*** sizə təşəkkür edirəm" [XIIc.s.237].

İsmin çıxışlıq halında işlənən sözlərə qoşulan qoşmalardan biri də böyük natiqin qarşıya məqsəd qoyduğu hallarda işlənən "ötrü"dür: "Bu real vəziyyəti dərk edib, hamımız əl-ələ verib böhrandan şərəflə çıxmalı, müstəqil Azərbaycanı irəliyə doğru aparmalıyıq. Bundan ***ötrü*** isə gərək hər kəs öz sahəsində məsuliyyətlə çalışsın" [IIc.s.139].

"Ötrü" qoşması Heydər Əliyev nitqində səbəb bildirmək mənasındadır: "Ancaq bütün bunlara baxmayaraq biz Ermənistanla sülh yaratmaq, münaqişəni sülh yolu ilə aradan qaldırmaq istəyirik. Bundan ötrü də çox konstruktiv addımlar atırıq" [VIIc.s.28].

Böyük natiq "ötrü" qoşmasını "də" qüvvətləndirici ədatla qüvvətləndirə bilir.

Başqa bir məqamda "ötrü" qoşmasını "bundan ötrü" şəklində işlədərək auditoriyada güclü maraq doğura, nitqini mənalı edə bilir: "Ümumiyyətlə, deyim ki, Azərbaycan əməkdaşlıq üçün böyük imkanlara, ***bundan ötrü*** təbii ehtiyatlara, sənaye potensialına, elmi-texniki və intellektual potensiala malikdir" [VIIc.s.46 ].

Bir sıra hallarda isə "üçün", "ötrü" qoşmaları birgə işlədilir: "Kənd təsərrüfatı məhsulları istehsalı da bizim üçün aktualdır. ***Bundan ötrü*** bizim böyük imkanlarımız var" [VIIc.s.48].

İsmin çıxışlıq halına qoşulan "ötrü", "sonra" qoşmaları bəzən ardıcıl olaraq böyük natiqin nitqində səslənir: "Əmin olun ki, şəxsən mən ***bundan ötrü*** bütün imkanlarımdan istifadə edəcəyəm. Dəfələrlə demişəm və bir daha qeyd edirəm: mənim həyatım xalqa məxsusdur, xalqın ixtiyarındadır və bundan sonra da bütün həyatımı xalqa həsr etməyə hazıram, həyatımın qalan hissəsini də sizə və bütün Azərbaycan xalqına bəxş edirəm" [Ic.s.189].

"Ötrü" qoşması böyük natiqin dilində səbəb-məqsəd mənası daşıyır: "Bəzən azərbaycanlılar öz aralarında danışarkən fikirləşirlər ki, bizim də ermənilərinki kimi lobbimiz olsaydı, başqa ökələrdə bizim də diasporumuz olsaydı, şübhəsiz, onlar da bizdən ***ötrü*** çox iş görərdi" [Ic.s.431].

Heydər Əliyevin nitqində "ötrü" qoşması "bu məqsədlə" ifadəsini əvəz edən bir qoşmadır: "Əmin olun ki, şəxsən mən bundan ötrü bütün imkanlarımdan istifadə edəcəyəm" [Ic.s.189].

Zaman anlamında olan "əvvəl", "sonra" qoşmaları auditoriyada keçmişə səyahət və gələcəyə inam ovqatı yaradır: "Mən çox sevinirəm və xoşbəxtəm ki, ilk dəfə Azərbaycan yazıçılarının qurultayında 27 il bundan ***əvvəl*** nitq söyləmiş, o qurultayın iştirakçısı olmuşam və ondan ***sonrakı*** qurultaylarda da daim iştirak etmişəm, yazıçılarımızla, şairlərimizlə, mədəniyyət xadimləri ilə bir yerdə olmuşam, bu gün də sizinlə bir yerdəyəm" [XIIIc.s.99].

İsmin çıxışlıq halına qoşulub zaman mənası ifadə edən "sonra" qoşması da böyük natiqin nitqlərində heç də az təsadüf etmir: "SSRİ-nin saxlanılmasına yol verməməliyik. Biz bunu etməsək, bunu bizdən ***sonra*** gələn nəsillər üçün saxlamamalıyıq" [XIIIc.s.98].

Burada "sonra" qoşması felin vacib şəkli ilə çulğalaşaraq qəti gələcək zamanda baş verən hadisələri göstərir.

İsmin çıxışlıq halında işlənən "sonra" qoşması zaman mənası ifadə edərək böyük natiqin dilində bəzən təkrarlanaraq nitqə ekspressivlik verə bilir: "Ondan bir gün ***sonra*** mən Parisdə oldum. Bilirsiniz ki, yanvar ayında mən Fransanın prezidenti cənab Jak Şirakın dəvəti ilə Parisə getmişdim. Amma iki aydan ***sonra*** yenidən Fransada oldum, bu ölkənin prezidenti Jak Şirakla görüşdüm" [IXc.s.119].

"Sonra" qoşması ismin çıxışlıq halında olan "bundan" əvəzliyinə qoşularaq böyük natiqin nitqlərində qəti gələcək zamanda səslənən cümlələrdə daha çox işlədilir. "Bundan sonra" ifadəsini eşidən auditoriya qətiyyətli dövlət başçısı nitqini eşitməyə hazırlaşır: "Hesab edirəm ki, respublikamızı bu cinayətkarlardan təmizləmək prosesi ***bundan sonra da*** davam edəcəkdir" [VIIIc.s.391].

Eləcə də bu qoşma cəmiyyətdə baş verən neqativ hallarla mübarizədə qüvvətləndirici ədatlarla birgə işlədilir: "Biz bunların qarşısını almışıq, ***bundan sonra da*** alacağıq, kökünü kəsəcəyik" [VIIIc.s.392].

Bu cümlədə "sonra" qoşması "da" qüvvətləndirici ədatla, başqa bir cümlədə isə: "Gəncləri ***bundan sonra bax*** belə hallardan, bu cür xəstəlikdən – o illərdə Azərbaycanda bu xəstəlik geniş yayılmışdır – xilas etmək lazımdır" [VIIIc.s.392] – "bax" ədatı ilə birgə işlənərək fikrin auditoriyaya çatdırılmasında mühüm rol oynayır.

"Sonra" qoşması Heydər Əliyevin gələcəyə tuşlanan, auditoriyalarda əminlik yaradan nitqlərində yerindəcə işlənir: "Mən əminəm ki, bir neçə ildən ***sonra*** Azərbaycanın iqtisadiyyatında çox ciddi dəyişiliklər olacaqdır. Bu əminliyin əsasını imzalanmış neft müqavilələri, Azərbaycanda iqtisadi islahatların və bazar iqtisadiyyatının, özəlləşdirmənin ardıcıl surətdə həyata keçirilməsi təşkil edir" [VIIIc.s.285].

Heydər Əliyev nitqində zamana işarə edən "sonra" qoşması zaman ardıcıllığını auditoriyaya izah etmək baxımından vacibdir: "***Sonra***, bu qurultay ikinci dəfə Türkiyədə, Ankarada keçirilərkən bizim əziz dostumuz, qardaşımız, Türkiyənin prezidenti hörmətli Sülyeman Dəmirəlin təşəbbüsü və iştirakı ilə bu qurultaya güc verilmiş və bu ənənənin köklənməsini göstərmişdir" [VIIIc.s.5].

"Sonra" qoşması – ismin çıxışlıq halına qoşulan qoşma xüsusilə məişət üslublu çıxışlarda özünü göstərir: "Görürsünüz, bəzən faciə özündən ***sonra*** böyük bir abidə doğurur, böyük bir müqəddəs ocaq, ibadətgah, ziyarətgah doğurur" [Xc.s.418-419].

Bu qoşma ən çox gələcək zamana münasibət mənasında işlənir: "Bütün bu tədbirlərin həyata keçirilməsində Türkiyə daim Azərbaycana dayaq olub, daim Azərbaycanla bir yerdə olubdur. Ümidvaram ki, ***bundan sonra da*** bir yerdə olacaqdır" [IXc.s.364].

"Sonra" qoşması keçmiş tarixdən bu günədək, indiyədək olan zamanı tez-tez Heydər Əliyev nitqində müşahidə etməyə əsas verir: ""Fatih" Universiteti yaşca gənc universitetdir. An-

caq sevindirici hal odur ki, təşkil olunduğu qısa müddətdən ***sonra*** universitet sürətlə inkişaf edibdir" [IXc.s.383].

"Sonra" qoşması "az" qeyri-müəyyən sayı ilə birləşəndə zaman anının yaxınlığı, "bir neçə ildən sonra" ifadəsində isə zaman anının uzaqlığı anlaşılır: "Mən şübhə etmirəm ki, bir neçə ildən ***sonra*** bu kadrlar qat-qat artacaqdır, bizim öz milli kadrlarımızdan yaxşı müəllimlərimiz olacaqdır, yaxşı təlimatçılarımız olacaqdır, bizim yaxşı məktəbimiz yaranacaqdır və müstəqil Azərbaycan bu sahədə də öz ordusuna tam arxayın ola biləcəkdir" [XIIc.s.335].

"Da" qüvvətləndirici ədatla güclənən, ismin çıxışlıq halına qoşulan "sonra" qoşması qəti gələcək zamanda baş verəcək situasiyaları auditoriyaların gözü qarşısında canlandırır: "Mən fürsətdən istifadə edib bunlara ***görə*** Azərbaycanın bütün səhiyyə işçilərinə təşəkkür edirəm və ümidvar olduğumu bildirmək istəyirəm ki, siz bu yolda ***bundan sonra da*** fədakarcasına çalışacaqsınız" [XIIc.s.172-173].

Bəzən də "sonra" qoşması qeyri-müəyyən saylara qoşula bilir: "…Qorbaçovun Azərbaycan xalqına qarşı həyata keçirdiyi bu hərbi təcavüzün əleyhinə çıxdım. Bundan az ***sonra*** ərizə verib Kommunist Partiyasından çıxanda da səbəbini əsaslandırdım" [XIIc.s.225].

Əgər birinci cümlədə Qorbaçovun siyasəti ilə Azərbaycan arasında tam ziddiyyət "qarşı" qoşmasının köməyi ilə açıqlanırsa, ikinci cümlədə "sonra" qoşması Heydər Əliyevin Kommunistlərin sıralarını tərk etmə vaxtını göstərir.

Keçmişə qayıdış baxımından "qabaq" qoşması böyük natiqin dilində məharətlə səslənir. Bu zaman "qabaq" qoşması "əvvəl"lə sinonimləşə bilən qoşmalardan sayıla bilir: "Qadınlar çadırlarda doğmağa məcbur olurlar. On il bundan ***qabaq*** Azərbaycanda qadınların doğması ancaq doğum evlərində olurdu" [XIIc.s.170].

Zaman mənası ifadə edən "qabaq" qoşması müəyyən nitq məqamlarında "da", "də" qüvvətləndirici ədatların köməyi ilə

gücləndirilir, beləliklə, mövzunun auditoriya tərəfindən mənimsənilməsi yüksəlir: “Həqiqəti demək lazımdır ki, Ermənistanın o separatçı, qəsbkar qüvvələri Azərbaycana qarşı qəsbkarlıq niyyətləri ilə bu gün deyil, dünən deyil, yüz il bundan ***qabaq da*** bu fikirlərlə yaşayıblar və bu planları həyata keçirməyə çalışıblar” [VIIc.s.196].

“Əvvəl”, “qabaq” qoşmalarının sinonimi kimi “öncə” qoşması da keçmiş zaman baxımından böyük natiqin dilində tez-tez eşidilir. Çox vaxt da bu qoşma təkrarlanaraq dinləyicilərin diqqətini əsas məsələyə, toplantının keçirilməsi ilə bağlı məsələyə yönəldir: “…Bunların nəticəsində 50 il bundan ***öncə*** Azərbaycanda ilk dəfə Elmlər Akademiyasının yaranması – bunların hamısı XX əsrdə Azərbaycanda elmin sürətlə inkişafını nümayiş etdirən faktlardır” [VIIIc.s.360].

Elə həmin auditoriyada Akademiyamızın – elm məbədimizin yaranmasını bir daha diqqətə çatdırır: “Əlli il bundan ***öncə*** Elmlər Akademiyasının yaranması Azərbaycanın çox əsrlik tarixində mühüm bir hadisədir” [VIIIc.s.361].

İsmin çıxışlıq halında işlənən sözlərə qoşulan qoşmalar arasında “əvvəl”, “sonra”, “qabaq”, “bəri” ilə yanaşı Heydər Əliyevin nitqləri üçün zaman anlamında olan “öncə” qoşması xüsusi yer alır: “Amma eyni zamanda bizim çoxəsrlik tariximiz onu göstərir ki, Azərbaycanın döyüşçüləri yüz illər, min illər bundan ***öncə*** çox cəsur döyüşçülər olublar, Azərbaycan xalqının keçmiş əsrlərdə – orta əsrlərdə, ondan əvvəlki dövrlərdə güclü hərbi dəstələri olubdur, özünün sərkərdələri olubdur, qəhrəmanları olubdur” [XIIc.s.332].

Zaman mənası ifadə edən qoşmalar “o”, “bu” əvəzliklərinə qoşulub müəyyən və qeyri-müəyyən saylarla birgə təsadüf edir. Yuxarıdakı cümlədə “yüz illər, min illər”, eləcə də “orta əsrlərdə” qeyri-müəyyən sayları yerindəcə işlənmişdir.

“Əvvəl”, “sonra” zaman anlamında olan qoşmalarla yanaşı “öncə” qoşması da tez-tez böyük natiqin nitqində müxtəlif mövzularla bağlı üzə çıxır: “Amma insan cəmiyyətinin öm-

rünü heç kəs bilmir. Yer üzərində neçə yüz min illərdir ki, insan yaşayır və insan cəmiyyəti mövcuddur. İbtidai icma dövrü – tarixçilər yazıblar – neçə min illər bundan ***öncə*** olubdur" [XIIIc.s.169].

Qeyri-müəyyən saya (neçə min il) qoşulan "öncə" qoşmasının köməyilə Heydər Əliyev auditoriyanı düşündürən mühüm bir suala – insan cəmiyyətinin ömrü nə qədərdir – cavab verir.

Əsas nitq hissələri ilə köməkçi nitq hissələri arasında keçid mərhələ təşkil edən qoşma kimi işlədilən "haqqında", "barəsində", "haqda", "barədə" sözləri Heydər Əliyevin işgüzar-publisistik üslublu çıxışlarında daha çox işlədilir. Bəzən bir cümlədə bu qoşmalar sinonim kimi işlədilir: "Ermənistan-Azərbaycan münaqişəsinin iki mərhələdə aradan qaldırılması ***haqqında*** ATƏT-in Minsk qrupu həmsədrlərinin axırıncı təkliflərinə müsbət münasibət bəslədiyimi bir daha təsdiqləyərək nəzərə çatdırmaq istəyirəm ki, bu təklifləri Azərbaycan tərəfi danışıqlar prosesinin gücləndirilməsi üçün əsas kimi qəbul etmişdir və bu ***barədə*** öz rəyini yazılı şəkildə təqdim etməyə hazırdır" [XIIc.s.275].

İsmin adlıq halına qoşulan "barəsində" qoşması Heydər Əliyevin nitqində mövzu obyekti mənasında işlənir: "Bu günlərdə biz Türkiyədə Azərbaycan ***barəsində*** çox yüksək dostluq-qardaşlıq münasibətlərini, böyük qonaqpərvərlik, hərarətli qəbul hiss edirik. Bunların hamısına ***görə*** türk xalqına, Türkiyə Cümhuriyyətinə təşəkkür edirəm" [IXc.s.362].

"Haqqında" qoşması publisistik üslubun tələblərinə uyğun nitq məqamlarında özünü göstərir: "Akademiya ***haqqında*** nə qanun qəbul olunacaq? Elm və texnika ***haqqında*** qanun qəbul ediləcək, amma akademiya, onun prinsipləri ***haqqında***, ola bilər prezidentin fərmanı olsun" [VIIIc.s.371].

İki ardıcıl cümlədə üç yerdə "haqqında" qoşması ritorik sualın tərkibində böyük natiqin nitqinə xüsusi əlvanlıq verir.

“Aid” qoşması aidlik, məxsusluq bildirir ki, bu qoşma böyük natiqin nitqində sinonim kimi həm “aid”, həm də “məxsus” ifadələri işlədilir: “Çünki indi Azərbaycanda bir çox partiyalar, ayrı-ayrı siyasi qruplar, ayrı-ayrı ictimai təşkilatlar var. Şübhəsiz ki, hər bir partiyanın, hər bir təşkilatın özünə ***aid***, özünə ***məxsus*** proqramı var, istiqaməti var” [Ic.s.188].

İsmin yönlük halına qoşulan “aid” qoşması müəyyən məqamlarda təkrar şəklində böyük natiq tərəfindən işədilir: “Mən bu sözləri fürsətdən istifadə edib deyirəm. Amma ola bilsin ki, bu sözlər bu mövzuya o qədər də ***aid*** deyildir. Mövzuya ***aid*** olan budur ki, Füzulinin adı ***haqqında*** burada cürbəcür təkliflər var... Amma bir halda ki, Füzuli doğrudan da əvəzedilməz bir şəxsiyyətdir, onda bu təklifə baxılmalıdır” [VIIc.s.173].

Aidlik, məxsusluq bildirən “aid” qoşması ilə yanaşı bu mətndə mövzu obyekti bildirən “haqqında” qoşmasından da istifadə yerli-yerində öz əksini tapmışdır.

Bəzən də “haqqında” qoşması da böyük natiqin dilində təkrarlanaraq mövzunun vacibliyini auditoriyaya çatdırır: “Ancaq təəsüf ki, – həmin 1988-ci il ***haqqında***, 1988-ci ilin fevral ayında başlanmış hadisələr ***haqqında*** burada deyildi, – təəssüf ki, onlar da Azərbaycanın rəsmi dairələrini oyatmamışdır, ayağa qaldırmamışdır və Azərbaycanın vəziyyəti ***haqqında*** düşünməyə cəlb edə bilməmişdir” [VIIc.s.181].

Üç yerdə “haqqında” qoşması, iki yerdə “təəssüf ki” modal sözünün təkrarlanması ilə müşayət olunan cümlə bütöv bir dövrü xarakterizə etməyə əsas verir.

Heydər Əliyevin nitqində ismin yönlük halına qoşulan qoşmalardan biri də “dair” qoşmasıdır. Bu qoşma “aid” qoşmasına sinonim kimi də işlədilə bilir: “Kənd təsərrüfatı məsələlərinə ***dair*** bir neçə böyük müşavirədə, müxtəlif səviyyələrdə keçirdiyimiz toplantılarda mən dəfələrlə bəyan etdim ki, bizim bütün iqtisadiyyatın inkişafında tutduğumuz strateji yol iqtisadiyyatı bazar iqtisadiyyatı yolu ilə irəlilətməkdən, iq-

tisadi islahatlar aparılmasından, o cümlədən də aqrar sektorda islahatlar həyata keçirilməsindən ibarətdir" [VIIc.s.89].

Elə "dair" qoşması nitqin başlanğıcında auditoriyaya söhbətin nədən gedəcəyini anladır ki, ilk baxışda adi görünən bir qoşma böyük natiqin nitqində mühüm mətləblərə girişdən xəbər verir, auditoriyanı çıxışa hazırlayır.

Aidlik məzmunu ifadə edən biri digərinin sinonimi olan "məxsus, aid, dair" qoşmaları içərisində "dair" qoşması Heydər Əliyevin verdiyi fərmanların adlarında daha çox istifadə olunur. Eləcə də, rəsmi publisistik üslubda "haqqında" qoşmasına çox yer verilir: "Buna görədir ki, mən iyunun 28-də yeni bir fərman verməli oldum: "Xarici ölkələrə məhsul satışının təmin edilməsi sahəsində nəzarətin gücləndirilməsinə dair əlavə tədbirlər haqqında"." [IIc.s.119].

### *"Kimi" qoşması*

"Kimi" qoşması müəyyən məqamlarda bənzətmə mənasında işlədilir: "Xalqımız bu bayramı əziz bir bayram ***kimi*** qoruyub saxlayıbdır" [IXc.s.35].

Müqayisə və bənzətmə mənasını ifadə edən sabit qoşma "kimi" böyük natiqin dilində təkrarlanaraq antroponimik sıralanmalarla harmoniya yaradır: "Siz hələ gəncsiniz. Qarşınızda böyük yaradıcılıq yolu vardır. İstərdim ki, sizdən əvvəlki sənətkarlar – Lütfəli Abdullayev ***kimi***, Rəşid Behbudov ***kimi***, Leyla Bədirbəyli kimi və başqaları ***kimi*** öz üzərinizdə çalışasınız" [XIIc.s.177].

"Kimi" qoşmasının dörd dəfə təkrarlanmasının, üç korifey sənətkarın sadalanmasının, "qarşı" və "başqa" qoşmalarının müstəqil mənalı söz kimi işlədilməsinin bir cümlədə şahidi oluruq.

Heydər Əliyevin nitqində "kimi" qoşması sifətlərə qoşularaq cümlədə ekspressivlik yaradır: "Bəlkə də həmin gənclərin özləri bilmirlər ki, onların adları, familiyaları, daxil ol-

duqları institutların, universitetlərin adları jurnallarda, dəftərlərdə yazılıb və indiyədək bunları əziz bir sənəd ***kimi*** özümdə saxlamışam” [XIIc.s.116-117].

Bu cümlədə “*-dək*” qoşması yönlük halda işlənən “indi” zaman zərfinə qoşularaq zaman mənasını ifadə edir.

Başqa bir nitq məqamında “kimi” qoşması feli sifətlə birgə işlənərək nitqin əlvanlığını, məna tutumunu artırır: “Ancaq mən, bütün çətin dövrləri yaşamış bir şəxs ***kimi***, sizə öz həyat təcrübəmdən və gördüklərimə əsasən tövsiyə edirəm ki, həyatınızda heç bir günü itirməyin” [XIIc.s.117].

Bu qoşma ismin adlıq halına qoşularaq bəzi məqamlarda təkrarlanaraq auditoriyada əminlik yaradır: “Əmin ola bilərsiniz ki, bir prezident ***kimi*** mən hər bir xarici şirkətin Azərbaycanda səmərəli işləməsi ***üçün*** əlverişli şərait yaradılması sahəsində bütün tədbirləri görəcəyəm. Mən sizin qarşınızda Azərbaycanda sabitliyin, ölkəmizdə bizneslə səmərəli məşğul olmaq imkanının, iqtisadiyyat sahəsində əməkdaşlığın təminatçısı ***kimi*** çıxış edirəm” [VIIc.s.47].

Heydər Əliyevin nitqində ismin çıxışlıq halına qoşulan “savayı” qoşması əsas fikrin hələ bitmədiyini auditoriyaya anladır: “Böyük qurbanlar verildi və faşizmin qarşısı alındı, Sovetlər İttifaqı bu müharibədə 27 milyon adam itirdi.

Amma onlardan ***savayı***, yaşayanların da içərisində nə qədər insan acından öldü, nə qədər insan əziyyət çəkdi. Bunlar hamısı o vaxt lazım idi ki, ölkə qorunsun və ölkə, eləcə də dünya faşizm ***kimi*** dəhşətli bir fəlakətdən xilas ola bilsin” [VIIc.s.184].

Yuxarıdakı mətndə “kimi” qoşması ismin adlıq halına qoşularaq bənzətmə mənası verir və bu gün də faşizmin necə bir fəlakət olduğunu dünyaya bəyan edir.

İsmin çıxışlıq halına qoşulan “savayı” qoşması çox olmasa da, yeri gəldikcə böyük natiqin nitqində işə düşür: “Keçmiş Sovetlər İttifaqının ərazisində bu ziddiyyətlər, bu toqquşmalar

baş verir – onlar xalqlara bəladan, qandan, faciədən ***savayı*** heç nə gətirmir” [IIIc.s.195-196].

“Savayı” qoşması – xüsusiləşmə və seçilmə məzmunu daşıyan bu qoşma da Heydər Əliyevin nitqlərində canlanaraq nitqin ekspressivliyini artırır: “Sosialist ölkələrindən ***savayı*** başqa ölkələr də var idi, “üçüncü dünya” ölkələri hesab olunurdu, – bilirsiniz də, bloklara qoşulmayan ölkələr, – onlar nə qədər kredit verirdi” [IXc.s.403].

Burada böyük natiq tərəfindən işlənmiş “savayı” qoşmasının köməyi ilə ölkələri təsnif edir, nitqini izahedici nitqə çevirir.

### *“Nisbətən” qoşması*

Müqayisə etmək baxımından Heydər Əliyevin müraciət etdiyi qoşmalardan biri də “nisbətən”dir: “Hesab edirik ki, keçmiş illərə ***nisbətən*** indi üç il atəşkəs dövrünü qoruyub saxlayırıq ki, münaqişəni sülh yolu ilə həll edək. Çünki Ermənistanı dəstəkləyən ölkələr çoxdur” [IXc.s.388].

“Nisbətən” və “ilə” qoşmaları, “ona görə də”, “ona görə”, “çünki” bağlıyacılarının köməyi ilə fikir auditoriyaya sərrastcasına çatdırılır.

“Görə” qoşmasının sinonimi olan yalnız nisbi müqayisə bildirən “nisbətən” qoşması Heydər Əliyevin paralellər apardığı çeşidli auditoriyalarda tez-tez səslənir: “Demək olar, bütün sahələrdə istehsal keçən ilin müvafiq dövründəkinə ***nisbətən*** aşağı düşmüşdür, hətta bəzi sahələrdə lap aşağı olmuşdur” [IIc.s.113].

Başqa bir nitq məqamında “nisbətən daha çoxdur” ifadəsi işə düşür, auditoriya paralelin mühakiməsinin şahidi olur: “Ancaq bir tərəfdən Ermənistanın təcavüzü ilə əlaqədar olaraq, digər tərəfdən son iki ildə Azərbaycanın Şimaldan nəqliyyat blokadasına alınması ilə əlaqədar olaraq, – Çeçenistandakı hadisələrə və başqa səbəblərə ***görə***, – bizim respublikamızda

olan çətinliklər başqa respublikalara ***nisbətən*** daha çoxdur" [VIIIc.s.362].

Araşdırmalar "ilə (-la, -lə)" qoşmasının Heydər Əliyevin nitqlərində geniş istifadə olunduğunu göstərir. Müxtəlif məna yükləri daşıyan bu qoşma böyük natiqin nitqlərinə xüsusi bir ekspressivlik verir. Aşağıdakı cümlələrdə vasitə və məkan obyekti kimi "ilə" qoşması işlənmişdir: "Neft kəmərlərindən biri Rusiya ərazisindən keçib onun Novorossiysk limanına, digəri isə Gürcüstan ərazisi ***ilə*** Supsa limanına gedəcəkdir. Lakin Gürcüstan, Türkiyə əraziləri ***ilə*** Aralıq dənizinə, Ceyhan limanına gedəcək böyük neft kəməri çəkmək də planlaşdırılır.

Lakin bu da kifayət deyildir. Söhbət Mərkəzi Asiyadan, – mən Qazaxıstan və Türkmənistanı nəzərdə tuturam, – başlayıb Xəzər dənizindən keçərək Azərbaycana, oradan da Qara dənizə doğru, ya da Türkiyə ərazisi ***ilə*** Aralıq dənizinə doğru boru kəmərləri yaradılmasından gedir.

Bununla eyni zamanda Avrasiya nəqliyyat dəhlizi yaradılmışdır və indi o, fəal işləyir və Mərkəzi Asiyadan Xəzər dənizi vasitə***silə*** Azərbaycana, Gürcüstana, Qara dəniz vasitə***silə*** Avropa və oradan geriyə yük daşımalarını həyata keçirir.

Bu iki yol – yüklərin nəql edilməsi və nəql kəmərləri ilə neft və qazın nəql edilməsi Avropa üçün, o cümlədən Polşa üçün böyük əhəmiyyətə malikdir. Biz prezident Kvasnevski cənabları ***ilə*** bu mövzuda danışdıq və hesab edirəm ki, Polşanın öz yanacaq ehtiyatlarını təmin etmək, özünün bir çox nəqliyyat məsələlərinin, o cümlədən Avropa ilə Mərkəzi Asiya və Qafqaz arasında nəqliyyat məsələlərinin həlli üçün yaranmaqda olan bu şəraitdən istifadə etməyə imkanı var" [XIIc.s.38].

İsmin çıxışlıq halına qoşulan "ötrü", "sonra" qoşmaları bəzən ardıcıl olaraq böyük natiqin nitqində səslənir: "Əmin olun ki, şəxsən mən bundan ***ötrü*** bütün imkanlarımdan istifadə edəcəyəm. Dəfələrlə demişəm və bir daha qeyd edirəm: mənim həyatım xalqa məxsusdur, xalqın ixtiyarındadır və

bundan ***sonra*** da bütün həyatımı xalqa həsr etməyə hazıram, həyatımın qalan hissəsinidə sizə və bütün Azərbaycan xalqına bəxş edirəm" [Ic.s.189].

"Ötrü" qoşması Heydər Əliyev nitqində səbəb bildirmək mənasındadır: "Ancaq bütün bunlara baxmayaraq biz Ermənistanla sülh yaratmaq münaqişəni sülh yolu ilə aradan qaldırmaq istəyirik. Bundan ***ötrü*** də çox konstruktiv addımlar atırıq" [VIIc.s.28].

Böyük natiq "ötrü" qoşmasını "də" qüvvətləndirici ədatla qüvvətləndirə bilir. Başqa bir məqamda "ötrü" qoşmasını "bundan ötrü" şəklində işlədərək auditoriyada güclü maraq doğura, nitqini mənalı edə bilir: "Ümumiyyətlə, deyim ki, Azərbaycan əməkdaşlıq ***üçün*** böyük imkanlara, bundan ***ötrü*** təbii ehtiyatlara, sənaye potensialına, elmi-texniki və intellektual potensiala malikdir" [VIIc.s.46].

Bir sıra hallarda isə "üçün", "ötrü", qoşmaları birgə işlədilir: "Kənd təsərrüfatı məhsulları istehsalı da bizim böyük imkanlarımız var" [VIIc.s.48].

Bu qoşma ismin adlıq halına qoşularaq bəzi məqamlarda təkrarlanaraq auditoriyada əminlik yaradır: "Əmin ola bilərsiniz ki, bir prezident ***kimi*** mən hər bir xarici şirkətin Azərbaycanda səmərəli işləməsi ***üçün*** əlverişli şərait yaradılması sahəsində bütün tədbirləri görəcəyəm. Mən sizin qarşınızda Azərbaycanda sabitliyin, ölkəmizdə bizneslə səmərəli məşğul olmaq imkanının, iqtisadiyyat sahəsində əməkdaşlığın təminatçısı ***kimi*** çıxış edirəm" [VIIc.s.47].

"Aid" qoşması aidlik, məxsusluq bildirir ki, bu qoşma böyük natiqin nitqində sinonim kimi həm "aid", həm də "məxsus" ifadələri işlədilir: "Çünki, indi Azərbaycanda bir çox partiyalar, ayrı-ayrı siyasi qruplar, ayrı-ayrı ictimai təşkilatlar var. Şübhəsiz ki, hər bir partiyanın, hər bir təşkilatın özünə ***aid***, özünə ***məxsus*** proqramı var, istiqaməti var" [Ic.s.188]

"Ötrü"qoşması böyük natiqin dilində səbəb-məqsəd mənası daşıyır: "Bəzən azərbaycanlılar öz aralarında danışarkən fikirləşirlər ki, bizim də ermənilərinki kimi lobbimiz olsaydı, başqa ölkələrdə bizim də diasporumuz olsaydı, şübhəsiz, onlar da bizdən ***ötrü*** çox iş görərdi" [Ic.s.431].

Heydər Əliyevin nitqində "ötrü" qoşması "bu məqsədlə" ifadəsini əvəz edən bir qoşmadır: "Əmin olun ki, şəxsən mən bundan ***ötrü*** bütün imkanlarımdan istifadə edəcəyəm" [Ic.s.189].

"İlə (-la)" qoşması böyük natiqin dilində birgəlik, bəzən də vasitə mənası ifadə edir: "Sonra söhbət kəskin şəkil aldı, mən təfərrüata varmaq istəmirəm, lakin biz yenə acılı-ağrılı fikirlərlə ayrıldıq" [Ic.s.51].

"Qədər" qoşması zaman anlamında olaraq frazeoloji birləşmələrin yaratdığı sinonim cərgənin hissələri arasına düşə bilir: "Xalqımız əsrlər boyu böyük sınaqlardan çıxıb və öz torpağını, öz mənliyini qoruyub indiyə ***qədər*** saxlaya bilibdir".

İsmin yönlük halına qoşulan "aid" qoşması müəyyən məqamlarda təkrar şəklində böyük natiq tərəfindən işlədilir: "Mən bu sözləri fürsətdən istifadə edib deyirəm. Amma ola bilsin ki, bu sözlər bu mövzuya o qədər də ***aid*** deyildir. Mövzuya ***aid*** olan budur ki, Füzulinin adı ***haqqında*** burada cürbəcür təkliflər var... – Amma bir halda ki, Füzuli doğrudan da əvəzedilməz bir şəxsiyyətdir, onda bu təklifə baxılmalıdır" [VIIc.s.173].

Aidlik, məxsusluq bildirən "aid" qoşması ilə yanaşı bu mətndə mövzu obyekti bildirən "haqqında" qoşmasından da istifadə yerli-yerində öz əksini tapmışdır. Bəzən də haqqında qoşması da böyük natiqin dilində təkraralanırıq mövzunun vacibliyini auditoriyaya çatdırır: "Ancaq təəsüf ki, – həmin 1988-ci ilin fevral ayında başlanmış hadisələr ***haqqında*** burada deyildi, – təəsüf ki, onlar da Azərbaycanın rəsmi dairələrini

oyatmamışdır, ayağa qaldırmamışdır və Azərbaycanın vəziyyəti ***haqqında*** düşünməyə cəlb edə bilməmişdir” [VIIc.s.181].

Üç yerdə “haqqında” qoşması, iki yerdə “təəssüf ki” modal sözünün təkrarlanması ilə müşayiət olunan nitq parçası bütöv bir dövrü xarakterizə etməyə əsas verir.

Zaman mənası ifadə edən “qabaq” qoşması müəyyən nitq məqamlarında “da”, “də” ədatlarının köməyi ilə qüvvətləndirilir, beləliklə mövzunun auditoriya tərəfindən mənimsənilməsi yüksəlir: “Həqiqəti demək lazımdır ki, Ermənistanın o separatçı, qəsbkar qüvvələri Azərbaycana qarşı qəsbkarlıq ilə bu gün deyil, dünən deyil, yüz il bundan ***qabaq*** da bu fikirlərlə yaşayıblar və bu planları həyata keçirməyə çalışıblar” [VIIc.s.186].

Heydər Əliyevin natiqlik məharətinin bir məziyyəti də ekspressivlik yaradılması çətin görünən nitq hissələrini təkrarlayaraq, auditoriyanı nitq cazibəsinə sala bilir: “Amma indi Dağlıq Qarabağ dünyanın bütün ölkələrində məşhurdur. Məşhurdur bu müharibəyə ***görə***, məşhurdur bu münaqişəyə ***görə***. Eyni zamanda, məşhurdur ermənilərin apardıqları təbliğata ***görə***, işlərə ***görə***” [VIIc.s.186]. Sadə bir qoşmanın, ismin yiyəlik halına qoşulan “görə” qoşmasının köməyi ilə bütöv bir fikir auditoriyaya aşılanır.

“Bunların hamısı indi həyata atılan gənclərimizin ömrünün daha da xoşbəxt olmasını təmin etmək üçün lazımdır. Qoy gənclər bundan ***sonra*** bir də qanla, müharibə ilə, döyüşlə rastlaşmasınlar” [XIIc.s.121]

Qoşmalarla bağlı Heydər Əliyevin çıxışlarının tədqiqi aşağıdakı nəticələrə gəlməyə əsas verir:

– Müxtəlif nitq hissələrinin, xüsusilə köməkçi nitq hissələrinin birgə, yanaşı işlədilməsi vasitəsi ilə nitqin məna çalarını qüvvətləndirmək Heydər Əliyev nitqinin başlıca məziyyətlərindəndir;

– Əsas nitq hissələri ilə köməkçi nitq hissələri arasında keçid mərhələ təşkil edən "haqqında", "barəsində", "haqda", "barədə" qoşmaları Heydər Əliyevin işgüzar-publisistik üslub-lu çıxışlarında daha çox işlədilir;

– "Qədər" qoşması böyük natiqin dilində haqqında danı-şılan hadisənin başlanğıc vaxtı ilə hazırkı vaxt arasında zaman hüduduna işarədir;

– İsmin yönlük halında işlənən sözlərə qoşulan qoşmalar içərisində "qarşı" qoşması böyük natiqin dilində müxtəlif mə-nalarda işlədilir. "Qarşı" qoşması böyük siyasi liderin nitqində əksər vaxtlarda tam ziddiyyət məzmunu bildirir;

– "Başqa" qoşması "əlavə" və "savayı" qoşmaları ilə sino-nimləşə bilən qoşma olub Heydər Əliyevin nitqlərində fikirlər arasına körpü salmaq məqsədi güdür;

– "Üçün" qoşması böyük natiqin fikrini yekunlaşdırmaq məqamlarında istifadə olunur;

– "Üçün" qoşması məsdərlərə qoşularaq əsasən səbəb-məqsəd məzmunu daşıyır;

– "Görə" qoşması nitqlərin sonluqlarında təşəkkür etmək məqamlarında təkrarlanaraq hörmət, ehtiram və səmimiyyət ifadə edir;

– Zaman anlamında olan "əvvəl", "sonra" qoşmaları audi-toriyada keçmişə səyahət və gələcəyə inam ovqatı yaradır;

– "Sonra" qoşması "bundan" əvəzliyinə qoşularaq qəti gələcək zamanda səslənən cümlələrdə çox işlədilir;

– "Sonra" qoşması "az" qeyri-müəyyən sayı ilə birləşəndə zaman anının yaxınlığı, "bir neçə ildən sonra" ifadəsində isə zaman anının uzaqlığı anlaşılır;

– "Əvvəl", "qabaq"qoşmalarının sinonimi kimi "öncə" qoşması da keçmiş zaman baxımından böyük natiqin dilində tez-tez eşidilir;

Beləliklə, üslubi-semantik xüsusiyyətlərə malik köməkçi nitq hissəsi sayılan qoşmaların gələcəkdə Heydər Əliyevin nitqlərində dərindən-dərinə tədqiqinə ehtiyac duyulur.

## 2.2. Heydər Əliyevin nitqində bağlayıcılar

Bağlayıcılar əsas nitq hissələrindən fərqli olaraq ancaq nitqdə bir dil hadisəsi kimi peyda olur və ünsiyyət prosesinə xidmət edir.[1]

Azərbaycan dilində işlənən bağlayıcılara aid aparılan tədqiqata əsasən onların məna növlərini on bir yerə bölmək olar. Daşıdıqları sintaktik vəzifə ilə yaratdıqları məna bir-birinə müvafiq gəldiyi üçün bağlayıcıların məna növlərini də vəzifələrinə əsasən iki böyük qrupa bölmək olar:

1) tabesizlik bağlayıcılarının məna növləri;

2) tabelilik bağlayıcılarının məna növləri;

**I.** Tabesizlik bağlayıcılarının məna növləri

1) birləşdirmə-bitişdirmə bildirənlər;

2) qarşılaşma bildirənlər;

3) bölüşdürmə bildirənlər;

4) iştirak bildirənlər;

5) inkarlıq bildirənlər;

6) aydınlaşdırma bildirənlər;

**II.** Tabelilik bağlayıcılarının məna növləri

1) aydılaşdırma bildirənlər;

2) səbəb bildirənlər;

3) müqayisə və bənzətmə bildirənlər;

4) şərt bildirənlər;

5) güzəşt bildirənlər;[2]

Nitqin təşkilində bütün bağlayıcılar iştirak edir. Onların içərisində əlaqələndirici element kimi son dərəcə işlək olan

---

[1] Afat Qurbanov. Dil və nitq. Bakı, APU nəşri. 1991, səh.70

[2] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya). Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

"və" aktivliyi ilə fərqlənir. O, həm ayrı-ayrı elementləri, cümlələri, həm də mətnləri bir-biri ilə əlaqələndirir.[1]

Heydər Əliyevin nitqlərinin əksərində "əgər" şərt bağlayıcısının arxasınca "ona görə də", "çünki" səbəb bağlayıcıları gəlir: "Respublikadakı bütün partiyaların hamısının bir yerdə üzvlərinin sayı cəmi 450 minə yaxındır. ***Əgər*** belə isə, demək, onlar 7 milyon 500 min əhalinin hamısını şübhəsiz ki, təmsil edə bilməzlər. ***Ona görə də*** əgər biz tam proporsional sistem üzrə seçki aparsaq, onda parlament seçkilərində əhalinin hamısının rəyini ala bilməyəcəyik. Çünki partiyalar əhalinin hamısını təmsil etmirlər" [IVc.s.128-129].

Heydər Əliyevin nitqində şərt bildirən "əgər" bağlayıcısı bir cümlədə iki dəfə təkrarlanaraq cümlənin semantik tutumunu gücləndirir: "***Əgər*** dünya həqiqətən beynəlxalq hüquq normalarını tanıyırsa, ***əgər*** dünyada insan hüquqları real şəkildə qorunursa onda heç kim Azərbaycanın bu gün düşdüyü vəziyyətlə razılaşmamalıdır" [IVc.s.112].

Bir sıra hallarda aydınlaşdırma tabelilik "ki" bağlayıcısı, eləcə də özünü "hamı bilməlidir ki" ifadəsi ilə göstərir: "Bununla yanaşı, hamı bilməlidir ***ki***, biz heç kimə bir qarış da olsun torpağımızı güzəştə gedə bilmərik" [IVc.s.111].

"Ki" aydınlaşdırma bildirən tabelilik bağlayıcısı Heydər Əliyev nitqində ən çox "belə nəticə verdi ki" ifadəsi ilə səslənir: "1981-ci ildə biz Hüseyn Cavidin cənazəsini Sibirdən gətirərkən geniş müzakirələr oldu və nəhayət, bu müzakirələr belə nəticə verdi ***ki***, o, Naxçıvanda – anadan olduğu yerdə dəfn olunsun" [IVc.s.10].

Başqa bir çıxış məqamında "ki" bağlayıcısı "nəticə ondan ibarət olmalıdır ki" ifadəsinin tərkibində auditoriyalar üçün fikri aydınlaşdırır: "Ona görə də bugünkü müzakirədən çıxan

[1] Həsənova S. Nitq mədəniyyəti və üslubiyyat. Bakı, 2005, səh.113-114

əsas nəticə ondan ibarət olmalıdır ***ki***, istənilən məqsədlərə zorakılıqla nail olmaq hallarına son qoyulmalıdır" [IVc.s.26].

Heydər Əliyevin nitqində bir sıra hallarda "halbuki" bağlayıcısı zidd fikirləri bir-biriylə bağlayaraq açıqlama verilir: "Bilirsiniz ki, bu müharibə 1988-ci ildə başlayıb. O vaxtlar Azərbaycan da, Ermənistan da Sovetlər İttifaqının tərkibində idi. Təəssüf ki, onda Azərbaycanda hakimiyyətdə olan adamlar bu müharibənin qarşısını ala bilmədilər. ***Halbuki*** Azərbaycan da, Ermənistan da bir dövlətin tərkibində idi" [IIIc.s.189].

Başqa bir məqamda "lakin" qarşılaşdırma bağlayıcısı səbəb bildirən "çünki" bağlayıcısı ilə birgə təsadüf edir: "Şübhəsiz ki, o vaxtlar Sovetlər İttifaqında hakimiyyət başında duran şəxslər, xüsusən Mixail Qorbaçov Azərbaycana xəyanət edib və Dağlıq Qarabağ məsələsinin qaldırılmasına, Ermənistanın Azərbaycana hücum etməsinə imkan verilibdir. ***Lakin*** bunun da qarşısı alına bilərdi. ***Çünki*** Sovetlər İttifaqı çox qüdrətli və güclü bir dövlət idi, böyük orduya, böyük imkanlara malik idi" [IIIc.s.189].

Dövlət quruculuğu ilə bağlı baş verən neqativ hallara qarşı mübarizədə "əgər" şərt bağlayıcısı sinonimlərlə birgə işlənir və bu sinonimlər dövlət quruculuğu məsələlərinə Heydər Əliyev baxışlarını əks etdirir: "***Əgər*** indi bunların hamısını ***zəhərləməyə, çirkləndirməyə***, bunları ***zibilləməyə*** başlasaq onda gələcək nəsillərə bizdən elə bir irs qalcaqdır ki, onlar bizə "sağ ol" demək, rəhmət diləmək əvəzinə lənət oxuyacaqlar" [IIIc.s.204].

İştirak bildirən "həm", "həm də" bağlayıcıları "ona görə də" səbəb bildirən bağlayıcılarla tez-tez birgə təsadüf edir: "Hər bir insan gərək öz məsuliyyətini hiss etsin. Bütün bunlar Nazirlər Kabinetinin ***həm*** səlahiyyətinə aid olan məsələlərdir, ***həm də*** onun üzərinə düşən vəzifələrdir, ***həm də*** onun məsuliyyətini təşkil edən amillərdir. ***Ona görə də*** hamı bütün bun-

ları bilməli, işləri bu tələblərə müvafiq surətdə aparmalıdır" [IIIc.s.204].

Heydər Əliyevin nitqində bağlayıcılar nitqin məna tutumunu yüksəltmək, nitqin auditoriya tərəfindən canlı şəkildə qəbul olunması yolunda mühüm rol oynayır. Azərbaycanın mənafelərinə zidd olan danışıqları dayandırmaq yolunda böyük natiqin kiçik bir çıxışı iki yerdə "ona görə də", "çünki", "buna görə də" səbəb bağlayıcıları, "özü də" dəqiqləşdirmə bildirən iştirak və "lakin" qarşılaşma bağlayıcısı ilə fikrin dinləyicilərə dəqiq, düzgün, emosional şəkildə çatdırılmasına xidmət edir: "Bayaq dedim ki, Bakıya gəldikdən sonra bir çox məsələ ilə yanaşı Qərbin neft şirkətləri ilə aparılan danışıqlarla da maraqlandım. Məlum oldu ki, hazırlanmış layihələr Azərbaycanın mənafeyinə müəyyən qədər zərər vurur. ***Ona görə də*** mən bu danışıqları dayandırdım. Sizə deyim ki, bunun ***özü də*** çox böyük cəsarət tələb edirdi. Çünki Qərb şirkətləri üç il idi ki, Azərbaycanda fəaliyyət göstərirdilər. Danışıqlar aparılmış, layihələr hazırlanmışdır. Mən danışıqları dayandırarkən mötəbər dairələrin bir çoxundan narazılıq eşitdim. ***Lakin*** bunların cavabında dedim".

"Əgər" şərt bağlayıcısı ilə başlayan cümlələrin ardınca "ona görə də" səbəb bildirən bağlayıcısının köməyilə auditoriya şərt irəli sürülmüş cümlənin izahını böyük natiqin dilindən eşidir: "***Əgər*** islahatlar bizi çox hissəsi dağılmış aqrar bölmənin daha da dağılmasına doğru aparsa, onda dərin quyunun dibinə düşmüş olarıq. ***Ona görə də*** bu islahatların aparılmasında mühafizəkarlığa qətiyyən yol vermək olmaz, eyni zamanda islahat şüarları altında aqrar bölmədə əldə olan potensialımızın dağılmasına da yol vermək olmaz" [IIIc.s.33].

Heydər Əliyevin nitqində bəzən bağlayıcılar ədat səviyyəsinə yüksəlir, sözün və cümlənin mənasını qüvvətləndirir: "Mənim xatirimdədir ***hətta***, 70-ci illərdə bəzi alimlərimiz, yazıçılarımız cəmiyyətimizi, ərazimizdə olan xalqları birlikdə

saxlayan bu "azərbaycanlı" sözünə bir az təcavüz etməyə çalışırdılar. Mən o zaman bu proseslərin şahidi olmuşam və vaxtilə bunların qarşısını almışam. ***Amma*** yaxşı ki, elə bunların qarşısı alınıb. ***Çünki*** hamımız azərbaycanlıyıq" [IIIc.s.101].

Səbəb və iştirak, eləcə də birləşdirmə bağlayıcıları bir cümlədə çulğalaşa, harmoniya yarada bilir: "Ancaq mən muzey deyəndə Səttar Bəhlulzadənin əsərlərindən ibarət daimi muzeyin yaranmasını nəzərdə tuturam. ***Çünki*** rəssamın ***həm*** həyatı, ***həm də*** yaradıcılığı, əsərləri, mədəni ***və*** mənəvi irsi xalqımızın bu günü ***və*** gələcəyi üçün mənəviyyat mənbəyidir, məktəbidir" [IIIc.s.30]. İkinci cümlədə "çünki" səbəb bağlayıcısı iki yerdə "və" birləşdirmə, "həm", "həm də" iştirak bildirən bağlayıcılarla birgə işlədilmişdir.

Səbəb bildirən "ona görə də", "ona görə" bağlayıcıları bir-birinin ardınca işlənərək nitqin izahediciliyini qüvvətləndirir. Bu zaman "çünki" səbəb bildirən bağlayıcısı yuxarıdakı bağlayıcılara qoşularaq anlamını ortaya qoyur: "Azərbaycanın keçmişində və son illərində nə qədər əzab əziyyətli mərhələlər olmuşdur, ona görə də əzab-əziyyətli dövrlərin xoşbəxt günləri də olacaqdır".

"Və" bağlayıcı ilə cümlə demək, cümlə yazmaq bir vaxtlar qadağan olmasa da az işlənirdi. Heydər Əliyevin dilində "və" bağlayıcısı yeni bir fikrin başlanmasına start verir: "Əlbəttə, satmaq da lazımdır, ancaq onları satıb Azərbaycan üçün istənilən qədər valyuta əldə etmək lazımdır. ***Və*** mən heç də təsadüfi demədim ki, bilmirəm nə üçün onun az miqdarı satışa gedir, valyutaya satışa gedir, əksəriyyəti daxili tələbata gedir" [VIIc.s.139].

Bu bağlayıcı canlı danışıq dilimizdə az istifadə olunsa da, yazılı nitqdə çox işlədilir. Amma Heydər Əliyev dilində bu bağlayıcı eyni bir cümlədə həm həmcins üzvlər, həm də tabesiz mürəkkəb cümlənin tərkib hissələri arasında birləşdirmə – bitişdirmə funksiyası daşıyır: "Biz Məhəmməd Füzulinin

500 illiyini bir yerdə qeyd etdik ***və*** ümumi əxlaqi ***və*** mənəvi dəyərlərimizə sadiq olduğumuzu, mənşəyimizə, tarixi köklərimizə sadiqliyimizi, gözəl ənənələrimizə sadiqliyimizi bir daha bildirdik ” [VIIIc.s.68].

Şifahi nitqdə az işlənən “və” bağlayıcısı Heydər Əliyevin nitqində lazımi səviyyədə işlənməklə yanaşı, hətta nitqə bir ekspressivlik də verə bilir. “Və” bağlayıcısı Heydər Əliyevin sırf siyasi çıxışlarında daha çox yer alır: “Tatarıstan prezidentinin Azərbaycana səfəri, imzalanmış saziş, dünən ***və*** bu gün keçirilmiş görüşlər, söhbətlər həyatımızda yeni hadisədir. Bu hadisə ***həm*** Rusiyada, ***həm də*** Azərbaycanda baş verən demokratik dəyişikliklərlə bağlıdır ***və*** xalqlarımızın daha çox ünsiyyət saxlamasına ***və*** onların əlaqələrinin möhkəmlənməsinə kömək edir” [VIIIc.s.65]. İki yerdə “və” bağlayıcısı “həm” və “həm də” iştirak bağlayıcıları ilə harmoniya təşkil edir, nitqin auditoriyaya çatdırılmasında, yüksək ekspressivlik qazanmasında natiqə kömək edir.

İki zidd təsəvvürü birləşdirmək anlamında olan “amma” bağlayıcısı böyük natiqin nitqində fəlsəfi düşüncələrin auditoriya ilə bölüşdürülməsində daha çox istifadə olunur : “İnsanlar bir-birindən çox fərqlidir. Dünyada eyni xasiyyətə malik iki insan tapmaq çətindir. Bu təbiidir. Biz təbiətə qarşı heç bir zor işlədə bilmərik. Təbiətin yaratdığı təbii qanunlar heç kəsin istəyindən, yaxud səyindən asılı olmayaraq işləyir. ***Amma*** bu təbii qanunlar içərisində də bir olmaq, daha da sıx olmaq, bir-birinə dayaq olmaq, əl uzatmaq üçün imkanlar çoxdur” [VIIc.s.18].

Böyük natiqin nitqində inkarlıq bildirən “nə”, “nə də” bağlayıcıları ciddi siyasi-psixoloji məqamlarda öz yerini tapır: “Ancaq ***nə*** o vaxt, ***nə də*** 1994-cü ilin oktyabrında mən hakimiyyəti qoyub heç yerə qaçmadım. ***Və*** televiziya qarşısında bəyan etdim ki, Azərbaycan xalqı qarşısında məsuliyyət daşıyıram” [XIIc.s.92].

"Ya", "ya da" bölüşdürmə bağlayıcıları Heydər Əliyevin nitqində biri digərinin əksi olan fikirləri ifadə etmək baxımından əhəmiyyətlidir. "***Ya*** xalqımı qoruyub saxlayacağam, ***ya da*** burda həlak olmağa hazıram. Canını qurtarıb qaçmaq böyük bir qəhrəmanlıq deyil, qorxaqlıqdır. Hakimiyyətdə olan adam gərək heç vaxt canı haqqında düşünməsin, xalq haqqında düşünsün ***və əgər*** lazım olsa, özünü xalqın yolunda şəhid etsin, qurban versin" [XIIc.s.92]. Yuxarıdakı cümlədə "ya" və "ya da" bağlayıcılarının köməyilə böyük natiq "dövlət başçısı necə olmalıdır" sualına cavab tapmaqda auditoriyaya kömək edir.

"Hətta" iştirak bağlayıcısı "nəinki" bağlayıcısından sonra gələrək auditoriyada canlanma yarada bilir: "Məlumdur ki, əsrimizin əvvəlində keçmiş Rusiyada ancaq Azərbaycanda, Bakıda neft çıxarılırdı və o, ***nəinki*** Rusiyanı, ***hətta*** Qərb ölkələrini də, Şərq ölkələrini də təmin edirdi" [IIc.s.150].

"O cümlədən" bağlayıcısı ümuminin içərisindən xüsusini seçmək hallarında işlədilir. Böyük natiq üçün əgər iqtisadiyyat ümumi xarakter daşıyırsa, kənd təsərrüfatı onun bir hissəsidir: "Yəni iqtisadi islahatlar keçirməli, kənd təsərrüfatının idarə olunmasını, mülkiyyət formasını dəyişdirməliyik. Bu, ümumən iqtisadiyyatda, o cümlədən kənd təsərrüfatında strateji yolumuzdur" [IIc.s.92].

### *Səbəb bağlayıcıları*

"Ona görə də" bağlayıcısı ilə böyük natiq Azərbaycan iqtisadiyyatını dünya səviyyəsinə qaldırmaq üçün nə etməli olduğumuzu auditoriyalara bəyan edir: "Bütün bu tədbirləri həyata keçirərkən biz bunu əsas tuturuq ki, Azərbaycanın iqtisadiyyatını dünya iqtisadiyyatına sıx qovuşdurmaq lazımdır. ***Ona görə də*** biz ölkəmizi xarici investisiyalar üçün, xarici şirkətlərlə əməkdaşlıq üçün açıq elan etmişik və fəal surətdə çalışırıq ki, bütün bunlar reallığa çevrilsin" [VIIc.s.42].

"Ona görə də" bağlayıcısı ilə böyük natiq müəllimlərin cəmiyyətdəki yerini açıqlayır: "Bu ondan irəli gəlir ki, xalqımız savadsızlıqdan, gerilikdən, ətalətdən bugünkü günə qısa tarixi bir müddətdə gəlib çatmaqda müəllimlərin rolunu qiymətləndirir və qarşısındakı adama hörmət əlaməti olaraq "müəllim" deyir. ***Ona görə də*** müəllimin cəmiyyətdə xüsusi yeri olduğu artıq heç kəsdə şübhə oyatmır" [IIc.s.117].

Müəllimlərlə bağlı başqa bir məqamda "ona görə də" bağlayıcısının köməyilə nə üçün müəllimə borclu olmağımızı öyrədir: "Hər birimizin müəllimi olmuşdur. Bu gün yaşayan adamlar – yaşlı nəsil, orta nəsil, gənc nəsil – heç kəs müəllimsiz bu səviyyəyə gəlib çatmayıb. ***Ona görə də*** hər bir vicdanlı adam, vətəninə, xalqına bağlı olan hər bir adam, qədirbilən adam müəllimini həmişə qəlbində saxlayır, onu daim hörmətlə yad edir" [IIc.s.117].

Heydər Əliyevin nitqində səbəb bildirən "çünki", şərt bildirən "əgər" bağlayıcıları təhsilimizin inkişafında XX əsrin 70-80-ci illərində respublika rəhbərliyinin gördüyü işləri auditoriyaya çatdırmaqda nitqə ekspressivlik qazandırır: "Mən bunu dəfələrlə demişəm, – biz respublikamızdan kənarda yeni bir ali məktəb miqyasında mütəxəssislər hazırlanmasına nail olduq. ***Çünki*** hər bir ali məktəbə orta hesabla ildə 700-800 nəfər qəbul olunurdu. ***Əgər*** biz respublikamızdan kənarda ildə 800-1000 və bundan da çox tələbə qəbul etdirirdiksə ***və*** onların ali təhsil almasına nail ola bilirdiksə, hesab etmək olardı ***ki***, ölkəmizdəki ali məktəblərdən başqa, daha bir böyük ali məktəbimiz var idi və bu da Azərbaycan üçün böyük töhfə idi" [XIIc.s.115]. Səbəb və şərt bağlayıcıları ilə başlayan nitq üç yerdə birləşdirmə bağlayıcısı "və", aydınlaşdırma bağlayıcısı "ki" ilə çulğalaşır.

"Həm" və "həm də" bağlayıcılarını böyük natiq əksər təsadüflərdə tamı hissələrinə ayırmaq, yaxud tamı hissələri ilə birgə verə bilmək məqamlarında işlədir: "Müstəqil Azərbay-

canı gələcəkdə də yaşatmaq, onu daha da möhkəmləndirmək, dünya miqyasında böyük dövlətə çevirmək üçün gənclərimiz bu gündən hazırlaşmalıdırlar. ***Həm*** şüuri, zehni, mənəvi cəhətdən, ***həm də*** fiziki cəhətdən hazırlaşmalıdırlar" [VIIc.s.10].

Bölüşdürmə bağlayıcıları "istər", "istərsə də" tamı hissələrə bölmək baxımından mühümdür: "Mən başa düşürəm ki, sizin ölkənizlə əməkdaşlıq üçün bazar iqtisadiyyatı, azad sahibkarlıq prinsipləri vacibdir. Odur ki, hazırda həyata keçirdiyimiz və zənnimcə, qısa müddətdə başa çatdıracağımız tədbirlər Azərbaycanda ***istər*** bizim, ***istərsə də*** xarici ölkələrin özəl biznesinin coşqun fəaliyyəti üçün tam imkan yaradacaqdır " [VIIc.s.46].

İştirak bildirən bağlayıcılar içərisində "həm", "həm də" bəzən "o cümlədən" bağlayıcısı ilə müştərək təsadüf edir: "İndi ***həm*** Polşanın, ***həm də*** Azərbaycanın ictimai-dövlət quruluşunu, həyatını səciyyələndirən tam müstəqillik, tam azadlıq elə bir əsasdır ki, bu əsas bizə bütün sahələrdə, ***o cümlədən*** iqtisadiyyat və ticarət sahəsində əməkdaşlığımızı inkişaf etdirməyə və danışmağa imkan verir" [XIIc.s.50]. Bütün sahələr içərisindən iqtisadiyyat və ticarəti ayırmaq məqsədilə "o cümlədən" bağlayıcısından istifadə olunur.

"Həm", "həm də" bağlayıcıları bütövü təşkil edən hissələrin sadalanması məqamlarında istifadə olunur: "Neftçilərimiz Bakıda ***həm*** quruda, ***həm də*** dənizdə, respublikamızın başqa məntəqələrində neftçıxarma, neft emalı ilə məşğul olaraq keçmiş Rusiyanın, ondan sonra Sovetlər İttifaqının neft sənayesinin inkişaf etməsinə böyük kömək göstərmişlər" [IIc.s.149].

Səbəb bildirən bağlayıcı kimi "bundan ötrü" də böyük natiqin dilində işlədilir: "Biz bu yolla getməliyik, ***bundan ötrü*** daha ciddi tədbirlər görməliyik" [IIc.s.92].

"Həm" bağlayıcısı bütövün, tamın hissələrə bölünməsi, bütövün hissələrdən təşkil olunması fəlsəfəsini Heydər Əliyev nitqində ortaya qoyur: "Bu gün biz ***həm*** Azərbaycanda, ***həm***

Füzulinin doğulduğu yerdə – Kərbəlada, Bağdadda, ***həm*** Ankarada, Türkiyədə Füzulinin 500 illiyini qeyd edərkən, artıq keçmişdəki kimi parçalanmış vəziyyətdə deyilik” [IIc.s.479].

Heydər Əliyev nitqində “həm”, “həm də” bağlayıcıları qarşılıqlı əlaqədə olan tərəfləri nəzərə çarpdırmaq məqamları, anları üçün işlədilir: “Gen fondu isə gənclərin ***həm*** mənəvi, ***həm də*** fiziki sağlamlığıdır. Mənəvi və fiziki sağlamlıq bir-biri ilə qarşılıqlı əlaqədədir. ***Çünki***, mənəviyyat pozulanda gənclərin fiziki sağlamlığını da pozur” [Ic.s.173]. Böyük natiq “həm” və “həm də” bağlayıcıları ilə tərəflərin qarşılıqlı əlaqəsini auditoriyaya açıqlayırsa, ”çünki” bağlayıcısı ilə bu əlaqəni, bu vəhdəti izah edir.

“Həm” bağlayıcısı təkrar olunduqca tamı hissələrə bölürsə, “həm də” bağlayıcısı nitqə qoşulanda yenidən hissələri tama qovuşdurur: “Üstəlik onu da yaddan çıxarmaq olmaz ki, Rusiya və Azərbaycanı bir-biri ilə az qala iki yüz illik tarix bağlayır. Bütün bu dövr ərzində ***həm*** mədəniyyətdə, ***həm*** elmdə, ***həm*** təhsildə, ***həm*** iqtisadiyyatda, ***həm də*** adamların şəxsi həyatında mövcud olan qarşılıqlı münasibətlər mühitini əslində elə bu əlaqələr yaratmışdır” [IIc.s.407].

Başqa bir nitq parçasında “həm”, “həm”, “həm də” qrupu ecazkarcasına səslənir: “Türkiyənin cümhurbaşqanı, əziz dostumuz, qardaşımız Süleyman Dəmirəlin bu mərasimdə bilavasitə iştirak etməsi, Füzuli haqqında geniş nitq söyləməsi, mən hesab edirəm ki, ***həm*** Türkiyə üçün, ***həm*** Azərbaycan üçün, ***həm*** də bütün türk dünyası üçün böyük bir hadisədir” [IIc.s.490]. Böyük natiq burada həm Türkiyə üçün, həm Azərbaycan üçün deyirsə Türk dünyasının mühüm dövlətlərini, mühüm hissələrini sadalayır, növbəti “həm də bütün türk dünyası üçün” ifadəsi ilə hissələri tama qovuşdurur.

“Əgər” şərt bildirən bağlayıcı ritorik sualların başlanğıcında gələ bilir: “Əgər” bağlayıcısı ilə başlayan ritorik suallar qarşı tərəfi düşündürür və məntiqə söykənməyə vadar edir:

“***Axı*** sərhədi Rusiya sərhədçiləri də qoruyurlar. ***Əgər*** kimsə Azərbaycandan keçirsə, Azərbaycan sərhədçiləri onu ***ya*** görməyiblərsə, ***ya da***, Azərbaycan əleyhinə aparılan təbliğatda deyildiyi kimi, “qəsdən buraxıblarsa”, onda nə üçün Rusiya sərhədçiləri tutub saxlamırlar? Nə üçün? Nə üçün dünən hökumətdə Rusiya sərhədçilərini qınayıb demədilər ki, onlar öz sərhədlərini pis qoruyurlar və birdən-birə başlayıblar ki, Azərbaycana qarşı viza rejimi tətbiq etmək lazımdır? Buyurun. ***Əgər*** Rusiya istəyirsə, ***qoy*** tətbiq etsin” [XXIIIc.s.36].

“Axı” qüvvətləndirici ədatı ilə başlayan nitq parçasında “əgər” şərt, “ya, ya da” bölüşdürmə bağlayıcılarından sonra ritorik suallar düzülür. Bu sualları eşidən auditoriyaya xüsusi cavab tələb olunmur. Başlanğıcda “axı”, sonda “qoy” əmr ədatı ilə qurtaran nitq ortada səbəb bildirən “əgər” və “ya-ya da” bölüşdürmə bağlayıcıları ilə bəzənir.

Qarabağ məsələsinin həllində süstlük göstərən beynəlxalq təşkilatlar “ancaq”, “o cümlədən” bağlayıcıları vasitəsilə “ittiham” olunur: “Mənim xatirimdədir, altı ildir ki, buraya gəlib ***həm*** Bakıda, ***həm də*** çadırlarda yaşayan qaçqınların vəziyyətini görən adamlar çox dəhşətə gəliblər, üzülürlər. ***Ancaq*** dünya ictimaiyyəti, ***o cümlədən*** Minsk qrupunun həmsədrləri bu məsələyə biganədirlər” [XXIIIc.s.60].

Heydər Əliyevin nitqində bağlayıcılar modal sözlər və ədatlarla çulğalaşaraq mövzunun aktuallığının auditoriyaya çatdırılmasında mühüm rol oynayır: “***Çünki*** son nəticədə bu məqsədə doğru gedirik və biz *məhz* həmin səviyyəyə gəlib çatanda, yəqin ki, xeyli asan olacaqdır. İndi isə *şübhəsiz ki,* keçid dövrünə böyük ehtiyac var. ***Ona görə də*** Rusiya-Azərbaycan komissiaysı bu baxımdan çox iş görə bilər. ***Ancaq*** bu, *zənnimcə,* məsələnin bir hissəsidir. Digər hissəsi isə odur ki, Rusiyada *da*, Azərbaycanda *da* islahatlar aparılır, mülkiyyət özəlləşdirilir, özəl sektor üstünlük təşkil edir və dövlət planlaşdırması, hansısa inzibati vasitələrdən istifadə etmək daha

yaramır. ***Yəni*** özəl sektorun daha sıx inteqrasiyası lazımdır. ***Məsələn***, bizdə çoxlu şərab istehsal olunur. Əvvəllər biz Sovetlər İttifaqında hamıdan çox üzüm istehsal edirdik" [XXIIIc.s.26]. "Çünki", "ona görə də" səbəb bağlayıcıları, "məhz", "da" ədatları, "şübhəsiz ki", "zənnimcə" modal sözləri, eləcə də aydınlaşdırma bağlayıcıları kimi işlənmiş "yəni" və "məsələn" böyük natiqin nitqinə xüsusi məna, ahəngdarlıq verir. Yeni bazar münasibətləri kimi böyük bir məsələ kiçik bir nitq parçasında auditoriyaya çatdırıla bilir.

"Ona görə də" səbəb bildirən tabelilik bağlayıcısı Heydər Əliyev nitqində çox təsadüf edir. Səbəb-nəticə fəlsəfi əlaqəsi hər çıxışda özünü göstərir. Hadisələrə fəlsəfi baxımdan yanaşan dövlət başçısının nitqində "ona görə də" bağlayıcısının tez-tez təsadüf etməsi təbii qəbul olunur. Bu bağlayıcı xüsusən müstəqilliyimizin təhlükə qarşısında olduğu məqamlarda səslənir: "Düşünun bunu, fikirləşin və anlayın ki, hər biriniz məsuliyyət daşıyırsınız. Mən hamınızı deyirəm. Birinci növbədə xalqın qarşısında, öz ailəniz, qohum-əqrabanız, övladlarınız, ata-babalarınızın ruhu qarşısında məsuliyyət daşıyırsınız. ***Ona görə də*** bu gün hər biriniz öz iş yerinizdə bu məsuliyyət hissi ilə işləməlisiniz, çalışmalısınız" [Ic.s.112].

Səbəb bildirən "ona görə ki", "ona görə" bağlayıcıları bir neçə dəfə təkrarlana bilir. Əfqanıstan veteranları ilə görüşdə böyük natiq onlara inandığını "ona görə" bağlayıcısını təkrar etməklə bəyan edir, veteranlar auditoriyasının rəğbətini qazanır: "Tam əminəm ki, siz öz sözünüzün və vədlərinizin sahibisiniz. Mən sizə inanıram. ***Ona görə ki***, siz döyüşlərdən, tufanlardan, sınaqlardan keçmiş adamlarsınız. ***Ona görə*** inanıram ki, siz o ağır müharibədən keçib öz vətəninizə qayıtmısınız. ***Ona görə*** inanıram ki, siz vətəninizi sevən adamlarsınız" [Ic.s.155].

"Ona görə də" bağlayıcısı ilə bazar iqtisadiyyatına keçməyin zəruriliyini qeyd edir: "Ancaq əsas səbəblərdən biri istehsalın aşağı düşməsi, son illər iqtisadiyyatda gedən dağıdı-

cı proseslər və yeni iqtisadi sistemə keçiddəki çətinliklərdir. ***Ona görə də*** mən bir daha bəyan edirəm ki, Azərbaycanın iqtisadi həyatı bazar iqtisadiyyatı yolu ilə, sərbəst iqtisadiyyat yolu ilə gedəcəkdir” [IIc.s.13].

Səbəb bildirən bağlayıcılar arasında “ona görə də” bağlayıcısı biri digərinə səbəb olan cümlələri, fikirləri bağlayır: “Məhəmməd Füzuli öz dövrünün həyatını əks etdirərək, öz mühitindən qida alaraq yaratdığı əsərləri uzaq gələcəyə istiqamətləndirmişdir. ***Ona görə də*** Füzulinin əsərləri 500 ildir ki, yaşayır və bundan sonra da yüz illərlə, min illərlə yaşayacaqdır” [VIIIc.s.25]. Uzaq gələcəyə istiqamətlənən əsərlər uzunömürlü olacaq ideyası “ona görə də” bağlayıcısı ilə həyata keçirilir.

Başqa bir məqamda Füzuli əsərlərinin əsas motivlərindən birinin “zorakılığa, zülmə, müharibəyə etiraz”dır ki, burada da “ona görə də” bağlayıcısı böyük natiqin dilində Füzulinin yaşadığı dövrlə əlaqəni üzə çıxarır: “Məhəmməd Füzulinin yaşadığı dövr çox mürəkkəb, böyük müharibələr dövrü olmuşdur. O, bu müharibələrin şahidi olmuş və müharibənin, düşmənçiliyin, cürbəcür münaqişələrin insana, cəmiyyətə nə qədər zərbələr vurduğunu öz gözləri ilə görmüşdür. ***Ona görə də*** Füzulinin əsərlərinin əsas motivlərindən biri də zorakılığa, zülmə, müharibəyə etirazdır” [VIIIc.s.26].

“Nə üçün güclü ordumuz olmalıdır” sualına cavablar “ona görə”, “ona görə ki” bağlayıcılarının köməyilə böyük natiqin dilindən auditoriyaya ünvanlanır: “Bizim güclü ordumuz olmalıdır. Güclü ordu ***ona görə*** lazımdır ki, biz sülh danışıqlarını cəsarətlə apara bilək. Qüdrətli ordumuz olmalıdır ki, biz ərazimizin təhlükəsizliyini daim qoruya bilək, öz torpaqlarımızı, ölkəmizi müdafiə edək. Bizim qüdrətli, möhkəm ordumuz olmalıdır, ***ona görə ki***, müstəqil Azərbaycan dövləti daim qüdrətli olsun” [IIc.s.84].

"Mən güman edirəm ki, sağlam düşüncəli, sağlam fikirli, sağlam əxlaqlı, sağlam əhval-ruhiyyəli gənclər Azərbaycan Respublikası gənclərinin böyük əksəriyyətini təşkil edirlər. ***Buna görə də*** sağlam düşüncəli, sağlam fikirli gənclər öz yolundan sapmış gəncləri düz yola çəkməli, düz yola çağırmalı, ayrı-ayrı qanunsuz hərəkətlərdən uzaqlaşdırmalı və respublikada, ***o cümlədən*** Bakı şəhərində əmin-amanlıq yaranmasına çalışmalıdırlar" [Ic.s.181]. "Buna görə də" bağlayıcısı müstəqillik yolunda Azərbaycan gənclərinin qarşısında duran vəzifəni yada salır, "o cümlədən" dəqiqləşdirici-aydınlaşdırıcı funksiyada olan bağlayıcı "buna görə də" bağlayıcısı ilə harmoniya yaradır [Ic.s.181].

Qarşılaşdırılan iki zidd təsəvvürü bir-birinə bağlayan "amma", "ancaq", "lakin" bağlayıcıları siyasi natiqliyimizin banilərindən Heydər Əliyevin nitqində xüsusi yer tutur. Bağlayıcıdan əvvəlki cümlənin dinləyicidə doğurduğu ehtimalı bağlayıcıdan sonrakı cümlə aradan qaldırır: "Çoxları hesab edirlər ki, biz Asiya qitəsində yerləşən bir ölkəyik. Azərbaycan Asiya ilə Avropanın birləşdiyi, qovuşduğu bir ərazidə yerləşən, ***amma*** Avropaya daxil olan bir ölkədir. ***Ancaq*** Azərbaycan öz kökünə, dini mənsubiyyətinə, ənənələrinə görə Şərq aləminə, İslam, Türk dünyasına daxil olubdur" [XIIIc.s.107]. "Azərbaycan Avropaya daxil olan bir ölkədir" ilkin fikir "ancaq" bağlayıcısı ilə əks fikirlə, zidd fikirlə "Azərbaycan Şərq aləminə, İslam, türk dünyasına daxil olubdur" sonuclanır.

Əks, ziddiyyət mənalı "amma", "lakin" bağlayıcılarının klassiklərin yaradıcılığında dilçilər tərəfindən öyrənilməsi[1] və bu öyrənmə ilə Heydər Əliyev nitqi arasında aparılan paralellər keçən bu əsrlərin, dağıdıcı müharibələrin, keşməkeşli dövrlərin dilimizə təsirinin cüzi olduğunu, Azərbaycan dilinin

---

[1] Sevil Mehdiyeva. Nəsimi "Divan"ında köməkçi nitq hissələri və köməkçi adlar. AMEA Humanitar və ictimai elmlər seriyası, 2002. №1-2,səh.127-137.

möhkəm dayaqlar üzərində bərqərar olan dil olduğunu sübut edir:

Nəsimi dilində:

*Anca kişilər dəviyi-islam edər,* ***əmma***
*Tək orda bir xaçilə zünhar bulunmaz.*
*Hər kişidə bir cübbəvü dəstar olur,* ***əmma****,*
*Min başda bir layiqi-dəstar bulunmaz!*[1]

Heydər Əliyevin dilində: "Azərbaycanda heç bir tarixi şəxsiyyətə məqbərə yoxdur, ***ancaq*** şairə, yazıçıya var. ***Amma*** gəlin açıq danışaq, bu xalqı yaşadanlar tək şairlər, yazıçılar olmayıblar. Azərbaycanın padşahları da, sərkərdələri də, xanları da olubdur".

"Amma" bağlayıcısı XXI əsr türk dünyasının lideri İlham Əliyevin də nitqində uğurla istifadə olunur. "***Amma*** sirr deyil ki, Bakı-Tbilisi-Ceyhan neft kəməri işə salınandan sonra bunun regional əməkdaşlığa da yəqin ciddi təsiri olacaqdır. ***Amma*** bu təsir də yenə Türkiyə, Gürcüstan, Azərbaycan üçün müsbət təsir olacaqdır".[2]

"Ancaq" bağlayıcısı Azərbaycanda yazıçı və şairlərə yubileylər keçirilməsinə gəc baxanlara Heydər Əliyev nitqində əks cavab hazırlayır: "Bəziləri indi də buna bir az kəc baxırlar, "bu yubileylər nəyə lazımdır, indi bizim həyatımız çətindir, ağırdır" – deyirlər. ***Ancaq*** mən bu fikirlə heç vaxt razı olmamışam, bu gün də razı deyiləm. Əminəm ki, keçirilən hər bir belə yubiley bizim həyatımızda çox böyük yeni hissiyyatlar doğurur, yeni qüvvələr meydana gətirir" [XIIIc.s.109].

---

[1] Nəsimi. Seçilmiş əsərləri I, II, III cild, Bakı, 1973. (Ic.175).

[2] Cəfərov Nizami, Musayev Osman, Osmanlı Dəyanət. Türk dünyasının yeni lideri. Bakı, "Çaşıoğlu", 2009. səh.672

Bağlayıcılarla nitqə ekspressivlik verə bilmək Heydər Əliyev nitqinə xas olan bir xüsusiyyətdir. Belə ki, böyük natiqdən "lakin", "ancaq", "amma" bağlayıcılarını eşidən auditoriya bu bağlayıcılara qədər olan fikrin qarşılığını gözləyir. Auditoriya yeni bir fikrin, yeni bir ideyanın ortaya qoyulacağını səbirsizliklə gözləyir: "Neft kəmərlərindən biri Rusiya ərazisindən keçib onun Novorossiysk limanına, digəri isə Gürcüstan ərazisi ilə Supsa limanına gedəcəkdir. ***Lakin*** Gürcüstan, Türkiyə əraziləri ilə Aralıq dənizinə, Ceyhan limanına gedəcək böyük neft kəməri çəkmək də planlaşdırılır" [XIIc.s.38]. Novorossiysk və Supsa limanlarına gedəcək neft kəmərlərinə qarşılıqlı olaraq Ceyhan limanı auditoriyaya açıqlanır. Heydər Əliyev nitqində qarşılaşma bağlayıcıları bir-birinin ardınca gələrək nitqə xüsusi çalarlar qazandırır: "Azərbaycanda heç bir tarixi şəxsiyyətə məqbərə yoxdur, ***ancaq*** şairə, yazıçıya var. ***Amma*** gəlin açıq danışaq, bu xalqı yaşadanlar tək şairlər, yazıçılar olmayıblar. Azərbaycanın padşahları da, sərkərdələri də, xanları da olubdur" [XIIIc.s.109]. "Ancaq" bağlayıcısı şair və yazıçıları digər tarixi şəxsiyyətlərlə qarşılaşdırırsa, ikinci halda "amma" bağlayıcısı xalqı yaşadanları şair və yazıçıları sərkərdə və xanlarla qarşılaşdırır, nitqin dolğunluğunu və qavranılmasını təmin edir.

"Ancaq" qarşılaşma bildirən bağlayıcı Heydər Əliyevin dilində fəlsəfi kateqoriyaların dialektik ziddiyətini vermək məqamlarında işlədilir: "Biz bu gün, bu el bayramı günü Məhəmməd Füzulinin Azərbaycanın paytaxtı Bakıda, Füzuli meydanında ucaldılmış heykəlinin önünə getdik, onun heykəlinin qarşısına güllər qoyduq. Ancaq Füzulinin özünün yaratdığı mənəvi heykəl bizim hər birimizin qəlbindədir" [VIIIc.s.25]. Əgər Füzulinin heykəli formadırsa onun qəlblərdə yaratdığı mənəvi heykəl isə məzmundur. "Ancaq" bağlayıcısı elə burada forma və məzmun arasında əlaqə yaradır, zidd təsəvvürləri bir-birinə bağlayır.

“Ancaq” qarşılaşma bağlayıcısını təkrar etməklə məntiqi ardıcıllıqlı bir nitq yaratmaq böyük natiqlərə müyəssər ola bilir ki, biz bunu Heydər Əliyevin 1997-ci ildə 30 oktyabrda Azərbaycan yazıçılarının X qurultayındakı çıxışında müşahidə edə bilirik: “***Ancaq*** son dövrdə ümumiyyətlə dövlətin yazıçılar, şairlər üçün yaratdığı şərait artıq o qədər qanuniləşmişdi ki, hamı hesab edirdi daim belə olacaq, belə də olmalıdır. ***Ancaq*** o quruluş dağıldı, biz o sistemdən imtina etdik və buna da heç vaxt heyfsilənməməliyik. Əksinə, ona görə sevinməliyik. Sevinməliyik ki, o quruluş, Sovet İttifaqı dağıldı. Sevinməliyik ki, əgər dağılmasaydı, biz dövlət müstəqilliyimizi əldə edə bilməzdik, bu mümkün deyildi. ***Ancaq*** bir halda ki, biz onun dağılmasını istəyirdik və istəyirdik ki, milli azadlığa çıxaq, müstəqil dövlət olaq, demək bunun əzab-əziyyətini də çəkməliyik. Başqa cür ola da bilməz. Bu təbiidir. ***Ancaq*** tərəziyə qoyanda – hansı ağır gəlir, hansı yüngül gəlir, – hamı bir səslə deyəcəkdir ki, bəli, müstəqillik naminə hər çətinliyə, hər əzab-əziyyətə dözməliyik. ***Ancaq*** bu çətinliklər daimi deyildir. Bunların da sonu var, bunlar müvəqqətidir. Mən bu gün bunu bir daha deyirəm və hesab edirəm ki, biz bu çətinliklərdən keçib gedəcəyik. ***Ancaq*** bu şəraitdə də biz keçmiş ənənələrə istinad edərək, – yəni siz onlara vərdiş etdiyinizə görə və biz də hesab edərək ki, doğrudan da gərək yazıçılar bu keçid dövründən bir balaca yüngül keçsinlər, – əlbəttə ki, imkan dairəsində müəyyən qayğılar göstərmək lazımdır” [XIIIc.s.111]. “Ancaq” bağlayıcısı altı dəfə təkrarlanaraq Sovetlər dövründən müstəqillik dövrünədək olan mərhələləri əvəzləyir. Qərarlaşmış sovet dövrü – quruluşun dağılması – milli-azadlığa çıxmaq – müstəqillik yolunda əzab-əziyyətə dözmək – çətinliklərin daimi olmaması – keçid dövrünü başa vurmaq.

Çünki bağlayıcısı auditoriyaya izah verir. Bu bağlayıcı ilə ulu öndər müstəqillik yolunda hər bir çətinliyə sinə gərməyi bizlərə öyrədir: “Bu günlər indiyədək yaşadığımız dövrlərin

bəlkə də hamısından qiymətlidir. ***Çünki*** biz indi milli azadlığa çıxmışıq, dövlət müstəqilliyini əldə etmişik, müstəqil dövlət kimi yaşayırıq" [Vc.s.201].

Heydər Əliyevin nitqində səbəb bildirən "çünki" bağlayıcısı ilə yekunlaşan bir cümlə bütöv bir çıxışın məzmununa uyğun gəlir: "Ona görə də aramızda olan, ayrı-ayrı şəxsi mənafe güdən qüvvələrə xəbərdarlıq edirəm: bütün bu işlərindən əl çəksinlər, bunların heç bir nəticəsi olmayacaq, onlar heç nəyə nail ola bilməyəcəklər. ***Çünki*** xalq artıq ayılmışdır, ayağa qalxmışdır" [Ic.s.99].

Səbəb bildirən "çünki" bağlayıcısı özündən əvvəlki cümləyə "nə üçün" sualı qoyulan bir məsələni izah edir: "Bax, bu günə qədər atəşin kəsilməsi və danışıqlar aparılması məsələsini irəli sürmüşük. Bəli, biz bu yolla getmişik və mən hesab edirəm ki, düzgün eləmişik. ***Çünki***, insanlarımız qırılır, kəndlərimiz dağılır, içimizdən olan təxribatçılar öz çirkin niyyətlərini həyata keçirmək üçün xalqa, millətə, torpağa xəyanət edirlər" [Ic.s.91].

Heydər Əliyevin nitqində "çünki" bağlayıcısı haqqında danışılan məsələlərə aydınlıq gətirir, səbəblər bir-bir auditoriya üçün sadalanır: "***Çünki*** orada yaşamaq çox çətin idi, bütün kommunikasiyalar kəsilmişdi, ***nə*** elektrik enerjisi var idi, ***nə də*** qaz və su. Mən öz həmyerlilərimə kömək etməli idim. Budur, dörd ildir ki, Azərbaycanı ağır vəziyyətdən ***bax*** beləcə çıxarıram" [XIIc.s.79]. Həyatının XX əsrin 90-cı illərindəki Naxçıvan dövrünü auditoriyaya bəyan edən Heydər Əliyev "çünki" bağlayıcısı ilə o dövrün çətinliklərini sadalayır. Bu sadalanmanı "nə", "nə də" inkarlıq bildirən bağlayıcılarla davam etdirərək "bax" qüvvətləndirici əmr ədatı ilə vəziyyətdən çıxmağımıza işarə edir.

Müxtəlif məna növlü bağlayıcılar bir cümlənin içində belə yüksək səviyyəli mənaları auditoriyalara çatdırmaqda böyük natiqə yardımçı olur, öz növbəsində də bağlayıcılar – köməkçi

nitq hissəsi olmaqdan mühüm nitq hissəsinə çevrilir: "***Çünki*** Füzulinin həyatı da, bütün yaradıcılığı da həm yüksək mənəviyyat, həm yüksək fəlsəfədir, həm də insanlara mənəvi, estetik qida verən böyük bir mənbədir" [VIIc.s.165].

Tabesizlik bağlayıcıları içərisində bölüşdürmə bildirən "ya", "ya da ki" Heydər Əliyev nitqində tez-tez təsadüf edərək "təəssüf ki" modal sözlə birgə işlənir: "***Təəssüf ki***, bizim yerli dövlət orqanları, inzibati orqanlar, hüquq-mühafizə orqanları da bir növ istər-istəməz qeyri-qanunu hərəkətlərə ***ya*** tabe olurlar, ***ya*** biganə qalırlar, ***ya da ki,*** diqqət verməк istəmirlər, ona görə də o şəxs orada istədiyini edir" [Ic.s.65-66]. "Ona görə də" səbəb tabelilik bağlayıcısı "o şəxs orada istədiyini edir" nəticə budaq cümləsini baş cümləyə bağlayır.

İştirak bildirən bağlayıcılar böyük natiqin nitqində ekspressivliyi gücləndirmək baxımından çox mühümdür. Bu bağlayıcılar arasında "həm", "həm də", "o cümlədən", "özü də" bağlayıcıları daha çox işlənir. Bu bağlayıcılar müxtəlif üslublarda, müxtəlif çeşidli auditoriyalarda özünə yer tapır: "Bundan sonra bir neçə böyük zavod – ***həm*** elektrotexnika, ***həm*** radiotexnika, ***həm də*** elektronika zavodları, maşınqayırma, ***o cümlədən*** Bakıda dərin özüllər zavodu tikildi və bu da o dövrdə sənayenin inkişafına az təsir etmədi. Bütün bunlar isə ***həm*** sənayenin inkişafı, ***həm də*** müasir texnologiyanın, ***özü də*** gələcəyi təmin edən texnologiyanın, tətbiq edildiyi sənaye müəssisələrinin yaradılması istiqamətində apardığımız siyasətin nəticəsi idi" [Ic.s.120]. "O cümlədən" bağlayıcısının köməyilə bütövün – "zavodların" – içərisindən xüsusini (dərin özüllər zavodu) ayırmaq üçün istifadə olunur. "Özü də" bağlayıcısı "həm", "həm də" bağlayıcılarının ifadə etdiyi fikirləri dəqiqləşdirir. Sənayemizlə bağlı işlətdiyi üç cümlədə yeddi iştirak bildirən bağlayıcının işlənməsi bir daha böyük natiqin dilində bağlayıcının necə böyük funksiyalar daşımasını göstərir.

"Həm", "həm də" iştirak bildirən bağlayıcılar Heydər Əliyevin nitqində tamın hissələrini birləşdirmək anlamında daha çox istifadə olunur: "Qədim dövrlərdən indiyə qədər idman insanları ***həm*** fiziki, ***həm də*** mənəvi cəhətdən yüksəldən bir vasitədir. İdmanla məşğul olan hər bir şəxs həm özünün fiziki sağlamlığını təmin edir, ***həm də ki***, cəmiyyətdə idmanın, bədən tərbiyəsinin insan üçün nə qədər lazım olduğunu sübut edir" [VIIc.s.7].

"Həm də" bağlayıcısı təkcə də işlənə bilir. Bu bağlayıcı izahedicilik xüsusiyyətinə də malikdir: "Arif Məlikovla biz sonralar da görüşürdük. Onun ***həm də*** rəssam olduğunu mən 7-8 il bundan əvvəl bilirdim" [IIIc.s.162].

Heydər Əliyev dilində "nəinki" və "həm də" bağlayıcıları bölüşdürmə funksiyası daşıyır. 26 avqust 1997-ci ildə Varşavada Polşa-Azərbaycan əlaqələrindən danışarkən əlaqələri "nəinki" və "həm də" bağlayıcılarının köməyilə bölüşdürür: "***Nəinki*** ticarət, iqtisadi əlaqələr mövcud idi. ***Həm də*** insani əlaqələr yaradılmışdır. Məsələn, yaxşı məlumdur ki, XV əsrdə Azərbaycan hökmdarı Uzun Həsən Polşa kralı Yagello ilə sıx əlaqə saxlamışdır" [XIIc.s.42]. Yuxarıda "məsələn" bağlayıcısı bölüşdürülən fikri təsdiq etmək baxımından mühüm rol oynayır.

"O cümlədən" bağlayıcısı bütövün içərisindən hissəni ayırmaq məqsədi ilə işlədilir: "Bununla eyni zamanda Avrasiya nəqliyyat dəhlizi yaradılmışdır və indi o, fəal işləyir və Mərkəzi Asiyadan Xəzər dənizi vasitəsilə Azərbaycana, Gürcüstana, Qara dəniz vasitəsilə Avropa və oradan geriyə yük daşımalarını həyata keçirir. Bu iki yol – yüklərin nəql edilməsi və neft kəmərləri ilə neft və qazın nəql edilməsi Avropa üçün, ***o cümlədən*** Polşa üçün böyük əhəmiyyətə malikdir" [XIIc.s.38]. Dinləyici böyük natiqin dilində Avropanı bütöv qəbul edirsə, Polşanı Avropa dövləti kimi, bir hissə kimi qəbul edir.

"Özü də" bağlayıcısı "həm", "həm də" bağlayıcısı ilə bir qrupda olsa da bu bağlayıcı Heydər Əliyevin dilində dəqiqləşdiricilik funksiyası daşıyır: "Hər halda bu təxribat hər kim tərəfindən törədilsə də, xüsusi olaraq təşkil edilmiş cinayətdir, ***özü də*** bir adama qarşı deyil, respublikamıza qarşı cinayətdir" [IIc.s.45].

Aydınlaşma bağlayıcıları kimi işlənən "yəni", "yəni ki", "məsələn" bağlayıcıları içərisində Heydər Əliyevin nitqində ən çox "məsələn" bağlayıcısı işlədilir: "Polyaklar Azərbaycanda 1918-ci ildə yaradılmış ilk demokratik hökumətin fəaliyyətində də iştirak etmişlər. ***Məsələn***, Kuçinski qardaşları Azərbaycan Demokratik Respublikası hökumətində işləyirdilər. 1918-ci ildə Azərbaycan demokratik hökumətinin ilk milli ordusunun qərargah rəisi general Sulkeviş idi..." [XIIc.s.43].

"Məsələn" bağlayıcısı bağlayıcıya qədər olan fikri auditoriya üçün aydınlaşdırır, fikri qüvvətləndirir. Polyakların Azərbaycan Demokratik Respublikası hökumətində iştirakını eşidən dinləyicilər "məsələn" bağlayıcısından sonra bu hökumətdə iştirak edən polyak ictimai-siyasi xadimlərinin adlarını, tutduqları vəzifələri eşidərək nitqə böyük bir heyranlıqla qulaq asırlar.

"Həm", "həm də" bağlayıcıları hissəni tamla yanaşı vermək baxımından seçilir: "Bəli, Vaqifin vəfatından 200 il sonra biz Şuşada onun məzarı üzərində əzəmətli bir məqbərə ucaltdıq. Bu, ***həm*** Vaqifin yaradıcılığına, ***həm də,*** ümumiyyətlə, ədəbiyyata, şeirə, mədəniyyətə olan münasibətimiz idi" [XIIIc.s.109].

Yekunlaşdırıcı "ümumiyyətlə" modal sözü "Azərbaycan ədəbiyyatı, şeiri, mədəniyyəti"ni tam kimi verirsə, "Vaqifin yaradıcılığı" isə bu tamın bir hissəsidir ki, bunlar "həm", "həm də" bağlayıcılarının köməyilə həyata keçirilir.

"Əgər" bağlayıcısı ilə düşdüyümüz vəziyyətin nələrlə şərtləndiyini auditoriya böyük natiqin dilindən eşidir: "***Əgər***

münaqişə başlanandan bizim ordumuz olsaydı, gücümüz olsaydı, respublikanın güclü imkanları olsaydı, belə vəziyyət yaranmazdı". Sonrakı nitq mərhələsində "əgər" şərt bağlayıcısı ilə gələcəyimizin necə olacağı şərtlənir: "***Əgər*** bu vəziyyət indi də davam edərsə, bilin ki, bizim ***nə*** müstəqilliyimiz olacaq, ***nə də*** Azərbaycan olacaq" [IIc.s.36].

Müəyyən şərtlər ("əgər") daxilində, müstəqilliyimizin inkarı ("nə", "nə də") baş verirsə, səbəbləri ("çünki") sadalamaqla və nəhayət "buna görə də" bağlayıcısının köməyilə nikbin əhval-ruhiyyə yaradır: "***Çünki*** bizim əhatəmiz çox mürəkkəbdir, bunu bilirsiniz. Dünyada ***o cümlədən*** keçmiş Sovet İttifaqının ərazisində gedən proseslər bir-iki illik proseslər deyil, bunlar davam edəcəkdir. ***Buna görə də*** ordunu yaratmaq, onu həqiqi orduya, torpaqlarımızı etibarlı müdafiə edə bilən qüdrətli orduya çevirmək bizim müqəddəs borcumuzdur" [IIc.s.37].

Heydər Əliyev nitqində tabesizlik və tabelilik bağlayıcıları bir-birilə çulğalaşaraq harmoniya yarada, auditoriyanı öz cazibəsində saxlaya bilir: "Bunlarla yanaşı, Füzulini ölkəmizdə, xüsusən yaxından tanıtmaq üçün onun haqqında populyar bir kitab olmalıdır. Elə bir kitab ki, onu oxuyan hər kəs Füzulini tezliklə tanıya bilsin. Tədqiqat əsərlərini alimlər, Füzulinin yaradıcılığı ilə maraqlananlar oxuyurlar. ***Amma*** Füzulini hamı tanımalıdır. Zənnimcə, Füzuli haqqında elə bir kitab lazımdır ki, biz onu ingilis, fransız, alman, ərəb, fars dillərinə tərcümə edib yayaq. Deyirsiniz ki, Avropada yubiley tədbiri keçirək. Həmin tədbirdə çox az adam iştirak edər. ***Ancaq*** orada elə bir kitab yayılsa, Füzulini daha çox adam tanıyacaqdır. ***Ona görə də*** hesab edirəm ki, bütün bu tədbirlərlə yanaşı, belə bir kitabın yazılması mütləq lazımdır. ***Çünki*** indi Füzulinin əsərlərini ingilis, fransız, alman dillərinə tərcümə edib yaymaq imkanımız yoxdur. Bunu gələcəkdə etməliyik. ***Lakin*** Füzuli haqqında geniş məlumat verən bir kitab varsa, onu tərcümə etmək, yox-

dursa yazmaq lazımdır. ***Özü də*** həmin kitab bütün keçmiş stereotiplərdən xilas olmalıdır. Məsələn, Fuad Qasımzadə burada dedi ki, o, keçmişdə tədqiqat apararkən Füzulini marksizm-leninizm ideologiyası ilə bağlamağa çalışırdı” [IIc.s.94-95].

Heydər Əliyevin nitqində müxtəlif növ bağlayıcılar bir-birinin ardınca nitqdə rəvanlıq, ardıcıllıq, əlvanlıq yaradır: “Dünən axşam cənab prezident Kvasnevski ilə mən əvvəlki bir çox yüzilliklər ərzində Polşa və Azərbaycan arasında iqtisadi əlaqələr, ticarət əlaqələri olduğunu sübut edən faktları xatırladıq. ***Məsələn***, dedik ki, orta əsrlərdə – XV və XVI yüzilliklərdə Azərbaycandan Polşaya əl ilə toxunan gözəl Azərbaycan xalçaları, pambıq, ipək, bir çox məhsullar göndərilirdi. Polşadan da Azərbaycana çoxlu məhsul gətirilirdi. Bunlar iqtisadi, ticarət əlaqələrimizin dərin kökləri olduğuna sübutdur.

***Lakin təəssüflər olsun ki***, bizim zəmanəmizdə bu səviyyəyə hələ çatmamışıq, ***halbuki*** indi Polşanın da, Azərbaycanın da imkanları bir neçə əsr əvvəl olduğundan daha böyükdür. ***Buna görə də*** Polşaya səfərim zamanı mənim vəzifələrimdən biri Polşa ilə Azərbaycan arasında iqtisadi münasibətlərin, ticarət münasibətlərinin inkişafına təkan verməkdir” [XIIc.s.49]. Böyük natiq “məsələn” aydınlaşdırmaq bağlayıcısı ilə Polşa-Azərbaycan münasibətlərinin tarixinə auditoriya ilə birgə səyahət edir, bu səyahəti aydın dəlillərlə izah edir. “Lakin” bağlayıcısı ilə XV və XVI əsrləri XX əsrlə qarşılaşdırır, təəssüf modal sözü, “halbuki” şərt bağlayıcısı ilə qınaq hissi yaradır. “Buna görə də” səbəb bağlayıcısı ilə Polşaya səfərinin məqsədini açıqlayır.

İnkarlıq bildirən “nə”, “nə də” bağlayıcıları auditoriyada nitqə yüksək məna çalarları qazandırır. Elə bu inkar bağlayıcıları böyük natiqin dilində izahedicilik xüsusiyyəti qazanır: “Amma baxın, XXVI olimpiya oyunlarına bizim 21 nəfər nümayəndəmiz gedir və onlar orada təmsil olunmaq, iştirak etmək hüququ alıblar. Dünyada yeganə haldır ki, bu toplantıya,

dünya səviyyəli görüşə gedən nümayəndə heyəti ***nə*** dövlət, ***nə də*** xalq tərəfindən təyin oluna bilməz” [VIIc.s.6]. Auditoriya olimpiya oyunlarında iştirak etməyin qaydalarını böyük natiqin dilindən eşidir.

İnkarlıq bildirən tabesizlik bağlayıcıları Heydər Əliyev dilində heç bir şeydən – terrordan, çevrilişdən – qorxmamağa xidmət edir: “Mən bəzi adamlara demişəm. Şəxsən mənim heç bir silahım yoxdur: ***nə*** topum, ***nə*** tapançam, ***nə də*** avtomatım var. Mənim idrakım var, iradəm var və xalq mənə ümid bəsləyirsə, xalq mənə bu səlahiyyəti vermişdirsə, xalqı bu ağır vəziyyətdən çıxarmağı öz öhdəmə götürmüşəmsə, güman edirəm ki, xalq məni müdafiə edəcəkdir. ***Ona görə də nə*** çevrilişdən qorxuram, ***nə*** mənə qarşı terror aktları hazırlayan qüvvələrdən qorxuram. Heç bir şeydən qorxmuram. Demişəm və indi də deyirəm: həyatımın bundan sonrakı hissəsini xalqa bağışlamışam. Xalq onu harada kəsərsə, orada da kəsiləcəkdir” [Ic.s.98-99]. İnkarlıq bildirən bağlayıcılarla poetik ruhlu bir nitq auditoriyanı riqqətə gətirir.

“Əlbəttə” təsdiq modal sözü “ancaq” qarşılaşdırma bağlayıcısı ilə çulğalaşaraq bitkin nitq yaradır. “***Əlbəttə***, Türkiyə kimi bir dövlətin, cümhuriyyətin qurulması, inkişafı bizim üçün böyük örnəkdir. ***Ancaq*** xalqımızın, ölkəmizin, dövlətimizin özünəməxsus xüsusiyyətləri var. Biz dünya təcrübəsindən istifadə edirik və etməliyik. ***Ancaq*** öz milli, mənəvi ənənələrimiz əsasında, xalqımızın, həyatımızın xüsusiyyətlərini nəzərə alaraq öz dövlətimizi qururuq və quracağıq” [XIIIc.s.114].

Beləliklə, Heydər Əliyevin nitqində bağlayıcıların araşdırılması aşağıdakı fikirləri söyləməyə imkan verir:

– Heydər Əliyevin nitqində tabesizlik və tabelilik bağlayıcıları bir-biriylə çulğalaşaraq harmoniya yarada, auditoriyanı öz cazibəsində saxlaya bilir;

– “Lakin”, “ancaq”, “amma” bağlayıcılarını eşidən auditoriya Heydər Əliyevin nitqində yeni bir fikrin, yeni bir ideyanın ortaya qoyulacağını gözləyir;

– “Ancaq” qarşılaşma bildirən bağlayıcısı Heydər Əliyevin dilində fəlsəfi kateqoriyaların dialektik ziddiyyətini vermək məqamlarında işlədilir;

– “Həm”, “həm də” iştirak bildirən bağlayıcılar böyük natiqin dilində hissələri tamda birləşdirmək anlamında daha çox istifadə olunur;

– “Həm”, “həm də” bağlayıcıları bütövü təşkil edən hissələrin sadalanması məqamlarında da geniş istifadə olunur;

– “Özü də”, bağlayıcısı “həm”, “həm də” bağlayıcısı ilə bir qrupda olsa da bu bağlayıcı Heydər Əliyevin dilində dəqiqləşdiricilik funksiyası daşıyır;

– “Ya”, “ya da” bağlayıcıları Heydər Əliyevin nitqində biri digərinin əksi olan fikirləri ifadə etmək baxımından mühümdür;

– “O cümlədən” bağlayıcısı bütövdən, tamdan hissəni ayırmaq məqsədi ilə işlədilir;

– Heydər Əliyevin nitqində bəzən bağlayıcılar sözün və cümlənin mənasını qüvvətləndirərək ədat səviyyəsinə yüksəlir;

– Heydər Əliyevin nitqində bağlayıcılar modal sözlər və ədatlarla çulğalaşaraq mövzunun auditoriyaya çatdırılmasında mühüm rol oynayır.

Bu fəsil Heydər Əliyevin nitqlərində bağlayıcı köməkçi nitq hissəsinin üslub yaratmaq imkanlarına bir baxışdır. Həm Heydər Əliyevin, həm də şair və yazıçılarımızın əsərlərində bağlayıcılarla əlaqədar dərin elmi-tədqiqat işləri öz həllini gözləyir.

## 2.3. Heydər Əliyevin nitqində ədatlar

Azərbaycan siyasi natiqliyinin banilərindən biri hesab olunan Heydər Əliyevin nitqini ədatlarsız təsəvvür etmək mümkünsüzdür. Söz və cümlənin mənasını qüvvətləndirdiyi üçün işlədilən köməkçi nitq hissəsi olan ədat böyük natiqin çıxışlarında xüsusi əhəmiyyət kəsb edir.

Heydər Əliyev nitqinin üslubi-morfoloji xüsusiyyətləri araşdırılsa da, bu araşdırmalar içərisində ədatlar tədqiqat obyekti olmamışdır. Məqsədimiz mənaca müxtəlif olan ədatların Heydər Əliyevin nitqində yerini müəyyənləşdirmək, onların bir-biri ilə münasibətini açıqlamaqdır.

Digər köməkçi nitq hissələri kimi ədat da cümlədə müstəqil sintaktik funksiya daşıya bilmir, yəni ədat ayrılıqda cümlə üzvü ola bilmir. Ədatlar aid olduğu söz və ya cümlənin mənasını ya qüvvətləndirir, ya məhdudlaşdırır, ya inkar edir, ya da söz və ya cümlələr arasında əlaqə yaradır.[1,2]

Mənaca müxtəlif olan ədatlar Heydər Əliyevin 1993-cü il 15 iyun – 1994-cü il 31 dekabrı əhatə edən dövrdəki çıxışları əsasında araşdırılmış və faizlə öz əksini tapmışdır. Məlum olmuşdur ki, qüvvətləndirici ədatlar 44.3% təşkil edərək Heydər Əliyevin çıxışlarında ön yeri tutur. ***Axı***, ***ən***, ***daha***, ***hətta***, ***da***, ***də*** qüvvətləndirici ədatları aparıcı rola malik olmuşdur. Məişət üslublu nitqdə çox işlənən ***lap***, ***ha***, ***-ca***, ***necə*** qüvvətləndirici ədatları isə çox az işlənmişdir.

Təsdiq və inkar ədatları 16.4% olmaqla böyük natiqin nitqində ikinci yeri tutmuşdur. Bunların içərisində ***bəli***, ***xeyr***, ***yox*** ədatlarına daha çox, ***bəli də***, ***bəli a***, ***hə***, ***heç***, ***heç də*** ədatlarına isə az təsadüf olunur. "***Bəli***, mən öz məsuliyyətimi bilirəm və

---

[1] Hüseynova Kəmalə. Ədatların İngilis və Azərbaycan dillərində işlənmə xüsusiyyətləri. Filologiya məsələləri, №4, 2009. s.154-158

[2] Hüseynzadə Muxtar. Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.

hesab edirəm ki, bunları etməliyəm... Buraya mən özümə görə yox, vəzifə tutmağa görə yox, xalqı bu vəziyyətdən xilas etmək üçün gəlmişəm”.

Böyük natiqin dilində ***bəli*** təsdiq ədatı hər bir insana, hər bir siyasətçiyə, hər bir dövlət xadiminə öz məsuliyyətini – xalq, vətən qarşısındakı məsuliyyətini dərkə çağırır.

Çox işlənmə tezliyinə görə üçüncü yeri 15.9% olmaqla dəqiqləşdirici ədatlar tutur. Bu ədatlar içərisində ***məhz***, ***elə*** üstünlük təşkil edir. ***Əsl*** dəqiqləşdirici ədatı Heydər Əliyev nitqində az işlənir. Əmr ədatlarına gəlincə, onlar Heydər Əliyev nitqində 10.6% yer tutur. Bu ədatlardan əsasən ***qoy***, ***bax***, ***gəlin***, ***görün*** daha çox işlənmiş, ***gəlsənə, qoysana, di*** əmr ədatları isə tək-tək hallarda işlənmişdir. Heydər Əliyev nitqindəki ritorik sualların əsasını təşkil edən sual ədatları 7.1% olmaqla onun nitqinin ecazkarlığını artırır. Bu sıradan ən az ***yəni***, ən çox isə ***məgər, bəs, -mı***$^4$ sual ədatları işlədilmişdir. Heydər Əliyevin nitqində digər ədatlarla müqayisədə məhdudlaşdırıcı (2.6%) və arzu (1.7%) ədatları (1.7%) ən az yer tutmuşdur. Məhdudlaşdırıcı ədatlardan ən çox ***ancaq, tək, təkcə***, ən az təsadüf edilən isə ***bir, bircə*** ədatları olmuşdur. ***Kaş, kaş ki, barı*** kimi arzu ədatlarının işlənilməməsi və yaxud az işlənməsi bir daha Heydər Əliyevin real həyata söykənən ciddi dövlət xadimi olmağından irəli gəlir.

“İndiki dövrümüzdə vətənpərvərlik ***ən*** aktual məsələdir. Torpaqlarımızın bir qismi işğal olunmuşdur, müharibədə məğlubiyyətlərə uğramışıq. Nə üçün? ***Məgər*** Azərbaycan xalqı bu qədər ***acizdirmi***, ***məgər*** Azərbaycan gəncləri bizə təcavüz edən qüvvələrdən həm fiziki, həm mənəviyyat, həm vətənpərvərlik cəhətdən ***zəifdirmi****?* Hesab edirəm ki ***yox***”

Bu hissədə ***ən*** qüvvətləndirici ədatının arxasınca ritorik suallar gəlir ki, onların da əsasında duran sual ədatları – ***məgər, -mi*** təkrarlanır. Bu ritorik suallara *yox* inkar ədatı ilə qəti cavab verilir. 6 cümlədə 6 ədat işlənməsi bir daha Heydər

Əliyev nitqində bu köməkçi nitq hissəsinin özünəməxsus ***yer*** tutmasından xəbər verir.

Böyük natiqin çıxışlarında müxtəlif mənalı ədatlar böyük bir harmoniya təşkil edir. "Təkrar edirəm, Rusiyanın hansı xalqa tarixən ***daha*** çox bağlı olduğundan, dini mənsubiyyətindən asılı olmayaraq ölçülüb-biçilmiş mövqeyi olmalıdır. Mənə elə gəlir ki, ***məhz*** bu halda həm Rusiyanın Qafqazda ***daha*** böyük nüfuzu olacaq, həm də Qafqazda ***daha*** çox sakitlik təmin ediləcək. Qafqazda ***daha*** çox sakitlik isə Rusiyada ***daha*** çox sakitlik deməkdir". Bu kiçik parçada ***məhz*** dəqiqləşdirici ədatı və dörd yerdə təkrarlanan ***daha*** qüvvətləndirici ədatı harmonik şəkildə bir-biri ilə uzlaşır.

Heydər Əliyevin nitqində bir cümlədə müxləlif ədatlar işlənir: "Belə layihələr doğrudan ***da*** varsa onlar həqiqətən işə yarayırsa, diqqətə yarayırsa, onda ***qoy*** onlar bu barədə lazımı qərarlar qəbul etsinlər. ***Yox***, elə deyildirsə onda ***qoy*** onlar təzədən işlənsin, təkmilləşdirilsin. Bir sözlə, biz bu sahədə gecikməməliyik. Amma, nə gizlətməli çox gecikmişik. ***Bəli***, çox gecikmişik". Bu nitqdə "qoy" – əmr, "yox" – inkar, "bəli" – təsdiq, "da" – qüvvətləndirici ədatları bir-biri ilə uzlaşır.

"Burada deyirlər ki, rüşvətxorluq indi ***ən*** yüksək zirvəsinə çatıb. O dövrdə ***də*** rüşvətxorluq var idi və ona qarşı ***ən*** ciddi mübarizəni mən aparmışam. İşdən çıxarırdıq, partiyadan kənar edirdik. ***Bəli***, bu tədbirləri mən görmüşəm. ***Gəlin***, açıq danışaq. Mən bütün həyatım boyu rüşvətxorluğa qarşı mübarizə aparmışam və bundan sonra ***da*** aparacağam" [Ic.s.74].

Nitqdə təkrarlar onun ecazkarlığını artıran vasitələrdəndir və qüvvətləndirici ədatları təkrarlandıqca böyük natiq "coşqun dağ seli" effektini yarada, auditoriyanı süstlükdən qurtara və səfərbər edə bilir. BMT Baş Katibi Butros Qali ilə görüşdəki kimi: "Ancaq, siz bilirsiniz ki, respublikamız üçün ***ən*** ağır, ***ən*** çətin, ***ən*** mühüm məsələ Azərbaycana qarşı olan hərbi təcavüzün qarşısının alınması məsələsidir". Üç dəfə təkrarlanan ***ən***

qüvvətləndirici ədatı nüfuzlu beynəlxalq təşkilatlara ayıldıcı təsir göstərə bilir.

"***Məhz*** bu yolla getmək üçün, ***məhz*** etibarlı, uzun müddətli sülh əldə etmək üçün Azərbaycan Silahlı Qüvvələri daha da güclü olmalıdır". Bu cümlədə *məhz* dəqiqləşdirici ədatı iki dəfə təkrarlanaraq, sonda qüvvətləndirici *da* ədatı ilə yekunlaşır. Dəqiqləşdirici ədatların köməyi ilə böyük natiq tariximizdəki mübahisəli məqamlara aydınlıq gətirir: "Azərbaycanın gerbi və digər atributları, Azərbaycan dövlətinin bu gün bu salonda səslənən əzəmətli himni də ***məhz*** o vaxt, o şəraitdə yaranmışdır".

Dəqiqləşdirici ədatlarla keçmiş tariximizə aydınlıq gətirən böyük natiq günün reallığından bu ədatların köməyi ilə çıxış edir, auditoriyaya öz fikrini dəqiqləşdirir.

"***Məhz*** buna görə ***də*** biz iyun ayının 24-də xarici şirkətlərlə demək olar ki, bağlanmaq ərəfəsində olan müqavilələrin müvəqqəti olaraq dayandırılması qərarını qəbul etdik. Bu ***heç də*** o demək deyil ki, biz bu şirkətlərlə müqavilə bağlamaqdan imtina edirik, yaxud bu şirkətlərin Azərbaycanda fəaliyyət göstərməsinin qarşısını alırıq. ***Yox***, sadəcə olaraq biz bu məsələni daha dərindən araşdırmaq istəyirik. Təkrar edirəm, Azərbaycanın ən böyük sərvəti olan neft yataqlarının bundan sonra xalqın inkişafı naminə istifadə olunmasına, ***daha*** səmərəli təşkilinə çalışırıq" [Ic.s.84]. Cümlədə ***heç də*** və ***yox*** inkar ədatları ilə ***məhz*** dəqiqləşdirici ədatını qüvvətləndirmək xüsusiyyəti ulu öndər, fenomen şəxsiyyət Heydər Əliyev nitqinə xasdır.

Əgər siyasi natiqlikdə qüvvətləndirici, dəqiqləşdirici ədatlar çox işlədilirsə, əmr, sərəncam, fərman imzalamaq gündəlik işi hesab olunan lider – Heydər Əliyevin nitqində əmr ədatları xüsusi yer tutur. Bu əmr ədatları dövlətçiliyimizin qorunmasına həsr olunmuş çıxış və nitqlərdə şimşək kimi parlayır, dövlətçiliyimizin əleyhinə çıxanların başında ildırım kimi çaxır: "Lakin, ***qoy*** onların hamısı bilsin ki, belə vəhşiliklərlə, təxri-

batlarla heç kəs Azərbaycan Respublikasının müstəqilliyini, onun siyasətini sarsıtmağa, bizi bu yoldan döndərməyə müvəffəq olmayacaqdır" [IIc.s.54]. Böyük natiqin dilində əmr ədatı dəqiqləşdirici və qüvvətləndirici ədatlarla çulğalaşır. "***Qoy***, heç kəs elə güman etməsin ki, Azərbaycan parlamenti müqavilənin nəzərdən keçirilməsini uzadacaqdır. Ümidvaram ki, parlament onu təsdiqləyəcək və burada göstərildiyi kimi müqavilə ***elə*** həmin gündən ***də*** qüvvəyə minəcək" [IIc.s.254].

Əsrin müqaviləsinin imzalanması mərasimində böyük natiq *qoy* əmr ədatının köməyi ilə ürəklərə çökən güman, şübhə buludunu dağıdaraq, *elə* dəqiqləşdirici ədatı ilə əminlik yaradır və *də* qüvvətləndiricinin köməyi ilə fikrini yekunlaşdırır.

Əmr ədatları içərisində *gəlin*, açıq danışaq, *gəlin*, belə danışaq ifadələrinə çox yer ayrılır.

Zuğulba pansiyonundakı müvəqqəti məskunlaşan qaçqınlarla görüşdəki çıxışın kiçik bir parçasına diqqət yetirsək *gəlin* əmr, *bəli* təsdiq, *da, axı* qüvvətləndirici ədatları səmimiyyət (*Gəlin*, belə danışaq) və təvazökarlıqla (Mən sizi günün altında saxlamışam, özüm *də* durmuşam) bir-birinə çulğalaşmışdır.

"***Gəlin***, belə danışaq. Görürəm, ürəyiniz doludur. Mən sizi günün altında saxlamışam, özüm ***də*** durmuşam. İstəyirəm fikirlərimi sizə çatdıram. Ondan sonra bu mikrofon, bu ***da*** siz, çıxıb sözünüzü deyə bilərsiniz. ***Bəli***, bunlar Milli Məclisdə tələb edirdilər ki, Bişkek protokolu məsələsi gündəliyə salınsın. ***Axı***, bu protokolda əvvəla, elə bir şey yoxdur – o mənada ***ki***, müzakirə olunası bir məsələ yoxdur" [Ic.s.587].

Bu əmr ədatları yüksək tribunalardan ən nüfuzlu, ən sayılan beynəlxalq təşkilatlara ünvanlanır. Sual ədatları ilə birgə səslənərək auditoriyada nitqin emosianallığını, təsir gücünü birə yüz artırır: "***Bax*** siz insan hüquqlarının müdafiəsində ATƏM-in mühüm vəzifəsindən danışdınız. ***Bəs*** respublikanın bütün ərazisində ağır vəziyyətdə olan, bir milyon nəfərdən çox qaçqının hüquqları tapdanmır***mı***, pozulmur***mu***?"

Təsdiq və inkar ədatları böyük natiqin nitqində ideyanın birmənalı, şəksiz təsdiqindən xəbər verir: "***Bəli***, o zaman, araşdırma vaxtı məlum idi ki, yanvarın 16-17-sində xəstəxanalarda yerlər hazırlanırdı. ***Bəli***, geniş palatalar hazırlanmışdı. Cərrahlara xəbərdarlıq edilmişdi" [Ic.s.340].

Azərbaycanın görkəmli elm və mədəniyyət xadimlərinin yubiley mərasimlərində ədatların işlənmə tezliyi artır. Belə ki, 18 sentyabr 1994-cü ildə Niyazinin ev muzeyinin açılışında 30 yerdə ədatlar işlənmişdir [IIc.s.247-251].

Eyni həcmdə digər bir rəsmi çıxışda – Xəzər şelfində yataqların birgə işlənməsi haqqında Bakıda Azərbaycan Dövlət Neft Şirkəti ilə xarici neft şirkətlərinin konsorsiumu arasında müqavilə imzalanması mərasimində cəmi 5 yerdə ədatlardan istifadə olunmuşdur [IIc.s.254-258].

Adətən rəsmi açıqlamalar, elmi üslubdakı nitqlərdə Heydər Əliyev ədatlarla nitqin ekspressivliyinə önəm verir. Bu bir daha Heydər Əliyevin Azərbaycanın müstəqilliyini yaradan dəyərli insanlara olan sevgisinin təzahürüdür.

Ədatlar Heydər Əliyev nitqində müxtəlif auditoriyaların bəzəyinə çevrilir, auditoriyalara qarşıya qoyulan məsələləri anlamaqda kömək edir, nitqin təsir gücünü artırır. Kənd təsərrüfatının vəziyyəti ilə bağlı çağırdığı müşavirədə özəlləşdirmənin aparılmasının zəruriliyini "xeyr" inkar ədatı ilə çatdırır: "Heç kəs də qorxmasın ki, özəlləşdirməni aparanda geriyə düşəcəyik. ***Xeyr***, bizdən asılı olmayaraq gedən obyektiv proseslər onu göstərir ki, mal-qaranın, iribuynuzlu, xırdabuynuzlu heyvanların sayı ictimai təsərrüfatda azalır, fərdi təsərrüfatlarda isə artır" [IIc.s.268].

Çıxışın digər bir yerində isə dəqiqləşdirici "elə" ədatının vasitəsi ilə özəlləşdirmənin nəticələrini sıralayır, sonda Azərbaycan əhalisinin ərzaq məhsulları ilə təminatını dəqiqləşdirir: "Deməк, ictimai təsərrüfatda olan mal-qaranı, əsaslı fondları özəlləşdirsək, şübhəsiz ki, yararlı şəkildə özəlləşdirsək, icti-

mai sektor üçün ayrılan yem sahələrini özəl sektora münasib qaydada verə bilsək və onları müəyyən texnika ilə, ləvazimatla təmin edə bilsək, yaxşı kəndli təsərrüfatları yarada bilsək, heyvandarlıq sahəsində çox irəliyə gedə bilərik. Elə bunun özü Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə təmin edilməsi üçün böyük iş olacaqdır" [IIc.s.268].

"Axı" qüvvətləndirici ədatı Heydər Əliyev nitqində gah cümlənin başında, gah da axırında özünə yer tapır. Eləcə də "axı" qüvvətləndirici ədatı bəzən dəqiqləşdiricilik, bəzən də izahedicilik çalarları qazanır: "***Axı*** biz neft kəmərlərindən birini Rusiya ərazisindən keçiririk. Neft kəmərlərinin hamısını Rusiya ərazisi ilə çəkmək olmaz ***axı***. Bu, ümumiyyətlə, mümkün deyildir" [XIIc.s.72].

"Axı" ədatı Heydər Əliyev nitqində izahedici fikrin qüvvətlənməsinə yönəlir. Bu zaman "axı" ədatı gah cümlənin başında, gah da sonunda özünə yer tapır: "Dünən mənə sual verdilər, ruslar haqqında – 500 minə qədər rus var, ruslar sıxılıb indi, nə üçün? ***Axı*** bunlar əsrlərlə burada yaşayan adamlardır, bunlar Azərbaycanın vətəndaşıdırlar. Rus üçün, burada yaşayan, burada doğulmuş, dədəsi, babası burada doğulmuş, qəbri burada olan rus üçün bura vətəndir ***axı***" [Ic.s.75]. İki yerdə "axı" ədatı ilə böyük natiq Azərbaycan xalqının digər xalqlara olan yüksək səviyyədə tolerantlığını diqqətə çatdırır.

"Axı" ədatı mənəviyyatımızın qorunması məsələlərində Heydər Əliyevin nitqini bəzəyir. Bu zaman "axı" ədatı "lap" və "ən" qüvvətləndirici ədatlarla birgə nitqə xüsusi rövnəq verir: "***Axı*** qız niyə gərək orta məktəbə qızıl bilərziklə gəlsin? Dünyanın inkişaf etmiş ölkələrindəki, ***lap*** elə kapitalist ölkələindəki ***ən*** zəngin ailələrdə belə bir şey yoxdur" [XXIXc.s.331].

Təkcə bir cümlədə üç yerdə – "lap", "ən", "belə" qüvvətləndirici ədatların işlədilməsi Heydər Əliyevin nitqinin cazibədarlığından xəbər verir.

"Ən" qüvvətləndirici ədatı böyük natiqin dilində müstəqillik yolunda cihad etmək ədatıdır. Azərbaycanın ərazi bütövlüyünü "ən mühüm" problem hesab edir: "Azərbaycanın ***ən*** mühüm problemi erməni təcavüzündən xilas olmaqdır" [XIIc.s.67].

Milli-mənəvi dəyərlərimizin təbliğində "daha" ədatı böyük natiqin dilində tez-tez işlədilir: "Biz indi öz müstəqil dövlətimizdə, müstəqil ölkəmizdə öz tariximizi, öz milli-mənəvi dəyərlərimizi, ənənələrimizi sərbəst, ***daha*** doğru, ***daha*** düzgün qiymətləndirə bilirik və onları heç nədən çəkinmədən, qorxmadan təbliğ edə bilirik" [VIIIc.s.28].

Bu ədatla Heydər Əliyev sinonim cərgələrin – "sınmamaq, əyilməmək, dərdə dözümlü olmaq" – köməyilə fikrini təsdiqləyir. "Bəli" təsdiq ədatı bəzən də dəqiqləşdiricilik xüsusiyyəti qazanır: "Çünki bu bizim millətimizin xüsusiyyətidir – sınmamaq, əyilməmək, dərdə dözümlü olmaq. ***Bəli***, bizim millətimiz məğrur, cəsur, qəhrəman millətdir" [XXVIc.s.67].

Təsdiq ədatı olan "bəli"nin köməyi ilə Heydər Əliyev Azərbaycan xalqının dahi insanlar yetişdirməsini diqqətə çatdırır: "***Bəli***, xalıqmız ***elə*** xalqdır ki, tarixin hər bir mərhələsində böyük, dahi insanlar yetişdirir və biz bununla fəxr etməliyik. Biz kasıb xalq deyilik. Yəni biz intellekt cəhətdən kasıb deyilik. ***Bəli***, xalqımızın zəkası çox zəngindir" [VIIIc.s.335]. Biz burada "bəli" təsdiq ədatının arxasınca "elə" dəqiqləşdirici və qüvvətləndirici funksiyada olan ədatın birgə təsadüf olunmasının, eləcə də "bəli" ədatının təkrarının şahidi oluruq.

"Bəli" təsdiq ədatı ilə Heydər Əliyev Azərbaycanda müxtəlif sahələrdə qazanılmış nailiyyətləri təsdiqləyərək, bu nailiyyətləri inkar etməyə əsas vermir. Sanki "bəli" ədatı ilə şübhəli məqamlara son qoyur: "İngiltərədən, Edinburq Universitetindən gələn qonağımız, professor burada çıxış edərkən dedi ki, neçə ölkədə olubdur. O, inkişaf etmiş hansı ölkədə bu qədər yazıçı, bu qədər qurultay nümayəndəsi görübdür? Bu elə

boş yerdən əmələ gəlməyibdir. ***Bəli***, bunu o dövr, dövrün imkanları yaradıbdır. İnsanlar, bizim Azərbaycan yazıçıları, şairləri də öz istedadlarına, aldıqları təhsilə və bu sənətə sadiqliklərinə görə bu yolu seçiblər, yazıçılıqla məşğuldurlar və böyük işlər görüblər” [XIIIc.s.101].

1990-cı il 20 Yanvarla bağlı çıxışlarında Heydər Əliyev nitqi ədatlarla zənginləşir, ədatlar bir-birini əvəz edir, auditoriyanı da emosionallığa yükləyir:

“Amma ondan yarım il, yaxud yeddi-səkkiz ay sonra Azərbaycanın başına bundan on qat artıq bəla gəldi. Nə etdiniz? Bizdən, xalqımızdan üzr istədilərmi?

***Yox***! Buna qiymət verildi? ***Yox***! Həmin o yanvarın 24-25-də keçirilən plenumda, – indi vəzifədə olan bəzi adamlar da var, deyirlər ki, biz nə edəcəkdik? – ***Görün***, nə edərdiniz. O vaxt Kommunist Partiyasının Mərkəzi Komitəsi ***ən*** yüksək, hakim dövlət strukturu idi. Sessiyada qəbul olunmuş qərarı təsdiq edəydiniz, təkrar edəydiniz – əgər bundan artığına gücünüz, yaxud qüdrətiniz çatmırdısa” [VIIIc.s.378]. Yuxarıdakı nitq parçasında ritorik suallarla 20 Yanvar faciəsini törədənlərə müraciət olunur, “yox” inkar ədatı ilə suallara cavab verilir, “görün” əmr ədatı ilə məmurlara nə etməli olduqları anladılır.

Heydər Əliyevin nitqində fəlsəfədəki ziddiyyətlər qanununa zidd gedənlərə “yox” ədatı ilə cavab var: “Mənəviyyat ən yüksək insani keyfiyyətdir. İnsanlar mənəviyyatı əsrlər boyu qoruyub saxlayıblar. Bu heç də o demək deyil ki, keçmiş zamanlarda hamı yüksək mənəviyyata malik olub, amma mənəviyyatsızlar olmayıbdır. ***Yox***! İnsan cəmiyyəti belədir ki, mənəviyyatlı ilə mənəviyyatsız arasında daim mübarizə gedir” [XXVIIIc.s.207].

“Yox” inkar ədatı ilə xalqı düşündürən problemlərə aydınlıq gətirilir. 19 dekabr 2000-ci ildə Mirmövsüm Ağanın ziyarətgahındakı nitq bu qəbildəndir: “İndi, həyatımızın bu ke-

çid dövründə maddi cəhətdən çətinliklər vardır. Bunu siz də bilirsiniz, biz də bilirik. Onlar var. Ona görə yox ki, biz bu maddi çətinliklərin aradan qaldırılması ilə məşğul deyilik, yaxud da bunlara biganəyik. ***Yox***. Ona görə ki, müstəqil olduq, milli azadlığa çıxdıq" [XXXIc.s.245].

"Yox" ədatı ilə böyük natiq arxayınçılığa, süstlüyə, ətalətə sanki yox deyir: "Mən ümidvaram ki, özəlləşdirmə, iqtisadi islahatların, torpaq islahatının həyata keçirilməsi, xüsusən, kənd təsərrüfatı məhsullarının artırılmasına gətirib çıxaracaqdır və biz 1997-ci ildə bunların müsbət nəticələrini görəcəyik. Ancaq bu o demək deyildir ki, bunlar hamısı asanlıqla əldə olunacaqdır. ***Yox***, qarşıda hələ görüləsi işlər olduqca çoxdur. Gərgin iş görülməlidir və bu sahədə Nazirlər Kabinetinin üzərinə çox böyük vəzifələr düşür" [VIIIc.s.83].

Vətən və torpaq məsələlərində xalqla prezidentin birliyi məsələsini "yox" ədatının köməyi ilə ortaya qoyur. Taleyüklü məsələlərdə prezident və hər bir vətəndaşın eyni borcu daşıdıqlarını auditoriyaya çatdırır. "Yox" inkar ədatı hər kəsin borcunun nədən ibarət olduğunu auditoriyaya bəyan edir: "Ancaq torpaqlarımızın geri qaytarılmasına nail ola bilməmişik, qaçqınların geri dönməsini təmin edə bilməmişik, respublikamızın ərazi bütövlüyünə nail ola bilməmişik. Bunu etmək bizim borcumuzdur, hamımızın borcudur. Heç kəs düşünməsin ki, bu, ancaq prezidentin borcudur, qalanları isə orada-burada gəzməlidir. ***Yox***, bu, Vətəninə sədaqətlə yanaşan hər bir vətəndaşın borcudur" [IIIc.s.71].

Müstəqillik və azadlıq yolunda hansı prinsipi tutmağımızı Heydər Əliyev "məhz" ədatı ilə dəqiqləşdirir: "Odur ki, biz öz müstəqilliyimizi və azadlığımızı heç vaxt və heç kimə, heç bir ölkəyə, heç bir dövlətə güzəştə getməyəcəyik. Biz bütün ölkələrlə münasibətləri də ***məhz*** bu prinsipi əsas tutaraq qururuq" [XIIc.s.73].

“Məhz” dəqiqləşdirici ədatı atəşkəs haqqında fikirləri dəqiqləşdirir: “Bildiyiniz kimi, iki il yarımdan çoxdur ki, biz atəşi dayandırmışıq. Artıq qan tökülmür, övladlarımız tələf olmur. Sülh şəraiti yaratmışıq. Bunu da ***məhz*** ona görə yaratmışıq ki, məsələlərin sülh yolu ilə həll edilməsinə nail olaq” [VIIIc.s.157].

“Məhz” ədatı böyük natiqin dilində iqtisadi böhrandan çıxmaq yollarını dəqiqləşdirmək məqsədi güdür: “Bilirsiniz ki, Azərbaycan iqtisadiyyatı ağır böhran içərisindədir. Neft sənayesində də böyük çətinliklər yaranmışdır. ***Məhz*** bu böhrandan çıxmaq, Azərbaycan iqtisadiyyatını inkişaf etdirmək, xalqımızın rifahını qısa müddətdə lazımi səviyyəyə qaldırmaq üçün hamı əl-ələ verib müqavilənin həyata keçirilməsinə çalışmalıdır” [IIc.s.260].

Heydər Əliyevin nitqində “məhz” ədatı Azərbaycan təqvimində görkəmli yer tutan günləri dəqiqləşdirir. 18 sentyabr 1994-cü ildə Niyazinin ev-muzeyinin təntənəli açılışındakı çıxışdakı kimi: “Əsla təsadüfi deyildir ki, ***məhz*** bu gün-Azərbaycanın təqviminə həkk olunmuş musiqi bayramı günü böyük bəstəkar, dahi dirijor, Azərbaycan xalqının böyük mədəniyyət xadimi, respublikamızın görkəmli ictimai xadimi Niyazinin ev-muzeyi açılır” [IIc.s.247].

Polşa ticarət palatasında 27 avqust 1997-ci ildəki görüşdə Avrasiya nəqliyyat dəhlizinin “Polşa üçün, Polşa biznesi, Polşa sahibkarları üçün” maraq doğurmasını dəqiqləşdirir. Məhz dəqiqləşdirici ədatı burada “zənnimcə” modal sözü ilə qüvvətlənir: “Bölgəmizdə Avrasiya nəqliyyat dəhlizi yaradılmışdır. O, Sərq ilə Qərb arasında qədim İpək yolunun marşrutu üzrə Mərkəzi Asiya bölgəsini Avropa ilə Xəzər dənizi, Azərbaycan vasitəsilə birləşdirir. Bu, ***məhz*** elə bir sahədir ki, o Polşa üçün, Polşa biznesi, Polşa sahibkarları üçün maraq doğura bilər. Azərbaycanda neft və qaz sahəsində iri kimya sə-

nayesi kompleksi var. ***Zənnimcə***, biz bu sahədə də əməkdaşlıq edə bilərik” [XIIc.s.51].

Dəqiqləşdirici ədat “məhz” Heydər Əliyevin müqavilə və sazişlərin hansı məqsədlə bağlandığının xalqa çatdırılması yolunda istifadə etdiyi ədatdır. 20 avqust 1997-ci ildə “Azəriqızıl” dövlət şirkəti ilə Amerikanın “R.V.İnvestment qrup servisis LLS” şirkəti arasında bağlanan saziş haqqında fikir bu qəbildəndir: “Bildirmək istəyirəm ki, iqtisadiyyat sahəsində indiyədək gördüyümüz işlər, həyata keçirdiyimiz tədbirlər, atdığımız addımlar və imzaladığımız müqavilələr Azərbaycanın iqtisadiyyatını inkişaf etdirmək və Azərbaycan Respublikası əhalisinin, vətəndaşlarının rifah halını yaxşılaşdırmaq üçün edilibdir. Bu saziş də ***məhz*** həmin məqsədi daşıyır” [XIIc.s.15].

Elə həmin müqavilənin bağlanmasının kimə xidmət etməsi, eləcə də bu müqavilənin tarixi addım olması dəqiqləşdirilir: “Biz Allahın, taleyin Azərbaycan xalqına bəxş etdiyi bu sərvətləri indi məhz xalqın rifah halını yaxşılaşdırmaq, xalqa təqdim etmək üçün işə başlayırıq. Bu, tarixi hadisədir. Bu gün iftixar hissi ilə deyə bilərik ki, bu tarixi addımı ***məhz*** indi, müstəqil Azərbaycanda biz atırıq” [XIIc.s.17].

Heydər Əliyevin nitqində xüsusi yer tutan dəqiqləşdirici ədat “məhz” xüsusi tədqiqat obyekti olmağa layiq ədatdır. Bu ədatın köməyi ilə müxtəlif çeşidli auditoriyalarda böyük natiq fikrini dəqiqləşdirir. Müslüm Maqomayevə ünvanlanan təbrikdə onun “ifası üçün yazılmış çoxlu mahnının yaranması” dəqiqləşdirilir: “Güclü səsiniz, coşğun temperamentiniz və yüksək vokal mədəniyyətiniz, üstəlik daim təkmilləşməyə can atmağınız sizi sönməz ulduza çevirmişdir. Çoxcəhətli istedadınız sayəsində siz hər mahnıya təkraredilməz rövnəq verirsiniz, onun ifasını bir aktyorun teatrına çevirirsiniz. ***Məhz*** bu məziyyət xüsusi olaraq sizin ifanız üçün yazılmış çoxlu mahnının yaranmasına səbəb olmuşdur” [XIIc.s.5].

Elə həmin təbrikdə Azərbaycanın xalq artisti Müslüm Maqomayevin "musiqi sənətinin canlı əfsanəsi" olması dəqiqləşdirilir: "Layiq görüldüyünüz çoxsaylı təltiflər və mükafatlar arasında ən qiymətlisi, şübhəsiz ki, Azərbaycan xalqının məhəbbətidir. ***Məhz*** bu məhəbbət sizi musiqi sənətinin canlı əfsanəsi etmişdir" [XIIc.s.6]. Heydər Əliyevin nitqində "məhz" dəqiqləşdirici ədatı "şübhəsiz ki" modal sözü ilə birgə işlənir ki, bu da dəqiqləşmiş ifadələrə dinləyicilər arasında şübhə yeri qoymur. Bu ədat böyük natiqin dilində məkanı müəyyənləşdirir: "Məlum olduğu kimi, Orta Asiyanın bir çox alimləri vaxtı ilə burada, Bakıda, ***məhz*** bu universitetdə təhsil almışlar".

Elə ədatı bəzən qüvvətləndirici, bəzən də dəqiqləşdirici funksiya daşıyır: "Şübhəsiz, dünyada ***elə*** bir əmin-amanlıq dövrü gələcək ki, bəlkə də sərhədləri qorumaq lazım olmayacaqdır. İnsanlar ***elə*** bir səviyyəyə gəlib çatacaqlar, dövlətlərarası münasibətlər ***elə*** bir yüksək, sivilizasiyalı səviyyəyə gəlib çatacaqdır ki, bəlkə bunlara ehtiyac olmayacaqdır" [VIIIc.s.197].

Bu ədat böyük natiqin nitqində həm dəqiqləşdirici, həm də dəqiqliyi qüvvətləndirici funksiya daşıyır. "Elə" ədatı Heydər Əliyev nitqində zamanı dəqiqləşdirməyə xidmət edir: "Burada ən qədim tariximizdən" – "Dədə Qorqud" dastanından da bir epizod göstərildi. ***Elə*** o vaxt da, ondan sonrakı illərdə və əsrlərdə də xalqımız müxtəlif çətinliklərdən, bəlalardan uğurla keçərək öz istedadını həmişə göstərmişdir" [XXXIc.s.173].

Auditoriyada dinləyicilərin diqqətini müəyyən hadisələrə, məsələlərə cəlb etmək mənalarını yaradan "bax" ədatını Heydər Əliyev müxtəlif çeşidli auditoriyalarda işlədir. Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədə şairin yaradıcılığını dinləyicilərə bu ədatın köməyi ilə çatdırır: "Səməd Vurğunun bütün əsərləri Vətənə məhəbbətlə, Azərbaycana, xalqımızın dilinə, milli ənənələrinə məhəbbətlə doludur. Səməd Vurğunun şəxsiyyətini ifadə edən, onun əsərlərinin əsas mənası və məzmunu ***bax*** budur" [IXc.s.20].

Heydər Əliyevin nitqində "məhz" ədatı ilə dəqiqləşdirilən fikirlər "bax" ədatının köməyi ilə auditoriyanın diqqətini özünə cəlb edir: "***Məhz*** Səməd Vurğunun şeirləri, poemaları, pyesləri, dramları – hamısı birlikdə xalqımızı xırda-xırda bu yüksək səviyyəyə çıxarıbdır. Səməd Vurğunun yaradıcılığının əsas xüsusiyyətləri ***bax***, budur. ***Məhz*** buna görə Səməd Vurğun qiymətlidir" [IXc.s.21].

Bu ədatla Heydər Əliyev dövlət strukturlarını ciddiyyətə səsləyir, onlara öz məsuliyyətlərini xatırladır. Bu məsuliyyəti xatırlatmaq "daha da" qüvvətləndirici ədatı, "dərk etsinlər" felinin əmr şəkli ilə gücləndirilir: "Nazirlər Kabineti ***bax***, bu işlərlə ciddi məşğul olmalıdır. Tək bu işlə deyil, Nazirlər Kabinetinin qarşısında çox vəzifələr durur. Yenə də deyirəm, bu gün mənim məqsədim bu barədə geniş danışmaqdan ibarət deyil. Biz bu barədə artıq danışmışıq və təkrar etməyin əhəmiyyəti yoxdur. Mən sadəcə bir neçə məqamı yada salıram ki, Nazirlər Kabinetinin məsuliyyətini bir daha xatırladım, Nazirlər Kabineti, onun rəhbərliyi – baş nazir, onun müavinləri, Nazirlər Kabinetinin aparatı üzərilərinə düşən məsuliyyəti ***daha da*** ciddi dərk etsinlər" [VIIIc.s.85].

"Bax" ədatı Heydər Əliyevin nitqində auditoriyanın diqqətini müəyyən hadisələrə cəlb etmək üçündür: "Mən iyulda Madriddə Avroatlantika Tərəfdaşlıq Şurası İttifaqının iclasında iştirak etdim və orada Polşa, Çexiya və Macarıstanın NATO-ya qəbul olunmasını alqışladım. ***Bax***, bizim yolumuz budur, bu yol haqq-ədalət və öz milli mənafelərimizin müdafiə edilməsi yoludur" [XIIc.s.73].

Əmr ədatları Heydər Əliyev nitqində qətiyyətli dövlət başçısının nitqi kimi səslənir. "Bax" ədatı vasitəsilə xalqı ekoloji mədəniyyətə səsləyir, vətəndaşları bu məsələlərdə dövlətlə bir olmağa çağırır: "Ancaq əgər hər bir vətəndaş, hər bir Bakı sakini öz evinin ətrafında, yaşadığı binada təmizlik işləri aparsa və buna nail olsa, ərazini yaşıllaşdırsa, öz binasını gözəl-

ləşdirsə, bilin ki, bu bizim hakimiyyət orqanlarına da kömək olacaqdır. Ancaq bunun nəticəsi xalq üçün, sizin üçün və vətəndaşlar üçün olacaqdır. Mən sizi ***bax***, bu yola dəvət edirəm" [XXVIIc.s.10].

"Bax" ədatı dinləyicilərdə poetik bir ovqat yarada bilir. Səməd Vurğun haqqında xatirələrini dilə gətirən Heydər Əliyev sonda "bax" ədatının köməyi ilə auditoriyanı Vurğunlu illərə qaytara, keçmiş nəsili bugünkü nəsilə tanıda bilir: "Burada şəxsi xatirələr də söylənildi. Mənim də şəxsi xatirələrim vardır. Biz gənclər vaxtilə Səməd Vurğunu sadəcə olaraq görməkdən özümüzü xoşbəxt hesab edirdik. Biz özümüzü xoşbəxt hesab edirdik ki, Səməd Vurğunu haradasa gördük, dinlədik, eşitdik. Biz o illərdə ***bax***, belə yaşamışdıq" [IXc.s.22].

Böyük natiqin dilində "qoy" əmr ədatı insanları qətiyyətə səsləyir. Siyasi plüralizm məsələlərini önə çəkir. Xüsusilə müstəqilliyin ilk illərində belə səfərbəredici, qətiyyətə çağıran nitqlərə xüsusi ehtiyac duyulur: "Əgər bu iqtisadi islahatların keçirilməsinə kiminsə ciddi dəlillərlə etirazı varsa, onu *desin*. ***Qoy*** heç kəs *çəkinməsin*. Kim islahatların əleyhinə çıxış etmək istəyirsə, buna etiraz etmək istəyirsə, konkret sübutları, faktları varsa, ***buyursun***" [IIIc.s.56-57].

Əmr ədatları felin əmr şəkli ilə vəhdətdə verilir. Yuxarıdakı sitatda "desin", "çəkinməsin", "buyursun" fel formaları uğurla işlədilir. Heydər Əliyev nitqində "qoy" əmr ədatı qətiyyətli mövqe tutma məqamlarında işlənir. Bu zaman əmr ədatı "qoy" şərt bildirən "əgər" bağlayıcısı ilə birgə işlənir: "***Əgər*** Rusiyanın buraya qoymağa milyardlarla sərmayəsi varsa, ***qoy*** gətirib qoysun və öz mənfəətini götürsün. Ancaq indi Rusiyanın belə imkanlarının olmaması o demək deyil ki, biz dünyanın başqa ölkələri ilə iş görməməliyik" [XIIc.s.71].

Sual ədatları ilə auditoriyada ritorik suallarla çıxış edən böyük natiq inkar ədatı "yox" un köməyi ilə tarix fəlsəfəsinin "tarixi qaralamaq olmaz", "tarixi təhrif etmək olmaz" müd-

dəaları ilə çıxış edir. Bu zaman sual və inkar ədatları bir-birini əvəzləyir: "Görürsünüz ki, Niyazinin bütün həyatı, bütün yaradıcılığı Sovet İttifaqında olmuşdur. İndi biz bunu danmalı, buna qaramı yaxmalıyıq? Yoxsa, biz bunu pozmalıyıq***mı***, dağıtmalıyıq***mı***? ***Yox***, əsla, yox! Bu musiqimizin inkişaf, hətta intibah dövrüdür. Biz bunu etiraf etməliyik" [IIc.s.249].

Klassiklərimizin əsərlərində "-mı, -mi, -mu, -mü" ədatlarından istifadə və bu zaman Heydər Əliyevin nitqləri ilə aparılan paralellər bir daha dilimizin əsrlərin sınaqlarına sinə gərən bir dil olduğuna sübutdur. Nəsimi yaradıcılığında ədat köməkçi nitq hissəsinin tədqiqi[1] bu sıradandır:

*Yüzündür gülistan, billah, degil**mi**?*
*Sözündür gün-fəkan, billah, degil**mi?***
*Saçındandır Xətavü Çinü Rumə,*
*Səba ənbərəfşan, billah, degil**mi**?*[2]

"Bəs" sual ədatının köməyi ilə Heydər Əliyev auditoriyanı səfərbər edir, auditoriya ritorik suala veriləcək cavabı səbirsizliklə gözləyir. 7 sentyabr 2000-ci ildə, Nyu-Yorkda minilliyin zirvə görüşündəki çıxışda biz bunun şahidi oluruq: "***Bəs*** qarşıdan gələn yüzillikdə dünya necə olacaqdır? İki sistemin qarşıdurmasının tarixə qovuşması, demokratiya və sərbəst bazar ideyalarının üstünlük qazanıb yayılması elə bir dünyanın qurulmasına kömək etməlidir ki, orada bütün dövlətlərin mənafeləri nəzərə alınacaq və həqiqətən bərabər hüquqlu tərəfdaşlıq sahmana salınacaqdır" [XXXc.s.11].

---

[1] Mehdiyeva Sevil. Nəsimi "Divan"ında köməkçi nitq hissələri və köməkçi adlar. AMEA Humanitar və ictimai elmlər seriyası, 2002. №1-2, səh. 127-137
[2] Nəsimi. Seçilmiş əsərləri, Bakı, 1973. I, II, III cild

Heydər Əliyevin nitqində "gəl", "gəlin", "gəlsən", "gəlsəniz", "gələsən", "gələsiniz", "gəlsənə" ədatları içərisində ən çox "gəlin" ədatına təsadüf edilir.

"Gəlin" əmr ədatı ilə ulu öndər sanki xalqını müxtəlif məsələlərin həllində yanına çağırır, məsələləri xalqla birgə yoluna qoyur. "Gəlin" əmr ədatı nəzərləri gələcək üfüqlərə zillənən, irəliyə baxan, xırda məsələlərə baş qoşmayan bir lider nitqindən xəbər verir: "Bunlar xırda məsələlərdir. ***Gəlin***, vaxtımızı bunlara sərf etməyək. ***Gəlin***, vaxtımızı ona sərf edək ki, bundan sonra nə edək? İndiyədək nə olub, hamısı geridə qalıb. Yenə də deyirəm, keçənə güzəşt etmək lazımdır, irəliyə baxmaq lazımdır" [XIIIc.s.20-21].

"Gəlin" əmr ədatı Heydər Əliyev nitqində elmimizin inkişafına yönəlir: "Ancaq bizdə gənc nəsil, gənc alimlər də var. ***Gəlin***, gənc alimlərlə bir görüş, toplantı keçirək, onları dinləyək, onların problemləri ilə daha da yaxından tanış olaq, onlara kömək edək. Bizim elmimiz inkişaf etməlidir. Elmimizi gənclər, siz inkişaf etdirəcəksiniz" [VIIIc.s.393].

"Gəlin" əmr ədatı Heydər Əliyevin nitqində səmimiyyət məqamlarında, xalqı səfərbər etmək, birləşdirmək məqamlarında daha çox yer alır. Cümlədə bu əmr ədatı bəzən dalbadal gəlir: "***Gəlin***, bu gün səmimi olaq, gəlin bu gün açıq olaq, heç kəs heç kəsdən çəkinməsin, kimin nə sözü var desin, kimin ürəyində nə var desin, hamısını çıxaraq, ataq ortaya, danışaq. Azərbaycanlı kimi hamımız bu məsələni bərabər həll edək" [Ic.s.76].

Yenə də "gəlin" əmr ədatı rüşvətxorluq kimi cəmiyyətə yad olan elementlərə qarşı mübarizədə işlədilir: "***Gəlin***, açıq danışaq. Mən bütün həyatım boyu rüşvətxorluğa qarşı mübarizə aparmışam və bundan sonra da aparacağam" [Ic.s.255].

"Gəlin" ədatının köməyilə Heydər Əliyev auditoriyanı özü ilə həmrəyliyə səsləyir, tarixə auditoriya ilə birgə nəzər salır: "Ancaq ***gəlin***, tarixə nəzər salaq, mən də azərbaycanlı-

yam, Azərbaycanda yaşamışam, həyatımın əksər hissəsi Azərbaycanda keçib. Siz bilirsiniz ki, 14 ilə yaxın Azərbaycana rəhbərlik eləmişəm" [Ic.s.74].

"Görün" əmr ədatı böyük natiqin dilində auditoriyanın diqqətini müəyyən bir məsələyə cəlb etmək məqsədi daşıyır. "Görün" ədatının arxasınca böyük natiqin ritorik sualları sıralanır. Ritorik suallara "bəli" təsdiq ədatı ilə cavab verilir. Cavab verilən məsələ "gəlin" ədatı ilə auditoriyanı çıxışa qoşa bilir: "Amma ***görün*** burada nələr danışdılar. ***Görün*** nə qədər adamı, vəzifəli adamları qanunsuz-filansız tutublar, aparıblar, dustaq saxlayıblar, gizlədiblər. Bu nə dəhşətli şeydir?! Biz buna necə laqeyd qala bilərik? Yaxud necə deyə bilərik ki, burada təəccüblü heç nə yoxdur? Necə ola bilər bu? Mənim fikrim belədir. Qiymətim də budur. Burada dedilər, mən yenə də qeyd edirəm: ***Bəli***, həmin zonada, həmin bölgədə sosial-iqtisadi problemlər var. Ancaq ***gəlin***, fikirləşək: Azərbaycanın hansı zonasında sosial-iqtisadi problemlər yoxdur? Dedilər Lənkəranda işsizlər var. Azərbaycanın hansı zonasında işsizlər yoxdur?" [Ic.s.78].

"Ki" ədatı böyük natiqin dilində qüvvətləndirici funksiyadadır: "700 il Osmanlı imperatorluğu olubdur, bu dövlət olubdur. Özü də dünyanın bir çox hissəsini əlində saxlayıbdır. Neçə-neçə müharibələr, döyüşlər aparıbdır. Rusiya və başqa imperiyalarla döyüşlər, müharibələr aparıbdır, qalib olubdur. Həmin torpaqları da asanlıqla əlinə keçirməmişdi ***ki***" [XIIIc.s.55].

"Ki" ədatı böyük natiqin dilində həm də təsdiqləyici funksiya daşıyır: "İndi görürsünüz açıldı ***ki***. Yəni nə qədər də çətinliklər də olsa, belə bir muzey açmaq çətin bir şey deyildir" [IIIc.s.74]. Cəlil Məmmədquluzadənin ev-muzeyinin açılmasının gecikməsi və nəhayət açılması ilə bağlı söhbətdə "ki" ədatı yerindəcə çox gözəl işlənir.

Qüvvətləndirici "belə" ədatı da Heydər Əliyev nitqində özünə yer alır: "Biz fəxr edirik ki, xalqımız ***belə*** qədim, zəngin mədəniyyətə malikdir" [VIIIc.s.29].

Heydər Əliyev nitqinin cazibədarlığı ondadır ki, bu nitq söyləndiyi auditoriyadan asılı olmayaraq zənginliyi ilə seçilir. 22 sentyabr 1994-cü ildə Prezident sarayında kənd təsərrüfatı işlərinin gedişinə həsr olunmuş müşavirədə də nitq ədatlarla bəzənir: "Mənə məlumat verdilər ki, istənilən qədər toxum var. Çatışmayan 20 min ton toxumu almaq üçün də biz vaxtilə vəsait ayırdıq, – prezidentə məlumat verildi ki, dünən bu barədə qərar qəbul edilmişdir. ***Axı*** bu qərarın qəbul edilməsi barədə biz 15-20 gün bundan qabaq söhbət etmişik və göstəriş də vermişik. ***Bəs*** bu qərar nə üçün gecikib və niyə dünən qəbul olunub? Məsələni süründürmək, gecikdirmək nəyə lazımdır? Biriniz deyirsiniz ki, müqavilə yoxdur, o biriniz deyirsiniz ki, müqavilə var. Çatışmayan cəhətlər olubsa, bunları həll edin. ***Axı*** toxum lazımdır. Əkin getməlidir" [IIc.s.272].

Bir sıra hallarda "bəs" sual ədatının köməyi ilə auditoriyaya ritorik sualla müraciət edən böyük natiq "bax" əmr ədatını təkrar etməklə qətiyyətli cavab nümunəsi yaradır. "Nezavisimaya qazeta"nın müxbirinə müsahibədə olduğu kimi:

"– Yaxın vaxtlarda Azərbaycanda vəziyyət necə olacaq?

– Mən belə hesab edirəm ki, biz iqtisadi mənada bazara deyil, olsa-olsa adi bazara malikik, o da ki, çox bəsitdir. ***Bəs*** bu adi bazarı iqtisadi bazara necə çevirməli? ***Bax***, məsələ də bundadır. ***Bax***, burada yada salmaq lazımdır ki, bazar iqtisadiyyatının və əmək bazarlarının infrastrukturlarını, texnologiyaları, vergi sistemlərini ardıcıl surətdə yaratmaq və bir çox digər məsələləri yoluna qoymaq lazımdır" [Ic.s.122-123]. Qüvvətləndirici ədatlara siyasi natiqin çıxışlarında, xüsusilə ikitərəfli dövlət səviyyəli danışıqlarda daha çox təsadüf olunur. İstanbulun Atatürk hava limanında rəsmi qarşılanma mərasimindən sonra jurnalistlər qarşısında bəyanatdakı kimi: "Əziz

Süleyman bəy! Sizinlə bir daha görüşmək, bir çox məsələlər haqqında fikir mübadiləsi aparmaq, məsləhətləşmək bizim üçün çox vacibdir və bu imkana görə Sizə təşəkkür edirəm.

Əmin olduğumu bildirmək istəyirəm ki, indiki qısamüddətli işgüzar səfər zamanı keçiriləcək görüşlər, danışıqlar iki ölkə arasında əlaqələrin ***daha da*** inkişafına kömək edəcəkdir. Altı ildən bəri davam edən müharibə Azərbaycan üçün ***ən*** böyük problem olaraq qalır. Ermənistanla Azərbaycan arasında müharibə, Ermənistanın Azərbaycana təcavüz etməsi Qafqaz bölgəsində vəziyyəti ***daha*** çox gərginləşdirir və bu ağır vəziyyət qonşu dövlətlərə də təsir edir. Mən əminəm ki, bugünkü danışıqlarda ***da*** həmin məsələlər və iki qardaş ölkə arasında əməkdaşlığın ***daha da*** möhkəmləndirilməsi ilə əlaqədar digər məsələlər hərtərəfli müzakirə olunacaqdır. Mən dəvəti ***məhz*** bunun üçün qəbul edib İstanbula gəlmişəm. İnanıram ki, görüşlərimiz xalqlarımız üçün çox faydalı olacaqdır” [IIc.s.17-18].

Yuxarıdakı nitq parçasından qüvvətləndirici ədatları çıxarmış olsaq qarşıya qoyulan problemlər və onların həlli yolları sönük görünə bilər ki, bu da Heydər Əliyev nitqi üçün uyğun sayılmaz. “Əlaqələrin daha da inkişafı”, ”Azərbaycan üçün ən böyük problem”, “Qafqazda vəziyyətin daha çox gərginləşməsi”, “iki qardaş ölkə arasında əməkdaşlığın daha da möhkəmlənməsi” kimi səslənən ifadələrin qüvvətləndirici ədatlarla çulğalaşması zəngin, ecazkar nitqdən xəbər verir. Azərbaycan Respublikası prezidentinin vəzifələrini həyata keçirən Respublika Ali Sovetinin sədri Heydər Əliyevin mətbuat konfransında bəyanatı (10 sentyabr 1993-cü il) “belə” ədatı ilə zəngindir: “Mən dedim ki, həmin dövlətlər tərəfindən ***belə*** yardım, ***belə*** təşəbbüs yoxdur. Hər halda biz başqa ölkələrdən hələ ***belə*** yardım almamışıq. Lakin əgər ***belə*** təşəbbüs olarsa, biz onu məmnuniyyətlə qəbul edirik” [Ic.s.37].

Heydər Əliyevin nitqində ədatlar auditoriyada fəlsəfi dünyagörüş yaradır. Türkiyə parlamentində dahi Azərbaycan şairi

Məhəmməd Füzulini anma mərasimindəki çıxış bu sıradandır: “Füzuli 500 il bundan qabaq da nurlu bir ulduz kimi parlayıbdır, dünyaya öz şüalarını yayıbdır. Füzuli ***təkcə*** Şərqdə yox, müsəlman aləmində, türk dünyasında yox, bütün dünyada, o cümlədən inkişaf etmiş Qərb ölkələrində çox məşhur olmuşdur. ***Amma*** Azərbaycan xalqı üçün, bizim üçün Füzuli ***daha*** əziz olmuş, sevilmiş, son əsrdə xüsusilə yüksək zirvələrə qaldırılmışdır. Bu gün çox böyük iftixar hissi ilə deyə bilərik ki, Füzuliyə bizim Azərbaycan xalqının, Azərbaycan alimlərinin verdiyi qiymət, onun əsərlərindən daim bəhrələnmələri xalqımızın öz kökünə, adət-ənənəsinə, öz keçmişinə, öz tarixinə, dininə, dilinə nə qədər sadiq qalmasını sübut edir” [IIc.s.478]. Yuxarıdakı nitq parçasında böyük natiq “təkcə” məhdudlaşdırıcı ədatı ilə Füzulinin Şərqə, müsəlman aləminə, türk dünyasına sığmadığını, onun dünya şöhrətli şair olduğunu vurğulayır “amma” qarşılaşdırma bağlayıcısı, “daha” qüvvətləndirici ədatının köməyi ilə Füzulini yenidən özümüzə – Azərbaycan xalqına qaytarır, bütöv və hissə fəlsəfəsini poetik bir dillə dinləyicilərə aşılayır.

“Bəli” təsdiq ədatı həlli müşkül görünən məsələlərin çözülməsi məqamlarında Heydər Əliyev tərəfindən işlədilir. Bu zaman auditoriya məsələnin ciddiliyini sanki yenidən qəbul edir: “***Bəli***, mən çalışdım, özü də var qüvvəmlə çalışdım, nəticədə münaqişəni sülh yolu ilə aradan qaldırmağa müvəffəq olduq. İndi bu problem daha mövcud deyildir.

Sizi əmin edirəm ki, Afiyəddin Cəlilovun, Şəmsi Rəhimovun həyatlarına qəsd edən canilər də tapılacaq və cəzasını alacaqlar. Bu, bütün terrorçulara xəbərdarlıqdır. ***Qoy*** onlar bilsinlər ki, bu dəhşətli cinayətlər ayrı-ayrı şəxslərin həyatına deyil, müstəqil Azərbaycana qarşı yönəldilmiş xəyanətdir. Bu xəyanətlərə əl atanlara ar olsun” [IIc.s.366-367].

Heydər Əliyev ictimai-siyasi hadisələrin əsil mahiyyətini açmaq məqamlarında “məhz belə qiymətləndirirəm” ifadələ-

rindən istifadə edir: “Əvvəlki hadisələr kimi, bu son hadisə də Azərbaycanda daxili sabitliyi pozmaq, dövlət çevrilişi etmək cəhdidir. Mən bunu ***məhz*** belə qiymətləndirirəm. Bildiyimiz kimi, son aylar ərzində ictimaiyyət arasında da, cəmiyyətdə də çox danışıqlar, söz-söhbətlər gedir, mətbuatda da yazılır, ayrı-ayrı ölkələrin kütləvi informasiya vasitələrində qızışdırıcı məqalələr verilirdi ki, dövlət çevrilişi hazırlanır, dövlət çevrilişi olacaqdır və s. və i.a. Mən bütün bu söz-söhbətləri, məqalələri həmişə çox soyuqqanlılıqla qarşılayırdım. ***Elə*** bu gün də sizinlə çox soyuqqanlı, təmkinlə danışıram. Çünki mən Azərbaycan xalqının iradəsinə arxayınam. Çünki mən müstəqil Azərbaycan dövlətinin qüdrətinə arxayınam” [IIc.s.338-339].

Beləliklə, Heydər Əliyevin nitqində ədatların tədqiqi aşağıdakı nəticələrə gəlməyə əsas verir:

– Ədatların əsas nitq hissələri və digər nitq elementləri ilə vəhdətdə öyrənilməsi vacibdir;

– Ədatların öyrənilməsi müasir Azərbaycan dilinin zənginləşməsində Heydər Əliyevin rolunu bir daha nümayiş etdirir;

– Heydər Əliyevin müxtəlif (elmi, publisistik, məişət, dini) üslublu, eləcə də dinləyicilərin tərkibi baxımından müxtəlif növ auditoriyalardakı nitqlərində ədatların işlənməsini öyrənmək zərurəti ortaya çıxır;

Aparılan elmi-tədqiqat işi Heydər Əliyevin nitqində aşağıdakı sistemləşdirməni aşkara çıxarır:

– qüvvətləndirici ədatlar çıxışda ana fikrin, əsas fikrin auditoriyalara çatdırılmasında, gərgin ictimai-siyasi proseslərdə, ölkə həyatının böhranlı anlarında daha çox istifadə olunur;

– dəqiqləşdirici ədatlar Heydər Əliyevin nitqindəki izahedicilik məziyyətindən kənarda qalmır. Bu ədatlar müxtəlif növ auditoriyalarda, gah elmimizdə, gah tariximizdə, gah ölkəiçi münasibətlərin, gah da dünya miqyaslı incə problemlərin çözülməsində səslənir;

– sual ədatları nitqin polemik səciyyə daşımasını təmin edir, nitq prosesinə bütün dinləyiciləri qoşa bilir;

– təsdiq və inkar ədatları güclü iradə sahibi olan Heydər Əliyev şəxsiyyətinin nitqdə qarşıya qoyulan məsələlərə birmənalı fikrini ortaya qoyur;

Heydər Əliyevin nitqində ədatların ayrı-ayrılıqda, eləcə də bir-biriylə qarşılıqlı əlaqədə öyrənilməsi gələcəkdə dilçi alimlərimizin qarşısında duran mühüm tədqiqat işidir.

## 2.4. Heydər Əliyev nitqində modal sözlər

Modal sözlərin əsas vəzifəsi modallığı müxtəlif tərzdə ifadə etməkdən ibarətdir. Modallıq isə müxtəlif bir iş, hadisə, əşya, əlamət və keyfiyyət haqqında verilən hökmün gerçəkliyini, həqiqiliyini ya təsdiq, ya da inkar edən, söylənilən fikirlə bağlı müəyyən münasibət bildirən məntiqi-qrammatik kateqoriya hesab olunur.[1]

Modal sözlər bu gün köməkçi nitq hissəsi kimi dilçi alimlərimiz tərəfindən qəbul edilsə də XX əsrin 70-ci illərinədək əsas nitq hissələri ilə köməkçi nitq hissələri arasında orta mövqe tutan nitq hissəsi hesab olunurdu[2].

Modal sözlər üç cəhətdən-semantik, morfoloji və sintaktik-səciyyələnir:

a) semantik cəhətdən modal sözlər fikrin varlıqla əlaqəsini və söylənilən fikrə danışanın münasibətini ifadə etmək qabiliyyətinə malikdir;

b) morfoloji cəhətdən modal sözlər heç bir dəyişikliyə uğramayan, bir növ amorflaşmış sözlərdir;

c) sintaktik cəhətdən modal sözlər cümlənin heç bir üzvü ilə qrammatik əlaqəyə girə bilmir;

Məntiqi-qrammatik məna daşıyan modal sözlərin böyük natiq Heydər Əliyevin nitqində öyrənilməsi digər nitq hissələri ilə müqayisədə az əhəmiyyət kəsb etmir. Kitabın bu fəslində modal sözlər məna növlərinə görə Heydər Əliyevin nitqində araşdırılmışdr. Gerçəkliyə münasibətin müxtəlifliyi modal sözlərin çoxsaylı məna növlərini yaradır.

Heydər Əliyevin nitqində ən çox təsadüf olunan modal sözlər gerçəkliyə münasibətin dərəcəsini bildirənlərdir ki, on-

---

[1] Hüseynzadə M. Müasir Azərbaycan dili (morfologiya). Bakı, "Şərq-Qərb", 2007. 280 səh.

[2] Əlizadə Ziynət. Müasir Azərbaycan dilində modal sözlər (Monoqrafiya). Bakı, "Maarif" nəşriyyatı, 1965. səh.118

ları da öz növbəsində üç qismə bölmək olar: gerçəkliyə uyğunluğun adi dərəcəsini bildirənlər;

gerçəkliyə uyğunluğun qəti təsdiqini bildirənlər;

cümlədə ifadə olunan fikrin gerçəkliyinə şübhə, güman, ehtimal bildirənlər.[1]

Modallıq daim dəyişmədə və inkişafda olan canlı bir prosesdir. Nitq prosesində yeni-yeni leksik vahidlərin modal sözlərə çevrilməsi, modallıq ifadə etməsi müşahidə olunur. Bu dialektik inkişaf prosesində modal sözlərin dilin lüğət fondunda xüsusi çəkisi artan xətlə yüksəlir.[2]

Bir cümlədə bir, iki, hətta üç modal söz işlənib müxtəlif modal məna çalarlıqlarının ifadəsinə xidmət edə bilir. Cümlədə modal sözlərin təkrarı fikrin qabarıq çatmasına, daha canlı ifadə edilməsinə və fikirdə emosiyanın qüvvətlənməsinə xidmət edir.[3] Böyük natiq öz fəlsəfi fikirlərini auditoryaya açıqlayarkən "təbii ki," "təbiidir ki" modal sözlərdən geniş istifadə edir. Cəmiyyət və hər bir fərd vəhdətini ortaya qoyur: "***Təbiidir ki***, hər bir insanın öz şəxsi həyatı var. İnsanın şəxsi həyatındakı vəziyyəti onun cəmiyyətdəki vəziyyətinə və gedən proseslərə də təsir edir" [XIIIc.s.86].

"Təbiidir" modal sözü Heydər Əliyevin nitqində ritorik sualları cavablandırarkən işlədilir: "Mən göstəriş vermişəm və bütün dövlət sənədləri latın əlifbası ilə yazılır. Ancaq onları başqa yerlərə göndərəndə çoxları oxumaqda çətinlik çəkirlər. Nə üçün belə olubdur? Bu ***təbiidir***, çünki bir əlifbadan başqasına keçmək asan deyil" [XIIIc.s.108].

---

[1] Hüseynzadə M. Müasir Azərbaycan dili (morfologiya). Bakı, "Şərq-Qərb", 2007. 280 səh.

[2] Cahangirov Fikrət. Modallıq kateqoriyasının məntiqi və qrammatik mahiyyəti // Azərbaycan Milli Elmlər Akademiyasının xəbərləri. Humanitar və ictimai elmlər seriyası, 2003. №1-4, s.283-293.

[3] Əlizadə Ziynət. Müasir Azərbaycan dilində modal sözlər (Monoqrafiya). Bakı, "Maarif" nəşriyyatı, 1965. səh.118

"Doğrudan da" modal sözü Heydər Əliyevin nitqində Azərbaycanımızın böyük sərvətlərə malik olmasını təsdiqləyir: "***Doğrudan da***, bizim Aran zonasında çox gözəl münbit torpaqlarımız, pambıq və digər texniki bitkilərin əkilib becərilməsi üçün yararlı torpaqlarımız var. Biz taxıl məhsulları istehsal etmək üçün çox yararlı torpaqlara malikik" [VIc.s.54].

"Düzdür" modal sözü böyük natiqin nitqində səmimiyyət ifadə edir: "***Düzdür***, o vaxt imkanlarım yox idi. Ancaq sadəcə ordan-burdan soruşurdum ki, muzey açıldımı-açılmadımı? Dedilər: yox, açılmadı. Nəhayət, Bakıya işə qayıdan kimi yenə də bu məsələ ilə maraqlandım və lazımi tədbirlər görmək barədə göstərişlər verdim" [IIIc.s.73].

Qəti təsdiq modal sözü "doğrudan da" böyük natiqin nitqlərində mühüm yer tutur. Bu modal sözlə Heydər Əliyev Azərbaycan məkanını xarakterizə edir. Xarici qonaqlar üçün Azərbaycan məkanının yaz-yay ayları daha gözəl olduğunu dilə gətirir: "***Doğrudan da*** ilin son ayı olan dekabr yubiley tədbirlərinin keçirilməsi üçün o qədər də münasib deyildir. Digər tərəfdən, dekabr qış ayıdır və Azərbaycan yubiley təntənələrinə gələn qonaqlara yaz-yay aylarındakı kimi təsir bağışlamaz" [IIc.s.97].

"Doğrudur" modal sözü ilə Heydər Əliyev öz fikrini auditoriyaya aşılayır: "***Doğrudur***, Cəlil Məmmədquluzadə yaradıcılığı elə bir dəryadır ki, o dəryanın dibinə gedib çatmaq, hamısını əhatə etmək mümkün deyildir" [IIIc.s.76].

"Doğrudur" modal sözü Heydər Əliyev nitqində Azərbaycan tarixinə aid olan həqiqətlərin auditoriyaya çatdırılması yolunda mühüm bir köməkçi nitq hissəsidir: "***Doğrudur***, Azərbaycan öz tarixinin qısa bir dövründə müstəqil demokratik dövlətini yaratmışdı. Bu, 1918-1920-ci illərdə olmuşdur. Lakin iki ildən sonra, həm Azərbaycanda, həm də bütün Zaqafqaziyada sovet hakimiyyətinin qurulması ilə bu dövlət öz fəaliyyətini dayandırmışdır" [Ic.s.420].

"Doğrudur" modal sözü "xüsusən" modal sözünün köməyi ilə qüvvətlənir. "Xüsusən" modal sözü ümuminin içində xüsusini ayırmağa və "doğrudur" modal sözünü gücləndirməyə xidmət edir: "***Doğrudur***, sonrakı dövrlərdə və xüsusən 50-ci illərdə Azərbaycanda "Molla Nəsrəddin" məktəbini davam etdirməyə çalışdıq. Ancaq bu gün etiraf etməliyəm ki, buna nail ola bilmədik" [IIIc.s.77].

Qəti təsdiq bildirən "şübhəsiz ki" modal sözü böyük natiqin dilində təkrarlanaraq auditoriyada şübhə yeri qoymur, ərazi bütövlüyümüzün təmin olunmasında, sərhədlərimizin toxunulmazlığında, işğal olunmuş ərazilərin qəsbkarlardan təmizlənməsində güzəştə yer olmayacağını bəyan edir:

"***Şübhəsiz ki,*** biz bu vəziyyətdən çıxacağıq. ***Şübhəsiz ki***, işğal olunmuş torpaqlarımızın azad edilməsinə nail olacağıq. ***Şübhəsiz ki***, işğal olunmuş torpaqlardan Ermənistan silahlı qüvvələrinin çıxarılmasına nail olacağıq. ***Şübhəsiz ki***, Azərbaycan Respublikasının ərazi bütövlüyünün təmin edilməsinə nail olacağıq. ***Şübhəsiz ki***, biz sərhədlərimizin toxunulmazlığına nail olacağıq. Biz bunlara nail olacağıq. Müstəqil Azərbaycan özünün bütün ərazisinin sahibi olacaq. Müstəqil Azərbaycan Respublikası öz taleyinin sahibi olacaqdır" [VIc.s.38-39].

Təsdiq modal sözü "həqiqətən" ictimai-siyasi məsələlərə aydınlıq gətirmək hallarında işlənir. "Yeri gəlmişkən" modal sözü isə özündən qabaqkı fikri təsdiqləyir və qüvvətləndirir: "***Həqiqətən***, 1994-cü ildə biz "Əsrin müqaviləsi"ni imzaladıq. Azərbaycana qarşı həddindən çox mənfi hərəkətlər oldu, amma biz bunların hamısını dəf edə bildik. Rusiya bizim Şimal qonşumuzdur, biz onunla dostluq münasibətləri saxlamaq, fəal əməkdaşlıq etmək istəyirik. ***Yeri gəlmişkən***, imzaladığımız müqavilələrdə, – onların sayı artıq doqquza çatmışdır, – Rusiyanın "LUKoyl" şirkəti də iştirak edir" [XIIc.s.71].

Təsdiq bildirən modal sözlər içərisində "düzdür" modal sözü Heydər Əliyev nitqində xüsusi çəkiyə malikdir. Audito-

riya bu modal sözün köməyilə situasiyanı düzgün başa düşür: "Ancaq mən güman edirəm ki, bizim daxili işlər orqanlarında, polis orqanlarında illər boyu yaradılmış potensial o qədər möhkəmdir ki, belə adamlar onu dağıda bilməzdilər. ***Düzdür***, zərər vurublar – həm mənəvi, həm də maddi zərər vurublar. ***Düzdür***, insanların bir hissəsinin beyinlərini zəhərləyiblər, onların psixologiyasını korlayıblar – bunların hamısı göz qabağındadır, – ancaq yaranmış potensialı dağıda bilməyiblər və bunu dağıtmağa onların heç gücü də çatmazdı" [Ic.s.140-141].

Güman bildirən modal söz "güman edirəm ki" Heydər Əliyevin nitqində heç də güman bildirmir. Əksinə bu modal sözün arxasınca qətiyyətli ifadələr özünə yer alır (belə adamlar onu dağıda bilməzdilər). Burada "düzdür" modal sözü iki dəfə təkrarlanaraq "göz qabağındadır" frazeologizmi ilə çulğalaşır: "***Əlbəttə***, bu mənfi halların mövcud olması, sirayət etməsi və necə deyərlər, bir xəstəlik kimi yayılmasının obyektiv və subyektiv səbəbləri var. Obyektiv səbəblər ***şübhəsiz ki,*** son dövrlərdə Azərbaycanda gedən ictimai-siyasi proseslər, iqtisadiyyatın dağılması, qanunçuluğun pozulması və yüksək dövlət orqanlarının özünün qanuna zidd hərəkətləri, vəzifədən sui-istifadə etmək hallarıdır" [Ic.s.143-144].

"Ancaq ***təəssüf ki***, gömrük orqanlarının işindən çoxlu şikayətlər, narazılıqlar gəlir. Mən bəzən xaricdə olarkən, respublikada iş adamları ilə rastlaşarkən, onların Azərbaycana gəlib iş görməsi barədə söhbət edərkən, xarici investisiyaların respublikamıza gətirilməsi haqqında danışıqlar apararkən məni çox sarsıdan, narahat edən sözlər eşidirəm" [IIIc.s.110].

"Görünür"modal sözü obyektivliyi əks etdirmək üçün Heydər Əliyev dilində tez-tez işlədilir. Əgər auditoriyada azacıq da olsa şübhə yeri qalırsa, bu şübhələr "çünki" bağlayıcısının köməyi ilə aradan qaldırılır. Natiqin nitqindəki obyektivlik tam ciddiyyəti ilə auditoriya tərəfdən qəbul edilir.

Auditoriya Heydər Əliyevin nitqlərində güman bildirən modal sözlərin sonda güman olmadığı qənaətinə gəlir. Heydər Əliyevin "gümanları" gələcəkdə həyata keçirilən gümanlardır: "Eyni zamanda qeyd etmək istəyirəm ki, əgər dünyanın böyük ölkələrinin neft şirkətləri Azərbaycanın neft yataqlarına maraq göstərirlərsə, ***güman edirəm ki***, o ölkələrin dövlət dairələrini Azərbaycan Respublikasının bugünkü ictimai-siyasi vəziyyəti də maraqlandırmalıdır. Güman edirəm ki, neft şirkətlərinin əksəriyyəti təmsil olunduqları dövlət dairələri ilə sıx bağlıdırlar" [Ic.s.86-87]. Bu modal sözlər "Azərbaycanın ictimai-siyasi vəziyyəti, durumu həmişə sabit olmalıdır" prinsipini dövlətçilik yolunda hər bir vətəndaşa anladır.

"Güman edirəm ki" modal sözü böyük natiqin nitqində ilk baxışdan güman bildirirsə, zaman Heydər Əliyev nitqində gümana yer qalmadığını göstərir. Bu gün dünya azərbaycanlılarının həmrəyliyi günü buna sübutdur: "***Güman edirəm ki***, belə görüşlər gələcəkdə dünya azərbaycanlılarının həmrəyliyi üçün, onların bir-biri ilə sıx əlaqə saxlaması, bir-biri ilə yaxın olması üçün ilk addımlardır" [Ic.s.432].

Bu modal sözdən böyük natiq dini auditoriyalarda da geniş istifadə edir: "***Güman edirəm ki***, əməlisaleh olduğumuza görə bizim bu dualarımız, arzularımız qəbul olunacaq (Yerdən səslər: İnşallah) və güman edirəm ki, biz hamımız birlikdə Azərbaycanın bu ağır vəziyyətdən çıxmasına çalışacağıq (Yerdən səslər: İnşallah)" [Ic.s.84].

"Güman edirəm ki" modal sözünün arxasınca güman etdiyi məsələləri qəti gələcək zamanda qoymaqla auditoriyanı gümandan çıxararaq gələcəyə hazırlaya bilmək Heydər Əliyev nitqinin ecazkarlığından xəbər verir: "***Güman edirəm ki***, hələ bir neçə nəsil Azərbaycan tarixçisi, ədəbiyyatşünası, siyasətşünası, alimi Cəlil Məmmədquluzadə xəzinəsini, yaradıcılığını araşdıracaq, onu tədqiq edərək yeni-yeni kəşflər edəcəkdir" [IIIc.s.81].

Cümlədə modal sözlərin təkrarı fikrin qabarıq çatmasına, daha canlı ifadə edilməsinə və fikirdə emosiyanın qüvvətlənməsinə xidmət edir.[1] Bəzən bir modal söz bir-birinin arxasınca cümlədə təkrarlanır. "Təəssüf", "təəssüf ki" modal sözlərinin təkrarlanması hadisələrin, neqativ halların dərinliyindən xəbər verir: "***Təəssüf ki***, çox ***təəssüflər olsun ki***, keçən il biz nəinki irəliyə gedə bilmədik, hətta müəyyən sahələrdə əvvəlki illərə nisbətən geri düşdük, yəni inkişafı təmin edə bilmədik" [VIc.s.57]:

"***Təəssüf ki***, son illərdə, iyirminci əsrin son mərhələsində dünyanın müxtəlif regionlarında sülh pozulmuş, insanlar arasında, dövlətlər arasında, ayrı-ayrı qruplar arasında toqquşmalar, vuruşmalar, müharibə gedir və bunların hamısı insanların rahat yaşamasına mane olur" [Ic.s.385-386].

Heydər Əliyev təəssüfü Sovetlər İttifaqı dağılandan sonra xalqa məxsus sərvətlərin özbaşınalıqla nadan əllərə keçməsinədir: "***Təəssüflər olsun ki***, müəyyən dövrdə Azərbaycanda özbaşınalığa, hərc-mərcliyə, deyə bilərəm ki, sahibsizliyə görə ölkənin bu cür sərvətləri ayrı-ayrı nadan adamların əlinə keçmişdir və bəziləri hələ bu gün də onların əlindədir. Bu gün mən sizə bir daha deyirəm, hamısını xalqa qaytaracağıq. Heç kəsə imkan verə bilmərik ki, xalqın sərvəti, vəsaiti, zəhməti ilə, necə deyərlər, xalqın bütün çalışqanlığı ilə yaranmış və xalq üçün olan, xalqa xidmət edən belə obyektlər ayrı-ayrı əllərə keçsin" [VIIc.s.9]. Təəssüf edən dövlət başçısının növbəti nitqi həmişə olduğu kimi qətiyyətli ifadələrlə başa çatır. Auditoriya "nadan adamların əlinə keçən sərvətin" xalqa qaytarılacağını böyük natiqin dilindən eşidir, Heydər Əliyev nitqinin qətiyyətinin şahidi olur.

---

[1] Əlizadə Ziynət. Müasir Azərbaycan dilində modal sözlər (monoqrafiya). Bakı, "Maarif" nəşriyyatı, 1985. səh.118

Heydər Əliyevin nitqində "təəssüf ki" modal sözü keçmişimizdə baş verən neqativ hallara yönəlir: "***Təəssüf ki,*** o dövrdə bəlkə bu belə idi. ***Çünki*** bizim həyatımızda ateist tərbiyəsi hökm sürürdü, din inkar olunurdu və bu əsər bəlkə də bu baxımdan, həmin istiqamətdə xidmət göstərirdi. ***Ancaq*** Mirzə Cəlil bu əsəri yaradarkən heç də dinə müxalif çıxmayıbdır, əksinə, bu əsərlə islam dininin xalqımız üçün nə qədər böyük mənəvi dəyər olduğunu sübut etməyə çalışıbdır" [IIIc.s.80]. "Təəssüf ki" modal sözün arxasınca "çünki" bağlayıcısı təəssüf olunanlara izah verir. "Ancaq" bağlayıcısı ilə Mirzə Cəlilin islama olan sevgisini auditoriyaya açıqlayır. Yuxarıdakı parçada "təəssüf ki" modal sözün bağlayıcılarla – "çünki", "ancaq" harmoniyasının şahidi oluruq.

Müəyyən orqanların, təşkilatların işindəki nöqsan və çatışmazlıqlara təəssüf edən qətiyyətli dövlət başçısı bu neqativ halları aradan qaldırmaq üçün Prezident sarayında müşavirələr çağırılmasını zəruri hesab edir: "Ancaq ***təəssüf ki,*** gömrük orqanlarının işindən çoxlu şikayətlər, narazılıqlar gəlir. Bax, bunların hamısını nəzərə alaraq, Dövlət Gömrük Komitəsinin hesabatını dinləmək üçün bu gün bu müşavirəni çağırmışam və məsələnin səmərəli müzakirə olunması üçün rəhbər vəzifəli şəxsləri buraya dəvət etmişəm" [IIIc.s.110].

Bu modal söz Heydər Əliyev dilində mənəviyyatımızdakı "çatışmazlıqlar", "geriliklərlə" bağlı məqamlarda tez-tez işlədilir: "***Təəsüf ki***, mənəviyyatda çatışmazlıq, mənəviyyatda gerilik bizi bu gün də sıxır. Mənəviyyatımızda ayrı-ayrı şəxslərin, ayrı-ayrı qrupların mənfi hərəkətləri cəmiyyətimizi, xalqımızı incidir".

XX əsrin 90-cı illərində Azərbaycan iqtisadiyyatının böhranlı vəziyyətə düşməsinə təəssüf edən Heydər Əliyev əsas məsələ kimi diqqəti istehsalın azalmasının qarşısını almağa yönəldir: "İqtisadiyyatın çox sahəsi var, əsas sahəsi isə istehsaldır. Təəssüf ki, bizdə bu sahə son illər get-gedə zəifləyir,

istehsalın həcmi aşağı düşür. Bütün bunların əsas səbəbi isə iqtisadiyyatın böhran vəziyyətində olmasıdır" [Ic.s.10].

Modal sözlər içərisində "təəssüf ki", "təəssüflər olsun ki" kimi mürəkkəb modal sözlər Heydər Əliyev nitqində cəmiyyətdə müxtəlif sahələrdəki çatımazlıqlar, nöqsanlar, cəmiyyətə zidd hərəkətlər müşahidə ediləndə işlənir. Bu modal sözlər çıxışın məzmununa uyğun gələrək, çıxışın auditoriyalardakı təsir gücünü artırır. Sovet təsərrüfat sistemindən imtina dövründə bu təsərrüfatın intizamsız şəkildə pozulmasını qəbul etmir: "Ancaq ***təəssüflər olsun ki***, on illərlə yaranmış böyük iqtisadi, o cümlədən aqrar bölmədəki potensial bu proseslər zamanı tədricən və bəzən də sürətlə dağıdılıbdır. İndi biz elə bir mərhələyə gəlib çatmışıq ki, bir tərəfdən bu dağıdıcı prosesin qarşısı alınmalı, digər tərəfdən, həmin prosesin dayandırılması üçün inzibati amirlik metodlarının nəticə vermədiyi artıq bizə məlum olduğundan, iqtisadi qanunlar, prinsiplər əsasında işi qurmalıyıq ki, bu gözəl torpağımızdan, mövcud iqtisadi potensialımızdan səmərəli istifadə edək" [IIIc.s.61].

Böyük natiqin dilində "təəssüf ki" modal sözü müstəqilliyimizə xidmət edən əsərlərin çapında yol verilən nöqsanlara işarədir: "Burada deyildi ki, "Molla Nəsrəddin" jurnalının faksimilesi on iki cilddən ibarətdir. ***Təəssüf ki,*** on il bundan öncə onun cəmi bir cildi buraxılıbdır, indiyə qədər qalanları çap edilməyib" [IIIc.s.82].

Heydər Əliyev kənd təsərrüfatındakı baxımsızlığa, çatışmazlığa təəssüf edir. "Demək" modal sözü ilə kənd təsərrüfatındakı vəziyyətin böhranlı həddə çatmasını göstərir. "Bilirsiniz" modal sözü ilə insanlarımızı yaratmağa, qurmağa çağırır: "***Təəssüflər olsun ki***, sonrakı dövrdə bu çay plantasiyaları baxımsızlıq, ayrı-ayrı qrupların dağıdıcı, pozucu işləri nəticəsində dağılmışdır. Kənd təsərrüfatı naziri bu gün mənə məlumat verdi ki, respublikada bu il cəmisi min ton yaşıl çay yarpağı əldə edilibdir. Amma mənim xatirimdədir, 1980-ci il-

də respublikada 26 min ton çay yarpağı yığılmışdı. ***Deməks***, bu rəqəm 26 dəfə azalıbdır. Mən soruşuram ki, nə üçün bu belə olubdur? Deyir ki, siz gördüyünüz çay plantasiyalarından indi çox az bir hissə qalıbdır. Bilirsiniz, dağıtmaq asandır, amma yaratmaq, qurmaq çətindir" [VIIIc.s.202-203].

"Bilirsiniz" modal sözünü eşidən auditoriya özünü Heydər Əliyevin fəlsəfi fikirlərinin sehrinə düşəcəyinə hazırlayır: "***Bilirsiniz***, dünyada heç kəs daimi deyil, insan mənəviyyat üçün yaşamalıdır. Mənəviyyatını qoruyan, yaşayan insan əbədi olacaqdı. Amma səkkiz ildir Azərbaycanın başına cürbəcür bəlalar gətirən nadürüst, cinayətkar adamlar, vəzifə hərisləri, – hansılar ki, bu gün də Azərbaycanda qarışıqlıq salmaq istəyirlər, – belə adamların heç birisi yaşamayacaqdır. Ola bilər, fiziki cəhətdən ömrü çox olsun, amma mənəvi cəhətdən ömrü olmayacaqdır. Biz isə, əgər Allahın kəlamına, Qurani-Kərimin kəlamına da, ulu babalarımızın vəsiyyətinə də istinad etmiş olsaq, mənəviyyat üçün yaşamalıyıq" [VIc.s.49]. Auditoriya "mənəviyyat", "mənəvi tərbiyə" kimi fəlsəfi fikirləri "bilirsiniz" modal sözü ilə qavrayır.

Başqa bir çıxış məqamında "bilirsiniz" modal sözü dövlətçiliyimizin qorunmasına yönəlir, qanunları pozmağa cəhd göstərən hər bir şəxsi düz yola dəvət edir. "Keçmiş xidmətlərindən istifadə edib qanunu pozmağa heç kimin ixtiyarı olmamalıdır" prinsipini auditoriyalardan xalqa bəyan edir: "***Bilirsiniz***, heç kəs deyə bilməz ki, mənim filan vaxt filan xidmətim olubdur, filan vaxt meydanda bir az çox qışqırmışam, yaxud da az qışqırmışam, mənim qanunu pozmağa ixtiyarım var. ***Yox***, artıq bizdə hüquqi dövlət yaranıbdır" [XIIIc.s.278]. İki cümlə ilə auditoriyaya bəyan edilən fikir "bilirsiniz" modal sözlə başlayıb "yox" inkar ədatı ilə yekunlaşır.

"Bilirsiniz" feli modal söz böyük natiqin dilində auditoriyada müəyyən bir məsələnin anlaşılmasında çaşqınlığa düşənlərə yönəlir. "Bilirsiniz" modal sözünün arxasınca həmin

məsələnin izahı gəlir: "***Bilirsiniz***, mən bunu dəfələrlə demişəm və bu gün fürsətdən istifadə edib yenə də deyirəm: biz türkdilli xalqların ailəsinə mənsub olan bir xalqıq. Ancaq bunun çox şaxələri var. Bunun bir şaxəsi də Azərbaycan dilidir" [XIIIc.s.135]. Bu çıxışda Azərbaycan dilindən imtina edərək türk dili ifadəsini qəbul etmək istəyənlərə "bilirsiniz" modal sözlə cavab verilir.

Başqa bir fəlsəfi-tarixi çıxış məqamında: "***Bilirsiniz***, 1975-ci ildə Azərbaycanda olan səviyyə tarixdə heç vaxt olmayıb. 1970-ci illərdə kənd təsərrüfatında əldə olunmuş nailiyyətlərə mən bilavasitə rəhbərlik etmişəm. Mən 1980-ci illərin əvvəllərində həm burada işləyərkən, həm də sonra Moskvada işləyərkən, Sovetlər İttifaqının rəhbərlərindən biri və Siyasi Büronun üzvü kimi gördüm ki, kənd təsərrüfatı artıq bu forma ilə irəliyə gedə bilməyəcəkdir. Məsələn, mən o vaxtkı onuncu beşilliyi götürürəm. 1976-1981-ci illəri əhatə edən onuncu beşillikdə Azərbaycanda kənd təsərrüfatı istehsalı 50 faiz qalxdı. Amma bütün Sovetlər İttifaqında məhsul istehsalı cəmi 12 faiz artdı. Mən hesab edirdim ki, onlar yaxşı işləyə bilməyiblər, biz yaxşı işləyirik, bizim sürətimiz yuxarıdır. Amma Moskvaya getdim, tanış oldum. Bəli, fərq var idi. Biz yaxşı işləyirdik. Respublikaların çoxunda bizim səviyyədə işləmirdilər. Amma mən gördüm ki, ola bilər, bir beşillik də Azərbaycan belə getsin, lakin bu forma ilə daha gedə bilməyəcəkdir" [VIc.s.67]. Auditoriya hələ Sovetlər dönəmində Heydər Əliyevin uzaqörənliyinin şahidi olur, "bilirsiniz" modal sözlə çox incə, çox gizli mətləblərə bələd olur.

"Bilirsiniz" modal sözü ilə Heydər Əliyev milli təəssübkeşlik hissləri zəif olanları, millətə bir tam kimi baxa bilməyənləri tənqid edir: "***Bilirsiniz***, keçmişdə belə bir əhval-ruhiyyə vardı ki, guya bizim dağ rayonlarımız geridə qalmışdır, orada camaatın mədəni, yaxud bilik səviyyəsi o qədər də yüksək deyildir. Amma siz də görmüsünüz ki, həmin o illərdə

aparılan işlər ölkəmizin cürbəcür bölgələrində olan əhalinin həm elm, bilik səviyyəsini, həm də mədəni səviyyəsini, eyni vəziyyətə qaldırdı. İndi mən burada görürəm, kəlbəcərlilərdən nə qədər şair var. Hər çıxış edən şeir oxuyur, özü də başqasının yox, özünün yazdığı şeiri oxuyur. Elə bunun özü kəlbəcərlilərin həm nə qədər istedadlı olduğunu, həm də mədəniyyətə, ədəbiyyata nə qədər qovuşduğunu göstərir. Kəlbəcərdən nə qədər böyük alimlər, ziyalılar var. Yəni keçmişdə bəzən belə əhval-ruhiyyə vardı ki, dağda yaşayanlar guya dağ adamlarıdır. Bəzən şəhərdə onlara bir az kəc baxır, yaxud başqa cür yanaşırdılar" [VIc.s.47].

"Bilirsiniz ki" modal sözü ilə ilk baxışda məlum həqiqət auditoriyaya çatdırılır. Sonra "lakin" bağlayıcısının köməyi ilə situasiya auditoriyaya aydınlaşdırılır: "***Bilirsiniz ki***, doqquz aya yaxındır döyüşlər getmir, atəşkəsə nail olmuşuq. Biz atəşkəs rejiminə sadiqik, gələcəkdə də buna çalışacağıq. Lakin bizə uzunmüddətli möhkəm sülh lazımdır, sülh haqqında Böyük Siyasi Saziş imzalanmalıdır. Biz buna çalışırıq. Lakin buna nail olmaq üçün çox iş görülməlidir" [IIIc.s.108].

"***Bilirsiniz***, insanlar qurulan şeyi dağıtmağa çox malikdirlər. Bu, çətin bir şey deyildir. Amma bunu tikmək, yaratmaq neçə illər tələb edib, burada nə qədər zəhmət çəkilib, nə qədər vəsait qoyulub, işlər görülübdür" [XIIc.s.9].

Təsadüfi deyil ki, "bilirsiniz" modal sözü bu gün ölkə başçısı, Heydər Əliyevin siyasi, mənəvi varisi İlham Əliyevin də dilində çox işlədilir: "Bilirsiniz, hər bir tarixi mərhələnin öz gündəliyi var".[1]

"Bilirsiniz, biz istəyirik ki, hər şey ədalətlə həll olunsun".[2]

---

[1] Cəfərov Nizami, Musayev Osman, Osmanlı Dəyanət. Türk dünyasının yeni lideri. Bakı, "Çaşıoğlu", 2009. səh.724
[2] Yenə orada. səh.727

"Bilirsiniz, əlbəttə, bunun müxtəlif səbəbləri ola bilər. Ümid edirəm ki, bu işlərlə məşğul olan, yəni sosial araşdırmalarla məşğul olan mütəxəssislər, təşkilatlar, institutlar bunu araşdıracaqlar".[1]

Davamiyyət bildirən "əvvəla", "ikincisi" kimi modal sözlər nitqdə ardıcıllığa xidmət edir: "***Əvvəla***, təşəkkür edirəm ki, siz iki il bundan öncə gördüklərinizi indi müqayisə edərək, ədalətli olaraq, Azərbaycanda baş vermiş dəyişiklikləri görmüsünüz və bu barədə öz sözlərinizi dediniz. Təşəkkür edirəm. Ona görə ki, bəzən ölkəmizə gələn bir para adamlar vəziyyəti düzgün qiymətləndirə bilmirlər. ***İkincisi***, öz ölkəmizin daxilində elə adamlar var ki, onlar müxalifətdə olduqlarına görə Azərbaycanda baş verən hər şeyi qara eynəklə görürlər və hər bir şeyi də pis qiymətləndirirlər. Odur ki, bu müsbət qiymətinizə görə sizə təşəkkürümü bildirirəm" [VIIIc.s.144-145].

Nəticə bildirən "nəhayət" modal sözü adətən "güman edirəm ki" və "ümidvaram ki" modallarla birgə təsadüf edir. Yuxarıdakı modal sözlər kombinasiyası auditoriyada əminlik, sabahkı günə inam yaradır: "***Nəhayət***, bir neçə müqavilə də işlənib hazırlanıbdır və ***güman edirəm ki***, onlar sabah imzalanacaqdır. Bu, Amerikanın "Şevron" şirkəti ilə, "Eksson" şirkəti ilə və "Mobil" şirkəti ilə hazırlanmış müqavilələrdir və bununla bərabər Amerikanın "AMOKO" şirkəti ilə müştərək iş görmək üçün hazırlanmış yeni müqavilədir. ***Ümidvaram ki***, bunlar da imzalanacaqdır" [XIc.s.196].

Ümimiləşdirmə və təsdiq bildirən modal sözlər nitqin ekspressivliyini artırmaq baxımından mühümdür. "Ümumiyyətlə" və "doğrudur" modal sözlərinin iştirak etdiyi 4-5 cümlə ilə Heydər Əliyevin nitqində XX əsr xarakterizə oluna bilir: "***Ümumiyyətlə***, XX əsr elə başlanğıcından sonunadək çox çətin bir əsr, ağır bir dövr olubdur. ***Doğrudur***, XX əsrin sakit

[1] Yenə orada. səh.730

dövrləri də olubdur. Amma qalmaqallı, qarışıq, çətin, ağır dövrləri daha çox olubdur. Bizim qismətimizə nə düşübdür? Biz bunun bir çox hissəsini görmüşük" [XIIIc.s.83].

Bəzən bir cümlədə bir neçə modal söz təsadüf edir ki, bunlar nitqin əlvanlığını yüksəldir. Bir cümlədə bir, iki və hətta üç modal söz işlənib müxtəlif modal məna çalarlıqlarının ifadəsinə xidmət edə bilir[1]: "***Ümumiyyətlə, hesab edirəm ki***, mühüm sərhəd-keçid məntəqələrindəki vəziyyətə kompleks şəkildə baxılmalıdır. ***Ona görə də*** Prezident Aparatındakı müəyyən şəxslər, Nazirlər Kabineti bu barədə fikirləşməlidir, bizim şöbələr bu işlə məşğul olmalıdır və bu məsələlərə kompleks şəkildə baxılması barədə təkliflər verməlidirlər" [IIIc.s.116]. "Ümumiyyətlə", "hesab edirəm ki" modal sözlərinin ardınca "ona görə də" bağlayıcısının köməyi ilə felin icbar şəklində qətiyyətli nitqi ortaya qoyur.

Nəticə və ümumiləşdirmə bildirən nitq situasiyalarında Heydər Əliyev "bir sözlə" modal sözündən istifadə edir. Bu modal sözlə çıxışlarının yekununda istifadə edib, tapşırıqlarını verir: "***Bir sözlə***, 98-ci ilin planı və 97-ci ilin yekunları, – xüsusən qaz sahəsində, təkcə qaz sahəsində yox, başqa sahələrdə də, – o cümlədən həmin qaz-kompressor stansiyası işə salınmasından indiyə qədər görülən iş, əldə olunan nəticə, – mən bilirəm ki, oraya çoxmilyardlıq vəsait qoyulubdur, o vəsaitin nəticəsində biz nə əldə etmişik, nə qədər vəsait qoyulub, – bunların hamısını araşdırın, müzakirə edin, mənə məruzə edin" [XIIIc.s.437].

Heydər Əliyevin nitqində "beləliklə" modal sözü "nəhayət", "kimi", "ümidvaram ki" modal sözləri ilə birgə təsadüf edir. Bu zaman auditoriya öz ümid və arzularını böyük natiqin ümid və arzularına qoşur: "***Beləliklə***, biz indiyədək görülən iş-

---

[1] Əlizadə Ziynət. Müasir Azərbaycan dilində modal sözlər (monoqrafiya). Bakı, "Maarif" nəşriyyatı, 1985. səh.115

ləri qiymətləndirməliyik. Biz onlarla fəxr edə bilərik. Biz eyni zamanda əməkdaşlığımızın nə qədər genişləndiyinin şahidiyik. Amma bu da son hədd deyildir. Hələ qarşıda çox böyük imkanlar vardır. Mən ***ümidvaram ki***, Amerikanın Azərbaycanda fəaliyyət göstərən neft şirkətləri ilə bərabər, Birləşmiş Ştatların bir çox digər neft şirkətləri də bu əməkdaşlığa qoşulacaqlar" [XIc.s.212].

Heydər Əliyevin nitqində "müxtəsəri" modal sözü nəticə bildirmək məqamlarında işlənir. Polşanın "Jiçe Varşava" qəzetinin müxbirinin 27 avqust 1997-ci ildə "cənab prezident, Siz Azərbaycanın hansı problemini ən mühüm problem sayırsınız" sualına verdiyi cavab beləcə də yekunlaşır: "Biz bununla prinsipcə razıyıq. Mən bunu Vaşinqtonda ABŞ prezidentinə də dedim. ABŞ ATƏT-in Minsk qrupunun həmsədrlərindən biridir. ***Müxtəsəri***, bu problem (Qarabağ problemi – red.) Azərbaycanın ən başlıca problemidir" [XIIc.s.68-70]

Heydər Əliyevin çıxışlarının sonluğu bəzən nəticə bildirən iki və ya daha çox modal sözlə yekunlaşır. "Müxtəsəri" modal sözü ilə bir neçə problemə toxunulur: "***Nəhayət***, razılığa gəldik ki, yaxın vaxtlarda Polşa Azərbaycanda, Azərbaycan isə Polşada səfirlik açacaqdır. ***Müxtəsəri***, biz bütün sahələrdə – iqtisadiyyat, ticarət, təhsil, mədəniyyət, siyasi məsləhətləşmələr sahəsində və digər sahələrdə münasibətlərimizin inkişafına böyük təkan verdik" [XIIc.s.78].

Böyük natiqin dilində nəticə bildirən modal sözlər təkrarlandıqca auditoriya çıxışın ana məzmununu bir daha eşidir, çıxış yaddaqalan olur: "***Beləliklə***, bizim Amerika Birləşmiş Ştatları ilə geniş iqtisadi əlaqələrimiz başlandı. Bu əlaqələr son illərdə sürətlə inkişaf edir. Bundan sonra biz yeni müqavilələr imzaladıq. ***Nəhayət***, dünən Vaşinqtonda, Ağ evdə Azərbaycan ilə Amerika Birləşmiş Ştatları arasında energetika sahəsində əməkdaşlıq haqqında saziş imzalandı. ***Beləliklə***, biz dünən Ağ evdə Amerika–Azərbaycan əlaqələrində xüsusi yer

tutan enerji sektorunun inkişaf etdirilməsi üçün hökumətlərarası saziş və dörd Amerika şirkəti ilə müqavilələr, sazişlər imzaladıq” [XIc.s.283].

“Beləliklə” modal sözü Heydər Əliyevin müşavirələrə yekun vurmaq məqamlarında daha çox təsadüf edir: “***Beləliklə***, 1995-ci ilin yekunlarından danışarkən onu demək lazımdır ki, vəziyyət keçən il kənd təsərrüfatı sahəsində, aqrar sahədə qənaətbəxş hesab edilə bilməz” [VIc.s.57].

Bir qisim modal sözlər Heydər Əliyevin nitqində xəlqiliyə söykənir. Belə ki, ümumişlək modal sözlərlə auditoriya ciddi siyasi məsələlərin çözülməsini böyük natiqin dilindən eşidir: “***Məncə***, bu təşkilatın perspektivləri var. O, hər bir respublikanın daha müvəffəqiyyətlə inkişafı üçün lazımdır. Buna görə də mən Azərbaycanın rəhbəri olanda MDB-yə etimad ab-havası və birliyə daxil olmaqdan ötrü şərait yaratmaq üçün çox səy göstərdim. ***Doğrusu***, bu o qədər də asan deyildi. Müxtəlif səbəblər ucbatından Azərbaycanda Müstəqil Dövlətlər Birliyinə qarşı çox mənfi münasibət yaranmışdı” [IIc.s.23].

“Zənnimcə” modal sözü Heydər Əliyevin nitqində gələcəyə yönələn elmi fikirlərin auditoriyaya izahı ilə bağlı məqamlarda öz yerini tapır: “Biz gələcəkdə qaz ixrac edəcəyik. Bununla yanaşı, sizin bu suallarınız Azərbaycanı qaz və neftin Mərkəzi Asiyadan Avropaya nəql olunması baxımından cəlb edir. Qazaxıstandakı “Tenqiz” yatağından neftin Azərbaycan vasitəsilə Avropaya ixracı sahəsində əməkdaşlığa artıq başlanmışdır. Belə hesab edirəm ki, Türkmənistanda da qazın Xəzər dənizi və Azərbaycan vasitəsilə ixracının təşkili bütün tərəflər üçün çox faydalı olardı. ***Zənnimcə***, biz buna gəlib çıxacağıq” [VIIIc.s.266].

“Zənnimcə” modal sözü böyük natiqin dilində söylənilən fikrin özünə məxsus olduğunu auditoriyaya izah edir. Neftin nəqli ilə bağlı sazişlər və bu sazişlərə mane olan qüvvələrə münasibətini bildirir: “***Zənnimcə***, sazişlərin dayandırılması

haqqında söhbətlər bilərəkdən, Azərbaycanın yeni rəhbərliyi haqqında rəy yaratmaq, atdığımız düzgün addımı gözdən salmaq məqsədi ilə aparılırdı. İndi hamıya aydındır ki, biz heç bir sazişi dayandırmamışıq, çünki belə sazişlər, ***ümumiyyətlə***, olmamışdır" [Ic.s.134-135].

Böyük natiq "zənnimcə" modal sözünü hadisələrə öz şəxsi fikrini bildirdiyi məqamlarda işlədir: "Mən böyük imkanlara malik olduğumuzu dedim. Bizdə meyvə, üzüm olduqca çoxdur, uzümçülük sənayesi, hər cür bolluca tərəvəz var. ***Yeri gəlmişkən***, Azərbaycanın meşə və dağlarında çoxlu cır meyvə də yetişir. Bilirəm ki, bu meyvələr Avropanın diqqətini həmişə cəlb edir. Sadəcə olaraq bu məsələni daha konkret şəkildə müzakirə etmək lazımdır. ***Zənnimcə,*** biz əməkdaşlıq üçün imkanlar tapacağıq" [XIIc.s.56]. Burada Azərbaycan təbiətinə dərindən bələdik, Avropa ölkələrinin bizim kənd təsərrüfatı məhsullarımıza tələbatı "zənnimcə" modal sözü ilə gələcəkdə yaranacaq əməkdaşlığa zəmin yaradır.

"Zənnimcə" modal sözü elmi mühakimələrdə Heydər Əliyevin çox işlətdiyi modal sözdür. Bu modal söz cümlənin ortasında da işlədilir: "Kənd təsərrüfatı sahəsində, kənd təsərrüfatı məhsulları istehsalı sahəsində keçən ilin nəticələri haqqında burada verilən məlumatlar, ***zənnimcə***, tam təsəvvür yaradır" [VIc.s.56]

Natiq hadisələrə öz şəxsi münasibətini bildirmək üçün çox vaxt "zənnimcə", "mənim fikrimcə" modal sözlərlərindən istifadə edir: "Mənim fikrimcə" modal sözü Heydər Əliyevin dilində mühüm yer tutur: "***Mənim fikrimcə***, "Ölülər" əsərinin ikinci mühüm cəhəti ondan ibarətdir ki, orada təkcə dindən istifadə edib fırıldaqla məşğul olan adamlar ifşa edilmir, həm də insanların mənəviyyatının nə qədər əhəmiyyətli olduğu açıq-aşkar göstərilir" [IIIc.s.80].

Natiqlik sənətində hadisələrə natqin öz baxışlarını, şəxsi fikirlərini bildirən "zənnimcə", "fikrimcə" modal sözləri Hey-

dər Əliyevin nitqlərini də tərk etmir. "Zənnimcə" modal sözü müxtəlifyönlü məsələlərə böyük natiqin şəxsi münasibətini bildirir. XXI əsrin astanasında zor gücünə dövlətdə dəyişikliklərə beynəlxalq təşkilatların imkan verməyəcəyinə öz fikrini bildirir. Əgər belə bir iş baş verərsə gerçəkliyə uyğunluğun qəti təsdiqini bildirən "əlbəttə" modal sözü ilə "biz buna yol verməyəcəyik" qətiyyətli ifadəni işlədir: "***Zənnimcə***, dünya birliyi və beynəlxalq təşkilatlar heç vaxt imkan verməzlər ki, indi, biz XXI əsrin astanasında olduğumuz bir vaxtda, dünya sivilizasiya və demokratiya yolu ilə getdiyi bir vaxtda zor gücünə dövlətdə dəyişikliklər və ya bir dövlətin bütövlüyündə dəyişikliklər edilməsi mümkün olsun. ***Əlbəttə***, biz buna yol verməyəcəyik və öz sərhədləri daxilində vahid, bütöv dövlət kimi Azərbaycan öz ərazisinin və öz müqəddəratının tam sahibi olacaqdır" [Ic.s.131-132].

Heydər Əliyev zənnində, fikrində yanılmayan siyasətçilərdəndir ki, "zənnimcə" modal sözünü eşidən auditoriya həmin modal sözdən sonra gələn fikirlərin reallaşacağına inanır: "Zənnimcə, gənclərimiz nizami ordu yaradılacağına inanaraq, onun doğurdan da Azərbaycanı qorumaq üçün yaradılacağına inanaraq ordu sıralarında xidmət etməyi özlərinin şərəfli vəzifəsi sayacaqlar" [Ic.s.175-176].

"Xatirinizdədirsə" modal sözün köməyi ilə Heydər Əliyev auditoriyanı özü ilə keçmişə aparır, auditoriyada canlanma yaradır, auditoriyanı diqqətin yayınması kimi hallardan xilas edir: "***Xatirinizdədirsə***, elan olunandan sonra sonra ki, Şeyx Nəsrullah ölüləri dirildəcəkdir, nə qədər adam onun gəlişini böyük maraqla gözləyirdi... "Ölülər" əsəri ilə tanış olanlar bu dialoqları yaxşı bilirlər" [IIIc.s.81]. Yuxarıdakı situasiyada böyük natiq Mirzə Cəlil dühasının yaratdığı ölməz "Ölülər" əsərini auditoriya ilə birgə varaqlayır.

"Xatirimdədir" modal söz gerçəkliyin keçmiş vaxtlardakı təsdiqindən xəbər verir desək yanılmarıq. Azərbaycan tarixi-

nin, ədəbiyyatının keçmişini "xatirimdədir" modal sözü ilə auditoriyaya xatırladır, arxasınca qəti təsdiq modallarla fikrini çıxış günü üçün təsdiqləyir: "***Xatirimdədir***, bir dəfə haradasa dedim ki, Nizaminin fəlsəfi görüşləri haqqında çoxlu tədqiqatlar aparmışlar. ***Şübhəsiz***, Nizaminin şeirlərini proletar şeirinə döndərmək mümkün deyildir, ona görə də hamı sübut etməyə çalışmışdır ki, Nizami metafizik yox, dialektik olmuşdur. ***Əlbəttə***, bunlar təbiidir və heç kimi günahlandırmaq lazım deyil. Mən də bu fikirdə deyiləm. Bu, o dövrün nəticəsidir və indi heç kəs deməsin ki, o zaman belə düşünməmişdir" [IIc.s.94].

Müxtəlif məna növləri daşıyan modal sözlər bir-birinin ardınca ictimai-siyasi məsələlərin çözülməsində ustalıqla işlədilir: "***Düzdür***, müharibəni Azərbaycan xalqı başlamayıbdır. Bu müharibə başıbəlalı Azərbaycanı parçalamaq, yenidən dağıtmaq məqsədi güdən böyük siyasi qüvvələr tərəfindən başlanıb. Ancaq eyni zamanda bu məsələlərin həllinə ağılla, səriştə ilə yanaşılsaydı, ***şübhəsiz ki***, biz belə fəlakətli, faciəli nəticələrə gəlib çıxmazdıq. Nə etməli, ***görünür***, taleyimiz belə imiş. Amma bu, təkcə tale ilə bağlı deyil. Bütün bunlar, ***şübhəsiz***, obyektiv səbəblərdən çox, subyektiv səbəblərlə bağlıdır" [Ic.s.164-165].

Azərbaycan xalqının böyük siyasi qüvvələr tərəfindən müharibəyə cəlbi gerçəkliyə uyğunluğun qəti təsdiqi olan "düzdür" modal sözü ilə başlayır. "Tale belə imiş" ifadəsinə güman bildirən "görünür" modal sözünün qoşulmasının ardınca "amma" qüvvətləndirici ədatı ilə auditoriyanı gümandan çıxararaq "şübhəsiz" modal sözü ilə hər şeyi taleyin boynuna yükləməməyi, subyektiv amillərə də diqqət yetirilməsini auditoriyanın nəzərinə çatdırır.

Bəzən də böyük natiqin çıxışlarında eyni məna daşıyan modal sözlər bir cümlədə işlədilir. Qonşu Gürcüstanda rəsmi səfərdə olan Heydər Əliyev Gürcüstanın qonşu və dost ölkə olmasını "əlbəttə", "şübhəsiz" modal sözlərinin arxasınca gü-

man edirəm modal sözünü işlədir: “***Əlbəttə***, ***şübhəsiz***, Gürcüstan bizim üçün yaxın qonşu və dost ölkədir. Çox böyük tarixi əlaqələrimiz var. Bu əlaqələri inkişaf etdirmək üçün mənim Gürcüstana səfərim çox əhəmiyyətlidir və güman edirəm, çox yaxşı nəticələr verəcəkdir” [Vc.s.403-404].

Müxtəlif mənalı modal sözlərin birgə işlədilməsi ilə bağlı bir neçə sitat gətiririk:

Ukraynada səfərdə olan Heydər Əliyev Ukrayna-Azərbaycan münasibətlərinin formalaşmasındakı xidmətlərinə görə Ukraynanın ali dövlət mükafatına layiq görülməsini səmimi ifadələrlə auditoriyaya açıqlayır. Öz respublikasında- Azərbaycan Respublikasında mükafat almamasını gerçəkliyin adi (təbiidir) və qəti (əlbəttə) təsdiqini bildirən modal sözlərlə qeyd edir və bu fikirlərin kimə məxsusluğunu auditoriya böyük natiqin dilindən bilavsitə eşidir: “Son vaxtlar Ukrayna ilə Azərbaycan arasında əlaqələr uğurla inkişaf edir və bu işdə Ukrayna prezidentinin, hörmətli Leonid Daniloviç Kuçmanın böyük xidməti var. ***Şübhəsiz***, bu əlaqələrin inkişafı üçün mən də lazımi tədbirlər görmüşəm və görürəm və mənim bu azacıq xidmətim indi belə yüksək qiymətləndirilmişdir. Açığını deyirəm, mən Azərbaycan Respublikasının prezidenti vəzifəsində ilk dəfədir ki, mükafat alıram. Öz respublikamda indiyədək heç bir mükafat almamışam. ***Əlbəttə***, bu təbiidir, mənim fikrimcə, prezident öz respublikasının mükafatı ilə təltif edilə bilməz. Mən başqa dövlətin, dost ölkə, dost dövlət olan Ukraynanın mükafatını da ilk dəfə alıram” [IXc.s.49-50].

Heydər Əliyevin nitqində modal sözlər qüvvətləndirici ədatlarla çulğalaşa, nitqə xüsusi çalarlar qazandıra bilir. Belə ki, güman bildirən “görünür” modal sözü gerçəkliyə uyğunluğun adi dərəcəsini bildirən “təbii ki” modal sözü ilə birgə işlədilir. Sonda “bax” ədatı ilə fikir qüvvətləndirilir: “Görünür, bunlar da az imiş. 1987-ci ildə mən istefaya getdikdən sonra, 1988-ci ildə Ermənistan-Azərbaycan münaqişəsi başlandı.

Təbii ki, mən bu məsələ barəsində öz mövqeyimi bildirdim. Mənim mövqeyim Qorbaçovun və onun komandasının mövqeyinə uyğun gəlmədi. Bax, burada biz toqquşduq" [XIIc.s.78].

Böyük natqin dilində müxtəlif mənalı modal sözlər çulğalaşır. XXVI Yay Olimpiyadasında (Atlanta, ABŞ) iştirak edəcək Azərbaycan idmançıları ilə görüşdə komandamızın Olimpiya oyunlarında iştirakını qəti təsdiq modal sözü "şübhəsiz ki" ilə əlamətdar hadisə hesab edir. Sonrakı nitq mərhələsində "birinci tərəfi", "ikinci tərəfi" davamiyyət bildirən modal sözlərlə bu iştirakı dəyərləndirir. Fikrini isə "ancaq" ədatı ilə qüvvətləndirərək "güman edirəm" modal sözlə bitirir: "***Şübhəsiz ki,*** sizin, yəni Azərbaycan Respublikası komandasının XXVI olimpiya oyunlarında iştirak etməsi özü əlamətdar bir hadisədir. Siz oradan hansı nailiyyətlə qayıdacaqsınız, bu məsələnin ***ikinci*** tərəfidir. ***Birinci*** tərəfi ondan ibarətdir ki, siz XXVI olimpiya oyunlarında Azərbaycanı təmsil etmək hüququ qazanmısınız və Azərbaycan xalqı adından dünya olimpiya oyunlarında iştirak edəcəksiniz. ***Ancaq*** hər biriniz, ***güman edirəm***, Azərbaycanın hər bir vətəndaşı sizin orada iştirakınızın nəticələrini gözləyəcəyik" [VIIc.s.8].

Müxtəlif modal sözlərin çulğalaşmasının tez-tez şahidi oluruq. Ermənistan-Azərbaycan münaqişəsinin sülh yolu ilə həllində bu gün də hərbi əməliyyatların davam etməsinə təəssüf edərək, qarşı tərəfin yola gəlmədiyi təqdirdə müdafiə qüdrətimizin güclənməsini "əlbəttə" və "təbii" təsdiq modal sözlərlə ana xətt kimi auditoriyaya çatdırır: "Biz ***əlbəttə***, bununla razılaşa bilmərik və ona görə də problemi danışıqlar yolu ilə həll etməyə səy göstərməklə yanaşı, torpaqlarımızın, ərazimizin müdafiəsi üçün tədbirlər də görürük. ***Təbii ki***, bütün bunlar hərbi əməliyyatlara gətirib çıxarır və həmin əməliyyatlar, təəssüflər olsun, bu gün də davam edir. Lakin bir daha təkrar edirəm ki, biz hərbi əməliyyatların davam etdirilməsini istəmirik, biz məsələnin sülh yolu ilə həllinə tərəfdarıq" [Ic.s.438].

Müstəqilliyin ilk illərindəki çıxışlarda modal sözlər daha geniş yer almışdır. 21 sentyabr 1993-cü il Azərbaycan Respublikası Elmlər Akademiyasında ziyalılarla görüş bu qəbildəndir. Bu çıxışda gerçəkliyə uyğunluğun qəti təsdiqini bildirən "şübhəsiz" və "şübhəsiz ki" modal sözlər daha çox işlənmişdir: "Bu gün, ***şübhəsiz ki***, hər bir kəsi, o cümlədən ziyalıları ən çox maraqlandıran və eyni zamanda ən çox narahat edən Azərbaycan Respublikasının indiki vəziyyətidir. Bu hər bir Azərbaycan vətəndaşını düşündürür, narahat edir və ən çox, ***şübhəsiz ki***, ziyalıları, intellektual səviyyəli adamları düşündürür" [Ic.s.148].

"Şübhəsiz" modal sözü xalqın birləşməsi məqamlarında işlənir: "Qarşımızda vəzifələr çoxdur. Ancaq ***şübhəsiz ki***, tək mən, yaxud da ki, mənimlə bərabər bir neçə adam bunların hamısının öhdəsindən gələ bilməz. Xalq birləşməlidir. Xalqın ağlı, zəkası, biliyi birləşməlidir" [Ic.s.150].

"Şübhəsiz ki" modal sözü böyük natiqin nitqində müstəqilliyimizlə fəxr edilməli, onun qiymətləndirilməsi məqamlarında işlənir: "Müstəqillik Azərbaycan üçün böyük tarixi bir hadisədir, taleyin xalqımıza verdiyi böyük bir fürsətdir. ***Şübhəsiz ki,*** biz bununla fəxr etməliyik" [Ic.s.150].

"Şübhəsiz ki" modal sözü Heydər Əliyevin nitqində ilk demokratik respublika yaradılmasının tarixi hadisə olmasına işarədir: "Azərbaycanda 1918-ci ildə ilk demokratik respublika yaradıldı. Bu, ***şübhəsiz ki***, tarixi bir hadisədir" [Ic.s.153].

Bu çıxışda bir neçə məqamda "təəssüf" modal sözü işlənir. Heydər Əliyev təəssüf edir. Heydər Əliyev xalqın mənəvi imkanlarından istifadə olunmasına təəssüf edir: "Xalqımız öz suverenliyini, öz müstəqilliyini qorumağa qadir xalqdır. ***Təəssüf ki,*** Azərbaycan xalqının içində, mənəviyyatında olan imkanlardan bu dövrdə istifadə olunmayıbdır" [Ic.s.149].

Heydər Əliyev vətən qarşısında borcunu anlamayanlara, borcunu dərk etməyən insanlara təəssüf edir: "Hamı borclu-

dur. Heç kəs deyə bilməz ki, borclu deyil. Xalqın övladları bu torpaqda doğulub dünyaya gəliblərsə, atalarımızın, babalarımızın ruhu bizim üçün müqəddəs və əzizdirsə, öz borcumuzu verməliyik. Bu, hamının borcudur. ***Təəssüf ki,*** bəzi adamlar belə hesab edirlər ki, kimsə qoy gedib torpağı müdafiə etsin, amma o birisi öz şəxsi işi ilə məşğul olsun" [Ic.s.149].

Heydər Əliyev öz şəxsi mənafelərini, şəxsi məqsədlərini ön planda saxlayan qruplara təəssüf edir. Bəzən "təəssüf" modal sözü həm söz, həm də cümlə rolunu oynayır: "Son illərin ən əcaib hadisəsi ondan ibarətdir ki, Azərbaycanın bu ağır dövründə birləşib torpaqlarımızı qorumaq, millətimizin, xalqımızın şərəfini qorumaq, tariximizi qorumaq əvəzinə ayrı-ayrı qruplar, ayrı-ayrı şəxslər bu fürsətdən istifadə ediblər, vəzifə, məqam hərisliyinə düşüblər, öz şəxsi mənafelərinə, şəxsi məqsədlərinə nail olmağa çalışıblar. Meydana gündə bir siyasətçi çıxıb, ancaq sonra iç üzləri açılıbdır. ***Təəssüf***. Ancaq yəqin ki, xalqımız bunları da görməlidir. Yəqin ki, cəmiyyətin içində olan bu ünsürlər də meydana çıxmalı idilər" [Ic.s.149].

Heydər Əliyev 90-cı illərdə müstəqillik elan olunmasına baxmayaraq respublikanın iqtisadiyyatında, sosial həyatında, elm və mədəniyyətində baş verən mənfi proseslərə təəssüf edir: "***Təəssüf ki,*** müstəqillik əldə ediləndən indiyə qədər iş görülməyibdir. "Müstəqillik, müstəqillik" deyə bağıran adamlar belə hesab edirlər ki, onlar bu müstəqilliyin qəhrəmanıdırlar və müstəqillik Azərbaycan üçün artıq bütün şəraitləri yaradıbdır. Bax buna görə də Azərbaycan belə vəziyyətə düşübdür. Son illər Azərbaycanda gedən proseslər ***təəssüf ki***, respublikanın iqtisadiyyatına, sosial həyatına, elminə, mədəniyyətinə çox böyük zərər vurub" [Ic.s.151]

Heydər Əliyev müstəqillik deyib milli sərvətlərimizi görməyən, bu sərvətdən istifadə etməyən adamlara təəssüf edir: "***Təəssüf ki***, müstəqillik haqqında çox bağıran adamlar bu milli sərvətlərimizi həm görməyiblər, həm də onlardan isti-

fadə etməyi bacarmayıblar, yaxud da ki, istifadə etmək istəməyiblər” [Ic.s.151].

Heydər Əliyev bazar iqtisadiyyatı ilə bağlı elmimizin dağılmasına, mədəniyyətimizə biganə yanaşmağımıza təəssüf edir: “Ancaq bir tərəfdən biz müstəqillik əldə edərək böyük iftixar hissi ilə yaşayırıq, digər tərəfdən isə ***təəssüf ki***, elmi dağıdır, mədəniyyətə biganə yanaşırıq. Bazar iqtisadiyyatına keçmək o demək deyildir ki, elmə, mədəniyyətə ayrılan vəsait azaldılmalı, bu sahələr ağır maddi vəziyyətə salınmalıdır” [Ic.s.160].

Heydər Əliyev şəxsiyyətlərin ideallaşdırılmasına təəssüf edir: “Ona görə də heç bir dövrü, heç bir şəxsi ideallaşdırmaq lazım deyildir, ***təəssüf ki***, bu ideallaşdırma xəstəliyi 70 ildir beynimizə girmişdir. Bundan xilas olmaq lazımdır” [Ic.s.156].

Heydər Əliyev tariximizdə təhrif olunan faktlara təəssüf edir. Tarix fəlsəfəsinə söykənərək “tarixi təhrif etmək olmaz” prinsipindən istifadə edir: “Biz tariximizi həmişə obyektiv təhlil etməliyik və bugünkü nəslə, gələcək nəsillərə düzgün çatdırmalıyıq. ***Təəssüf ki,*** əvvəlki dövrlərə aid tariximizdə çox faktlar təhrif olunubdur, indi də təhrif edilir” [Ic.s.154].

Ulu öndərin Elmlər Akademiyasında 21 sentyabr 1993-cü ildə, müstəqilliyin keşməkeşli ağır dövründəki çıxışı 1997-ci ildə Yeni Azərbaycan Partiyasının yaradılmasının 5-ci ildönümü münasibətilə etdiyi çıxışla (28 modal söz) müqayisə olunmuşdur. Akademiyada olan çıxış həcm etibarilə iki dəfədən az olmasına baxmayaraq modal sözlər say etibarilə çox işlənmişdir (33 modal söz).

Təkcə, bu çıxışda 13 yerdə “təəssüf”, 8 yerdə “şübhəsiz” modal sözü istifadə edilmişdir.

Modal sözlərin nitqin ekspressivliyini, məna yükünü, əlvanlığını necə yüksəltməsini əyani izah etmək məqsədilə Heydər Əliyevin bir neçə çıxışı araşdırılmışdır. Nitq boyu modal sözlərin bir-birini əvəz etməsindəki qanunauyğunluqlar tədqiq

olunmuşdur. Bu baxımdan müxtəlif mövzulu çıxışlara diqqət yetirilmişdir. 29 noyabr 1997-ci ildə Respublika sarayında Yeni Azərbaycan Partiyasının yaradılmasının 5-ci ildönümü münasibətilə keçirilən təntənəli yığıncaqdakı nitq YAP yaradılarkən baş verən çətinliklərlə başlayır. Bu zaman "xüsusən" modal sözünün köməyilə o dövrdəki siyasi vəziyyət auditoriyaya izah olunur: "Yeni Azərbaycan Partiyası yaranarkən onun tərəfdarları cox idi. Ancaq onun yaranmasına maneçilik göstərənlər də az deyildi. ***Xüsusən,*** o zaman, Azərbaycanda çoxpartiyalılıq prinsipinin elan olunmasına baxmayaraq, Yeni Azərbaycan Partiyasının yaranması hakimiyyət dairələri tərəfindən heç də müsbət qəbul edilməmişdir" [XIIIc.s.263].

Sonrakı nitq ardıcıllığında böyük natiq "düzdür" təsdiq və "nəhayət" yekunlaşdırıcı modal sözlə partiyaların necə yaranmasına aydınlıq gətirir. Bu aydınlığı "məhz" dəqiqləşdirici ədatı ilə başlayıb, "düzdür" modal sözü ilə təsdiq edir: "Deyə bilərəm ki, Azərbaycanda partiyaların tam əksəriyyəti ***məhz*** belə yaranmışdır. Yəni ayrı-ayrı şəxslər qruplaşaraq siyasi fəaliyyət göstərmək üçün, – bəziləri deyirlər ki. hakimiyyət əldə etmək üçün, – partiyalar yaratmağa başlamışlar. ***Düzdür***, Azərbaycanda onların çoxu elə yaranan zamandan indiyədək çox kiçik bir partiya, yaxud qrupdurlar. Ancaq yaranma prosesi belə olmuşdur" [XIIIc.s.265].

Heydər Əliyev "nəhayət" modal sözü ilə Yeni Azərbaycan Partiyasına başçılıq etməyə razılıq verməsinin səbəblərini sadalayır, ictimai-siyasi vəziyyəti auditoriyaya izah edir və "nəhayət" yekunlaşdırıcı modal sözlə müəyyən nitq mərhələsi üşün fikrini tamamlayır: "***Nəhayət***, Azərbaycanda vəziyyətin get-gedə ağırlaşdığını, çətinləşdiyini görərkən və bu partiyanın yaranması ilə əlaqədar mənə müraciət edən ziyalıların, respublikanın tanınmış adamlarının – ölkəmiz, xalqımız, torpağımız üçün ürəyi həqiqətən yanan adamların iztirabını duyarkən, onların xalqımız, ölkəmiz üçün bir iş görmək arzu-

sunu hiss edərkən mən tədricən belə bir partiyanın yaranmasına kömək etməyə razılığımı verdim" [XIIIc.s.265].

"Şübhəsiz" və "doğrudan da" qəti təsdiq modal sözləri ilə Yeni Azərbaycan Partiyasının yaranması ilə bağlı güman və şübhə buludlarını dağıdır, məntiqi təfəkkürlə auditoriyanı inandıra bilir, sonda "demək" modal sözü ilə fikrini yekunlaşdırır. Bu zaman "mən özüm haqqında demirəm" səmimiyyəti ilə partiya əməkdaşlarını qiymətləndirir: "***Şübhəsiz***, sonrakı hadisələr onu göstərdi ki, o vaxt Azərbaycandakı vəziyyət doğrudan da, belə bir patiyanın yaradılmasını bəlkə də biz anladığımızdan da çox tələb edirdi. 1993-cü ilin iyun ayında respublikada baş vermiş hadisələr Azərbaycanda hakimiyyət böhranı, vətəndaş müharibəsinin başlanması onu göstərdi ki, Azərbaycanın o vaxtkı iqtidarı və o vaxt mövcud olan çoxsaylı partiyaların heç biri xalqı, milləti bu vəziyyətdən çıxarmağa qadir deyildir. Tarix artıq bunu sübut edibdir. Əgər o çoxsaylı partiyalar, – o vaxtlar çoxları, hərə özü üçün bir partiya yaratmışdı, həmin partiyaların bir çoxu Yeni Azərbaycan Partiyasından xeyli əvvəl yaranmışdı, – buna qadir idilərsə, onlar Azərbaycanı o vəziyyətdən çıxaraydılar. Yaxud, iqtidarda olan Xalq Cəbhəsi, Müsavat Partiyası əgər buna qadir idisə – iqtidarda idi, hökuməti əlində saxlayaydı, dövləti müdafiə edəydi, dövlətin hüquqlarını saxlayaydı. Bunları nə iqtidarda olan partiyalar, nə də o vaxt iqtidara müxalifətdə olan partiyalar edə bildilər. ***Demək***, bu onu göstərir ki, bu partiyanı yaratmaq istəyən adamlar – mən özüm haqqında demirəm, onun təşəbbüskarları haqqında deyirəm – uzaqgörən imişlər, ***həqiqətən*** Azərbaycanın gələcəyi haqqında düşünürmüşlər" [XIIIc.s.268].

Növbəti nitq mərhələsində partiya yaranandan sonra müəyyən qrupların mənfi münasibətinə təəssüf edir, "görünür" modal sözlə o qrupları "dar düşüncəli insanlar" hesab edir, zamanın hər şeyi yerinə qoyduğunu söyləyərək "ən" qüvvətləndirici ədatının köməyilə Yeni Azərbaycan Partiyasının

dəyərliliyini auditoriyaya açıqlayır: "Partiya yaranarkən bu, əhali tərəfindən çox rəğbətlə qarşılandığı halda, ***təəssüf ki***, bəzi partiyalar, o cümlədən o vaxtkı iqtidar tərəfindən mənfi qarşılandı. Bəziləri hesab edirdilər ki, bu, zəif bir partiya olacaq, güclü partiya olmayacaqdır, cəmiyyətdə öz yerini tuta bilməyəcəkdir. ***Görünür***, onlar çox dar düşüncəli insanlar idi. Mən o vaxt da belə düşünürdüm. Amma ötüb keçən zaman hər kəsə hər şeyi sübut etdi. Beş il içərisində Yeni Azərbaycan Partiyası təşkilatlandı, genişləndi, böyüdü, möhkəmləndi və indi ölkəmizin ictimai-siyasi həyatında fəal iştirak edərək Azərbaycanın ***ən*** nüfuzlu, ***ən*** böyük və ***ən*** dəyərli partiyasıdır" [XIIIc.s.270].

Böyük natiq "bilirsiniz" modal sözü ilə həmişəki kimi insan fəlsəfəsinə keçir. İnsanın öz düşüncələrində, fikirlərində sərbəst olması ideyasını ön planda saxlayır. Heydər Əliyev böyüklüyünə xas olan bir dillə təvazökarlıq və səmimiyyətlə bağışlaya bilir, hər kəsi öz vicdanı ilə baş-başa qoyur: "***Bilirsiniz***, – mən bunu dəfələrlə demişəm, – mən bu insanların heç birisini o qədər qınamıram. İnsan müstəqildir, insan azaddır. İnsanı heç bir şeyə vadar etmək lazım deyil. ***Xüsusən*** məcbur etmək də lazım deyil. İnsan gərək hər bir şeyi özü istədiyi kimi etsin, öz istəyinə görə etsin və özünün mənəviyyatına uyğun etsin. Ona görə mən o adamlara da, hansılar ki, məsələn, bu 91-lərin imzaladığı o müraciəti imzalamayıblar, – onlara da mənim bu gün heç bir iradım yoxdur. Hərə özü öz tarixini təhlil etməlidir, hərə özü öz işinə qiymət verməlidir" [XIIIc.s.271].

Yenə də qəti təsdiq modal sözü olan "şübhəsiz ki" nitqdə işə düşərək Heydər-xalq, xalq-Heydər anlamını bir daha ortaya qoyur. Heydər Əliyev dühasının bir partiyaya sığa bilməyəcəyinin şəksiz-şübhəsiz olduğunu auditoriya qəbul edir: "Mən bunu demişəm, – ***şübhəsiz ki***, mən Azərbaycanın prezidenti seçilərkən Yeni Azərbaycan Partiyasının seçkisi nəticəsində seçilməmişəm. Siz bunu bilməlisiniz. O vaxt bütün

xalq – Yeni Azərbaycan Partiyasının üzvü olan da, olmayan da hamısı Heydər Əliyevin Azərbaycana, Bakıya gəlməsini tələb etdi və oktyabr ayında Heydər Əliyevin prezident seçilməsinə səs verdi. Ancaq prezidentin və Yeni Azərbaycan Partiyasının proqramı, prezidentin siyasəti eynidir" [XIIIc.s.273].

Partiya üzvləri qarşısında Heydər Əliyev 1993-cü ildə paralel aparır, "bəli" təsdiq ədatı ilə belə sakit, rahat, əmin-amanlıq şəraitinin o vaxtlar təsəvvürünün çətinliyini dilə gətirir, yenə də "bilirsiniz" modal sözü ilə insan, yaddaş, zaman fəlsəfəsini, unutqanlıq anlayışını bir araya sığışdırır: "Bəlkə də 1993-94-cü illərdə bunu təsəvvür etmək mümkün deyildi ki, Azərbaycan bu gün belə sakit, rahat, əmin-amanlıq şəraitində, sabitlik şəraitində yaşayacaqdır. Bəli, bunu o vaxt təsəvvür etmək mümkün deyildi. ***Bilirsiniz***, indi insanlar rahat yaşayır və artıq keçmişi unudurlar. Bəziləri elə bilir ki, belə də olmalı idi, belə də normaldır. Amma ay yoldaşlar, ay qardaşlar, ay bacılar, axı bu belə deyildir. Biz buraya nə qədər çətinliklərlə gəldik. Azərbaycanı daxildə nə qədər yaramaz ünsürlərdən təmizlədik, düşmən ünsürlərdən təmizlədik" [XIIIc.s.275].

"Xatirimdədir" modal sözlə Heydər Əliyev auditoriyanı keçmişə aparır. Auditoriya 1991-ci ilə qayıdır, hələ o vaxt Heydər Əliyevin dediyi fikirlərin doğruluğunun şahidi olur: "Mənim ***xatirimdədir***, 1991-ci ilin mart ayında Ali Sovetin sessiyasında SSRİ-nin qorunub saxlanılması haqqında referendum barəsində müzakirə gedərkən, mən o vaxt da qətiyyətlə dedim ki, Sovetlər İttifaqı dağılır, biz nəyin bahasına olursa-olsun müstəqilliyi əldə etməliyik. Biz bunu etməsək böyük günah etmiş olarıq. Əgər etməsək, onsuz da bunu gələcək nəsillər edəcəkdir. İndi siz görürsünüz ki, artıq dövlət müstəqilliyi reallığa çevrilibdir" [XIIIc.s.277].

Sonrakı nitq mərhələsində "bir neçə kəlmə Azərbaycanda çoxpartiyalı sistem haqqında" Heydər Əliyev öz fikirlərini irəli sürür, partiyaların qanun qarşısındakı məsuliyyətlərini

"şübhəsiz ki" modal sözlə yada salır, bəzi partiyaların silahlı dəstələri tərksilah etməməsinə təəssüf edir: "Hər bir partiya qanun çərçivəsində fəaliyyət göstərməlidir və qanundan kənara çıxmamalıdır. Əgər hansısa partiyanın qanuni hüquqları pozulursa***, şübhəsiz ki,*** dövlət bunun qarşısını almalıdır. Biz buna cavabdehik. Ancaq eyni zamanda biz qanunun pozulmasına da yol verməyəcəyik. Qanunu pozanlar qanun qarşısında cavabdehdirlər və cavabdeh olmalıdırlar. Mən bunu ona görə deyirəm ki, ***təəssüf ki***, yaxın keçmişə qədər bizdə partiyaların hətta silahlı dəstələri var idi" [XIIIc.s.279].

Çıxışını "güman edirəm ki" modal sözünə yaxın olan "hesab edirəm ki" modal sözü ilə iki yerdə təkrarlamaqla proqnostik olaraq Yeni Azərbaycan Partiyasının gələcək perspektivlərini partiya üzvləri qarşısında açıqlayır: "***Hesab edirəm ki,*** Yeni Azərbaycan Partiyası yaranmasının 5-ci ildönümünü qeyd edərək daha da çox təcrübə, güc toplayaraq gələcəkdə daha geniş fəaliyyət göstərəcəkdir. Bu 5 il müddətində Yeni Azərbaycan Partiyası sübut edibdir ki, o sağlam partiyadır, demokratik prinsiplərə söykənən partiyadır, Azərbaycanın müstəqilliyinin təmin olunması yolunda fəal çalışan partiyadır. ***Hesab edirəm ki,*** Yeni Azərbaycan Partiyasının fəaliyyətinə Azərbaycanda maraq günü-gündən artacaq, onun sıraları genişlənəcək, Yeni Azərbaycan Partiyasına gənclər daha da çox maraq göstərəcəklər" [XIIIc.s.290].

Publisistik üslubda söylənilən bu nitqdə (Yeni Azərbaycan Partiyasının 5-ci ildönümü münasibətilə) 28 dəfə modal sözdən istifadə olunmuşdur. Bu zaman təsdiq bildirən modal sözlər içində "düzdür" (2), "doğrudur", "şübhəsiz" və "şübhəsiz ki", (5) halda işlənmişdir. Yekun və nəticə bildirən modal sözlər içərisində "nəhayət" (3), "demək" (3), "beləliklə" (1), "beləliklə də" (8) halda istifadə olunmuşdur. "Güman edirəm ki", "hesab edirəm ki", "görünür" kimi güman və ehtimallıq bildirənlər 4 yerdə işlənmişdir. İfadə olunan fikrə

emosional münasibət bildirən modal sözlər-"təəssüf ki", "təəssüflər olsun ki" 3 halda rast gəlinmişdir. "Xatirimdədir", "bilirsiniz" kimi modal sözləri də fikrə emosional münasibət bildirən qrupa aid etmək olar.

Modallıq daim dəyişmədə və inkişafda olan canlı bir prosesdir. Nitq prosesində yeni-yeni leksik vahidlərin modal sözlərə çevrilməsi, modallıq ifadə etməsi müşahidə olunur. Bu dialektik inkişaf prosesində modal sözlərin dilin lüğət fondunda xüsusi çəkisi artan xətlə yüksəlir[1]. Şükranlıq dilindən düşməyən ulu öndərin nitqində özünəməxsus modal sözlər içərisində "şükürlər olsun ki" yuxarıdakı fikirləri özündə ehtiva edir: "***Şükürlər olsun ki***, orada müharibə qurtardı. İndi kommunikasiya xətləri açıqdır, dəmir yolu da işləyir, avtomobil yolu da. Hətta Bakıdan sərnişin qatarları Kiyev və Moskvaya gedərkən Çeçenistan ərazisindən keçir" [XIIc.s.72]. Ölkənin iqtisadi durumunun komunikasiyalardan asılı olduğunu, bu komunikasiyaların açılmasına şükranlığını dilə gətirir, auditoriyanı da şükranlıq hissləri yaşamağa sövq edir.

"Allaha şükürlər olsun ki" modal sözü islam dini, bu din uğrunda mücadilə edən insanlarla bağlı çıxışlarda səslənir: "Şeyx Şamilin qohumları, nəvə-nəticələri Azərbaycanda yaşayıblar. ***Allaha şükürlər olsun ki,*** onlardan biri də indi burada bizimlə bir yerdədir, Azərbaycanın Şəki rayonunda yaşayır" [XIIIc.s.144]. Şeyx Şamil kimi Qafqaz qəhrəmanının qohumlarının sağ qalmasına, Şeyx Şamil nəslinin davam etməsinə şükür edir. Bu şükranlıq İslam dininə sadiq insanların nəslinin davam etməsinədir.

"Bilirsiniz" modal sözü araşdırmalar göstərir ki, əsasən Heydər Əliyevin nitqində işlədilir. Bu da təbiidir. Ona görə ki,

---

[1] Cahangirov Fikrət. Modallıq kateqoriyasının məntiqi və qrammatik mahiyyəti // Azərbaycan Milli Elmlər Akademiyasının xəbərləri. Humanitar və ictimai elmlər seriyası, 2003. №1-4, s.283-293.

Heydər Əliyevin izahedicilik xüsusiyyəti kəsb edən nitqləri, fəlsəfi, tarixi dəyərlərə malik olan nitqləri bu modal sözdən istifadəni zəruri edir.

Yenə də Azərbaycanın faciələrlə üzləşdiyi XX əsrin 20-ci illəri. Yenə də həmin illərə Heydər Əliyev baxışı. Və yenə də "bilirsiniz" modal sözünün işlənməsi: "***Bilirsiniz***, əgər Oktyabr inqilabından, 1920-ci ildən sonra zorla, inqilabi yolla, repressiyalarla insanları kolxoza girməyə məcbur ediblərsə, torpaqları zorla repressiyalarla insanların əlindən alıblarsa, indi biz həmin işlərin əksinə apardığımız tədbirlərdə nə zor işlətməliyik, nə də təzyiqlər etməliyik. Biz çalışmalıyıq ki, insanlar dərk etsinlər, anlasınlar" [VIIc.s.91].

"Bilirsiniz" modal sözü həmişəki kimi Heydər Əliyev nitqində fəlsəfi məsələlərin işıqlandırılmasında önəmli köməkçi nitq hissəsidir. Gəlin "bilirsinizmi" modal sözə qədər cümlənin auditoriyada yaratdığı effektə nəzər yetirək: "Burada çıxış edənlər dedilər ki, Füzulinin həyatı çox ağır keçib, bəxti gətirməyib". Auditoriya bu cümlədən sonra "bilirsinizmi" modal sözünü eşidincə bu ağır həyatla bağlı Heydər Əliyev dilindən hökmən yeni bir fikir, yeni bir fəlsəfi düşüncə eşidəcəyinə əmin olur. Çünki hər dəfə "bilirsinizmi" modal sözündən sonra auditoriya hansısa ideyanın açıqlanması, hansısa bir fəlsəfi ideyanın gerçəkləşməsinin şahidi olur: "***Bilirsinizmi***, bir insanın həyatının ağır və məşəqqətli keçməsi, əlbəttə, qeyri-adi bir şey deyildir. Amma buna böyük tarixi nöqteyi-nəzərdən baxsaq, görərik ki, bu, kiçik bir şeydir. Əsas və mühüm məsələ Füzulinin yaradıcılığı və onun qoyub getdiyi irsdir. Onun necə yaşaması və həyatının necə keçməsi o qədər də vacib deyildir. Vacib olan budur ki, o necə bir irs qoyub gedib və 500 ildən sonra biz bu irsdən nə qədər bəhrələnir və faydalanırıq " [VIIc.s.166].

"Bilirsiniz " modal sözü böyük natiqin nitqində gah fəlsəfi fikirlərin, gah siyasi plüralizmin, gah da adi məişət məsələ-

lərinə münasibət tələb olunan məqamlarda işlədilir: "***Bilirsiniz***, Azərbaycanın içərisində olanlar Azərbaycandadır. Azərbaycan demokratik hüquqi dövlət qurur. Azərbaycanda demokratiya bərqərar olubdur. Demokratiya olan yerdə müxalifət olmalıdır və müxalifət də var. Azərbaycanda 30-dan artıq siyasi partiya qeydiyyata alınıbdır, müxalifət qəzetləri var, – Xalq Cəbhəsinin bir neçə qəzeti var, Müsavatın bir neçə qəzeti var, başqa partiyaların qəzetləri var. Hamısı dərc olunur, bunlar müxalifət kimi öz fikirlərini bildirirlər. ***Əlbəttə***, müxalifət iqtidara qarşı öz fikrini bildirməlidir. Amma bu, doğru-düzgün, ədalətli olmalıdır, böhtan yox! Böhtan yox, yalan yox, uydurma yox, saxtalaşdırma yox!" [XIIc.s.93]. Yuxarıdakı nitq parçası "bilirsiniz" modal sözlə ölkədəki iqtidar-müxalifət münasibətlərinə aydınlıq gətirir. "Əlbəttə" təsdiq modal sözü müxalifətin öz fikrini bildirməli olduğunu təsdiq edir. "Yox" inkar ədatları ilə müxalifətə nəyi etməmək tövsiyə edilir.

"Bilirsiniz" modal sözü təkcə fəlsəfi məsələlərdə deyil, beynəlxalq məsələlərdə də auditoriyaları səfərbər edə bilir. Eləcə də bu modal sözlə beynəlxalq təşkilatlar, ölkələr qınağa çəkilir, Azərbaycanın haqq səsinin eşidilməməsinə təəssüf edir: "***Bilirsiniz***, indi münaqişə olan, yaxud ağır iqtisadi vəziyyətdə olan ölkələrə beynəlxalq təşkilatlar da, ayrı-ayrı ölkələr də və xüsusən Amerika Birləşmiş Ştatları da kömək edir. Amerika Birləşmiş Ştatları Ermənistana bilavasitə maddi yardım, maliyyə yardımı göstərir, – bu, dövlət proqramındadır, – Gürcüstana da, Qırğızıstana da, başqalarına da yardım göstərir. Amma Azərbaycana bu yardım qadağan olunubdur" [VIIc.s.187].

Nəticə və ümumiləşdirmə bildirən "demək" modal sözünə qədər böyük natiq görülən işləri sadalayır. Sonda isə "bir sözlə" və "demək" modal sözlərinin köməyilə nitqini yekunlaşdırır: "Yaşayış nə qədər çətin olsa da, insanlar üçün rahatlıqdır. Buna nail olmaq üçün nə qədər səy göstərdik, danışıqlar apardıq, beynəlxalq təşkilatlardan, ATƏT-dən, onun Minsk

qrupundan, Rusiyanın, Amerikanın vasitəçiliyindən istifadə etdik. ***Bir sözlə***, bütün imkanlardan istifadə edərək atəşi dayandırdıq. ***Demək***, vətəndaş müharibəsinin qarşısını aldıq, Azərbaycanı parçalamağa qoymadıq və atəşi kəsdik ki, qüvvələrimizi toplayaq, görək müharibə edəcəyikmi, yaxud torpaqlarımızı sülh yolu ilə qaytaracağıq?" [IIIc.s.150].

"Zənnimcə" modal sözünün köməyilə Heydər Əliyev ölkə həyatındakı mühüm hadisələrə öz qiymətini verir. Tələbə qəbulunda test üsuluna önəm verilməsini müsbət hadisə hesab edən böyük natiq "şübhəsiz ki" modal sözü ilə bu sistemdə nöqsanların da ola biləcəyini normal qəbul edir, bu üsulun gələcək perspektivlərini açıqlayır: "Odur ki, dünyada, daha doğrusu, bir sıra ölkələrdə sınaqdan çıxarılmış test üsulunun Azərbaycanda tələbə qəbulunda tətbiq edilməsi, ***zənnimcə***, çox müsbət hadisələrdən biridir. 1992-ci ildə bu üsulun bizdə də tətbiq edildiyini eşitdikdə mən ona müsbət münasibətimi dərhal bildirmişdim və bu gün də bildirmək istəyirəm. ***Şübhəsiz ki***, bu üsulun tətbiqində səhvlər də, çatışmazlıqlar da olub. Bunlara baxmayaraq, 1992-ci və 1993-cü illərdə test üsulu ilə qəbul əvvəlki bütün illərdəkinə nisbətən daha keyfiyyətli, daha ədalətli olmuşdur və ali məktəblərin müəllimləri və rəhbərləri barəsində bir çox hallarda tamamilə əsassız olan narazılıq və söz-söhbətlər qurtarmasa da, xeyli azalmışdır" [IIc.s.103].

"Daha doğrusu" modal sözü ilə test üsulunun sınaqdan çıxmış üsul olması auditoriyanın diqqətinə çatdırılır. Bu üsulda da səhvlər və çatışmazlıqların ola biləcəyinə şübhə etmir.

"Nəhayət", "bir sözlə", "beləliklə" yekunlaşdırıcı modal sözlərlə yanaşı Heydər Əliyev nitqində "müxtəsəri" yekun bildirən modal sözə də yer ayrılır: "Turizmə dair müqavilə dövlətlərimiz arasında turist hərəkatını genişləndirməyə imkan verəcəkdir. Elm və mədəniyyət haqqında müqavilə də əhə-

miyyətlidir. ***Müxtəsəri***, bu sazişlərdən hər biri xüsusi əhəmiyyətə malikdir" [XIIc.s.39].

"Xatirimdədir" modal sözün köməyilə auditoriyanı keçmişə aparıb "Qaraşəhərin" tərifini verən böyük natiq sonda şükürlər edir. "Allaha şükürlər olsun ki" modal sözlə şəhərimizin hisdən xilas olan hissəsinin bu gününə sevindiyini bəyan edir: "***Allaha şükür olsun ki***, bunlara son qoyulubdur. Görürsünüz ki, indi burada yaşıllıqlar, ağaclar var. Həmin bax o qara yer indi təbiətin ən gözəl rəngləri kimi gözümüzün qarşısındadır. Mənim xatirimdədir, bu zavoda ilk dəfə gələndə, – o vaxt bunun adı Partiyanın XXII qurultayı adına zavod idi, – ərazini gəzən zaman, – bilirsiniz ki, bu zavod dənizin sahilinə çıxır, – dəhşətə gəldim. Çünki o vaxt burada yer də qara idi, dənizin sahili də" [IIc.s.240].

Heydər Əliyev nitqində "Allaha şükürlər olsun ki" modal sözü müstəqilliyimizə xidmət edən hər bir şeyə, hətta radio-televiziya qülləsinin inşasına da tətbiq edilir: "***Allah şükürlər olsun ki***, son iki il müddətində bu tikintiyə böyük təkan verdik və artıq başa çatdırılıb. Siz də, sizinlə bərabər mən də çox böyük iftixar, məmnuniyyət hissi ilə buraya toplaşmışıq və Azərbaycanın fəxri olan radio-televiziya qülləsinin, ötürücüsünün açılışında iştirak edirik. Bu hadisə münasibətilə sizi bir daha təbrik edir və əmin olduğumu bildirmək istəyirəm ki, bu radio-televiziya qülləsi Azərbaycan xalqına, müstəqil Azərbaycan Respublikasına on illərlə, bəlkə də yüz illərlə xidmət edəcəkdir" [VIIc.s.74].

Ümumi dilçilikdə modallıaq kateqoriyasının tədqiqinə xeyli sayda əsərlər[1] həsr olunmasına baxmayaraq, bu mövzu

[1] Xasıyeva İlhamə. İngilis və Azərbaycan dillərində modal tipli sözlərin nitq hissələri sistemində yeri // Filologiya məsələləri, №2, 2008. səh. 131.
Səmədova Jalə. İngilis dilində modallığın sintaktik ifadə vasitələri // Filologiya məsələri, №4, 2008. səh. 82.

hələ də geniş tədqiqə ehtiyacı olan problem kimi qalmaqdadır. Modallıq kateqoriyasını izah edən konsepsiyaların çoxluğu isə tədqiq olunan məsələnin mürəkkəbliyindən xəbər verir.[1]

"Heydər Əliyevin nitqində modal sözlər" fəslini aşağıdakı müddəalarla yekunlaşdırmaq olar:

Qəti təsdiq bildirən "şübhəsiz ki" modal sözü böyük natiqin dilində təkrarlanaraq auditoriyada şübhə yeri qoymur, ərazi bütövlüyümüzün təmin olunmasında, sərhədlərin toxunulmazlığında, işğal olunmuş ərazilərin qəsbkarlardan təmizlənməsində güzəştə yer olmayacağını bəyan edir;

Gerçəkliyə uyğunluğun qəti təsdiqini bildirən "əlbəttə" və "şübhəsiz" modal sözləri böyük natiqin dilində müstəqilliyin ilk illərində Azərbaycanda gedən ictimai-siyasi prosesləri, iqtisadiyyatdakı qanunauyğunsuzluqları çözmək, araşdırmaq baxımından diqqətəlayiqdir;

XX əsrin son mərhələsində dünyada baş verən məhəlli, regional münaqişələrə, insanların rahatlığını pozan toqquşmalara, vuruşmalara Heydər Əliyev "təəssüf ki" modal sözün köməyilə təəssüf edir;

Heydər Əliyev nitqində "təəssüf ki" modal sözü keçmişimizdə baş verən neqativ hallara yönəlir;

Modal sözlər içərisində "təəssüf ki", "təəssüflər olsun ki" kimi mürəkkəb modal sözlər Heydər Əliyev nitqində cəmiy-

---

Ибрагимова Саида. Дискурс модальности в лингвиспеке XX века. AMEA-nın xəbərləri Humanitar elmlər seriyası, 2005, №3, səh. 132-145.

Ибрагимова Саида. Коцепция модальности академика В.В.Виноградова // AMEA, Xəbərlər Humanitar elmlər seriyası, 2005, №4, səh. 87-96.

Грена М. О сущности модальности // В кн. Языкознание в Чехословакии М.: Прогресс, 1978, с.277-301.

Зверева Е.А. Научная речь и модальность Л.: Наука, 1983.

[1] Mahmudova Dilbər. Ümumi dilçilikdə modallıq kateqoriyasının tədqiqi // Filologiya məsələləri, №3, 2009, səh.127

yətdə müxtəlif sahələrdəki çatışmazlıqlar, nöqsanlar, cəmiyyətə zidd hərəkətlər müşahidə ediləndə işlənir;

Heydər Əliyev öz şəxsi mənafelərini, şəxsi məqsədlərini ön planda saxlayan qruplara təəssüf edir. Bəzən "təəssüf" modal sözü həm söz, həm də cümlə rolunu oynayır;

"Zənnimcə" modal sözü Heydər Əliyevin nitqində gələcəyə yönələn elmi fikirlərin auditoriyaya izahı ilə bağlı məqamlarda öz yerini tapır;

Natiqlik sənətində hadisələrə natiqin öz baxışlarını şəxsi fikirlərini bildirən "zənnimcə", "fikrimcə" modal sözləri Heydər Əliyev nitqlərini də tərk etmir. "Zənnimcə" modal sözü müxtəlifyönlü məsələlərə böyük natiqin şəxsi münasibətini bildirir;

"Xatirinizdədirsə" modal sözün köməyi ilə Heydər Əliyev auditoriyanı özü ilə keçmişə aparır, auditoriyada canlanma yaradır, auditoriyanı diqqətin yayınması kimi hallardan xilas edir;

Heydər Əliyev bazar iqtisadiyyatı ilə bağlı elmimizin dağılmasına, mədəniyyətimizə biganə yanaşmağımıza təəssüf edir;

"Bilirsiniz" modal sözü ilə həmişəki kimi insan fəlsəfəsinə keçir. İnsanın öz düşüncələrində, fikirlərində sərbəst olması ideyasını ön planda saxlayır. Heydər Əliyev böyüklüyünə xas olan bir dillə təvazökarlıq və səmimiyyətlə bağışlaya bilir, hər kəsi öz vicdanı ilə baş-başa qoyur;

"Bilirsiniz" modal sözü böyük natiqin nitqində gah fəlsəfi fikirlərə, gah siyasi plüralizmə, gah da adi məişət məsələlərinə münasibət tələb olunan məqamlarda işlədilir;

Araşdırmalar göstərir ki, "bilirsiniz" modal sözü Heydər Əliyevin fəlsəfi, tarixi dəyərlərə malik nitqlərində daha çox işlədilir;

"Bilirsiniz" modal sözünü eşidən auditoriya özünü Heydər Əliyevin fəlsəfi fikirlərinin sehrinə düşəcəyinə hazırlayır;

"Bilirsiniz" feli modal söz böyük natiqin dilində auditoriyada müəyyən bir məsələnin anlaşılmasındakı çaşqınlığa düşənlərə yönəlir. "Bilirsiniz" modal sözün arxasınca həmin məsələnin izahı gəlir;

"Beləliklə" modal sözü Heydər Əliyevin müşavirələrə yekun vurmaq məqamlarına daha çox təsadüf edir.

Bu gün dilçilikdə mübahisəli məqamlarla zəngin modal sözlərin gələcəkdə Heydər Əliyevin nitqləri əsasında tədqiqi məqbul sayılır.

# III FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ FRAZEOLOJİ BİRLƏŞMƏLƏR

Ədəbi dilin ümumxalq dilinə yaxınlaşmasında, nitqin fərdi xarakter almasında, müxtəlif daxili hiss və həyəcanların ifadəsində frazeoloji üslubiyyat digər üslubiyyatlardan az iş görmür.[1] Üslub baxımından həqiqi mənalı sözlərin məcazi mənalı sözlərlə əvəz edilməsi ekspressivlik yaradır. Hər hansı bir məfhum və ya hadisənin dolayı yolla ifadəsinin nəticəsi olan frazeoloji ifadələr dilin ən canlı, zəngin və fəal vahidlərindəndir[2]. Heydər Əliyevin nitqini araşdırarkən Azərbaycan dili frazeologiyasını öyrənən elmi əsərlərdən istifadəyə geniş yer verilmişdir.[3, 4]

Heydər Əliyevin nitqlərinin mühüm bir gücü milli ruhu əks etdirən leksik vahidlərlə-frazeoloji birləşmələrlə zənginliyindədir. Frazeoloji birləşmələrə böyük natiqin müxtəlif çeşidli auditoriyalardakı çıxışlarında tez-tez rast gəlinir. Bu fəsildə frazeoloji birləşmələrin Heydər Əliyevin nitq arxitektonikasındakı yeri müəyyənləşdirilir, digər nitq elementləri ilə əlaqələri tədqiq edilir. Heydər Əliyevin nitqindəki frazeoloji birləşmələr üslublardan və müxtəlif məsələlərin həllini tapdığı auditoriyalardan asılı olaraq nəzərdən keçirilmişdir. Dildə işlədilən bir çox frazeoloji birləşmələr müəyyən şərait və hadisə ilə bağlı meydana çıxır və müəyyən mənada həmin şəraitlə

---

[1] Həsənova S. "Nitq mədəniyyərti və üslubiyyat", Bakı, 2005, 192 s.

[2] Həsənova S. "Nitq mədəniyyərti və üslubiyyat", Bakı, 2005, 192 s.

[3] Kazımov Q.Ş. Azərbaycan dili frazeologiyasının ən qədim qatı (yazıyaqədərki dövr). Filologiya məsələləri, 2006. №2, səh.3-53.

[4] Seyidəliyev Nəriman. Folklor frazeologiyasının bədii ədəbiyyatda işlədilməsi. Filologiya məsələləri, №9, 2008. səh.46-50

bağlı hərəkətin analoji xüsusiyyətini ifadə edir.[1,2,3] Frazeoloji birləşmələrin adətən bədii ədəbiyyatda zəngin üslubi xüsusiyyətlər daşımasından tez-tez danışılır. Azərbaycan dilçiliyində Ə.Dəmirçizadə, S.Cəfərov, A.Məmmədov, A.Axundov, R.Məhərrəmova, H.Bayramov, T.Zeynalova və başqaları[4] frazeologiya üzərində əhəmiyyətli araşdırmalar aparmışlar. Lakin aparılmış tədqiqatlara baxmayaraq frazeologiya daim araşdırmalara, tədqiqata ehtıyacı olan elm sahəsi kimi mövcuddur[5]. Bədii ədəbiyyatda zəngin üslubi mahiyyət kəsb edən frazeoloji birləşmələrin siyasi natiq Heydər Əliyevin şifahi söylənilən nitqlərində öyrənilməsi xüsusi maraq doğuran məsələlərdəndir.

Frazeoloji birləşmələrin araşdırılması kitabda aşağıdakı ardıcıllıqla verilmişdir:

Heydər Əliyevin nitqlərinin giriş hissələrində frazeoloji birləşmələr;

Somatik frazeoloji birləşmələr;

Atalar sözü və məsəllərdən yaranmış idiomatik ifadələr;

Böyük natiqin tez-tez müraciət etdiyi frazeoloji birləşmələr;

Dövlətçiliyimizlə bağlı frazeoloji birləşmələr;

Lider və xalq vəhdətini əks etdirən frazeoloji birləşmələr;

---

[1] Məmmədova T.R. Frazeoloji birləşmələr və onların növləri. Filologiya məsələləri, №1, 2007. səh.50-52

[2] Arnold I.V. The English Word, M. 1973.

[3] Seyidov Y. Azərbaycan ədəbi dilində söz birləşmələri, Bakı, 1966.

[4] Axundov A. "Dil və mədəniyyət". Bakı, "Yazıçı", 1992. 192 s.

Bayramov H. Azərbaycan dili frazeologiyasının əsasları. Bakı, Maarif, 1978.

Cəfərov Səlim. Müasir Azərbaycan dili. II hissə. Leksika. Bakı, "Şərq-Qərb", 2007. səh. 192.

Dəmirçizadə Ə.M. Azərbaycan dilinin üslubiyyatı, Bakı, Azərtədrisnəşr, 1962. səh.236

Zeynalova T., Əliyeva Ş. Некоторые виды фразеологиических единиц со структурой предложения в современном английском языке// Filologiya məsələləri, №1, 2007. s.135.

[5] Məhərrəmova T. Filologiya məsələləri, №1, 2007, s.131-134

Qaçqın və köçkün auditoriyalarında səslənən frazeoloji birləşmələr;

Xalq ruhuna söykənən frazeoloji birləşmələr;

Dövlətlərarası münasibətlərdə səslənən frazeoloji birləşmələr;

Azərbaycan dili ilə bağlı frazeoloji birləşmələr;

İqtisadi məsələlərin çözülməsi ilə bağlı frazeoloji birləşmələr;

Kənd təsərrüfatı ilə əlaqədar keçirilən müşavirələrdə səslənən frazeoloji birləşmələr;

Sahibkarlıqla bağlı frazeoloji birləşmələr;

Xaricdə yaşayan soydaşlarımızla olan görüşlərdəki frazeoloji birləşmələr;

Müstəqilliyə qarşı çıxan qüvvələrlə bağlı frazeoloji birləşmələr;

Nitqdə nikbinlik aşılayan frazeoloji birləşmələr;

Dini üslubun tələb etdiyi frazeoloji birləşmələr;

Fəlsəfi, tarixi məsələlərlə əlaqədar söylənilən frazeoloji birləşmələr;

Erməni təcavüzü ilə bağlı işlədilən frazeoloji birləşmələr;

Siyasi frazeologiya ilə bağlı özünə yer alan frazeoloji birləşmələr;

"Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" kitabının I hissəsində Heydər Əliyev nitqinin giriş və sonluqları bölməsində frazeoloji birləşmələr yeri gəldikcə istifadə olunmuşdur:

"Ürəkdən salamlamaq" – bu frazeoloji birləşmədən böyük natiq ən çox çıxışlarının giriş hissələrində istifadə edir. 3 iyul 1996-cı ildə Köln şəhərində Almaniyanın iş adamları ilə görüşdəki çıxışda olduğu kimi: "Hörmətli xanımlar və cənablar! Mən sizi ***ürəkdən salamlayıram*** və bu xoş, Azərbaycan Respublikası üçün çox gərəkli görüşdən olduqca məmnunam" [VIIc.s.37].

Bir sıra hallarda isə "səmimi qəlbdən salamlamaq" frazeoloji birləşməsini "ürəkdən salamlamaq" sinonimi əvəzləyir. Buradan bir daha Azərbaycan dilinin söz ehtiyatının zənginliyi, Heydər Əliyevinsə bu söz ehtiyatına dərindən bələd olduğu anlaşılır: "Hörmətli xanımlar və cənablar! Mən sizi ***ürəkdən salamlayıram*** və bu xoş, Azərbaycan Respublikası üçün çox gərəkli görüşdən olduqca məmnunam" [VIIc.s.37].

Nitq ilə bağlı, danışılacaq mövzularla bağlı böyük natiqin frazeoloji birləşmələri mövcuddur. Bu frazeoloji birləşmələr gələcək natiqlər üçün hazır qəliblərdir desək yanılmarıq: "Ancaq bu beş il ağır, çətin olmuşdur. Bu gün bizim bir daha görüşümüz olacaq, mən bu barədə orada ***geniş danışacağam***. Ona görə də indi bu mövzuya ***geniş yer vermək*** istəmirəm" [VIIc.s.14]."Geniş danışmaq", "mövzuya geniş yer vermək" frazeologizmləri böyük natiqin bilavasitə nitq ilə, danışıq ilə bağlı auditoriyalarda tez-tez işlətdiyi frazeoloji birləşmələrdir.

Auditoriyanı frazeoloji birləşmələrin monotonluğundan çıxaran Heydər Əliyev frazeoloji sinonimlərdən uğurla istifadə edir. "Söhbət salmaq", "söz açmaq", "söhbət açmaq" frazeoloji birləşmələri kimi:

"Bu ***söhbəti*** sən ***saldın***, mən də bir daha deyirəm ki, Azərbaycanın müstəqilliyi uğrunda mübarizədə Bəxtiyar Vahabzadənin xidmətləri böyükdür" [VIIIc.s.338].

"Məsələn, siz Süleyman Rəhimov haqqında ***söz açdınız***" [VIIIc.s.339].

"Bu gün bizim dövrümüzdə yaşayanlardan ***söhbət açsaq***, Bəxtiyar Vahabzadə də belədir" [VIIIc.s.339].

Yüksək sevgi və səmimiyyət dolu görüşlərində Heydər Əliyev "səmimi qəlbdən salamlamaq", "məmnun olmaq" frazeoloji birləşmələri ilə auditoriyaya yol açır: "Mən sizin hamınızı Azərbaycan xalqı adından, Azərbaycan Respublikasının vətəndaşları adından ***səmimi qəlbdən salamlayıram*** və sizinlə bugünkü görüşümdən çox ***məmnun olduğumu*** bildirirəm. Bir

neçə saat bundan öncə Azərbaycandan buraya, Bonn şəhərinə gəlmişəm və sabah mənim Almaniyada rəsmi səfərim başlanır" [VIIc.s.24].

Frazeoloji birləşmələr nitqin ekspressivliyini artırmaq baxımından təkrarlanır: "Rica edirəm sizdən, şəxsi ambisiyalarınızı ***kənara qoyun***, şəxsi instinktlərinizi, şəxsi mənafelərinizi, şəxsi məqsədlərinizi ***kənara qoyun***, düşünün, Azərbaycan Respublikasının dövlətçiliyi təhlükə altındadır" [Ic.s.112].

Xalqla, ictimaiyyətlə görüşlərində etdiyi çıxışlar "ürəkdən salamlamaq", "səmimi duyğularımı çatdırmaq" kimi frazeoloji birləşmələrlə zəngindir: "Əziz bacılar və qardaşlar, əziz həmvətənlər! Sizi burada, Bərdə şəhərinin mərkəzi meydanında görməkdən çox məmnunam. Ona görə də buraya toplaşdığınız üçün sizə təşəkkür edirəm. Sizi ***ürəkdən salamlayır***, hamınıza xoş arzularımı və ***səmimi duyğularımı çatdırıram***" [Ic.s.507].

Vətən həsrəti ilə bağlı, vətənlə bağlı frazeoloji söz birləşməsi kimi "ürəyi getmək" diaspor nümayəndələri qarşısında daha çox səslənir: "Bilirəm ki, vətəndən ötrü sizin ***ürəyiniz gedir***, vətəni çox istəyirsiniz" [VIIIc.s.326].

Somatik frazeoloji birləşmşlər: "Bədən üzvlərini bildirən sözlərdən çox aydın, ifadəli, məzmunlu idiomatik ifadələr yaranmışdır. Bunlar dilçilik ədəbiyyatında cismani və somatik ifadələr adlandırılır".[1]

Dilin semantik sistemindən asılı olaraq, somatik frazeoloji birləşmələrin komponenti kimi müxtəlif somatizmlər iştirak edir (somatizm – soma "bədən, bədənə aid" yunan sözündən yaranmışdır). Somatizm insanın bədən üzvlərinin adlarını bildirən terminlərdir. Bəzi müəlliflər[2] somatik frazeoloji

---

[1] Müasir Azərbaycan dili. 3 cilddə. I cild. Bakı, 1971. səh.262

[2] Hacıyeva Əzizə. Müxtəlifsistemli dillərdə somatik frazeoloji birləşmələr. Bakı, "Nurlan", 2007. səh.52-54

birləşmələri dilin frazeoloji sisteminin üzvü hissəsi kimi qəbul edirlər.

Azərbaycan dilində "baş" sözü çoxmənalı vahidlər sırasına daxil olduğu üçün onun vasitəsi ilə yaranan digər düzəltmə sözlərdə də semantik cəhətdən əlaqə və yaxınlıq özünü göstərir. Bu semantik çalarlıq ümumi şəkildə "böyüklük", "yüksəklik", "irəlidə olmaq" vəs. müvafiq oxşarlıqlarla ifadə edilir.

Eləcədə Azərbaycan dilində "baş" sözü vasitəsilə yaranan düzəltmə və mürəkkəb sözlərlə bərabər müxtəlif söz birləşmələrinin yaranmasına da təsadüf edilir. Bu cür söz birləşmələri dildə geniş mövqe qazanır və çoxcəhətli semantik xüsusiyyətlərə malik olur, istər danışıq dilində, istərsə də bədii ədəbiyyatda emosionallıq yaratmaq vasitələrindən biri kimi çıxış etmək hüququ qazana bilir[1]

Azərbaycanın söz ustaları bədən üzvləri ilə bağlı sözlər əsasında yaranmış ifadə vasitələrindən yararlanaraq dilimizin zənginləşməsinə kömək etmişlər. Heydər Əliyevin nitqində biz siyasi natiqlik səhnəsində bu tip sözlərin semantik zənginliyinin şahidi oluruq.

Başla – bədən üzvü olan başla bağlı çoxmənalı ifadələrə Heydər Əliyevin nitqində tez-tez rast gəlirik. "Başına gətirilmək" ifadəsinə diqqət yetirsək: "Mən belə fikirdəyəm ki, nə qədər millətimiz yaşayır, 20 Yanvar hadisələrini unutmaq olmaz, çünki bu, xalqımızın ***başına gətirilən*** hadisədir. Təsəvvür edin, Sovetlər Birliyinin tarixində, – onun daxilində on beş respublika var idi, o cümlədən Azərbaycan, bu tarixi mən yaxşı bilirəm, – heç bir xalqın, heç bir ölkənin ***başına*** o qədər faciə ***gətirilməmişdi***" [IXc.s.400].

---

[1] Qədimova Məryəm. Azərbaycan dilində baş sözünün məna yükü. // Bakı Universiteti nəşriyyatı, 2001. 53 səh.

“Başında olmaq” – “rəhbərlikdə olmaq”, “aparıcı olmaq” mənasında işlədilir: “Bilirsiniz, vaxtilə mən Sovetlər İttifaqının ***başında olan*** adam olmuşam” [IXc.s.403].

Heydər Əliyevin nitqində bədənlə, bədən üzvləri ilə bağlı idiomatik ifadələrə rast gəlirik ki, bu ifadələr nitqə xüsusi bir rövnəq verir: “Xocalıda nə qədər vəhşətlər, soyqırımı etdilər, – bunu bir dəfə, iki dəfə dedik, orada-burada göstərdik. Biz bunu heç də unutmamışıq. Bu, qəlbimizdə, bədənimizdə daim ***qanı tökülən, qan sızan yaradır*** *” [IXc.s.399]*

“Başını ağrıtmaq” – “Azərbaycanda belə bir söz var: ağrımayan başımı niyə ağrıdım. Sizdə belə söz varmı? Hesab edirəm ki, əgər mənim ***başım ağrımırsa***, millətin faciəsi ilə bağlı qoy on dəfə də artsın. Amma bunu unutmaq olmaz” [IXc.s.400].

20 Yanvar faciəsi ilə bağlı Türkiyədə dediyi bu sözlərin içərisində “başımı ağrıtmaq” – “problemləri üzərimə götürmək” mənasında olan idiomatik ifadələrlə böyük natiq Azərbaycan dilinin incəliklərinə bir daha bələdliyini, eləcədə heç kəsə bu səviyydə qismət olmayan milli təəssübkeşlik hissini auditoriyalara açıqlayır.

“Baş əymək” – bu frazeoloji birləşmə Heydər Əliyev dilində ən çox şəhid ailələri ilə görüşlərdə, şəhidliklə bağlı məqamlarda daha çox işlədilir.

“Baş əymək” – ehtiram bildirmək, təzim etmək anlamındadır ki, bu frazeoloji birləşmələr Heydər Əliyevin nitqlərində üslubi keyfiyyət qazanır: “Bu gün, bu bayram günündə şəhidlərin ruhunu böyük minnətdarlıq hissi ilə yad edirəm, onların qəhrəmanlığı, cəsurluğu və ruhu qarşısında *baş əyirəm*” [IIc.s.373-374].

Burada böyük natiq sinonim cərgənin – “qəhrəmanlığı, cəsurluğu və ruhu” – köməyi ilə üç məqamda işlədilə biləcək frazeoloji birləşmədən –

qəhrəmanlığı qarşısında baş əymək;

cəsurluğu qarşısında baş əymək;

ruhu qarşısında baş əymək; – yararlanaraq zəngin bir nitq nümunəsi yaradır.

"Başı qarışıq olmaq" – bu frazeoloji birləşmədə işlərin çox olması, problemlərin çoxluğu başa düşülür: "Mən Ali Sovetin sədri kimi, işə başlayandan sonra Ali Sovetə bu məlumatlar vaxtaşırı gəlirdi, ancaq bilirsiniz ki, o vaxtlar bizim ***başımız həddindən artıq qarışıq*** idi" [Ic.s.63].

Mənasına, leksik tərkibinə və ekspressivlik dərəcəsinə görə rəngarəng olan idiomatik ifadələr ən gözəl bədii vasitə kimi üslub gözəlliyi üçün müxtəlif şəkildə istifadə edilir.[1] Müəyyən leksik, qrammatik dəyişikliyə yol verən idiomatik ifadələrin əsas mənasını pozmadan onlardan: müəyyən sözləri ixtisar etmək, bəzi idiomatik ifadələrə müəyyən söz əlavə etmək, idiomatik ifadənin tərkibindəki üzvlərdən birini eyni nitq hissəsindən olan sözlə əvəz etmək, sözlərin yerini dəyişmək mümkündür[2] ki, bunlara Heydər Əliyevin nitqlərində tez-tez təsadüf edirik.

Böyük natiqin "başla bağlı" ən çox işlətdiyi somatik frazeologizmlər aşağıdakılardır: "baş əymək", "başı çıxmaq", "başı ucalmaq", "başı qarışmaq", "baş tutmaq", "başa düşmək", "baş qaldırmaq", "baş qoşmaq", "baş açmaq", "baş açmamaq", "baş ağartmaq".

"Əldə olunmaq" – frazeoloji birləşməsi də Heydər Əliyevin tez-tez istifadə etdiyi, xüsusilə də müstəqilliyimizlə bağlı tez-tez işlətdiyi frazeoloji birləşmələrdəndir: "Bu illərdə çox böyük nailiyyətlər ***əldə olunub***. Sovetlər İttifaqı dağılan kimi, məhz bunun nəticəsində biz öz müstəqilliyimizi bəyan

---

[1] Hüseynova Aytən. İngilis dilində idiomatik ifadələr və onların Azərbaycan dilində ifadə üsulları // Filologiya məsələləri №9, 2008. səh.173-178

[2] Bayramov H.A. "Azərbaycan dilinin frazeologiyasının əsasları". Bakı, "Maarif" nəşriyyatı, 1978.

etdik və respublikamız beşinci ildir ki, müstəqil dövlət kimi yaşayır” [VIIc.s.15].

“Əl çalmaq” – frazeoloji birləşməsi də böyük natiqin dilində müxtəlif mənalarda işlədilir: “Matça oğlumla birlikdə baxırdım. O məni sakit edirdi ki, narahat olma, almanlar udacaqlar. Bu söhbətimizdən bir neçə dəqiqə sonra almanlar birinci qolu vurdular. Biz ikimiz də ***əl çaldıq***. Amma London stadionundakı almanlar o qədər ***əl çalırdılar*** ki, bizim ***əl çalmağımızı*** heç kəs eşitmirdi” [VIIc.s.31].

Somatik idiomlardan Heydər Əliyevin nitqində ən çox işlənənlərdən biri də “əl”lə bağlıdır. Xalqın əmlakının mənimsənilməsi, dağıdılması məqamlarında “əllərə düşmək” frazeologizmindən istifadə olunur: “Ona görə də mənim üçün çox narahatedici hal idi ki, bu kompleks ayrı-ayrı nadanların ***əllərinə düşmüşdü*** və bunu gənclərin tələblərinə həsr etmək əvəzinə, cürbəcür başqa məqsədlər üçün istifadə edirdilər” [VIIc.s.9].

“Əllərə keçmək” frazeoloji birləşməsi “əllərə düşmək” frazeoloji birləşmənin sinonimi kimi işlədilir: “Heç kəsə imkan verə bilmərik ki, xalqın sərvəti, vəsaiti, zəhməti ilə, necə deyərlər, xalqın bütün çalışqanlığı ilə yaranmış və xalq üçün olan, xalqa xidmət edən belə obyektlər ayrı-ayrı ***əllərə keçsin***” [VIIc.s.9].

“Əl uzatmaq” frazeoloji birləşməsinə gəldikdə burada millətin, xalqın, soydaşların bir-birinə kömək etməyi, bir-birinə arxa-dayaq olmağı önə çəkilir: “Amma bu təbii qanunlar içərisində də bir olmaq, daha da sıx olmaq, bir-birinə dayaq olmaq, ***əl uzatmaq*** üçün imkanlar çoxdur”.

“Əlindən alınmaq” – frazeoloji birləşmə ilə keçmiş Sovetlər İttifaqında XX əsrin 30-cu illərindəki mövcud səhv kollektivləşmə siyasətinin iç üzünü açıb göstərir: “Bütün bu tədbirlər asanlıqla həyata keçirilmədi. Repressiyalar aparıldı, torpaqları ***əldən verməyən*** adamlar həbs olundu, yurd-yuvala-

rından sürgün edildi. Onların böyük əksəriyyəti hələ o dövrdə repressiyalar nəticəsində və xüsusən kənd təsərrüfatının kollektivləşdirilməsi ilə əlaqədar yerlərindən kütləvi surətdə sürgün edilmiş, mal-mülkü ***əlindən alınmış*** adamlardır” [VIIc.s.87]. Maraqlı nitq hadisəsi kimi biz burada iki ardıcıl cümlədə iki antonim frazeoloji birləşməni görürük – “əldən verməmək”, “əlindən almaq”.

Xalq ruhuna söykənən frazeoloji birləşmələrdən “əldən getmək” böyük natiqin dilində müxtəlif auditoriyalarda işlənir: “İyul ayının 2-dən indiyədək Ermənistan silahlı qüvvələri tərəfindən aparılan hücumlar nəticəsində bir çox kəndlər və yaşayış yerləri ***əldən gedib***, dağıdılıb, yandırılıbdır” [Ic.s.20].

“Göz qabağında olmaq” frazeoloji birləşməsi bir qisim frazeoloji birləşmələr kimi müxtəlif məqamlarda işlənir. Əgər bir məqamda işlərin sona yetməsi, nəticələrin alınması mənasındadırsa: “Ancaq mən inanırdım ki, bu nəticələr olacaqdır. İndi isə nəticələr ***göz qabağındadır***” [IXc.s.170]

Başqa bir nitq məqamında isə auditoriyanı bu frazeoloji birləşmənin köməyi ilə polemik söhbətə qoşa, nitqini canlı edə bilir: “Bu ictimai-siyasi sabitliyin nəyin bahasına, hansı çətinliklər hesabına əldə edildiyini siz hamınız bilirsiniz. Bunların hamısı sizin ***gözünüz qabağında olubdur***, bunu respublikanın bütün ictimaiyyəti, hər bir vətəndaşı bilir” [IXc.s.171]

“Gözdən salmaq” – “Ancaq deməliyəm ki, sonra, 1987-ci ilin axırında mən istefaya çıxanda – sizin xatirinizdədir, 1988, 1989, 1990-ci illərdə burada, Moskvada mənim əleyhimə böyük təqib başlamışdı, müxtəlif qəzetlərdə məni ***gözdən salan***, başdan-başa iftiralarla dolu yazılar dərc edilirdi, məni özbaşınalıqda və sairədə günahlandırmaq üçün bu faktdan da istifadə edildi” [IXc.s.100].

“Əlimdən gələni etmək” frazeoloji birləşməsi qarşı tərəfdə əminlik yaratmaq baxımından mühümdür: “Mənə göstərilən bu yüksək şərəf üçün Ukrayna dövlətinə təşəkkürümü bildiri-

rəm və sizi əmin edirəm ki, Ukrayna ilə Azərbaycan əməkdaşlığını inkişaf etdirmək, möhkəmləndirmək üçün indiyə qədər olduğu kimi, bundan sonra da ***əlimdən gələni edəcəyəm***" [IXc.s.49].

Başqa bir çıxış məqamında isə "ələ keçirmək" hərbi frazeoloji birləşmə kimi səslənir, torpaqların işğalı kimi başa düşülür: "İyunun 12-dən etibarən Ermənistan hərbi qüvvələri Ağdam və Ağdərə istiqamətlərində hücum edərək Ağdərə rayon mərkəzini və bir neçə kəndimizi ***ələ keçiriblər***" [Ic.s.15].

Ümumilikdə dilin somatik frazeoloji sisteminin tədqiqi bir neçə cəhətdən aktualdır. Türk dillərində bədən üzvlərinin adlandırılmasında "detallaşdırmağa" meyl çox güclüdür və müvafiq leksemlər təkcə sərbəst söz birləşmələrində deyil, həm də somatik frazeoloji birləşmələrin yaranmasında fəallıq göstərir, nitq mədəniyyətinin və nitq ustalığının artırılmasına şərait yaradır.[1]

Dilimizdə bir qrup idiomatik ifadələr var ki, onlar atalar sözü və məsəllərdən yaranmış və yaxud məzmununu onlardan almışdır.[2] Müəyyən tarixi dövrdə yaranıb və yüzilliklər boyunca dəyişməz qalaraq, öz mənası ilə xalqın uzaq tarixi keçmişimizin ən müxtəlif sahələrini əks etdirən atalar sözləri frazeologiyanın əsasını təşkil edir.[3]

Azərbaycan folkloru, xüsusilə də nağıllar və dastanlar ümumxalq dili əsasında yaranan frazeoloji birləşmələrlə zəngindir.[4]

---

[1] Hacıyeva Əzizə. Müxtəlif sistemli dillərdə somatik frazeologiyanın müqayisəli-tipoloji tədqiqinin əhəmiyyəti. Filologiya məsələləri. №3, 2008. səh.11-20.

[2] Müasir Azərbaycan dili. 3 cilddə. I cild. Bakı, 1971. səh.263

[3] Muradova Zülfiyyə. İngilis dilinin frazeologiyasında atalar sözləri və onların semantik xüsusiyyətləri // Filologiya məsələləri, №4, 2008, s.205

[4] Seyidəliyev Nəriman. Folklor frazeologiyasının bədii ədəbiyyatda işlədilməsi // Filologiya məsələləri №9, 2008. s.46-50.

Atalar sözləri xalqın həyat tərzini, adət-ənənəsini, fikrini, düşüncəsini obrazlı şəkildə ifadə edən bütöv sintaktik vahidlərdir ki, onların siyasi natiqlik sahəsində yerli-yerində Heydər Əliyevin nitqində işlədilməsinin tədqiqi dilçilik elmimizə böyük töhfə sayılar.

Elmdə milli dil və onun davamı kimi milli ədəbi dil anlayışı var. Füzuli dilindəki frazeoloji birləşmələrin, atalar sözləri və məsəllərin hamısı müasir Azərbaycan dilində yaşayır və işlənir.[1]

Türkiyədə olarkən Heydər Əliyev "Azərbaycanda bir söz var" deyərək dilləri bir-birinə yaxınlaşdırmaqla yanaşı əsas, ana fikrini auditoriyaya çatdırır: "Azərbaycanda bir söz var, insan ***uman yerdən küsər***. Bu söz sizdə varmı – uman yerdən küsərlər? Azərbaycan Türkiyədən çox şey umur. Türkiyə bizim qardaşımızdır, qan qardaşımız, can qardaşımızdır. Qan qardaşı olan da, Azərbaycanda yenə bir söz var, öz ***boğazından kəsib*** qardaşına verir" [IXc.s.402].

"Ağır günün ömrü uzun çəkməyəcəkdir" – mürəkkəb frazeoloji birləşmə gah qaçqınlar auditoriyasında, gah ziyalılarla görüşdə, gah da uşaqlar auditoriyasında səslənir: 1iyun 1996-cı ildə Uşaqları Beynəlxalq Müdafiə günü münasibətilə uşaq musiqi festivalı qaliblərinin yekun konsertində olduğu kimi: "Xalqımız bilir, uşaqlarımız, körpələrimiz də bilməlidirlər ki, ağır günün ömrü uzun çəkməyəcəkdir. ***Ağır günün ömrü gödək olur***. Biz bu ***ağır günlərdən çıxacağıq***" [VIc.s.190]. Elə buradaca ikinci bir frazeoloji birləşmənin – "ağır günlərdən çıxmaq" şahidi oluruq. Bu frazeoloji birləşmələrlə böyük natiq gələcəyin sahiblərini, qurucularını – uşaqları nikbinliyə çağırır.

Heydər Əliyevin nitqində ən çox işlənən frazeoloji birləşmələri aşağıdakı kimi vermək olar:

---

[1] Hacıyev T.İ. Azərbaycan milli ədəbi dili məsələsinə bir baxış // Bakı Universitetinin Xəbərləri, 2009. №3, səh.21-25

"Təşəkkür bildirmək" – "Mən sizi ürəkdən salamlayıram, bu hadisə münasibətilə təbrik edirəm və Azərbaycan Respublikasına göstərdiyiniz bu qayğıya, bu diqqətə, bu hörmətə görə bir daha ***təşəkkürümü bildirirəm***" [IXc.s.300].

Mürəkkəb frazeoloji birləşmələr

"məhəbbət hisslərini söndürə, qıra bilməmişdir" – "Hətta son yetmiş illik ayrılıq da xalqlarımızın, millətlərimizin arasında olan dostluq, qardaşlıq ***məhəbbət hisslərini söndürə, qıra bilməmişdir***" [IXc.s.287].

Yaxın ölkələr arasında münasibətlərin yaxşılaşmasına yönələn frazeoloji birləşmələrə "dostluğu gücləndirmək", "yüksəklərə qaldırmaq" çox rast gəlir: "Əminəm ki, bugünkü gündə, indiyə qədər atdığımız addımlar və bundan sonra görəcəyimiz işlər də Türkiyə – Azərbaycan ***dostluğunu daha da gücləndirəcək, yüksəklərə qaldıracaqdır***" [IXc.s.296].

"Dərk etmək" – "Mən bu gün böyük məmnuniyyətlə "Dövlət nişanı" nı qəbul etdim. Mənim üçün bunun nə qədər böyük şəxsi əhəmiyyəti olduğunu ***dərk edirəm*** " [IXc.s.292].

"Göz bəbəyi kimi qorumaq" – "Sizi əmin edirəm ki, biz Azərbaycanın dövlət müstəqilliyini ***göz bəbəyimiz kimi qoruyub saxlayacaq*** və onu heç vaxt ***əldən verməyəcəyik***" [IXc.s.292].

"Uğurlar diləmək" – "Bu gözəl münasibətə görə sizə bir daha təşəkkür edir, Türkiyə Cümhuriyyətinə, xalqına səadət və xoşbəxtlik arzulayır, Türkiyə Cümhuriyyətinin qarşısında duran bütün vəzifələrin yerinə yetirilməsində sizə ***uğurlar diləyirəm***" [IXc.s.293].

"Ürəkdən təbrik etmək" – "Bu hadisə həm sizin üçün, həm bizim üçün – hamımız üçün birlikdə çox sevindirici haldır və buraya toplaşanları, Türkiyənin, Azərbaycanın bütün vətəndaşlarını bu münasibətlə ***ürəkdən təbrik edirəm***" [IXc.s.293].

"Əldən verməmək" – "Nə qədər çətin olsa da, nə qədər təzyiqlər olsa da biz dövlət müstəqilliyimizi heç vaxt ***əlimizdən verməyəcəyik***" [IXc.s.312]

"Sözünüzə qayıtmaq" – "Bax, buna görə də yenə sizin ***sözünüzə qayıdıram***, – çox doğrudur ki, Qarabağ məsələsini unutmaq olmaz" [IXc.s.40].

"Aradan qaldırmaq" – frazeoloji birləşməsi böyük natiqin çıxışlarında az işlənmir: "Hər halda nümayəndə heyətinin başçısı hesab edir ki, bu səbəbləri ***aradan qaldırmaq*** üçün onlar Dağlıq Qarabağın rəhbərlərinə rəsmi sorğu verməli, rəsmi cavab almalı və öz təqvimini yalnız bundan sonra, bir neçə gün keçdikdən sonra, həyata keçirməyə başlamalıdırlar"

"Boyun olmamaq" – Nitqində populist şüarlara yer verməyən, sözün qiymətini, dəyərini gözəl bilən böyük natiq frazeoloji birləşməsini yerindəcə işlədir, bu gün siyasətlə məşğul olan hər bir kəsi verdiyi sözə əməl etməyə çağırır: "– Bəlkə, indi sülhü Azərbaycana qaytara biləcəksiniz?

Heydər Əliyev: – Təkrar edirəm, mən heç nə ***boyun olmuram***. Lakin münaqişəni aradan qaldırmaq üçün imkanlar var" [Ic.s.48].

"Söz vermək" – Prezident Sarayında müşavirələr aparan dövlət başçısının dilində tez-tez işlədilən frazeoloji birləşməsidir: "Ona görə də mən güman edirəm ki, söhbətimizə birinci növbədə indi Ağdamda yaşayanlar başlasınlar. Ağdam rayon icra hakimiyyətinin başçısına ***söz verirəm***" [VIIc.s.179].

"Addımını başa düşməmək" frazeoloji birləşməsi qarşı tərəfə narazılığı bildirmək kimi başa düşülür: "Cənab Raffaellinin qəbul etdiyi qərarın səbəbləri bizə məlum deyildir. Onun bu addımını biz ***başa düşə bilmirik***, belə qərardan narazılığımızı və narahatlığımızı bildiririk" [Ic.s.19].

Bir sıra frazeoloji birləşmələr böyük natiqin yalnız özü tərəfindən yaradılır desək heç yanılmarıq. "Daxili siyasi iqlimə təsir göstərmək" tipli frazeoloji birləşmələr bu qəbildəndir:

“Lakin Ermənistan tərəfdən Azərbaycan Respublikasına qarşı aparılan müharibə və xüsusən də son günlərdə həmsərhəd rayonlara edilən hərbi hücumlar daxili ***siyasi iqlimə*** güclü ***təsir göstərir***” [Ic.s.15].

Heydər Əliyevin nitqinə xas olan izahedicilik frazeoloji birləşmələrin də izahında özünü göstərir. Frazeoloji birləşmənin ardınca onun sinonimi gəlir, auditoriya izahı elə böyük natiqin öz dilindən də eşidir: “Ancaq sonrakı dövr və bu proseslərin davamı göstərdi ki, bizim arzularımız ***çin olmadı***, yerinə yetmədi və biz bu işlərlə məşğul olmaq məcburiyyətində qaldıq...” [Ic.s.64]. “Çin olmaq” arxaik frazeoloji birləşməsini eşidən auditoriya üçün əlavə izaha ehtiyac qalmır.

Bir sıra frazeoloji birləşmələri yalnız Heydər Əliyev nitqində müşahidə edə bilərik ki, bu frazeoloji birləşmələr də böyük natiq tərəfindən izah olunur: “Mən bu müddətdə məsələyə səbrlə, təmkinlə, ***hörmətlə yanaşmışam*** və bütün ***qüvvələrə etibar eləmişəm***, ətrafımda olan, respublikanın rəhbərliyində olan, Ali Məclisin tərkibində olan adamlara etibar eləmişəm, ümid bəsləmişəm ki, bu məsələni həll edəcəyik” [Ic.s.78].

“Qanuna riayət etmək – Qüvvələrə etibar etmək” – frazeoloji birləşməsinin ardınca bu qüvvələr – respublika rəhbərliyində və Ali Məclisdə olan adamlar xalqa tanıdılır: “Ona görə də mən arzu edərdim ki, bizim sahibkarlarımız ***qanuna riayət etsinlər***, qanuni yolla getsinlər. Onlar qanuni yol ilə gedərək həqiqi sahibkar ola bilərlər” [VIIc.s.230].

Dövlətçiliklə bağlı, dövlətimizi qorumaqla bağlı frazeoloji birləşmələr ardıcıl düzülür: “Azərbaycanın cəmiyyətini o tərəf, bu ***tərəfə çəkən*** ayrı-ayrı adamlar, Azərbaycanda gedən siyasətə ***kölgə salan*** adamlar, Azərbaycanda aparılan tədbirlərə ***xor baxan*** adamlar, Azərbaycanda həyata keçirilən bu müsbət proseslərə mənfi ***qiymət verən*** adamlar Azərbaycanın milli mənafeyinə ***zidd gedən*** adamlardır” [VIIc.s.287].

Lider və xalq vəhdətini anlamaq üçün Heydər Əliyevin tez-tez müraciət etdiyi frazeoloji söz birləşmələrindən "ayağa qalxmaq", "xalqın gücünə arxalanmaq", "ümid bəsləmək", "ümidləri doğrultmaq", "həyatı xalqa bağışlamaq", eləcədə "həyatı xalqa qurban vermək" və s. çoxsaylı misallar göstərmək olar: "Çünki xalq artıq ayılmışdır, ***ayağa qalxmışdır***. Xalqın gücünün qarşısında heç bir qüvvə dayana bilməz. Mən də ***xalqın gücünə arxalanıram***. Əgər xalq məni bu gün lazım bilməsə, sabah getməyə hazıram. Ancaq mənə gələn məlumatlara görə, xalq mənə ***ümid bəsləyir***. Mən də bu ***ümidi doğrultmaq*** üçün həyatımın qalan hissəsini ***xalqa bağışlamışam*** və ona ***qurban verməyə*** hazıram" [Ic.s.99].

Heydər Əliyevin nitq və çıxışlarının araşdırılması böyük natiqin nitqində bir sıra mürəkkəb frazeoloji birləşmələri aşkar edir ki, bunlar nitq mədəniyyətimizə böyük töhfələr sayıla bilər: "Azərbaycanın gələcəyini öz çiyinlərində irəliyə aparmaq" – "Amma bu gələcəyi biz sizinlə birlikdə qurmalı, yaratmalıyıq və gənclər ***Azərbaycanın gələcəyini öz çiyinlərində irəliyə aparmalıdırlar***" [VIIc.s.11].

"Azərbaycan dövlətinin qayğısı altında olmaq" frazeoloji birləşməsi böyük natiqin nitqində gah uşaqlar auditoriyasında, gah əsgərlər qarşısında, gah da aparıcı elm müəssisələrində işlədilir: "Siz – Azərbaycanın övladları, bizim əziz balalarımız, Azərbaycanın gələcəyisiniz. Sizin bugünkü həyatınız, yaşayışınız, təhsiliniz, böyüməyiniz ***Azərbaycan dövlətinin daim qayğısı altındadır***" [IIIc.s.4].

Qanunlara hörmət, qanunun aliliyini təmin etmək baxımından işlədilən frazeoloji birləşmələr içərisində ən çox işlədilənlərdən biri də "əqidədən dönməmək"dir: "Ancaq vəzifə çərçivəsində, şübhəsiz ki, biz hamımız qanuna riayət etməliyik, qanunun aliliyini təmin etməliyik və bu yolda şübhəsiz ki, mən ***öz əqidəmdən dönməyəcəyəm***" [Ic.s.13].

Dövlət əhəmiyyətli məsələlərdə "müzakirə açmaq" frazeoloji birləşmədən istifadə olunur: "Mən artıq sizə izah etdim hansı səbəblərə görə biz indiyə qədər bu məsələ barədə heç bir yerdə heç bir ***müzakirə açmamışıq***" [Ic.s.75].

Digər bir çıxış məqamında "müzakirə etmək" frazeoloji birləşməsi auditoriyalara yol açır, rəsmi görüşlərdə daha çox səslənir: "Bu gün biz mühüm məsələləri ***müzakirə etdiyimiz*** bir vaxtda bu məsələləri ortalığa atıb gündəliyə salmaq təklifi verəndə ara qarışdırmaq istəyirlər" [Ic.s.73]. Elə "müzakirə etmək", "gündəliyə salmaq" frazeoloji birləşmələri ən çox rəsmi üslubda işlədilir.

"Söz vermək" frazeoloji birləşməsi dövlət başçısı dilində mötəbər iclaslarda bir and kimi səslənir: "Şübhəsiz ki, son illərdə Azərbaycanın ictimai-siyasi həyatında böyük səhvlərə yol verilib. Əgər Azərbaycan xalqı özündə qüdrət və imkan taparsa, əgər Azərbaycan xalqı bizə imkan verərsə, mən sizə, bütün azərbaycanlılara ***söz verirəm*** ki, bu səhvlərin hamısını aradan qaldıracağıq, amma bizə imkan vermək lazımdır" [Ic.s.73].

Vətən həsrəti ilə bağlı, Vətənlə bağlı frazeoloji söz birləşməsi kimi "ürəyi getmək" xüsusilə diaspor nümayəndələri ilə görüşlərdə səslənir: "Bilirəm ki, vətəndən ötrü sizin ***ürəyiniz gedir***, vətəni çox istəyirsiniz" [VIIc.s.326].

Vətəndaş necə olur, vətəndaşlıq məfhumuna nələr daxildir kimi suallara aşağıdakı frazeoloji birləşmələrlə cavab verilir: "Ona görə də mən sizi vuruşmağa, toqquşmağa deyil, sadəcə olaraq ***vətəndaşlıq mövqeyinizi bildirməyə*** dəvət edirəm, insanlıq ***mənəviyyatını***, insanlıq ***şərəfini bildirməyə*** dəvət edirəm" [Ic.s.98].

Dövlətçiliyiimizin əleyhinə qalxan qüvvələrə qarşı böyük natiqin nitqlərində "ayağa qalxmaq", "qarşısını almaq" kimi frazeoloji birləşmələr mövcuddur: "Əlikramın və onun quldur dəstəsinin bu cinayətkar hərəkətlərinin ***qarşısını alsın***. Eyni

zamanda biz o bölgədən olan deputatların, vəzifəli adamların bir qrupuna göstəriş verdik ki, bu rayonlara getsinlər. Həmin rayonlarda camaat artıq ***ayağa qalxmışdır***" [Ic.s.94].

Qətiyyətli dövlət başçısına xas olan frazeoloji birləşmələrdən biri kimi "yol verməmək" dövlət səviyyəli tədbirlərdə Heydər Əlievin nitq və çıxışlarında, bəyanatlarında səslənir: "Ayrı-ayrı adamların bu proseslərdə öz şəxsi mənafelərini güdməsi bütün Azərbaycan dövlətinin həm iqtisadiyyatına, həm milli qüdrətinə, həm də dövlətçiliyinə böyük zərbədir. Buna ***yol vermək*** olmaz və mən sizi əmin edirəm ki, bu vəzifəni tutduğum dövrdən belə bir mövqedəyəm və buna ***yol verməyəcəyəm***" [Ic.s.86].

Cəmiyyətimizə zidd qanunsuzluqların ləğvi mənasında "aradan götürmək", "aradan qaldırmaq" frazeoloji birləşmələri böyük natiqin dilindən düşmür: "Burada şübhə olmasın və bu barədə olan əyintiləri, bu barədə olan qanunsuzluqları, ədalətsizlikləri biz ***aradan götürəcəyik***, ancaq yenə də bir şey qanunsuz olursa, o biri qanunsuz işlə qanunsuzluğu aradan götürmək olmaz. Bir şey ədalətsizliklə olubsa, ədalətsizliklə ədaləti bərpa etmək olmaz. Ədaləti bərpa etmək lazımdır. Qanunsuzluğu ***aradan qaldırmaq*** lazımdır" [Ic.s.75].

Ölkədəki ictimai-siyasi sabitliyi pozmağa çalışan insanlar özünəməxsus frazeoloji birləşmələrlə – "şaiyələrə uymaq", "çirkin niyyətlər güdmək" – nəinki tənqid olunur, onlar hətta ittiham səviyyəsində yerinə oturdulur: "Odur ki, qoy orada-burada şayiə yayanlar, yaxud bu ***şayiələrə uyan, çirkin niyyətlər güdən*** adamlar bunu eşitsin və bilsinlər: Azərbyacnın bu ağır dövründə heç kəsə heç vaxt ictimai-siyasi sabitliyi pozmağa imkan verilməyəcəkdir" [Iic.s.110].

Dövlətçiliyimizin qorunması yolunda Heydər Əliyevin nitqlərinə qətiyyətlilik bildirən frazeoloji birləşmələr daxil olur. Bu tip frazeoloji birləşmələr məmurlar auditoriyasında səslənərək dövlətçilik ətrafında səfərbər olunmağı əsas şərt

kimi qoyur: "Təhsil sahəsində çirkin işlər görən adamların öz mənfi niyyətlərinə nail olmaq üçün necə alçaq vasitələrə ***əl atdıqlarını*** görürəm. Mən bir daha xəbərdarlıq edirəm qoy heç kəs güman etməsin ki, belə əməllər ***gözdən qaçacaq***, yaxud onları görən yoxdur, bunlara görə cəza verilməyəcəkdir. Xeyr. Belə şey olmayacaqdır. Mən bir prezident kimi Azərbaycan Respublikasının bu ali dövlət vəzifəsini öz ***üzərimə götürərkən*** xalqa söz vermişəm, mən öz sözümün ***üstündə durmuşam*** və axıra qədər duracağam, son damla qanımadək, son nəfəsimədək ***sözümdən dönməyəcəyəm***. Heç kəs də ***iradəmi qıra bilməyəcək***. Ona görə də belə adamlar bilməlidirlər ki, çirkin əməllərindən çəkinməsələr, onların haqqında ciddi cəza tədbirləri görüləcəkdir" [IIc.s.109].

Azərbaycanın güclü dövlətə çevrilməsi yolunda işlədilən frazeoloji birləşmələr: "irəliyə getmək", "qüdrətli dövlətə çevirmək", "yüksəklərə qaldırmaq" tez-tez işlədilir: "Mən əminəm ki, əldə edilən bu nailiyyətlər əsasında biz hamımız birlikdə ***irəli gedəcəyik***, müstəqil Azərbaycanın bayrağını daha da ***yüksəklərə qaldıracağıq,*** Azərbaycanı daha ***qüdrətli dövlətə çevirəcəyik***, hər bir Azərbaycan vətəndaşı üçün daha da yaxşı yaşayış təmin olunacaqdır" [IXc.s.40]

"Dövlətçiliyin qorunmasına qalxmaq" – "Amma o silahlı qüvvələrin, kişilərin əleyhinə qadınlar, – bəziləri də ayaqyalın, başıaçıq, havanın da bir az soyuq vaxtında qucaqlarında uşaqla çıxmış, Prezident sarayının önünə gəlmişdilər və Azərbaycan dövlətçiliyinin ***qorunmasına qalxmışdılar***, onun ***keşiyində dayanmışdılar***" [IXc.s.26].

Sosial-iqtisadi sahənin inkişafı ilə bağlı iclaslarda "təkliflər vermək", "tələblər irəli sürmək" frazeoloji birləşmələri daha çox yer alır: "Baxmayaraq ki, mən bu barədə daim görüşlərdə, müşavirələrdə, müzakirələrdə bu məsələlərin nizama salınması üçün Nazirlər Kabinetinin rəhbərliyinə ***təkliflər vermişəm*** və tələblər ***irəli sürmüşəm***" [VIIc.s.110].

“Hakimiyyət davası aparmaq” – “Ancaq Azərbaycan artıq bir neçə il ərzində Ermənistan tərəfindən təcavüz altında olduğu halda, Ermənistan torpaqlarımızı işğal etdiyi halda, insanlar gedib Azərbaycanın torpaqlarını qorumaq üçün canlarını qurban verdiyi bir zaman bunlar burada bir-biri ilə ***hakimiyyət davası aparırdılar***” [VIIc.s.276].

Yolla bağlı frazeoloji birləşmələr arasında müstəqillik yolu xüsusi önəm daşıyır: “Azərbaycanın tutduğu yol müstəqil Azərbaycan Respublikası, demokratik hüquqi cəmiyyət qurmaq yoludur. Biz bu ***yolla gedirik*** və gedəcəyik. Bizi bu ***yoldan heç kəs döndərə bilməyəcəkdir***” [IIc.s.8].

Həyatımızın tələbindən doğan sözlər – “Ona görə də birlik adi bir şey deyil. Bəzən bu “birlik” sözünü o qədər işlədirlər ki, o, ***hörmətdən düşür***. Çünki elə hər bir adam deyir ki, birlik olsun. Bilirsiniz, bir var ki, bu şüarı ayrı-ayrı məqsədlər üçün desinlər, bir də var ki, bu, ***həyatımızın tələbindən doğan*** sözlər olsun” [VIIc.s.17].

Xalqın qarşısına çıxan ciddi, taleyüklü məsələlərin elə xalqın özü tərəfindən də “yoluna qoyulmasını” Heydər Əliyev tələb kimi qarşıya qoyur, xalqı bu cür məsələlərin həllində səfərbər edir: “Biz güman edirdik ki, Lənkəranda, bir Lənkəranda yox, bu zonada, adlarını çəkdiyim rayonlarda yerli əhali özü, bu rayonların ağsaqqalları, ziyalıları, nüfuzlu adamları, işbilən adamları, bilikli adamları, hörmətli adamları özləri bu məsələləri yəqin ki, dərk edəcəklər, bu məsələləri öz ***yoluna qoyacaqlar*** və bəlkə də bu məsələlərə dövlət tərəfindən müdaxilə olunmasına ehtiyac yoxdur” [Ic.s.64].

Bir qisim frazeoloji birləşmələr xalqın ələmli günlərində, ağır günlərində böyük natiq tərəfdən işlənir: “Yenə də deyirəm, ***ürəyimizi incidən, sarsıdan*** odur ki, Ağdam şəhəri və rayonun bir hissəsi işğal edilmişdir” [VIIc.s.178].

“Fəlakət qarşısında durmaq” – “1994-cü ilin oktyabr ayında Azərbaycan yenidən böyük bir ***fəlakət qarşısında durdu***.

Amma xalq ***ayağa qalxdı***, təhlükənin qarşısında durmaqla fəlakətin qarşısı alındı” [VIIc.s.278].

Xalqın formalaşması ilə bağlı Heydər Əliyevin tez-tez müraciət etdiyi frazeoloji birləşmələr mövcuddur ki, bu frazeoloji birləşmələr qaçqın və köçkün auditoriyalarında xüsusilə səslənir: “Xalqımız əsrlər boyu ***böyük sınaqlardan çıxıb*** və öz torpağını, öz ***mənliyini qoruyub*** indiyə qədər saxlaya bilibdir” [VIIc.s.181].

Bu cümlədə işlənmiş “böyük sınaqlardan çıxmaq”, “mənliyini qorumaq”, “mənliyini saxlamaq” kimi frazeoloji birləşmələr auditoriyada milli mənlik şüurunu formalaşdırır. Elə bu fikirlərin ardınca “milli mənliyini sındırmaq” frazeoloji birləşməsi gəlir: “1990-cı ildə Azərbaycanın başına böyük faciələr gəlibdir. Respublikaya böyük qoşun dəstələri yeridilərək Azərbaycanın milli ***mənliyini sındırmağa*** çalışıblar”.

“Müraciət etmək” anlamında olan “üz tutmaq” frazeoloji birləşməsi ölkədə ictimai-siyasi vəziyyətin gərgin olduğu məqamlarda işlənir: “Ancaq bunların hamısından ümdə indi Gəncədə baş vermiş hadisələri, bununla əmələ gəlmiş gərginliyi aradan götürməkdən ibarətdir. Mən burada Milli Məclisin iclasında, bu tribunadan ***üzümü*** bütün Azərbaycan vətəndaşlarına ***tuturam***, bizim qardaşlarımıza, bacılarımıza, övladlarımıza ***tuturam*** və ***müraciət edirəm*** və bildirirəm ki, bizim respublika indi ağır vəziyyətdədir” [Ic.s.12].

Lider və xalq vəhdətini bildirmək üçün Heydər Əliyevin tez-tez müraciət etdiyi frazeoloji birləşmələrə “ayağa qalxmaq”, “xalqın gücünə arxalanmaq”, “ümid bəsləmək”, “ümidləri doğrultmaq”, “həyatı xalqa bağışlamaq”, eləcə də “həyatı xalqa qurban vermək” və s. çoxsaylı misallar göstərmək olar: “Çünki xalq artıq ayılmışdır, ***ayağa qalxmışdır***. Xalqın gücünün qarşısında heç bir qüvvə dayana bilməz. Mən də xalqın ***gücünə arxalanıram***. Əgər xalq məni bu gün lazım bilməsə, sabah getməyə hazıram. Ancaq mənə gələn məlumatlara görə,

xalq mənə ***ümid bəsləyir***. Mən də bu ***ümidi doğrultmaq*** üçün həyatımın qalan hissəsini ***xalqa bağışlamışam*** və ona qurban verməyə hazıram” [Ic.s.99].

Xalqın taleyüklü məsələlərində hansı mövqedə olmağımızı “yaxanı kənara çəkmək”, “neytral mövqe tutmaq”, “laqeydlik göstərmək” frazeoloji birləşmələrin köməyi ilə bizə göstərir: “Mən sizdən xahiş edirəm ki, hərə öz sahəsində öz fəaliyyətini göstərsin. Neytral ***mövqe tutmaq, bitərəf qalmaq, laqeydlik göstərmək,*** yaxud ***yaxanı kənara çəkmək*** indi yaramaz. Və heç kəs də gərək belə mövqedə olmasın” [Ic.s.80].

Məişət üslublu nitqlərində böyük natiq bir sıra frazeoloji birləşmələrdən istifadə edir ki, bu frazeoloji birləşmələr xəlqilik baxımından mühümdür: “Bilirsiniz, Azərbaycanın səhiyyəsi, həkimləri yüksək səviyyədədir. Adam bəzən özününkünün ***qədrini bilmir***” [VIIIc.s.333].

“Qədrini bilmək” – frazeoloji birləşməsi M.Qədirli adına Mərkəzi Hövzə xəstəxanasında müalicə olunan xalq şairi Bəxtiyar Vahabzadə ilə görüşdəki söhbətdə bir neçə yerdə təkrarlanır: “Mənim oğlum İlham Moskvada Beynəlxalq Əlaqələr Universitetini bitiribdir. Bu dünyada ən məşhur universitetdir. Dünyanın ən böyük diplomatlarının çoxu orada təhsil alıblar. Amma biz vaxtilə bunların ***qədrini bilməmişik***” [VIIIc.s.334]. Elə həmin görüşdə bu frazeoloji birləşmə təkrarən səslənir: “Ancaq axı Azərbaycan da böyük mütəxəssislər, kadrlar yetişdirib. Elm, səhiyyə, tibb, təhsil, tibb xidməti sahəsində nə qədər yüksək səviyyəli adamlar yetişdirmişik, bunların qədrini bilmək lazımdır” [VIIIc.s.334].

“Xalq üçün ürəyi yanmaq” frazeoloji birləşməsi ilə Heydər Əliyev Azərbaycanı ağır vəziyyətdən kimlərin çıxaracağını sadalayır: “Azərbaycan xalqı və onun qabaqcıl, işıqlı fikirli adamları, xalqa sədaqətli övladları, xalq üçün ***ürəyi yanan*** şəxsləri birləşərək Azərbaycanı bu ağır vəziyyətdən çıxaracaqlar” [Ic.s.102].

Xalqın üzləşdiyi çətinliklər zamanı işlədilən frazeoloji birləşmələr: "Dərd-qəm içində yaşamaq" – "O vaxt insanlar ***dərd-qəm içində yaşayırdı***" [IXc.s.39].

***Erməni işğalı ilə bağlı frazeoloji birləşmələr***

"Bütün bunlara görə Kəlbəcərin dörd il bundan əvvəl işğal edilməsi, düşmən ***tapdağı altında qalması*** bizim ***hər birimizi ağrıdır***" [IXc.s.112].

"Öz payını vermək" – "Vətəni bu ağır vəziyyətdən xilas etmək üçün hərə öz ***payını versin***, səy göstərsin, nəyə qadirdirsə onu etsin: oturub gözləsin ki, Azərbaycanın prezidenti var, o bizim torpaqları azad edəcək, biz də öz yerimizə-yurdumuza qayıdacağıq" [IXc.s.122].

Qaçqın və köçkün auditoriyasında böyük natiqin tez-tez işlətdiyi frazeoloji birləşmələri "əldən getmək" – "İşğal olunmuş torpaqlarda Azərbaycanın varidatı dağılıbdır. İnsanların evləri, malları, əmlakı – hər bir şeyi ***əldən gedibdir***, dağılıbdır" [VIIc.s.273].

"Gəlib çıxmaq" – frazeoloji birləşməsi digər ifadələrə qoşulanda müxtəlif məna çalarlı frazeoloji birləşmələr yaradır: "Sizin dediyiniz ***sözlərin üstünə gəlib çıxıram*** ki, əgər bu bir milyon qaçqın haqqında daim bizdə də, sizdə də, Avropada da verilişlər getsə unudulmaz" [IXc.s.399].

Qaçqın və köçkün auditoriyalarında işlədilən frazeoloji birləşmələr sırasında "tapdağı altında qoymamaq" çox işlənir: "Ancaq o da məlumdur ki, bu, xalqımızın, Azərbaycan millətinin iradəsidir, biz torpaqlarımızı başqalarının ***tapdağı altında heç vaxt qoymayacağıq***" [IXc.s.217].

Eləcə də "qayğım altındadır" birləşməsi köçkün və qaçqınların problemlərinin birbaşa prezidentin nəzarətində olmasına işarədir: "Bunun üçün bu gün də çalışırıq, sabah da çalışacağıq. Sizin yaşayışınız Azərbaycan dövlətinin, şəxsən mənim daim ***qayğım altındadır***" [IXc.s.217].

"Çətinliklərə sinə gərmək" – frazeoloji birləşməsi xalqda iradə, mətinlik aşılamaq məqamlarında daha çox təsadüf edir: "Biz bütün bu ***çətinliklərə sinə gərəcək,*** onların qarşısını ***alacaq*** və bu ***vəziyyətdən çıxacağıq***" [IIc.s.334].

Heydər Əliyev nitqinin frazeoloji birləşmələrlə zənginliyi dilçi alimlərimiz tərəfdən birmənalı qəbul olunur. Təkcə bu bir cümlədə üç yerdə frazeologizmdən istifadə olunmuşdur – "çətinliklərin qarşısını almaq", "çətinliklərə sinə gərmək", "vəziyyətdən çıxmaq".

"Ürəyi dağa dönmək" – bu frazeoloji birləşmə Heydər Əliyevin nitqində milli təəssübkeşliyin bariz nümunəsi kimi səslənir. Bu frazeoloji birləşmə müxtəlif auditoriyalarda insanları sehrləyir, nitqinin cazibəsinə salır: "Mən sonrakı illərdə Moskvada işlədiyim dövrdə Afrikanın cənubunda məsələn, Mozambikdə, Anqolada, yaxud Cənubi Asiyada – Laosda, Vyetnamda, Şimali Koreyada olarkən orada Bakı kondisionerlərini görəndə ***ürəyim dağa dönürdü***. Sevinirdim ki, nəhayət, Azərbaycan Respublikasının, Azərbaycan xalqının da istehsal etdiyi məhsullar dünya miqyasına çıxıb" [Ic.s.196].

Başqa bir məqamda bu frazeoloji birləşmə Azərbaycan gənclərinin təhsili, elmi ilə bağlı səslənir: "O vaxtkı ali təhsil naziri, şəhərin rəhbərləri, Moskvadakı bütün institutların rektorları, tanınmış professorlar oraya toplaşmışdı. Salon ağzınadək dolu idi. Orada Cəbrayıl rayonunun dağ kəndindən olan bir gənc – adı yadımda deyil, Moskva Universitetinin humanitar fakültələrindən birinin dördüncü kursunun əlaçı tələbəsi idi – rus dilində çıxış edəndə ***ürəyim dağa döndü***" [Ic.s.172].

Vətənpərvərliyə çağırış kimi səslənən frazeoloji birləşmələr: "Harada yaşayırsansa – yaşa, yaxşı da, pis də yaşasan, gərək ***ürəyin*** öz vətəninlə, ***torpağınla döyünsün***. Gərək nəbzin vətənin nəbzi ilə vursun. Bu vətənpərvərlik hissi bizim hər birimizdə olmalıdır" [IXc.s.78].

“Azərbaycanın milli ənənələrinin üstündən keçməyəsiniz” – “Təhsilin özündə aparılan islahatlar çox vacibdir. Mənim sizə tövsiyəm ondan ibarət olar ki, islahatları düşünülmüş qaydada aparasınız, formalizmə, konyunkturaya yol verməyəsiniz, Azərbaycanın milli ənənələrinin ***üstündən keçməyəsiniz***” [XXIc.s.249].

Heydər Əliyevin frazeoloji birləşmələrinə xalq ruhu hakimdir, bu tip frazeoloji birləşmələrin auditoriyalarda işlənməsi nitqin dinləyicilərə olan təsir gücünü dəfələrlə artırır: “Ümidləri çin olmaq” – “Əlbəttə, biz çalışacağıq ki, sizin bu ***ümidləriniz çin olsun***. Biz çalışacağıq ki, bu arzularınız həyata keçsin. Əmin olun ki, şəxsən mən bundan ötrü bütün imkanlarımdan istifadə edəcəyəm” [Ic.s.199].

“Yağ-bal içində üzmək” – “Onlar öz yerlərində qalmağa, vəzifələrindən bərk-bərk yapışıb onu əldən verməməyə və öz ailələrinin ***yağ-bal içində üzməsini*** təmin etməyə var qüvvələri ilə çalışırdılar” [Ic.s.47].

“Oxları daşa dəymək” – xalq frazeoloji ifadəsini böyük natiq izah şəklində verir: “Mənə qarşı iki dəfə qəsd etdilər, iki dəfə məni öldürmək istədilər. Amma ***oxları daşa dəydi, niyyətləri baş tutmadı***” [Ic.s.59].

Heydər Əliyev xalq dilində mövcud olan frazeoloji birləşmələrdən istifadə edir və bu zaman həmin frazeoloji birləşmələrin izahını da verir: “Dedim: “Harada görünüb ki, xalqın ***başında dəlləklik öyrənəsiniz***. Onun üzərində eksperimentlər aparırsınız”. “Dəlləklik etmək” frazeologizmi mənaca eksperiment aparmaq timsalındadır. “Başında dəlləklik öyrənmək” – bu idiomatik ifadə eksperiment aparmaq mənasındadır ki, böyük natiq bunu öz müsahibələrində verir [Ic.s.59].

Ümumişlək frazeoloji birləşmələr də böyük natiqin nitqində xüsusi yer tutur. Belə frazeoloji birləşmələrlə bu böyük insanın, ulu öndərin bir insan kimi ona xas olan xarakteri açılır: “– Necə bilirsiniz, sizə xain olan adamları başa düşmək

olarmı? Heydər Əliyev: Mən kinli adam deyiləm, heç kəsi də ***gözümçıxdıya salmaq***, təqib etmək fikrim yoxdur” [Ic.s.47].

Başqa bir məqamda “ürək-dirək vermək” frazeoloji birləşməsi ilə auditoriyanın qəlbinə yol açılır: “Başqa məsələdir ki, əvvəllər onlar mənə tanış deyildilər. Bu adamlar məni axtarıb tapır, mənə ***ürək-dirək verir***, gözdən salınmış xadimlə ünsiyyət üstündə özlərinin də rüsvay ediləcəyindən qorxmurdular. Bu, adamın qəlbini riqqətə gətirir və unudulmazdır” [Ic.s.47-48].

“Ürək-dirək vermək”, “gözdən salınmaq” frazeoloji birləşmələri xalq – lider vəhdətini ortaya qoyur, “güclü lider xalqla sıx bağlı olan liderdir” anlamını ifadə edir.

Böyük natiqin dilində ciddi, qlobal məsələlər auditoriyalara sadə, ümumişlək, xalq ruhundan qidalanan frazeoloji birləşmələrin köməyi ilə çatdırılır: “Keçmiş Sovetlər İttifaqının bərpa olunması, Azərbaycan Respublikasının da ora daxil olması ehtimalı haqqında bəzi ***şayiələr, fikirlər gəzir***. Bunlar xülyadır” [ Ic.s.10].

Heydər Əliyevin nitqində tənqidi notlarla zəngin, deyərdik ki, satirik üslublu frazeoloji birləşmələrdən məharətlə istifadə olunaraq müəyyən dövr tam xarakterizə olunur: “Halbuki özləri azadlıqdan, hürriyyətdən və haqq-ədalətdən ***dəm vurur***, bunlardan ***ağız dolusu danışırlar***, axırı nə oldu – hamılıqla oğurluğa qurşandılar! Xalq bütün bunları görürdü və buna görə də çox məyus olmuşdu! İş-gücləri küçələrə düşüb “Mersedes”lərdə ***ora-bura çapmaq*** və ***boşboğazlıq etmək*** idi. Elə hey danışır, dil boğaza qoymurdurlar!” [Ic.s.58]. Təkcə yuxarıdakı “dəm vurmaq”, “ağız dolusu danışmaq”, “boşboğazlıq etmək”, “dil boğaza qoymamaq” kimi frazeoloji birləşmələr bir daha xalq qarşısında söz verib əməl etməməyin nə dərəcədə məsuliyyətsizlik olduğunu göstərır.

Ümumişlək frazeoloji birləşmələr böyük natiqin dilində ciddi mətləblərdən xəbər verir: “Çünki orada bir çox sadə

adamın ***pulu batıbdır***. Axı burada onların günahı nədir, onları aldadıblar. Amma vəzifəli adamlar ki, gedib o cür yaramaz təşkilatlara, cürbəcür uydurma banklara – “Vahidbank”a, “Xəyalbank”a və başqalarına dollar qoymuşdular ki, ondan faiz götürəcəklər, – onların ***pulu batdı*** və çox yaxşı oldu ki, batdı. Mən bilirəm ki, bəzilərinin pulu batıbdır” [IXc.s.170].

“İşlərin axsaması” – Bu frazeoloji birləşmə işlərin sürətinin azalması, ləngiməsi anlamında, xüsusilə kənd təsərrüfatı və sənaye sahəsindəki çatışmazlıqlarla əlaqədar işlədilmişdir: “Hansı tədbirləri həyata keçirmək, hansı işləri görmək lazımdır ki, həm islahatların gedişi sürətlənsin, həm də kənd təsərrüfatı sahəsində cari ***işlər axsamasın*** və islahatların aparılması cari işlərin həyata keçirilməsinə mane olmasın” [IXc.s.165].

Rəsmi dövlətlərarası münasibətlərlə bağlı frazeoloji birləşmələr: “İrəliyə aparmaq” – “Güman edirəm ki, əməkdaşlığımız üçün normativ hüquqi sənədlər var, sadəcə olaraq biz əməli işlə bu əməkdaşlığı daha da ***irəliyə aparmalıyıq”*** [IXc.s.367].

“Yüksəklərə qaldırmaq” – “Bir daha deyirəm, bu danışıqların, görüşlərin məqsədi Türkiyə – Azərbaycan əlaqələrini daha ***yüksəklərə qaldırmaqdır***” [IXc.s.367].

Diplomatiya sahəsində işlədilən frazeoloji birləşmələr arasında aşağıdakıları xüsusi qeyd etmək olar:

“Yol tutmaq” – “Ona görə Dünya Birliyinin mənafeyi, öz dövlətinin müdafiəsi naminə Rusiya Ermənistana daha çox təsir göstərə bilər ki, o, ***ağıllı yol tutsun***” [VIIIc.s.307].

“Hörmətlə baxmaq” – Öz tərcümeyi-halım nöqteyi-nəzərindən keçmişə böyük ***hörmətlə baxıram*** [VIIIc.s.313].

“Rol oynamaq” – Ancaq Sovetlər İttifaqı da öz rolunu oynayıbdır [VIIIc.s.314].

“Rol oynamamaq” – İki ildən sonra Rusiya yəqin etdi ki, Azərbaycandan Çeçenistana heç bir yaraqlı keçib getməmişdir

və bu, Çeçenistanda münaqişənin həllində heç bir rol oynamamışdır [VIIIc.s.319].

Ölkələrarası münasibətlərə və əlaqələrə gəlincə bir sıra tez-tez işlənən frazeoloji birləşmələrə təsadüf edilir: Bu sıradan "əlaqələri yüksək səviyyəyə qaldırmaq", "əlaqələri dərinləşdirmək", yaxud "əlaqələri genişləndirmək" frazeoloji birləşmələrini nümunə göstərə bilərik: "Almaniyaya səfərimdə məqsədim bu ***əlaqələri*** daha yüksək ***səviyyəyə qaldırmaq*** və onların daha da ***dərinləşməsi*** və ***genişlənməsi***, inkişaf etməsi üçün yeni tədbirlər görməkdir. Güman edirəm ki, indiyədək keçirdiyimiz görüşlər və bu gün, sabah da nəzərdə tutulan görüşlərimiz Azərbaycan-Almaniya əlaqələrini, xüsusən iqtisadi əlaqələrimizi genişləndirəcək. Biz bu əməkdaşlığın daha da ***yüksəklərə qaldırılmasına*** tərəfdarıq" [VIIc.s.56].

"İz qoymaq" frazeoloji birləşməsi böyük natiqin dilində keçmiş tarixə bir nəzərdir: "İkinci dünya müharibəsi illərində almanların Azərbaycandan uzaqlaşdırılmasına baxmayaraq, onların ölkəmizdə yaşadıqları dövrdə ***qoyduqları iz*** və onlardan sonra gələn nəsillərin nümayəndələrinin Azərbaycanda gördükləri işlər Azərbaycan üçün çox qiymətlidir" [VIIc.s.33].

Azərbaycanın haqq səsinin dünyaya çatdırılması yolunda qonşu ölkələri də Heydər Əliyev səfərbər edə bilir və bu zaman "səsini qaldırmaq" frazeoloji birləşməsi işə düşür: "Eyni zamanda biz bütün dövlətlərin, o cümlədən İran İslam Respublikasının Azərbaycanın ərazi bütövlüyü, sərhədlərinin toxunulmazlığı üçün öz ***səsini qaldırmasını*** arzu edirik və güman edirik ki, həmin səslər bundan sonra da gur olacaq" [IIc.s.49].

Ölkələrarası münasibətlərin möhkəmlənməsi münasibətilə böyük natiqin özünəməxsus frazeoloji birləşmələri arasında "möhkəm körpü yaratmaq"da var: "Güman edirəm ki, mənim səfərim, buradakı görüşlər və bugünkü mətbuat konfransı öl-

kələrimiz arasında möhkəm ***körpü yaradır*** və hər iki tərəf bundan səmərəli istifadə etməyə çalışmalıdır" [IIc.s.70].

"Əlaqələri yüksək səviyyəyə qaldırmaq" – "Mən bu görüşlərdən, danışıqlardan çox məmnunam, hesab edirəm ki, bu görüşlər, danışıqlar Almaniya-Azərbaycan əlaqələrini ***yüksək səviyyəyə qaldırdı***" [VIIc.s.63].

"Çox böyük yer tutmaq" – "Bizim görüş və danışıqlarımızda iqtisadi problemlər, ölkələrimiz arasında iqtisadi əlaqələrin inkişaf etdirilməsi məsələləri çox ***böyük yer tutdu***" [VIIc.s.63]

Heydər Əliyevin türkdilli xalqlarla bağlı nitq və çıxışlarında bir sıra mürəkkəb frazeoloji birləşmələr işlənir. Bu sıraya "tarixi köklərə malik olmaq", "köklərin əsrlərin dərinliklərinə gedib çıxması" kimi frazeoloji söz birləşmələri aiddir: "Qırğız və Azərbaycan xalqları arasında dostluğun kökləri əsrlərin ***dərinliklərinə gedib çıxır***. Biz eyni ***tarixi köklərə malikik***, bir dil qrupuna, bir dinə mənsubuq, milli, mənəvi adət və ənənələrimizdə oxşar uyğun cəhətlər çoxdur" [IXc.s.219].

"Bünövrəsini qoymaq" frazeoloji birləşməsinə Heydər Əliyevin Azərbaycanın digər qardaş və qonşu dövlətlərlə qarşılıqlı əlaqə baxımından keçirdiyi görüşlərdə tez-tez təsadüf olunur: "Qırğızıstan ilə Azərbaycan arasında dostluq və əməkdaşlıq haqqında müqavilənin xüsusi əhəmiyyəti var, o, bizim dostluğumuzun, qardaşlığımızın, əməkdaşlığımızın möhkəm müqaviləli-hüquqi ***bünövrəsini qoyur***" [IXc.s.200].

"Mərhələ açılmaq", "münasibətləri inkişaf etdirmək və dərinləşdirmək" kimi frazeoloji birləşmələr böyük natiqin dilində müstəqilliyin ilk illərində özünə yer tapır: "Beləliklə, yeni ***mərhələ açılır*** və bu mərhələdə suveren Qırğızıstan və suveren Azərbaycan ***münasibətlərimizi inkişaf etdirmək*** və ***dərinləşdirmək*** üçün gələcək fəaliyyət proqramını müəyyənləşdirmişlər" [IXc.s.220].

Qabaqcıl təcrübənin ölkəmizə gətirilməsi ilə bağlı Heydər Əliyevin frazeoloji birləşməsi mövcuddur: “Son mərhələdə mən belə fikrə gəldim ki, bizim nümayəndələr Rusiyanın Oryol, Nijni-Novqorod vilayətlərinə də getsin və onların da ***təcrübəsini öyrənib gətirsinlər***” [VIIc.s.90]. “Təcrübəni öyrənib gətirmək” frazeoloji birləşmə bu gün həyatımızın istənilən sahəsində dünya təcrübəsindən yararlanmaq, faydalanmaq baxımından zəruridir.

“Hakim dil olmaq” – Bunlar hamısı onu göstərir ki, dövlət dilimiz, ana dilimiz – Azərbaycan dili ölkəmizdə ***hakim dildir*** [VIIc.s.247].

Frazeoloji birləşmələrin köməyi ilə xalqın dil yaddaşı təzələnir, arxaikliklə müasirlik çulğalaşır: “Başqa məsələdir ki, bir müddətdən sonra onların ***paxırı,*** fırıldaqçı olduqları ***üzə çıxdı*** və buna görə də belələrini vəzifədən uzaqlaşdırmaq lazım gəldi” [Ic.s.49]. “Paxırı üzə çıxanlar vəzifədən uzaqlaşdırılır” deyimini auditoriya anlayır.

Dilimizin qorunması ilə bağlı, dilimizin saflığı ilə bağlı Heydər Əliyev dilində frazeoloji birləşmələr ortaya çıxır: “Dünyada bir kökdən olan nə qədər millətlər var. Bu, öz rəngarəngliyini nə qədər göstərsə, o qədər də güclü olacaq. Amma bir dili başqa ***dilin içərisində əritsən***, necə deyərlər, horra çıxacaq. Horradan da bir şey çıxmaz” [VIIc.s.22].

İqtisadi sahədə işlədilən frazeoloji söz birləşmələri içərisində “inflyasiyanın qarşısını almaq”, “manatın dəyərini möhkəmləndirmək” kimi iqtisadi frazeologizmlər xüsusi yer tutur: “Bilirsiniz ki, inflyasiyanın ***qarşısı tamamilə alınıb*** və indi Azərbaycanda inflyasiya yoxdur. Milli valyutamızın – manatın ***dəyəri möhkəmlənib*** və ötən illə müqayisədə dollarla nisbətdə 10 faiz artıbdır” [IXc.s.283].

İqtisadi məsələlərin çözülməsi ilə bağlı məsələlərdə bir sıra frazeoloji birləşmələr Heydər Əliyevin nitqində tez-tez təkrarlanır: “Azərbaycan isə Sovetlər dağıldıqdan sonra öz

müstəqilliyini əldə edən zaman Sovetlət İttifaqının dağılması və yaranmış böhran vəziyyəti ilə əlaqədar çox ağır iqtisadi ***problemlərlə rastlaşdı***" [VIIc.s.27].

Öz şəxsi mənfəətlərinə görə ölkə iqtisadiyyatına zərbə vuranlar yenə də özünəməxsus Heydər Əliyev frazeoloji birləşmələri ilə ittiham olunur: "Bu cür dəstələr Vətəni, torpağı müdafiə etmək əvəzinə öz şəxsi ***mənafelərini güdmüşlər***. Onlar Azərbaycanı nə günə salmışlar, nə dəhşətli vəziyyətə salmışlar – indi hamıya aydındır, hamının ***gözü qarşısındadır***" [Ic.s.102].

İqtisadiyyatımızın inkişafına mane olan bürokratizm, mərkəzləşdirmə kimi amilləri "əl-qolu bağlanmaq" frazeoloji birləşmə ilə əvəz edərək auditoriyada milli ovqat yaradır: "O vaxt bu sahədə çalışan vəzifəli şəxslər, o cümlədən də Nazirlər Kabineti, nazirliklər, müəssisə rəhbərləri çox şikayətlənirdilər ki, onların ***əl-qolu bağlanıb***" [VIIc.s.29].

"Nəticəsini göstərmək" – bu frazeoloji birləşmə siyasi-iqtisadi sahələrdə qarşıya qoyulan məqsədin yerinə yetirilməsi baxımından istifadə olunur: "...həm vergilərin toplanması ilə əlaqədar planların ödənilməsi, həm də başqa iqtisadi göstəricilər onu sübut edir ki, bizim tutduğumuz yol və həyata keçirdiyimiz tədbirlər doğrudur, düzgündür, iqtisadi islahatlar ardıcıl surətdə həyata keçirilir və bunlar iqtisadiyyatımızın vəziyyətində, müəyyən mənada onun inkişafında, artmasında öz ***nəticələrini göstərir***" [IXc.s.164].

"Tona çatmaq" – çəki vahidi ilə istifadə də bu frazeoloji birləşmələr istehsalla bağlı çıxışlarda işlədilir: "Xatırlayın orta hesabla ildə 800 min ton pambıq istehsal olunurdu, indi 300 min ***tona çata*** bilmirik. Üzüm istehsalı 2 milyon ***tona çatmışdı***, indi heç 300 min ton da istehsal edə bilmirik" [IXc.s.176].

Torpaqla, kənd təsərrüfatı ilə bağlı frazeoloji birləşmələrdən "torpağa əziz balası kimi baxmaq", "torpağın üzərində çalışmaq" tez-tez təkrarlanır: "Amma torpaq adamın özündə

olanda, yenə də deyirəm, ona əziz ***balası kimi baxacaq***, onun üzərində çalışacaq, işləyəcəkdir" [VIIc.s.217].

Torpaqla insan arasındakı münasibətlərdə Heydər Əliyev frazeoloji birləşmələri özünə yer alır: "Şəxsi mülkiyyətə keçəndən sonra insanlar həmin torpağa əziz ***balası kimi baxacaqlar***. Çünki insanın həyatı bütünlüklə bu ***torpaqla bağlı olacaqdır***" [VIIc.s.214].

Beləliklə "torpağa əziz balası kimi baxmaq", "torpağın üzərində çalışmaq" frazeoloji birləşmələri kənd təsərrüfatı ilə bağlı çıxış məqamlarında natiqlər üçün hazır frazeoloji birləşmələrdir.

Bir sıra frazeoloji birləşmələr müxtəlif nitq məqamlarında işlənir ki bunlardan biri də "aradan qaldırmaq"dır. "Kənd təsərrüfatında mövcud və on illərlə hakim kəsilmiş strukturu dəyişdirmək bəlkə də asan məsələ deyildir. Ancaq bu o demək deyil ki, biz bu çətinliklərdən qorxub çəkinərək, yaxud çətinlikləri ***aradan qaldırmağa*** cürət etməyərək dayanıb vaxtı itirməliyik" [IIc.s.33].

Heydər Əliyevin nitqində frazeoloji birləşmələr kənd təsərrüfatı sahəsində də özünəməxsusluğu ilə seçilir: "Heç olmasa, qoy bundan sonra qalan günlər ərzində həm camaat daha da səfərbər olsun, həm də indiyədək görülməmiş işlər ***başa çatdırılsın***, səpin vaxtında, keyfiyyətlə aparılsın ki, yaxşı ***məhsulun bünövrəsini qoymağa*** macal tapaq" [Ic.s.490].

Elmi məntiqə söykənməyən, ictimaiyyəti aldatmağa çalışanlar "dəm vurmaq" frazeoloji birləşməsinin köməyi ilə qınağa çəkilir: "Bəziləri, o cümlədən də ictimaiyyətin bəzi nümayəndələri illərlə sübut etməyə çalışdılar ki, guya pambıqçılıq Azərbaycan üçün faydalı deyildir. Digərləri isə pambıqçılığın zərərli olmasından ***dəm vururdular***" [Ic.s.487]. "Dəm vurmaq" frazeoloji birləşməsinin ardınca "başı çıxmamaq", "ortaya cürbəcür fikirlər atmaq", "yanlış fikir yaratmağa can atmaq" frazeoloji birləşmələri "dəm vurmağ"ın mahiyyətini

auditoriya üçün açıqlayır: "Odur ki, nə iqtisadiyyatdan, nə kənd təsərrüfatından, nə də pambıqçılıqdan ***başı çıxan***, lakin bu sahələr barəsində ***ortaya cürbəcür fikirlər atıb,*** ictimaiyyəti çaşdıran, ayrı-ayrı adamlarda yanlış ***fikir yaratmağa can atan*** həmin adamlar qoy bir oturub fikirləşsinlər" [Ic.s.488].

Kənd təsərrüfatının inkişafı ilə bağlı proqnostik frazeoloji birləşmələr də Heydər Əliyevin çıxışlarında özünə yer tapır: "Bu günkü müşavirədə də məqsəd odur ki, özümüzü, bütün kənd əməkçilərini, kənd təsərrüfatı ilə məşğul olan bütün nazirlikləri, idarələri, müəssisələri bir daha səfərbər edək ki, həm ilin sonunadək ***əldə olunacaq*** məhsulların miqdarını, istehsalını artıraq, həm də gələn il üçün etibarlı zəmin yaradaq" [IIc.s.127].

Böyük natiq milli təəssübkeşlik hissinin yüksək səviyyədə özünü büruzə verdiyi frazeoloji birləşmələr kənd təsərrüfatındakı mövcud geriliyi, çatışmazlıqları "ürək ağrısı" ilə qarşılayır, istehsalın aşağı düşməsinin adama ağır gəldiyini söyləyir: "İndi mən aldığım cədvəllərə baxıram. İnanın ki, onlara baxdıqca ***ürəyim ağrıyır.*** Məsələn, respublikamız vaxtilə ildə 700 min ton tərəvəz tədarük edirdi. Amma indi vur-tut 50 min ton tərəvəz istehsal olunmuşdur. Bu adama ***ağır gəlir***" [IIc.s.135].

16 aprel 1997-ci ildə Prezident Sarayında kənd təsərrü fatında cari işlərin vəziyyətinin müzakirəsinə həsr olunmuş müşavirədə kiçik bir başlıqdakı mətnə diqqət yetirsək torpaqla, torpaqdan istifadə ilə bağlı nitqin ecazkarlığını yüksəldən frazeoloji birləşmələrlə auditoriyanı heyran qoyur. "Torpaq şəxsi mülkiyyətdə olanda həmin torpağın sahibi onu ***göz bəbəyi kimi qoruyacaqdır***. Ancaq məsələ təkcə onun qorunmasında deyildir. Gərək torpağın sahibinə bütün şərait yaradılsın ki, o, bu torpaqdan səmərəli istifadə edə bilsin. Torpağı alıb onun ***üstündə oturdu*** – nə olsun? Torpağı alandan sonra onun min dənə problemi çıxdı, onu da həll edə bilmədi – vətəndaş bundan da razı olmayacaqdır. Əksinə, hətta bəziləri söyəcək ki, niyə

məni bu ***işə saldılar***. Ona görə də burada çox problemlər vardır. Amma gərək bu problemlərəbizim komissiyada baxılsın. Kənd təsərrüfatı orqanları, yerli icra hakimiyyəti gərək bu işə xüsusi fikir versinlər. Bu işi bütün rayonların hamısında eyin cür həll etmək olmaz. Hər rayonun özünə görə xüsusiyyəti vardır. Buna görə də həmin məsələlər hər rayonun xüsusiyyətinə uyğun həll edilməlidir" [IXc.s.178].

Sahibkarlığın inkişafı ilə bağlı işlədilən frazeoloji birləşmələr: "islahatlar həyata keçirmək" – "Dövlətin iqtisadiyyat sahəsində tutduğu yol, onun siyasəti Azərbaycanın iqtisadiyyatını bazar iqtisadiyyatı yolu ilə aparmaqdan və bu məqsədlə iqtisadi ***islahatlar həyata keçirməkdən*** ibarətdir" [VIIc.s.218].

"Sərbəst işləməyə imkan verməmək" – "Çox siqnallar gəlir ki, sahibkarların ***sərbəst işləməsi*** üçün cürbəcür bürokratik maneələr var. Yaxud da ki, ayrı-ayrı vəzifəli şəxslər öz mövqeyindən sui-istifadə edərək onların sərbəst işləməsinə imkan vermirlər" [VIIc.s.220].

"Bazar iqtisadiyyatı yolu ilə aparmaq" – "Mən bu gün görüşümüzün əvvəlində dedim, bir də qeyd edirəm – biz respublikanın iqtisadiyyatını bazar iqtisadiyyatı ***yolu ilə aparırıq*** və bundan sonra da aparacağıq" [VIIc.s.228].

"Sahibkarlıq əhval-ruhiyyəsi yaratmaq" – "İqtisadiyyatda bu qədər ciddi dəyişikliklər aparmaq, insanların psixologiyasında dəyişikliklər aparmaq, onlara yeni prinsiplər əsasında işləməyi öyrətmək, ***sahibkarlıq əhval-ruhiyyəsi yaratmaq*** – bunlar asan məsələlər deyil" [VIIc.s.228].

"Qarşısında dura bilmək" – "Onlar öz hüquqları çərçivəsində iş görərək, arxayın ola bilərlər ki, hüquqları dövlət orqanları tərəfindən pozularsa, onlar bu orqanların ***qarşısında dura bilərlər***. Sahibkarların da hüquqları pozulmamalıdır və dövlətin də mənafeyinə zərər dəyməməlidir" [VIIc.s.231].

Azərbaycanın idman uğurları ilə bağlı idmançılarımızla görüşlərdə "nailiyyətləri yüksək qiymətləndirmək", "nailiy-

yətlər əldə etmək” frazeoloji birləşmələrindən geniş istifadə edir: “Ona görə də mən Olimpiya oyunlarında iştirakınızı və əldə etdiyiniz nailiyyətləri ***yüksək qiymətləndirib***, sizi ***ürəkdən təbrik edirəm***, cansağlığı arzulayıram və ümidvar olduğumu bildirmək istəyirəm ki, bundan sonra da idmanla məşğul olacaqsınız, Azərbaycan idmanının inkişafı üçün çalışacaqsınız və dörd ildən sonra, növbəti Olimpiya oyunlarında bundan da yüksək ***nailiyyətlər əldə edəcəksiniz***” [VIIc.s.202].

Ölkəmizdə bədən tərbiyəsi və idmanın inkişafı ilə bağlı Heydər Əliyevin nitqində özünəməxsus frazeoloji birləşmələr mövcuddur: “Azərbaycanın idman veteranları, – onların bir çoxu burada iştirak edirlər, – ölkəmizdə idmanın inkişafı üçün çox işlər görüblər, yaxşı ənənələr yaradıblar, gənclərimiz üçün yaxşı ***yollar açıblar”*** [VIIc.s.10].

“Yaxşı yollar açmaq” frazeoloji birləşmə ilə yanaşı “idman ulduzları hazırlamaq” mürəkkəb frazeoloji birləşmələr işlənir: “Ona görə bu gün mən idman sahəsində müəllimlik edənlərin, məşqçiliklə məşğul olanların, gənclərimizdən ***idman ulduzları hazırlayanların*** hamısına hörmət və ehtiramımı, onlara təşəkkürümü bildirirəm” [VIIc.s.10].

90-cı illərdəki iqtisadiyyatımız Heydər Əliyevin istifadə etdiyi frazeoloji birləşmələr ilə əks olunur, auditoriya iqtisadiyyatımızın hansı vəziyyətdə olduğunu böyük natiqin dilindən eşidir: “İndi Azərbaycanın iqtisadiyyatı ağır ***böhran içərisindədir***. İnsanların həyat tərzi ağırdır. Bunların səbəbi məlumdur” [IIc.s.9].

“Böhran içərisində olmaq” frazeoloji birləşməsinin ardınca “ağır proseslər içərisində yaşamaq” frazeoloji birləşməsi auditoriyalara yol tapır, ictimai-siyasi dövrü xarakterizə edir: “Biz ağır ***proseslər içərisində yaşayırıq***. Bu proseslərdən ***doğru yol tapmaq***, ***düz getmək*** üçün həm çox düşünülmüş, həm də cəsarətli hərəkət etməliyik. Biz belə də hərəkət edəcəyik” [IIc.s.9].

Heydər Əliyevin nitqində hər bir ünvanın öz frazeoloji birləşməsi var. Xaricdə yaşayan azərbaycanlılara ünvanlanan "hərarətli salamlar göndərmək" frazeoloji birləşməsinə tez-tez təsadüf olunur: "Ölkəmizin hüdudlarından kənarda yaşayan bütün azərbaycanlıları Novruz bayramı münasibətilə səmimi-qəlbdən təbrik edir, onlara Azərbaycan torpağından ***hərarətli salamlar göndərir*** və səadət, xoşbəxtlik arzulayıram" [Ic.s.483].

Auditoriyaları nikbinliyə səsləyən idiomlardan da yeri gəldikcə istifadə olunur: "Mən yaxşı bilirəm ki, belə bir yataqxanada bu qədər ailənin, adamın yaşaması çətindir, ağırdır. Ancaq mən dəfələrlə demişəm, sizə bir daha deyirəm: ***qara günün ömrü çox gödək olur***" [VIIc.s.28].

"Müstəqilliyə qənim kəsilmək" – müstəqilliyimizi qəbul etməyən, bu müstəqilliyi aradan qaldırmaq istəyən qüvvələri xalqa tanıtdırmaq məqsədi daşıyan frazeoloji birləşmələrdəndir: "Bunlarla yanaşı, Azərbaycanın müstəqilliyinə ***qənim kəsilmiş*** daxili və xarici qüvvələr ardı-arası kəsilməyən təxribatlarla ***xalqı sarsıtmağa***, onun azadlıq ***əzmini qırmağa*** çalışırlar" [IIc.s.510]. "Müstəqilliyə qənim kəsilmək" frazeoloji birləşməsi sinonim yaradan frazeoloji birləşmələrlə – "xalqı sarsıtmaq", "azadlıq əzmini qırmaq" – birgə işlənərək xalqı gələcək günlərə hazırlayır.

Dağlıq Qarabağ probleminin çözülməsi ilə bağlı "ümidlər bəsləmək", "ümidlə baxmaq" frazeoloji birləşmələri tez-tez işlənir: "Biz bununla da razılaşdıq, çünki, ATƏM-in, Minsk konfransının fəaliyyətinə böyük ***ümidlər bəsləyirik*** və indi də bəsləyirik" [Ic.s.34].

Fransa Respublikasının prezidenti Fransua Mitterana ünvanlanan məktubda isə "ümidlə baxmaq" frazeoloji birləşməsindən istifadə olunur: "Demokratik cəmiyyət, bazar iqtisadiyyatı yaratmaq yolu seçmiş Azərbaycan xalqı öz suveren dövlətini qurur və bütün dünyada demokratiyanın və azadlığın

əsil dayağı və mücəssəməsi olan sizin böyük ölkənizə böyük ***ümidlə baxır***” [Ic.s.31].

### *Nitqdə nikbinlik aşılayan frazeoloji birləşmələr*

Auditoriyalarda bir sıra frazeoloji birləşmələrlə nikbinlik yaratmaq böyük natiqə xas olan xüsusiyyətlərdəndir. “Ümidini heç vaxt itirməmək”, “çətinliklərlə üz-üzə gəlmək” kimi frazeoloji birləşmələr nitqdə əminlik yaratmaqla auditoriyaları gələcək günlərə hazırlayır: “Ona görə də respublikada yaşayış çətindir, bəzi ərzaq məhsulları çatışmır, işsizlər var. Ancaq sizi əmin etmək istəyirəm ki, bunlar hamısı müvəqqəti çətinlikdir, onları ***aradan qaldıracağıq***. Azərbaycan xalqı belə ***çətinliklərlə*** çox ***üz-üzə gəlmişdir***, lakin milli qürurunu, mənliyini, mənəviyyatını, ən nəhayət, ***ümidini heç vaxt itirməmişdir***, daim ümidlə yaşayaraq ***gələcəyə baxmış*** və çətinlikləri ***aradan qaldırmışdır***” [IIc.s.147].

Proqnostik çıxışlarında “çox müsbət görmək”, “göz qabağında olmaq” kimi frazeoloji birləşmələrdən istifadə edilir: “Odur ki, bu sahədə lazımi tədbirlər görülməli, islahatlar aparılmalı, qanunlar hazırlanıb qəbul edilməlidir. Həm də bu yolla gedərkən müəyyən mərhələdə daha ağır vəziyyətə düşə bilərik. Buna baxmayaraq, mən bunun gələcəyini çox ***müsbət görürəm***, çünki iqtisadiyyatı inkişaf etmiş respublikaların həyatı, onların vətəndaşlarının həyat tərzi, iqtisadiyyatın səviyyəsi ***göz qabağındadır*** ” [IIc.s.115-116].

Heydər Əliyevin nikbinlik yaratmaq məqsədi ilə auditoriyalarda işlətdiyi frazeoloji birləşmələr bəzən bir-birinin ardınca düzülür: “Azərbaycan xalqı bütün bu bəlalardan çıxmağa qadirdir. Biz ***heç vaxt sınmayacağıq***, bizim ***iradəmiz*** heç vaxt ***dönməyəcək***. Yenə də deyirəm ki, biz başqa ölkənin, başqa dövlətin torpağına ***göz dikməmişik***, ancaq öz ərazimizi, öz torpağımızı qorumağa çalışacağıq və buna ***nail olacağıq***. Azərbaycan öz müstəqilliyini heç vaxt ***əldən verməyəcək***.

Xalqımız öz milli azadlığını qoruyacaqdır" [IIc.s.49]. Yuxarıdakı parçada "bəlalardan çıxmağa qadir olmaq", "heç vaxt sınmamaq", "heç vaxt dönməmək", "nail olmaq", "əldən verməmək" frazeoloji birləşmələri auditoriyada gələcək günlərə nikbinlik aşılayır.

"Sınaqlardan keçmək", "addım atmaq" kimi frazeoloji söz birləşmələri gələcəklə bağlı nikbin fikirlərin auditoriyalara yönəlməsində mühümdür: "Xalqımız ötən dövrlərdəki o sınaqlardan keçdiyi kimi, biz də bu ***sınaqlardan keçəcəyik***, bu ***addımı atacağıq*** və müstəqil Azərbaycan Respublikasının ərazi bütövlüyünü təmin edəcəyik, Ermənistan silahlı qüvvələrini işğal etdikləri torpaqlarımızdan çıxaracağıq, siz öz yerinizə-yurdunuza qayıdacaqsınız" [IXc.s.216].

Həyatda itirilmiş yaxın adamlarla bağlı frazeoloji birləşmələr özünəməxsus ovqat yaradır: "Həyat yoldaşım Zərifə Əzizqızı 85-ci ildə vəfat etmişdir. Tanınmış oftolmoloq idi. Üstəlik, musiqi də bəstələyir, gözəl piano çalır, oxuyurdu. Biz otuz il birlikdə ***ömür sürmüşdük***… Bu yaxınlarda böyük qardaşlarım və bacım ***dünyalarını dəyişmişlər***. Ailədə səkkiz uşaq idik. Atam dəmir yolunda fəhlə idi, gecə-gündüz işləyirdi. Bizi anamız ***boya-başa çatdırmışdır***" [Ic.s.55]. Bu kiçik parçada "ömür sürmək", "dünyasını dəyişmək", "boya-başa çatdırmaq" kimi frzaeoloji birləşmələr dini-poetik bir ovqat yaradır, dahi şəxsiyyətin iç dünyasını auditoriyaya açıqlayır.

Vəziyyətin kritikliyini, böhranlı ana yetişməsini auditoriyaya çatdırmaq baxımından "bundan pisini ağla gətirmək" frazeoloji birləşməsi isifadə olunur: "İndi Azərbaycanda vəziyyət belədir, iqtisadiyyat büsbütün dağılmışdır. O ki qaldı ictimai-siyasi vəziyyətə, bundan ***pisini ağla gətirmək*** olmaz" [Ic.s.50].

"Əl çəkmək" frazeoloji birləşməsi, "qəlbimdə qalmaq"la birgə təsadüf edərək ulu öndərin gənclik arzularını və bu arzuların sonralar yerinə yetirilməsini dilə gətirir: "Başlıca arzum arxitektor olmaq idi. Həmin ixtisas üzrə hətta bir az oxumuş-

dum da, lakin sonra bu arzumdan ***əl çəkməli*** oldum. Hərçənd o, ***qəlbimdə qalır.*** Yeri gəlmişkən, Azərbaycanın rəhbəri olarkən şəhərsalma sahəsində az iş görmədim" [Ic.s.49].

Üslublardan asılı olaraq müxtəlif frazeoloji birləşmələr böyük natiqin nitqində işə düşür. Məsələn akademik Yusif Məmmədəliyevin 90 illik yubileyində onun həyatının çiçəkləndiyi bir vaxtda əbədiyyətə qovuşması aşağıdakı frazeoloji birləşmələrlə diqqətə çatdırılır: "Qəfil ölüm onun ***həyatını dayandırdı***. Xatirimdədir, 1961-ci ildə".

Təvazökarlıqla bağlı, dünya malına aludə olmamaqla bağlı bir sıra frazeoloji birləşmələr işlənir. Bu sıradan "mənsəbdə gözü olmamaq" frazeoloji birləşməsi mühümdür: "Ancaq heç bir vəzifədə, heç bir ***mənsəbdə gözü yox idi***. Nəinki gözü yox idi, hətta belə təkliflərdən dəfələrlə imtina etmişdir" [IXc.s.145].

Dini üslubun tələb etdiyi frazeoloji birləşmələr içərisində Heydər Əliyevin ən çox işlətdiyi "baş əymək", "rəhmət diləmək"dir: "Deyə bilərəm ki, bu, mənim həyatımda ən ağır itkilərdən ibarətdir. Mən dostum Tamerlanı müqəddəs cənazəsi qarşısında ***baş əyirəm***. Allahdan ona ***rəhmət diləyirəm***" [IXc.s.146].

Böyük natiqin şəhidliklə, Vətən, torpaq yolunda canlarını qurban vermiş igid oğul və qızlarımızla bağlı auditoriyalarda birbaşa işlətdiyi frazeoloji birləşmələr sonda Azərbaycan nitq mədəniyyəti xəzinəsinə böyük töhfələrə çevrilir. 20 mart 1996-cı ildə şəhid uşaqları və kimsəsiz uşaqlar üçün təşkil olunmuş Novruz şənliyindəki çıxışda söylənilən frazeoloji birləşmələr bu qəbildəndir: "Onlar ***həyatdan getməyiblər***, bizimlədirlər, qəlbimizdədirlər. Onlar bu gün bu salondadırlar, sizin şən, xoşbəxt gününüzü görüb daha da sevinirlər. Ona görə də siz özünüzü heç də valideynsiz hesab etməyin. Sizin valideynləriniz var. Müstəqil Azərbaycan dövləti sizin valideyninizdir. Sizin ***valideyniniz Azərbaycan torpağıdır***, Vətənimizdir, müstəqil Azərbaycan dövləti və onun prezidentidir. Siz buna arxa-

yın ola bilərsiniz” [VIc.s.12]. “Onlar həyatdan getməyiblər”, “valideyniniz Azərbaycan torpağıdır” və s. frazeoloji birləşmələr nikbin bir ovqat yaradaraq gələcəyin qurucuları olan uşaqların hafizəsinə, xatirəsinə həkk olunur.

Şəhidlər ulu öndərin bütün çıxışlarında yad olunur. Novruz bayramı münasibətilə söylədiyi nitqdə “ruhu qarşısında baş əymək” frazeoloji birləşməsi ilə qəlblərə yol açır, hər birimizi şəhid ruhlarına hörmət qoymağa səsləyir: “Vətənimizi müdafiə edərək şəhid olmuşlar. Bu bayram axşamında mən şəhid olmuş övladlarımızı yad edir və onların ruhu qarşısında ***baş əyirəm***. Mən xalqımızı əmin edirəm ki, şəhidlərin xatirəsi qəlbimizdə daim yaşayacaqdır. Vətən bu fədakarlığı heç vaxt unutmayacaqdır!” [Ic.s.482].

Frazeoloji birləşmələrin müəyyən qismi böyük natiqin dilində dini üslublu çıxış və nitqlərində səslənərək dindarlar auditoriyasını fəth edir: “İndi hər bir azərbaycanlının qəlbində bir niyyət var və bu amalla da ***müqəddəslərimizə üz tuturuq***. Bu niyyətlə də müqəddəs Orucluq bayramında inanc yerlərimizi ziyarət edirik” [Ic.s.480].

“Müqəddəslərimizə üz tutmaq” frazeoloji birləşməsinin ardınca elə həmin çıxışda “qaranlıqlardan çıxmaq”, “çətinliklərdən çıxmaq” frazeoloji birləşmələri ilə auditoriyanınn qəlbinə yol açılır: “Cənab Məhəmməd peyğəmbərin qoyduğu yol həmişə bizim üçün işıqlı olacaq və biz bütün bu ***qaranlıqlardan, çətinliklərdən çıxacağıq***. Burada çox arzular eşitdim ki, müharibə qurtarsın, əmin-amanlıq olsun” [Ic.s.481].

Dini üslublu çıxışlarında böyük natiqin tez-tez rast gəldiyimiz “şəhid ailələrinə üz tutmaq”, “dərin hüznlə başsağlığı vermək” kimi frazeoloji birləşmələrini görürük: “Bu bayram günündə ***şəhid ailələrinə üzümü tuturam***. Onların dərd-qəmi bütün xalqın dərd-qəmidir, bizim dərd-qəmimizdir. Əziz həmvətənlər bayram münasibətilə sizi təbrik edirəm” [IIc.s.12].

Başqa bir məqamda isə, Aşura günündə "başsağlığı vermək" frazeoloji birləşməsi səslənir: "Bu gün həzrəti Məhəmməd peyğəmbərin nəvəsi həzrəti imam Hüseynin qətlə yetirildiyi gündür. Biz ulu babalarımızın Vətən, torpaq, haqq-ədalət yolunda şəhid olduğu günü yad edirik. Bu münasibətlə mən bütün Azərbaycan müsəlmanlarına dərin hüznlə ***başsağlığı verirəm***" [IIc.s.27].

Heydər Əliyevin dini-məişət üslublu nitqlərində tez-tez işlətdiyi frazeoloji birləşmələr içərisində "baş əymək", "başsağlığı vermək", "rəhmət eləmək" mühüm yer tutur: "Mən bu gün Xəlil Rzanın cənazəsi qarşısında ***baş əyirəm***. Allah ona ***rəhmət eləsin***. Mən onun ailəsinə ***başsağlığı verirəm***. Başınız sağ olsun. Allah xalqımıza səbirlər versin. Allah Xəlil Rzaya ***rəhmət eləsin***" [IIc.s.44].

***Tarixi-fəlsəfi dünyagörüşlə bağlı frazeoloji birləşmələr***

Belə ki, fəlsəfə sahəsində tarix fəlsəfəsinə aid frazeoloji birləşmələr diqqət çəkməyə bilmir: "Adətən sovet hakimiyyəti dövrünü çox tənqid edirlər. Amma olan ***həqiqətləri*** də unutmaq, ***qaralamaq*** olmaz. Bizim dilimiz məhz o illərdə inkişaf etdi. Dilimizin qrammatikası, qanunları haqqında o dövrdə nə qədər əsərlər yazıldı. Bəli, belə əsərlər sovet hakimiyyəti dövründə yazıldı. Yenə də deyirəm, ***tarixi qaralamaq*** olmaz" [VIIc.s.23].

Bir qisim sadə frazeoloji birləşmələrin köməyi ilə böyük natiq fəlsəfi məna daşıyan məsələləri çözür. Mövcud problemlərin aradan qaldırılması yolunda imkana ehtiyac var ki, bu "imkan əldə etmək" frazeoloji birləşməsi ilə açıqlanır: "Əgər müharibə yoxdursa, döyüş əməliyyatları aparılmırsa, qan tökülmürsə, şübhəsiz ki, xalq daha sakit yaşayır. Xalq, cəmiyyət, dövlət sosial-iqtisadi problemlərlə daha fəal məşğul olmaq üçün ***imkan əldə edir***. Biz də bu imkandan çox fəal istifadə edə bilmişik və edirik" [VIIc.s.101].

Müstəqilliyin xalqın, ayrı-ayrı vətəndaşların öz qabiliyyətlərini göstərmək üçün açdığı şanslar Heydər Əliyev dilində "imkanlar açmaq" frazeoloji birləşməsi ilə əvəzlənir: "Bu, onu göstərir ki, müstəqillik bütün başqa sahələrlə yanaşı, Azərbaycan xalqının, gənclərimizin, idman, fiziki hazırlıq sahəsində də ***imkanlarını açır***, geniş nümayiş etdirir" [VIIc.s.7].

"Tarixi qaralamaq olmaz" frazeoloji birləşməsi ilə böyük natiq tarix fəlsəfəsinə aid fikirlərini auditoriyalara ünvanlayır: "Yenə də deyirəm, ***tarixi qaralamaq olmaz***" [VIIc.s.23].

Azərbaycanın XX əsrin 80-ci illərində düşdüyü vəziyyəti ittiham edən inkar formasında frazeoloji birləşmələr içərisində "rəsmi dairələri oyatmamaq", "rəsmi dairələri ayağa qaldırmamaq", "zəruri işlər görməmək" mühüm yer alır: "Ancaq təəssüf ki, – həmin 1988-ci il haqqında, 1988-ci ilin fevral ayında başlanmış hadisələr haqqında burada deyildi, – təəssüf ki, onlar da Azərbaycanın rəsmi ***dairələrini oyatmamışdır, ayağa qaldırmamışdır*** və Azərbaycanın vəziyyəti haqqında düşünməyə cəlb edə bilməmişdir. Amma Azərbaycan tərəfi nəyəsə ümid bəsləmiş, bunun müqabilində lazımi tədbirlər, Azərbaycanın müdafiə olunması üçün ***zəruri işlər görməmişdir***" [VIIc.s.181].

"Böyük olmaq üçün yaranmış tarixi şəxsiyyətlər kiçik hissiyyatlarla yaşaya bilməz" fəlsəfəsinə uyğun olaraq Heydər Əliyevin nitqində "kənara qoymaq", "kiçik hissiyyatı kənara qoymaq" frazeoloji birləşmələr mövcuddur: "Mən rica edirəm, kiçik hissiyyatı ***kənara qoymaq*** lazımdır, xırda ***dedi-qodunu kənara qoymaq*** lazımdır, bunların vaxtı gələr. Kimin kiminlə nə haqq-hesabı var, sonra edər. İndi bunun vaxtı deyil" [Ic.s.12].

Keçmiş tariximizi auditoriyalara çatdırmaq baxımından "tarixə nəzər salmaq" frazeoloji birləşməsindən böyük natiq tez-tez istifadə edir: "Ancaq gəlin ***tarixə nəzər salaq***, mən də azərbaycanlıyam, Azərbaycanda yaşamışam, həyatımın əksər

hissəsi Azərbaycanda keçib. Siz bilirsiniz ki, 14 ilə yaxın Azərbaycana rəhbərlik etmişəm" [Ic.s.73].

90-cı illərdə Azərbaycanın düşdüyü ictimai-siyasi vəziyyət ittiham şəklində olan frazeoloji birləşmələrin köməyi ilə auditoriyalara izah olunur: "Təəssüf ki, Azərbaycanın rəhbərləri, Azərbaycanın ağıllı adamları, Azərbaycanın ziyalıları bu proseslər başlayan kimi onların ***qarşısını almadılar*** və bu, bir müharibəyə çevrildi. Müharibə getdikcə genişləndi, Azərbaycanı idarə edən adamlar bu ***müharibəni apara bilmədilər*** və çox vaxt ***satqınlıqlara yol verdilər***" [Ic.s.77]. Bu kiçik mətndə üç yerdə işlənən "qarşısını almamaq", "müharibəni apara bilməmək", "satqınlığa yol vermək" frazeoloji birləşmələrin köməyi ilə o dövrdə ki məğlubiyyətlərə qiymət verilir.

Frazeoloji birləşmələr Azərbaycanın tarixinin düzgün, obyektiv olaraq çatdırılmasında mühüm rola malikdir. Tariximizin müəyyən mərhələləri böyük natiq tərəfdən auditoriyalara çatdırılır: "Birinci dünya müharibəsinin bitməsi ilə əlaqədar olaraq dünyada baş vermiş dəyişikliklər, sosialist inqilabı nəticəsində Rusiya ***imperiyasının dağılması*** Azərbaycanda müstəqil dövlət yaratmaq üçün şərait meydana gətirdi" [IIc.s.5].

Sonrakı nitq mərhələsində Heydər Əliyev yaranmış bu gənc, bu müstəqil dövlətin boğulmasından, süqutundan söz açır: "İlk Azərbaycan Demokratik Respublikası ağır və mürəkkəb şəraitdə fəaliyyət göstərirdi. Bir tərəfdən xarici qüvvələr, böyük dövlətlər Azərbaycanda müstəqil dövlətin yaranması ilə razılaşa bilməyərək cürbəcür vasitələrlə bu ***dövləti boğmağa çalışırdılar***" [IIc.s.6].

Böyük natiqin tarixi məqamlara aydınlıq gətirmək baxımından işlətdiyi frazeoloji birləşmələr mövzuya açar ola bilir. Sosialist təsərrüfat sistemindən bazar iqtisadiyyatına keçid dövründə insanlarda baş verən psixoloji məqamları "dərin kök atmaq", "ayrıla bilməmək" frazeoloji birləşmələri ilə şüurlara

çatdırır: "Bu, nəyi göstərir? Bir tərəfdən, bəzi adamlar istəyirlər ki, sərbəstliyə malik olsunlar, amma sərbəstlik verildikdə ondan istifadə etmirlər. Yəni bizim adamlarda keçmişin psixologiyası, əhvalı, iş üsulu və metodları o qədər ***dərin kök atmışdır*** ki, onlar ***bundan ayrıla bilmirlər"*** [IIc.s.120].

İmkan və gerçəklik dialektik kateqoriyalar böyük natiqin dilində sadə xalq misalları ilə auditoriyalara yönəlir: "İmkanımız varsa, şübhəsiz ki, gəlin genişləndirək. Tikinti aparmaq respublikamızın inkişafı üçün həmişə lazımlı işdir. Ancaq indi biz elə bir vəziyyətdə yaşayırıq ki, gərək ***ayağımızı yorğanımıza görə uzadaq.*** Qədimdən qalan bu xalq məsəli bugünkü vəziyyətimiz üçün çox əhəmiyyətlidir" [IIc.s.162].

"Səs ucaltmaq", "çətinliklərdən keçmək" frazeoloji birləşmələri Heydər Əliyevin XX əsrin 80-ci illərinin axırlarında apardığı mübarizəni əks etdirmək üçün istifadə edilir: "Yeri gəlmişkən, o vaxtlar 1987-ci ildə məni çalışdığım yüksək vəzifələrdən uzaqlaşdırmışdılar, lakin Moskvada yaşayırdım və Azərbaycana qarşı bu hərbi təcavüzlə əlaqədar öz etiraz ***səsimi ucaltdım***. Buna görə təqiblərə məruz qaldım və bir neçə aydan sonra Moskvanı tərk etməli oldum, çox ***çətinliklərdən keçdim***" [IXc.s.240]

Fikirlərin şüurlara çatdırılması, şəxsiyyətlərin xalqa tanıdılması, ictimai-siyasi hadisələrə düzgün qiymət verilməsi ilə bağlı böyük natiqin işlətdiyi frazeologizmlər dilimizin zənginləşməsində mühüm rol oynayır: "Səməd Vurğun şeirinin böyüklüyü, eyni zamanda gözəlliyi ondan ibarət idi ki, onun hər kəlməsi, hər sətri hər bir azərbaycanlının ***qəlbinə çatırdı***, onun ***beynini fəth edirdi***, onu öz ***təsiri altına salırdı***" [IXc.s.18].

"Ancaq Vaqifi ***geniş tanıtmaq***, onu ***xalqa*** daha da yaxınlaşdımaq, Vaqifin ***şəxsiyyətini açmaq***, onun ***surətini xalqa göstərmək*** və Vaqifi ***xalqa doğma etmək*** – bunların hamısını Səməd Vurğun etdi" [IXc.s.18]

“Demək olar ki, bir il bundan öncə, həmin gün, Ermənistan silahlı qüvvələri tərəfindən Kəlbəcərin işğal olunması məsələsinə əvvəlki illərə nisbətən daha çox ***aydınlıq gətirdilər***” [IXc.s.110].

Vəziyyətdən çıxış mənasında işlədilən frazeoloji birləşmələr içərisində “yollar aramaq” çox işlədilir: “Çünki komissiya təkcə bəzi məsələlərin həll olunması ilə məşğul olmamalı, bax, bu günlər meydana çıxan məsələlərin həll edilməsi ***yollarını aramalıdır***” [IXc.s.174].

Heydər Əliyevin frazeoloji birləşmələri cəbhədə düşmənlə üz-üzə dayanan Azərbaycan əsgərinə yönəlir: “Mən Novruz bayramı münasibətilə Azərbaycan Ordusunun bütün əsgər və zabitlərini təbrik edirəm. Onlar cəbhədə, səngərlərdə öz ***sinəsini, qeyrətini, cəsarətini*** düşmənlərimizə qarşı ***sipər etmişlər***” [Ic.s.482]. Bu parçada işlənən “sipər etmək” frazeoloji birləşməsi “sinəsini, qeyrətini, cəsarətini” sinonim cərgəsinin hər bir elementinə aid olur ki, bu tip cümlələr böyük natiqin nitqində tez-tez rast gəlir.

Gənclər auditoriyasında, xüsusilə də gənc əsgərlər arasında qəlbləri riqqətə gətirən frazeoloji birləşmələr işə düşür: “Ordunun borcu isə ondan ibarətdir ki, dövlətin siyasətini səmərəli etmək üçün öz gücünü artırsın. Azərbaycanın gənc övladları, torpağımızın keşiyində duran Azərbaycan balaları, mən sizi gördükcə ***ürəyim fərəhlə döyünür***” [Ic.s.504].

Bir qisim frazeoloji birləşmələr ulu öndərin nitqlərində ağsaqqal öyüdünü xatırladır: “Buna görə də sizə müraciət edirəm, o fərarilərə müraciət edirəm. Onlar çox ***səhv yoldadırlar***. Xalqın bu ağır günündə qaçıb gizlənmək olmaz. Belə yaşamaq heç də yaşamaq deyil. O fərarilərin valideynlərinə ***üz tuturam***: Ayılın, başa düşün, bilin – xalqımız, Vətənimiz böyük təhlükə qarşısındadır” [Ic.s.502].

“Yolda olmaq”, “üz tutmaq” frazeoloji birləşmələri ilə fərarilik edən gəncləri və onların valideynlərini düz yola çağırır.

### *Erməni təcavüzü ilə bağlı frazeoloji birləşmələr*

"Konstruktiv addımlar atmaq" – bu frazeoloji birləşmə böyük natiqin sülhlə bağlı çıxış və nitqlərinin əsasını təşkil edir: "Ancaq bütün bunlara baxmayaraq biz Ermənistanla sülh yaratmaq, münaqişəni sülh yolu ilə aradan qaldırmaq istəyirik. Bundan ötrü də çox ***konstruktiv addımlar atırıq***" [VIIc.s.28].

Frazeoloji birləşmə Heydər Əliyevin nitqində mahiyyəti açmaq baxımından ciddi səslənir: "Ermənistan yaranmış fasilədən istifadə edərək, Raffaellinin missiyası getdikdən sonra yeni güclü hücuma başlamışdır. Həmin hücum zamanı Ermənistanın silahlı qüvvələri Ağdam şəhərini işğal etmişlər. Bu xəyanətkar hərəkət hələ heç başlanmamış olan sülh prosesinə ***sarsıdıcı zərbə endirmişdir***" [Ic.s.45] "Sarsıdıcı zərbə endirmək" frazeoloji birləşməsi ermənilərin və ermənipərəst missioner təşkilatların iç üzünü açır.

"Ələ keçirmək" frazeoloji birləşməsi müxtəlif çeşidli auditoriyalarda tez-tez səslənir: "Erməni silahlı birləşmələri Kəlbəcər rayonunu tamamilə zəbt etmiş və keçmiş Dağlıq Qarabağ Muxtar Vilayətinin ərazisini tamamilə ***ələ keçirərək***, onun hüdudlarından kənara çıxmış, Ağdam, Füzuli, Zəngilan rayonlarında yaşayış məntəqələrini, hətta Azərbaycanın hissəsində bəzi əraziləri tutmuşlar" [Ic.s.33].

Böyük natiqin dilində frazeoloji birləşmələr Ermənistanın təcavüzkar, sülh təşəbbüslərindən qaçan bir ölkə kimi iç üzünü açmağa kömək edir: "Ermənistan tərəfi, görünür, öz iddialarını həyata keçirmək üçün cürbəcür yollara ***əl atır***. Ona görə də müharibə davam edir" [Ic.s.493-494]. "Cürbəcür yollara əl atmaq" frazeoloji birləşməsi Ermənistanın ədalətli yolda olmamasını auditoriyalara anladır. Başqa bir çıxış məqamında "vədə əməl etməmək", "sülh təşəbbüslərinə məhəl qoymamaq" frazeoloji birləşmələri Ermənistan dövlətinin iç üzünü auditoriyalara göstərir: "Mən dəfələrlə demişəm. Azərbay-

can müharibə etmək istəmir, bu müharibəni Azərbaycan başlamayıb. Biz müharibənin sülhlə başa çatmasına tərəfdarıq. Lakin Ermənistan tərəfi bizim bu sülh təşəbbüslərimizə ***məhəl qoymur***, hətta özü verdiyi ***vədə əməl etmir***" [Ic.s.497].

Azərbaycanın bir müstəqil dövlət kimi dünya birliyindəki mövqeyini bəyan edir, bu zaman qonşu dövlətlərin ərazi bütövlüyünə hörmətini dilə gətirir: "Mən dəfələrlə demişəm, bu gün sizin qarşınızda bir daha təkrar edirəm: biz müharibə istəmirik, Ermənistanın torpaqlarına ***göz dikməmişik***. Biz öz torpaqlarımızı, öz ərazimizi, öz Vətənimizi qoruyuruq" [IIc.s.42-43]. "Göz dikmək" frazeoloji birləşməsinin inkarı ilə böyük natiq ölkəsinin tutduğu mövqeyi açıqlayır.

***Heydər Əliyev şəxsiyyəti ilə bağlı frazeoloji birləşmələr***

"Məqsədə çatmaq" – "Bilirəm ki, xalq qarşısında, sizin qarşınızda böyük öhdəlik götürmüşəm və böyük məsuliyyət daşıyıram. İndi həyatımın yeganə məqsədi bu vəzifəni yerinə yetirmək, bu ***məqsədə çatmaq***, xalqımızı bu ***vəziyyətdən çıxarmaqdan*** ibarətdir" [IXc.s.122].

Böyük natiq bir sıra frazeoloji birləşmələrlə özünün keçdiyi həyat yolunu auditoriyalara anladır: "İftixar hissi keçirmək" – "Mən bu gün buraya gələrkən, Xəzərin sahilində, vaxtilə tamamilə boş olan bir yerdə böyük zavod korpuslarını və nəhəng qurğuları, sahili və bu sahənin ətrafında yüksəklərə qalxmış yaşıl ağacları görüb bir daha ***iftixar hissi keçirdim***" [VIIc.s.244].

"Çətin yollardan keçmək" – "Vaxtilə bu işlərin görülməsi üçün illərlə zəhmət çəkmişəm, bunların reallığa çevrilməsi üçün illərlə çox ***çətin yollardan keçmişəm***" [VIIc.s.244].

Öz xalqı qarşısında, xalqın gələcəyi, mövcudluğu baxımından meydanlara atılan və bu zaman məsuliyyətini dilə gətirən Heydər Əliyevin nitqlərində tez-tez öz "üzərimə götürmək" frazeoloji birləşməsini eşidirik: "Ona görə də biz bu qərarların

həyata keçirilməsindən istənilən nəticəni əldə edə bilməmişik. Məhz buna görə də mən yenidən -1996-cı ilin yarısı başa çatandan sonra bir daha Nazirlər Kabinetinin iclasının geniş tərkibdə keçirilməsini ***öz üzərimə götürdüm***” [VIIc.s.111].

Dövlət quran lider – Heydər Əliyevin nitqində təbii ki özünəməxsus frazeoloji birləşmələr mövcuddur. Bu tip frazeoloji birləşmələrə “müzakirələr aparmaq”, “fikirləri nəzərə almaq”, “məsələnin üzərində dayanmaq” və s. aid ola bilir: “Mən hesab edirəm ki, Nazirlər Kabinetinə 10 gün vaxt verilməlidir, dünən və bu gün ***aparılan müzakirələr*** əsasında, verilən tövsiyələr əsasında və mənim fikirlərimi ***nəzərə almaqla*** 10 gün müddətində bu təklifi hazırlayıb prezidentə təqdim etmək lazımdır.

Güman edirəm ki, bu məsələnin ***üzərində*** artıq ***dayanmağa*** ehtiyac yoxdur və hesab edirəm ki, bu salona toplaşan adamlar bu məsələnin mahiyyətini, mənasını və əhəmiyyətini artıq dərk edirlər” [VIIc.s.131].

Yuxarıdakı frazeoloji birləşmələrə “həyata keçirmək”, “öz payını vermək” frazeoloji birləşmələrini də qoşmaq olar: “Bu istiqamət çox düzgün istiqamətdir, ancaq siz gərək bu məsələni ardıcıl surətdə ***həyata keçirəsiniz***. Böyük xammal bazası olan belə böyük kompleks işləməlidir. Azərbaycanın iqtisadiyyatına mənfəət gətirməlidir və ölkəmizin sosial-iqtisadi məsələlərinin həll olunması üçün ***öz payını verməlidir***” [VIIc.s.137].

Heydər Əliyev üçün vəzifə böyük olduqca onu daşımaq da, o vəzifəni yerinə yetirmək də ağır və şərəfli olur: “Mənə bu gün böyük etimad göstərdiyinə görə Milli Məclisin üzvlərinə, Azərbaycanın Ali Sovetinə minnətdarlığımı bildirirəm və sizi əmin edirəm ki, bütün imkanlardan istifadə edib bu böyük vəzifəni, ağır bir ***yükü aparmağa*** çalışacağam və bu vəzifənin ləyaqətlə yerinə yetirilməsinə səy edəcəyəm” [Ic.s.10].

Böyük natiqin təbirincə böyük vəzifə "ağır bir yük aparmaq" frazeoloji birləşməsinə bərabər tutulur.

Dövlət başçısı kimi, prezident kimi bir sıra frazeoloji birləşmələr yalnız Heydər Əliyevin özünə məxsusdur: "Biz, doğrudan da çox ***məsuliyyəti öz üzərimizə götürmüşük***. Bir prezident kimi mən o qanunu imzalayarkən bu məsuliyyəti öz üzərinə götürərkən, inanmışam ki, bu Azərbaycan xalqına çox böyük faydalar gətirəcəkdir" [VIIc.s.215]. Doğrudan da "məsuliyyəti öz üzərinə götürmək" frazeoloji birləşməsi böyük natiqin məsuliyyətdən qaçmayan bir lider olduğuna dəlalət edir.

Azərbaycanda gənclərin idmanla məşğul olması ilə bağlı böyük natiqin işlətdiyi mürəkkəb frazeoloji birləşmələr idmançılarla görüşlərdə səslənir: "Biz, Azərbaycan Prezidenti kimi şəxsən mən ***söz vermişəm*** və indi də bunu təsdiq edirəm ki, idmana xüsusi ***qayğını öz üzərimə götürürəm***, Azərbaycan gənclərinə xüsusi qayğını öz üzərimə götürmüşəm və əmin ola bilərsiniz ki, bu qayğını daim hiss edəcəksiniz" [VIIc.s.203].

Heydər Əliyev şəxsiyyətinin böyüklüyünü auditoriyalara açıb göstərən frazeoloji birləşmə kimi "düz yola gəlmək"dən də tez-tez istifadə olunur. Bu birləşmə böyük natiqin dilində həm təsdiqdə, həm də inkarda işlənə bilir: "Ancaq mən imkan verirəm ki, bu adamlar özləri haqqında lazımi tədbirlər görsünlər, ***düz yola gəlsinlər***. Əgər kim nəhayət, ***düz yola gəlməsə***, onlar haqqında lazımi ölçülər götürüləcəkdir" [IIc.s.123]. Araşdırmalar göstərir ki, dildə inkarlıq bildirən frazeoloji birləşmələr də vardır və bu hal feli frazeoloji birləşmələrdə daha çox təsadüf edilir. H.Bayramov[1] haqlı olaraq təsdiq və inkarlıq baxımından feli frazeoloji birləşmələri üç qrupa ayırır: "1)

[1] Bayramov H. Azərbaycan dili frazeologiyasının əsasları. Bakı, Maarif, 1978.

Həm təsdiq, həm də inkarda işlədilənlər; 2) əsasən inkarda işlədilənlər; 3) əsasən təsdiqdə işlədilənlər”[1]

Bağlanmış müqavilələrə əməl etmək, sədaqətlilik baxımından böyük natiq “sadiq qalmaq” frazeoloji birləşmələri tez-tez işlədir: “Baş tutmuş olan və artıq üç ildir davam edən atəşkəsi yüksək qiymətləndirirəm. Mən İstanbulda biznes konfransında öz çıxışımda bir daha bildirdim ki, biz bu sazişə Böyük Sülh sazişi imzalanan vaxtadək ***sadiq qalacağıq***” [IXc.s.258].

“Öz üzərinə götürmək” – frazeoloji birləşməsi məsuliyyətlə bağlıdır: “Məhz buna görə də mən yenidən – 1996-ci ilin yarısı başa çatandan sonra bir daha Nazirlər kabinetinin iclasının geniş tərkibdə keçirilməsini ***öz üzərimə götürdüm***” [VIIc.s.111].

Heydər Əliyevin nitqlərində bir də görürsən ki, frazeoloji birləşmənin məcazi şəkildə deyilməsini elə Heydər Əliyev özü auditoriyalara anladır. Üzeyir Hacıbəyovun “O olmasın, bu olsun” musiqili komediyasının yeni quruluşda ilk tamaşasına baxdıqdan sonra yaradıcı kollektivin üzvləri ilə görüşdə “xarab olmaq” frazeoloji birləşməsinə verdiyi analizlər bu qəbildəndir: “Məsələn, tamaşada tost söylənilən səhnədə deyir ki, dünya get-gedə xarab olur. Amma dünya xarab olmur. Boş söz danışan adamlar iş görmək əvəzinə orada ***danışıq aparır***, burada ***söz gəzdirir*** və deyir ki, ***dünya xarab olur***. Dünya xarab olmur... Amma bu gün də, yüz il bundan əvvəlki kimi, adamlar çayxanada oturub deyirlər ki, dünya, hər şey xarab olur” [XVIIIc.s.330]. Dünyanın xarab olması frazeoloji birləşməsinə satirik cəhətdən böyük natiq tərif verir və elə buradaca

[1] Seyidəliyev Nəriman. Təsdiq və inkarda işlənən frazeoloji birləşmələr // Azərbaycan Milli Elmlər Akademiyasının xəbərləri. Humanitar və ictimai elmlər seriyası, 2003, №1-4, səh.273-282.

"danışıq aparmaq", "söz gəzdirmək" frazeoloji birləşmələri ilə satirik ovqatı bir az da artırır.

"Yüksək saxlamaq" frazeoloji söz birləşməsi "müəllim adını yüksək saxlamaq" mürəkkəb frazeoloji birləşmənin tərkibində ziyalılar auditoriyası qarşısında səslənərək təhsilimizə olan qayğını əks etdirir: "Mən çox arzu edirdim ki, həm dövlət universitetləri, ali məktəbləri, həm də özəl ali məktəblər təhsilin keyfiyyətinə xüsusi fikir versinlər və indiki bu çətinliklərə baxmayaraq, – bilirəm, maddi, sosial çətinliklər var, – təhsilin səviyyəsini və ***müəllim adını yüksək saxlasınlar***" [XVIIc.s.225].

Qaçqın və köçkün auditoriyasında tez-tez səslənən "dərd çəkmək" frazeoloji birləşməsi bir neçə dəfə təkrarlanmaqla bu frazeoloji birləşməni yaddaşlara hopdurur. Xalq "dərd çəkməsinin" səbəbini anlayır. Və burada "anlamaq" təfəkkür felini işlədərək böyük natiq problemlərə dərindən bələdliyini göstərir: "Çünki əgər biz ölkəmizin ərazi bütövlüyünün pozulmasının, əhalimizin bir qisminin yerindən-yurdundan didərgin düşməsinin dərdini çəkiriksə, amma siz bütün xalqın, vətənimizin ***dərdini çəkməklə*** yanaşı, hərəniz öz dərdinizi, ailənizin, evinizin də ***dərdini çəkirsiniz***. Ona görə mən sizi anlayıram. Kim desə ki, hamının dərdi sizin dərdiniz kimidir, bu, doğru, düz olmazdı [XVIc.s.113-114]. Qaçqın və köçkün auditoriyasında tez-tez səslənən "dərd çəkmək" frazeoloji birləşməsi bir neçə dəfə təkrarlanmaqla bu frazeoloji birləşməni yaddaşlara hopdurur. Xalq "dərd çəkməsinin" səbəbini anlayır. Və burada "anlamaq" təfəkkür felini işlədərək böyük natiq problemlərə dərindən bələdliyini göstərir.

Frazeoloji birləşmələrlə Heydər Əliyev Azərbaycan qadının, xüsusilə də qaçqın və köçkün qadınları xalqa, auditoriyalara tanıdır: "Yük götürmək", "zəhmət çəkmək", "əziyyət çəkmək", "üzərinə düşmək" frazeoloji birləşmələrlə böyük natiq qadınların cəmiyyətdəki rolunu göstərir: "Qaçqın, köçkün

vəziyyətində yaşayan bu ailələrin içərisində üzərinə ən çox ***yük götürən***, ən çox əziyyət, ***zəhmət çəkən*** qadınlardır. Çadırlarda ailə saxlamaq, uşaq bəsləmək, uçaq böyütmək qadınların ***üzərinə düşür***" [XVc.s.39].

"Aradan qaldırmaq" frazeoloji birləşməsi böyük natiqin çıxışlarında müxtəlif anlamlarda auditoriyalara ünvanlanır. 30 yanvar 1998-ci ildə Ramazan bayramı münasibətilə Qafqaz Müsəlmanları İdarəsinin sədri Şeyxülislam Hacı Allahşükür Paşazadə ilə görüşdə mənəviyyatımıza zidd şeylərin aradan qaldırılmasından söhbət açılır: "Qumarxanalar, gecə klubları, kazinolar, cürbəcür spirtli içkilərə insanların çox aludə olması şübhəsiz ki, bizim mənəviyyatımıza ziddir... Ancaq mən istərdim ki, siz mənim bu tədbirlərimin, əməli surətdə həyata keçirilməsində də fəal iştirak edəsiniz, beləliklə, biz mənəviyyatımıza zidd olan halları ***aradan qaldıraq***" [XIVc.s.195]. Frazeoloji birləşmələrlə bağlı fikirlərimizi aşağıdakı kimi yekunlaşdıra bilərik:

Somatik idiomlardan Heydər Əliyevin nitqində ən çox işlənənlərdən biri də "əl"lə bağlıdır;

"Əl uzatmaq" frazeoloji birləşməsinə gəldikdə burada millətin, xalqın, soydaşların bir-birinə kömək etməyi, bir-birinə arxa-dayaq olmağı önə çəkilir;

Heydər Əliyevin nitqinə xas olan izahedicilik frazeoloji birləşmələrin də izahında özünü göstərir. Frazeoloji birləşmənin ardınca onun sinonimi gəlir, auditoriya izahı elə böyük natiqin öz dilindən də eşidir;

Lider və xalq vəhdətini anlamaq üçün Heydər Əliyevin tez-tez müraciət etdiyi frazeoloji söz birləşmələrindən "ayağa qalxmaq", "xalqın gücünə arxalanmaq", "ümid bəsləmək", "ümidləri doğrultmaq", "həyatı xalqa bağışlamaq", eləcədə "həyatı xalqa qurban vermək" və s. çoxsaylı misallar göstərmək olar;

Heydər Əliyevin nitq və çıxışlarının araşdırılması böyük natiq tərəfindən bir sıra mürəkkəb frazeoloji birləşmələri aşkar edir ki, bunlar nitq mədəniyyətimizə böyük töhfələr sayıla bilər;

Dövlətçiliyiimizin əleyhinə qalxan qüvvələrə qarşı böyük natiqin nitqlərində "ayağa qalxmaq", "qarşısını almaq" kimi frazeoloji birləşmələr mövcuddur;

Qətiyyətli dövlət başçısına xas olan frazeoloji birləşmələrdən biri kimi "yol verməmək" dövlət səviyyəli tədbirlərdə Heydər Əlievin nitq və çıxışlarında, bəyanatlarında səslənir;

Cəmiyyətimizə zidd qanunsuzluqların ləğvi mənasında "aradan götürmək", "aradan qaldırmaq" frazeoloji birləşmələri böyük natiqin nitqindən düşmür;

Azərbaycanın güclü dövlətə çevrilməsi yolunda işlədilən frazeoloji birləşmələr: "irəliyə getmək", "qüdrətli dövlətə çevirmək", "yüksəklərə qaldırmaq" tez-tez işlədilir;

"Torpağa əziz balası kimi baxmaq", "torpağın üzərində çalışmaq" frazeoloji birləşmələri kənd təsərrüfatı ilə bağlı çıxış məqamlarında natiqlər üçün hazır frazeoloji birləşmələrdir;

Azərbaycanın güclü dövlətə çevrilməsi yolunda işlədilən frazeoloji birləşmələr: "irəliyə getmək", "qüdrətli dövlətə çevirmək", "yüksəklərə qalxmaq" tipindədir;

Lider və xalq vəhdətini bildirmək üçün Heydər Əliyevin tez-tez müraciət etdiyi frazeoloji birləşmələrə "ayağa qalxmaq", "xalqın gücünə arxalanmaq", "ümid bəsləmək", "ümidləri doğrultmaq", "həyatı xalqa bağışlamaq", eləcə də "həyatı xalqa qurban vermək" və s. çoxsaylı misallar göstərmək olar qaldırmaq"

Xalqın taleyüklü məsələlərində hansı mövqedə olmağımızı "yaxanı kənara çəkmək", "neytral mövqe tutmaq", "laqeydlik göstərmək" frazeoloji birləşmələri ilə həyata keçirilir;

"Çətinliklərə sinə gərmək" – frazeoloji birləşməsi xalqda iradə, mətinlik aşılamaq baxımından mühümdür;

Heydər Əliyevin frazeoloji birləşmələrinə xalq ruhu hakimdir, elə bu tip frazeoloji birləşmələrin auditoriyalarda işlənməsi nitqin dinləyicilərə olan təsir gücünü dəfələrlə artırır;

Böyük natiqin dilində ciddi, qlobal məsələlər auditoriyalara sadə, ümumişlək, xalq ruhundan qidalanan frazeoloji birləşmələrin köməyi ilə çatdırılır;

Ölkələrarası münasibətlərə və əlaqələrə gəlincə bir sıra tez-tez işlənən frazeoloji birləşmələrə təsadüf edilir: Bu sıradan "əlaqələri yüksək səviyyəyə qaldırmaq", "əlaqələri dərinləşdirmək", yaxud "əlaqələri genişləndirmək" frazeoloji birləşmələrini nümunə göstərə bilərik;

Frazeoloji birləşmələrin köməyi ilə xalqın dil yaddaşı təzələnir, arxaikliklə müasirlik çulğalaşır;

Türkdilli xalqlarla bağlı nitq və çıxışlarında bir sıra mürəkkəb frazeoloji birləşmələr işlənir. Bu sıraya "tarixi köklərə malik olmaq", "köklərin əsrlərin dərinliklərinə gedib çıxması" kimi frazeoloji söz birləşmələri aiddir;

Azərbaycanın idman uğurları ilə bağlı idmançılarımızla görüşlərdə "nailiyyətləri yüksək qiymətləndirmək", "nailiyyətlər əldə etmək" frazeoloji birləşmələrindən geniş istifadə edir;

Heydər Əliyevin nitqində hər bir ünvanın öz frazeoloji birləşməsi var. Xaricdə yaşayan azərbaycanlılara ünvanlanan "hərarətli salamlar göndərmək" frazeoloji birləşməsinə tez-tez təsadüf olunur;

Proqnostik çıxışlarında "çox müsbət görmək", "göz qabağında olmaq" kimi frazeoloji birləşmələrdən istifadə edilir;

Təvazökarlıqla bağlı, dünya malına aludə olmamaqla bağlı bir sıra frazeoloji birləşmələr işlənir. Bu sıradan "mənsəbdə gözü olmamaq" frazeoloji birləşməsi mühümdür;

Dini üslubun tələb etdiyi frazeoloji birləşmələr içərisində Heydər Əliyevin ən çox istədiyi "baş əymək", "rəhmət diləmək"dir;

Heydər Əliyevin dini-məişət üslublu nitqlərində tez-tez işlətdiyi frazeoloji birləşmələr içərisində “baş əymək”, “baş-sağlığı vermək”, “rəhmət eləmək” mühüm yer tutur;

Şəhidliklə, Vətən, torpaq yolunda canlarını qurban vermiş igid oğul və qızlarımızla bağlı auditoriyalarda birbaşa işlətdiyi frazeoloji birləşmələr sonda Azərbaycan nitq mədəniyyəti xəzinəsinə böyük töhfələrə çevrilir;

“Tarixi qaralamaq olmaz” frazeoloji birləşməsi ilə böyük natiq tarix fəlsəfəsinə aid fikirlərini auditoriyalara ünvanlayır;

“Böyük olmaq üçün yaranmış tarixi şəxsiyyətlər kiçik hissiyyatlarla yaşaya bilməz” fəlsəfəsinə uyğun olaraq Heydər Əliyevin nitqində “kənara qoymaq”, “kiçik hissiyyatı kənara qoymaq” frazeoloji birləşmələr mövcuddur;

Böyük natiqin tarixi məqamlara aydınlıq gətirmək baxımından işlətdiyi frazeoloji birləşmələr mövzuya açar ola bilir. Sosialist təsərrüfat sistemindən bazar iqtisadiyyatına keçid dövründə insanlarda baş verən psixoloji məqamları “dərin kök atmaq”, “ayrıla bilməmək” frazeoloji birləşmələri ilə şüurlara çatdırır;

Fikirlərin şüurlara çatdırılması, şəxsiyyətlərin xalqa tanıdılması, ictimai-siyasi hadisələrə düzgün qiymət verilməsi ilə bağlı böyük natiqin işlətdiyi frazeologizmlər dilimizin zənginləşməsində mühüm rol oynayır;

Öz xalqı qarşısında, xalqın gələcəyi, mövcudluğu baxımından meydanlara atılan və bu zaman məsuliyyətini dilə gətirən Heydər Əliyevin nitqlərində tez-tez öz “üzərimə götürmək” frazeoloji birləşməsini eşidirik;

Dövlət quran lider – Heydər Əliyevin nitqində təbii ki özünəməxsus frazeoloji birləşmələr mövcuddur. Bu tip frazeoloji birləşmələrə “müzakirələr aparmaq”, “fikirləri nəzərə almaq”, “məsələnin üzərində dayanmaq” və s. aid ola bilir;

“Yüksək saxlamaq” frazeoloji söz birləşməsi “müəllim adını yüksək saxlamaq” mürəkkəb frazeoloji birləşmənin tər-

kibində ziyalılar auditoriyası qarşısında səslənərək təhsilimizə olan qayğını əks etdirir;

Qaçqın və köçkün auditoriyasında tez-tez səslənən "dərd çəkmək" frazeoloji birləşməsi bir neçə dəfə təkrarlanmaqla bu frazeoloji birləşməni yaddaşlara hopdurur. Xalq "dərd çəkməsinin" səbəbini anlayır. Və burada "anlamaq" təfəkkür felini işlədərək böyük natiq problemlərə dərindən bələdliyini göstərir;

Frazeoloji birləşmələrlə Heydər Əliyev Azərbaycan qadınını, xüsusilə də qaçqın və köçkün qadınları xalqa, auditoriyalara tanıdır: "Yük götürmək", "zəhmət çəkmək", "əziyyət çəkmək", "üzərinə düşmək" frazeoloji birləşmələrlə böyük natiq qadınların cəmiyyətdəki rolunu göstərir.

Heydər Əliyevin nitqində frazeoloji birləşmələrin öyrənilməsi bu fəsillə məhdudlaşa bilməz. Gələcəkdə bütövlükdə Heydər Əliyevin nitqlərində işlədilmiş frazeoloji birləşmələrin lüğətini tərtib etmək zərurəti ortaya çıxır.

Beləliklə, bu fəsildə çeşidli auditoriyalarda frazeoloji birləşmələrdən nümunələr verilsə də, bütövlükdə Heydər Əliyevin nitqlərindıki frazeoloji birləşmələri əhatə etmədiyi üçün gələcəkdə bu nitq vahidinin dərindən tədqiqinə ehtiyac göz qabağındadır.

# IV FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ SİNONİMLƏR

Azərbaycan dilinin lüğət tərkibinin zənginləşməsində sinonimlərin rolu olduqca böyükdür. Sinonimika leksikologiyanın ən böyük sahəsidir. Ona görə də bu sahə həmişə dilçilərin nəzərini cəlb etmiş, hazırda da öz aktuallığını itirməmişdir.

Dil vahidlərinin sinonimliyinin araşdırılması, dəqiq müəyyənləşdirilməsi üslubi tədqiqatın başlıca cəhətlərindəndir. Sinonimlik əlaməti dilin bütün komponentlərində, onları təşkil edən hər növ vahidlərdə mövcuddur. Bu keyfiyyət söz, ifadə və cümlələrdə daha zəngin və rəngarəngdir. ***Lüğəvi sinonimlik.*** Sözlərin, ifadələrin sinonimliyi hər hansı bir fikrin incə və təsirli ifadə olunmasında xüsusi əhəmiyyət kəsb edir. Sinonimlik dilin lüğət tərkibini təşkil edən sözlə sözlər, ifadə ilə ifadələr və sözlərlə ifadələr arasında mövcud olur. Belə bir cəhət kamil və təsirli nitq üçün hər cür imkan yaradır. ***Qrammatik sinonimlik.*** Bu növ sinonimlik morfoloji formalarda, sintaktik konstruksiyalarda özünü daha çox göstərir. Ümumiyyətlə, sinonimika əhatəli semasioloji kateqoriyadır. Lakin bunun mahiyyəti, vəzifəsi və digər əlamətləri hələ dünya dilçiliyində ətraflı öyrənilməmişdir.[1]

Professor Nadir Məmmədlinin apardığı elmi-tədqiqatlarda leksik-semantik qruplar üzrə feli sinonimliyin öyrənilməsində nisbətən aşağıdakı təsnifat münasib bilinmişdir.

1. Hərəkət fellərinin sinonimliyi
2. Nitq fellərinin sinonimliyini
3. Təfəkkür, görmə və eşitmə fellərinin sinonimliyi
4. Hal-vəziyyət fellərinin sinonimliyi.

[1] Afat Qurbanov. Dil və üslub. Bakı, APU, 1992.

Nitq felləri öz funksional xarakterinə görə çoxsahəlidir. Nitq felləri, qeyd olunduğu kimi, daha çox təfəkkür, hal-vəziyyət və hərəkət felləri ilə semantik əlaqə yarada bilir.

Təfəkkür felləri idrak, psixoloji və məntiqi amillərin təzahürü kimi meydana çıxır. Ona görə də anlam, yaddaş, qavrama və başqa bu kimi prosesləri bildirən dil vahidləri intellektual fəaliyyət-təfəkkür fellərinin ümumi semantik sahəsinə daxil olur.[1]

Azərbaycan dili sinonimlərinin tədqiqində dilçi alimlərimizdən M.Hüseynzadənin, S.Cəfərovun, Ə.Dəmirçizadənin, N.Məmmədovun, H.Həsənovun, N.Abdullayevanın, B.Abdullayevin, T.Əfəndiyevanın, A.Qurbanovun, Z.Verdiyevanın, A.Axundovun, A.Nağdəliyevin, İ.Məmmədovun, K.Məmmədovanın, Q.Kazımovun, R.Məhərrəmovanın, N.Məmmədlinin, N.Abbasovanın, N.Seyidəliyevin, M.Quliyevanın və başqalarının xidmətlərini qeyd edə bilərik.[2]

Sinonim – yunanca – eyni adlanma deməkdir. Məlumdur ki, anlayışlar müxtəlif məna çalarlıqlarına malik ola bilir. Belə məna çalarlıqlarını sinonimlərlə daha dəqiq ifadə etmək, həm fikrin reallaşması, həm də mənanın başqasına çatdırılması cəhətdən böyük əhəmiyyət kəsb edir.[3]

Leksik və qrammatik sinonimlər dilin üslubi quruluşunda mühüm rol oynayır. Bunlar: a) fikrin dəqiq və düzgün ifadə olunmasını təmin edir; b) xoşa gəlməyən, tələffüzü, deyilişi çətin olan, yaxud mənası məqsədə müvafiq gəlməyən ifadə vasitələrini daha yararlısı ilə əvəz etməyə imkan yaradır; c) yeknəsəqliyin və təkrarın qarşısını alır; ç) nitqə rəngarənglik və ahəngdarlıq verir; d) fikrin ifadə tərzini incələşdirir, oxu-

---

[1] Nadir Məmmədov. Müasir Azərbaycan dilində fellərin leksik sinonimliyi. Bakı, “Maarif” nəşriyyatı, 1991. 112 səh.

[2] Əliyeva Zahirə. Azərbaycan dilində sinonim cərgələrin yaranması haqqında // Filologiya məsələləri, №3, 2009. s.261-266

[3] Babayev Adil. Dilçiliyə giriş. Dərslik. B. Maarif, 2004. 504 səh.

cuya, dinləyiciyə xoş təsir bağışlayır; e) üslubi modallığı ifadə edə bilir və s.[1]

Sinonimlər haqqında professor Nadir Məmmədlinin apardığı elmi-tədqiqat işi diqqətəlayiqdir: "Semasioloji ədəbiyyatda sinonim cərgədən geniş, hərtərəfli bəhs edilir. Sinonim cərgə haqqında nəzəri fikirlərdə elə bir köklü fərq yoxdur. Sinonim cərgə eyni nitq hissələrinə aid mənaca yaxın qrupdur. Sinonim cərgələrdə sözlər nominativ, əlavə mənalarına görə işlənə bilir. Bəzən məzmunca bir-birindən uzaq sözlər də bir ümumi mənada ümumiləşdirilir. Belə sinonim cərgələr ekspressivlik-emosionallıq ifadə edir". Hər bir sinonim cərgənin, semantik informasiyanın variant nüvəsi və ya dominantı var.[2]

Bu və ya başqa sinonimi təşkil edən müxtəlif sözlərin məcmusuna sinonimik cərgə deyilir. Hər sinonimik cərgədə bir neçə sinonim söz olur. Bu sözlərdən biri əsas söz hesab olunur. Sinonimik cərgədəki əsas söz dilçilikdə dominant söz adlanır.[3]

Heydər Əliyev nitqində sinonim cərgələrin bir tərəfi frazeoloji söz birləşməsindən ibarət olan iki sinonimdən ibarətdir: "Azərbaycanın dövlət müstəqilliyi ***əbədi***, ***dönməz*** olacaqdır. Xalqımız daim ***sərbəst***, öz ***taleyinin sahibi*** olacaqdır" [IXc.s.23]. Burada sərbəstliyin sinonimi kimi "öz taleyinin sahibi olmaq" frazeologiyası işə düşür.

Dildə emosional elementlər insanın hisslərini ifadə etməyə xidmət edir, ekspressiv vahidlər isə emosiyanın, iradənin, eləcə də fikrin ifadə edilməsində təsvirliliyin, ifadəliliyin gücləndirilməsinə xidmət edir. Nitqə daha qabarıq, daha çox təsirli, dərin təəssürat oyadan bir xüsusiyyət verən hər şey nitqin

---

[1] Kamil Əliyev. Üslubiyyat və üslublar sistemi. Bakı, 1985. səh.61

[2] Nadir Məmmədov. Müasir Azərbaycan dilində fellərin leksik sinonimliyi. Bakı, "Maarif" nəşriyyatı, 1991. 112 səh.

[3] Xəlilov Buludxan. Müasir Azərbaycan dilinin leksikologiyası, Bakı, "Nurlan", 2008. s.182-183

ekspressiyasına daxildir. O cümlədən sinonim cərgəni təşkil edən nitq vahidləri (nitq hissələri)[1] Heydər Əliyevin nitqində ekspressiyaya xidmət edir.

Sinonimlər böyük natiqin dilində antroponimik sıralanmalarla harmoniya yaradır: "Onlar – Səməd Vurğun da, Üzeyir Hacıbəyov da, Cəfər Cabbarlı da Azərbaycanı ***azad***, ***müstəqil***, ***sərbəst*** görmək istəyiblər" [IXc.s.21].

Sinonim cərgələr əksər vaxtlarda böyük natiqin çıxışlarının giriş hissələrinə təsadüf edir. Auditoriya elə giriş hissədə Heydər Əliyevin nitq cazibəsinə düşür: "Bu çıxışlar bir daha göstərdi ki, Azərbaycanda Rusiya ədəbiyyat və incəsənət ongünlüyündən sonra iyirmi beş il ötsə də, son illərin keşməkeşlərinə və çətinliklərinə baxmayaraq, ***məhəbbət***, ***qarşılıqlı anlaşma***, ***dostluq***, ***hörmət*** hissləri qalmışdır" [IXc.s.109].

Heydər Əliyevin çıxışlarında özünəməxsus sinonimlər üzə çıxır ki, bu Azərbaycan dilinin sinonimlər yaratmaq imkanının genişliyini bir daha göstərir: "***Fitri***, ***parlaq*** istedadı, çox nadir xüsusiyyətə malik olan istedadı, eyni zamanda ən gənc yaşlarından yazıb-yaratmaq əzmi Səməd Vurğunu qısa bir zamanda xalqımızın sevimli şairinə çevirmiş və o, həm Azərbaycanda, həm də bir çox xarici ölkələrdə ***tanınmış, sayılan*** bir insan olmuşdur" [IXc.s.17].

Burada fitri və parlaq sinonimləri yüksək kitab leksikasına aiddirsə, "tanınmış" və "sayılan" sinonimləri isə ümumişlək leksikaya aiddir.

Bəzən bir cümlədə üç-dörd üslubi sinonim cərgə ayırd oluna bilir: "İnsanlar o ***ağır***, ***əziyyətli*** günlərdən, daxili ***toqquşmalardan***, ***vuruşmalardan***, ***atışmalardan***, ***ədavətdən, ziddiyyətlərdən*** xilas olublar" [IXc.s.39]. On üç sözdən ibarət olan bu cümlədə üç yerdə sinonim cərgəyə təsadüf edirik.

---

[1] Cəlilova Teybə. Ekspressivlik və onun məna komponentləri haqqında. Filologiya məsələləri, №3, 2008. s.172-183.

Heydər Əliyev nitqində səslənən sinonimlərin bir məziyyəti, bir özünəməxsusluğu ondan ibarətdir ki, sinonimin ikinci və üçüncü tərəfləri izah xarakterində olur. Məsələn, böyük natiq "vətəndaş müharibəsi" deyirsə, sonrakı sinonim "qardaş qanının axıdılması" kimi səslənir: "Bir dəfə 1993-cü ildə çevriliş etdilər. Xalq Cəbhəsini hakimiyyətdən yıxdılar. O vaxt məni dəvət etdilər və mən gəlib ***vətəndaş müharibəsinin, qardaş qanı axıdılmasınının*** qarşısını aldım" [IIIc.s.189].

Sinonimlər təkrarlarla harmoniya yaradır. Daha doğrusu sinonimlərin təkrarlanması baş verir ki, bu da özlüyündə nitqin fenomenliyidir: "Bütün bu yaralar sağalacaq, müstəqil Azərbaycan öz hüdudları çərçivəsində, *öz* ***hüdudlarının*** *sahibi*, *öz* ***torpağının*** *sahibi*, *öz* ***ərazisinin*** *sahibi* olacaqdır" [VIc.s.12].

Heydər Əliyev nitqində elə məqamlar olur ki, sinonim cərgələrlə zəngin cümlələr ardıcıl olaraq düzülür: "Ölkədə elə ***tikintilər, qurğular, obyektlər*** olur ki, onlar müəyyən bir sahəyə xidmət edirlər. Dünya ümumiyyətlə, ***quruculuqla, tikib yaratmaqla,*** yaşayıb, inkişaf edibdir. Yer üzərindəki təbii sərvətlər ***təbiət, ilahi*** tərəfindən yaradılıbdır. Ancaq ***torpağın, yerin, kürreyi-ərzin*** üzərində yüz illərlə, min illərlə qurulanlar insanların ***zəhməti, iradəsi, zəkası***, onların əlləri ilə yaradılıbdır" [VIIc.s.70]. Bu cür sinonimlərlə zəngin nitq auditoriyanı yeknəsəqlikdən, monotonluqdan, bezikmədən qoruyur, sonrakı dinləmə mərhələlərinə hazırlayır.

Heydər Əliyevin bütün nitqlərinə hakim olan izahedicilk sinonimlərin işlənməsində də özünü göstərir. İnkişafın gedişində sıçrayış kimi qəbul olunan inqilabda radikallıq elementlərini nəzərə çarpdırır: "Hesab edirəm ki, bu***, inqilabi, radikal*** bir addımdır" [VIIc.s.93].

Nitqin gedişində böyük natiq gah ümumişlək, loru, gah da yüksək kitab leksikasında olan sözləri sinonimləşdirir. Dinləyicilər üçün əlavə izaha, şərhə ehtiyac qalmır: "Ancaq biz nə edək ki, Qərbi Almaniya kimi iqtisadi cəhətdən ***güclü,***

***dövlətli*** Qərbi Azərbaycanımız olmayıb ki, bizi – Azərbaycanı öz ***yedəyinə, himayəsinə*** alsın, öz təcrübəsini bilavasitə versin ki, necə edək" [VIIc.s.96]. Burada "yedək" loru, "himayə" isə kitab leksikasıdır ki, auditoriya belə sinonimləri maraqla qarşılayır.

Böyük natiqin nitqində sinonimlər antonim şəklində də işlədilir: "Çünki, bir də deyirəm, Azərbaycanın bu günü nə qədər ***çətin*** və ***ağırdırsa***, gələcəyi bir o qədər ***işıqlı***, o qədər də ***xoşbəxt*** və ***gözəldir***" [IIIc.s.5]. Bu cümlədə "çətin, ağır" sinonimi "işıqlı, xoşbəxt, gözəl" sinonimi ilə ziddiyyət təşkil edir.

Bir ictimai-iqtisadi formasiyadan digərinə keçid bütün sahələrdə olduğu kimi dilçilik sahəsində də özünü göstərir. Belə ki, keçid dövründə həyatımızın bütün sahələrində olduğu kimi iqtisadiyyat sahəsində də yeni terminlər, yeni sinonim cərgələr işə düşür: "Azərbaycanda ***sərbəst*** iqtisadiyyat, ***bazar*** iqtisadiyyatı, sahibkarlıq prinsipləri yaranacaq, ***bərqərar olacaq və inkişaf edəcəkdir***" [VIIc.s.118].

Bəzən, böyük natiqin ardıcıl düzülən cümlələrinin hər birində sinonimlər işlənir: "Mən güman edirəm ki, bu qurultay ***açıq-aydın, aşkar, sərbəst*** şəraitdə keçməlidir. Mənim fikrim belədir. Hərə öz ***sözünü*** deməlidir, öz ***fikrini*** bildirməlidir. Fikir ***sərbəstliyi, azaldığı*** təmin olunmalıdır" [XIIIc.s.54].

Heydər Əliyevin nitqində sinonimlərin özünəməxsus bir xüsusiyyəti sinonim cərgələrdə beynəlxalq mənşəli sözü sinonim kimi işlətməsidir: "Ona görə də o xalq ki, ***ayağa qalxmışdı*** və öz ***haqqını tələb edirdi***, o ***rejimin əleyhinə çıxırdı*** və Moskvanın, o vaxtkı kommunist rəhbərliyinin Azərbaycan xalqına qarşı ədalətsizliyinə öz ***protestini, etirazını*** bildirirdi" [XIIIc.s.40].

Sinonimlər auditoriyada əminlik yaratmağa səsləyir: "Bunlar heç kimi narahat etməsin. Biz Azərbaycanın daxilində sabitliyi qorumağa qadirik, ***mətinliyimiz, dəyanətimiz*** var. Buna əmin ola bilərsiniz" [IIc.s.327].

Heydər Əliyev nitqində sinonimlər ana fikrin, əsas fikrin, əsas ideyanın auditoriya tərəfindən qəbul olunması üçün mühümdür: "Ona görə də mən bu gün bir daha bəyan edirəm: əgər bizim sülhsevər ***təşəbbüslərimiz, addımlarımız, təkliflərimiz*** öz nəticəsini verməsə, Azərbaycan xalqı, Azərbaycan Ordusu öz ***torpaqlarını qorumağa,*** respublikamızın ***ərazi bütövlüyünü təmin etməyə*** qadirdir!" [Ic.s.483].

Heydər Əliyevin nitqlərində sinonimlər müxtəlif söz birləşmələri şəklində özünü təzahür edir. İzahedicilik qabiliyyətinə malik Heydər Əliyev nitqi sinonim cərgələrdə də öz əksini tapır: "Biz müstəqilliyimizi ***daimi edəcəyik***, ***əbədi edəcəyik***, ***qoruyub saxlayacağıq*** və heç vaxt dövlət müstəqilliyimizi ***əlimizdən verməyəcəyik***" [Vc.s.409-410]. Elə buradaca "qoruyub saxlamaq" və "əldən verməmək" frazeologizmlərinin birbaşa olmasa da, mənaca sinonim olduğu aydınlaşır.

Heydər Əliyevin nitqində bir cümlədə bir neçə yerdə sinonimlər işlənir: "Polis peşəsi ağır peşədir. O, bir tərəfdən ***cəsarət, şəxsi mətanət***, ikinci tərəfdən ***bilik, dərrakə, elm, təhsil,*** təcrübə tələb edir" [Ic.s.140-141].

Heydər Əliyevin nitqində sinonimlər sadə, həm də cərgə şəklində bir cümlədə təsadüf edir: "And içirəm ki, Prezident vəzifəsini ali ***məqsədlər, amallar*** naminə yerinə yetirəcək, Azərbaycan Respublikasının tam ***müstəqilliyini, suverenliyini, ərazi bütövlüyünü*** təmin etmək üçün əlimdən gələni əsirgəməyəcəyəm" [Ic.s.207].

Heydər Əliyev nitqində bir bütöv cümlədə bir neçə sinonim işlənir, nitqin ahəngdarlığı güclənir, təsir gücü artır: "Siyasətdə və iqtisadiyyatda ***sərbəstlik, hürriyyət, insan azadlığı, insan hüquqlarının qorunması*** və ***sərbəst iqtisadiyyat, bazar iqtisadiyyatı*** prinsipləri bərqərar olmalıdır" [Ic.s.9-10].

Heydər Əliyev nitqlərindəki sinonim cərgələrin ayrı-ayrı tərkib hissələri birbaşa sinonim olmasa da, çıxışlarda auditoriya bunları bir-birindən ayrılmaz, bir-birini gücləndirən və nitqin

auditoriyaya olan təsirini artıran sinonimlər olduğunu qəbul edir. Məsələn “hərəkət”, “meyl”, “cəhd” sözləri heç də sinonim kimi qəbul edilməyə bilər. Lakin cümlədə işlənmə yerinə diqqət yetirsək görərik ki, çox gözəl, cazibədar bir sinonim cərgə alınır. Elə bu faktlar özlüyündə böyük natiqin Azərbaycan dilinin dərin qatlarına bələd olmasından xəbər verir: “Gürcüstanda da ərazi bütövlüyü pozulubdur. Gürcüstanda da hərbi münaqişə var və separatçı qüvvələr ölkə ərazisinin bir qismini Gürcüstandan ayırmaq istəyirlər. Biz bu cür ***hərəkətləri, meylləri, cəhdləri*** daim pisləmişik və pisləyirik” [Vc.s.411].

Heydər Əliyev nitqində frazeoloji söz birləşmələrindən təşkil olunmuş sinonim cərgələrin bir özünəməxsusluğu da ondan ibarətdir ki, cərgənin əvvəlindən sonuna səbəb-nəticə əlaqəsinin şahidi oluruq: “İl yarımdır ki, ***müharibə getmir, atəş açılmır, güllə atılmır, adamlar həlak olmurlar.*** Biz atəşkəs, barışıq şəraitində yaşayırıq və əmin edirik ki, bu barışıq rejiminə tam sülhə nail olana qədər əməl edəcəyik” [Vc.s.125-126]. Müharibə getmirsə demək adamlar həlak olmayacaqdır səbəb-nəticə əlaqəsini dinləyici aydın təsəvvür edir.

Heydər Əliyevin nitqində sinonimlərin də təkrarlandığının şahidi oluruq: “İndi Azərbaycan üçün ***bir amal, bir məqsəd*** var: Azərbaycanı bu ağır vəziyyətdən xilas etmək, onun ərazi bütövlüyünü, müdafiəsini təmin etmək. Kimin əlindən nə gəlirsə, ***bu amal, bu məqsəd*** naminə etməlidir” [Ic.s.238].

Heydər Əliyevin nitqlərindəki özünəməxsusluğun bir səciyyəvi cəhəti də ondan ibarətdir ki, frazeoloji söz birləşmələrinin köməyi ilə, güclü analitik məntiqlə sinonim sıralar yaradılır: “Ona görə də qarşımızda duran əsas vəzifə Azərbaycanı erməni ***təcavüzündən xilas etmək***, işğal olunmuş ***torpaqlarımızı geri qaytarmaq***, Azərbaycanın ***ərazi bütövlüyünü, sərhədlərinin toxunulmazlığını*** təmin etməkdir” [IIc.s.12-13].

Elmi araşdırmalarla bağlı sinonimlər sırasına ən çox “müzakirə”, “təhlil”, “tədqiqat” və s. aid olur: “Ancaq biz bunlara

nail olduq və artıq 70-ci illərin sonunda bir neçə layihədə baxandan, onları ***müzakirə, təhlil*** edəndən sonra məhz indi tikintisi başa çatmış radio-televiziya qülləsinin layihəsini qəbul etdik” [VIIc.s.73].

Çox hallarda sinonimləri deyərdik ki, böyük natiq özü yaradır, ən maraqlı cəhət kimi bu sinonimlər şifahi nitqdə spontan alınaraq natiqin qarşıya qoyduğu məsələni həll etməyə imkan verir: “Ümumiyyətlə, bu ***görüşlər, danışıqlar, imzalanan sənədlər*** Türkiyə-Azərbaycan əlaqələri tarixində yeni bir ***mərhələ, səhifə*** açır” [IXc.s.278].

Heydər Əliyevin işlətdiyi sinonim cərgələrdə neologizmlərdən istifadə necə deyərlər yaddan çıxmır: “Ermənistanın Azərbaycana təcavüzü başlanandan indiyə qədər Türkiyə bu məsələdə həmişə Azərbaycanla bir olubdur, biz Türkiyənin ***dəstəyini, yardımını*** hiss etmişik” [IXc.s.275].

“Dəstək” sözü XX əsrin 70-80-ci illərində demək olar ki, ictimai-siyasi publisistikada işlənməyən sözdür ki, Heydər Əliyev bu sözü tez-tez işlədir.Və bu söz sinonim cərgələrin effektivliyini artırır. Əgər burada “dəstək” və “yardım” sözləri cərgə təşkil edirsə başqa bir məqamda “dəstək, dayaq” cərgəsi üzə çıxır, auditoriya monotonluqdan – sinonim monotonluğundan xilas olur, tez-tez dəyişən sinonim cərgələrin cazibəsinə düşür: “Bu məsələyə bu gün də göstərilən münasibət və Ermənistan-Azərbaycan münaqişəsinin keçən ilin dekabrında ATƏT-in üzvü olan ölkələrin dövlət başçılarının Lissabonda keçirilən Zirvə görüşündə qəbul olunmuş prinsiplər əsasında həll edilməsi barəsində apardığımız ***danışıqlar, məsləhətləşmələr*** və Türkiyənin bu barədə qəti mövqeyi bizim üçün böyük ***dəstəkdir, dayaqdır***” [IXc.s.278].

Heydər Əliyev sinonimlərinin bir özəlliyi də, bir özünəməxsusluğu da bu sinonimlərin əsasən frazeoloji söz birləşmələrindən ibarət olmasıdır: “Bu gün biz çox səmərəli ***da-***

***nışıqlar apardıq***, çox əhəmiyyətli məsələləri ***müzakirə etdik***, geniş ***fikir mübadiləsi apardıq***" [IXc.s.276].

Sinonimlərdən istifadə görkəmli Azərbaycan şair və yazıçılarının əsərlərində mühüm leksik-semantik xüsusiyyətlər daşıyır. Müəlliflər[1] bədii üslubda sinonimliyin 3 növünü (türk, alınma, müxtəlif mənşəli) ayırd edirlər.

Heydər Əliyev nitqində sinonimlərin bir xüsusiyyəti də ondan ibarətdir ki, Azərbaycan dilində olanla türkdilli xalqların dilindən götürülmüş sözlərin paralel işlədilməsidir: "Türkiyə-Azərbaycan dostluğunun yeni bir simvolu olan Ankara ***caddələrindən, küçələrindən*** birinə Azərbaycan caddəsi, Azərbaycan küçəsi adı verilir" [IXc.s.294].

Heydər Əliyevin nitqində sinonimlərin öyrənilməsi prosesində böyük natiqin Azərbaycan dilinin zənginliyindən istifadə etməklə sinonimləşmə yaratmasının şahidi oluruq: "Siz bizim dərdimizə həmişə şəriksiniz və bu məsələnin həllində Türkiyənin ***dəstəyini, əməli qayğısını*** daim hiss etmişik və hiss edirik" [IXc.s.314].

Heydər Əliyevin nitqində antonimlərin bir hissəsi sinonimlər şəklində verilir: "Lahıc özü də Azərbaycanın bir abidəsidir. Doğurdan da orada nadir bir təbiət və nadir xüsusiyyətə malik olan mühit, nadir insanlar var. Çox nadir. Elə bil ki, ***xırda***, ***balaca*** bir adadır, amma özünəməxsus ***ölkə*** kimi bir yerdir" [VIIc.s.197].

Sinonimlər ədatların təkrarı ilə harmoniya yaradaraq nitqin ekspressivliyini yüksəldir: "Bu yol *daha* ***doğru***, *daha* ***real***, *daha* ***düzgün*** yoldur" [VIIc.s.191].

"Qonşu dövlətlərlə sülh şəraitində yaşamaq lazımdır" prinsipini əsas götürən böyük natiq bir sıra sinonimlərdən yerindəcə istifadə edir: "Bir-biri ilə həmsərhəd olan ölkələr,

---

[1] Məmmədova Sevinc. Mikayıl Müşfiq yaradıcılığında sinonimlərin üslubi xüsusiyyətləri haqqında // Filologiya məsələləri, №3, 2011. səh.128-135

qonşu olan ölkələr daim ziddiyyətli vəziyyətdə yaşaya bilməzlər. Hər bir ***müharibənin***, hər bir ***düşmənçiliyin*** sonu ***sülh*** olacaqdır, sonu ***barışıq*** olacaqdır" [VIIc.s.189].

Böyük natiqin dilində sinonimlər təkrarlarla çulğalaşa, yüksək nitq effekti yarada bilir: "Strateji nöqteyi-nəzərdən isə Ermənistan təcavüzünün qarşısının alınması üçün ***Ağdam*** şübhəsiz ki, çox əhəmiyyətli bir nöqtə idi. *Ağdam* ***qorunmalı*** idi, *Ağdam* ***saxlanılmalı*** idi, *Ağdam* ***müdafiə*** olunmalı idi. *Ağdamın* işğalı yolverilməz idi" [VIIc.s.180].

Heydər Əliyevin nitqində işlədilən sinonim cərgənin elementləri həm yüksək kitab leksikasına, həm də ümumişlək sözlər qrupuna aid olur: "Burada çıxış edən natiqlərin hamısı həm 1988-ci ildən Ermənistan tərəfindən Azərbaycana edilən hərbi təcavüzlə əlaqədar, həm də Ağdam rayonunun kəndlərinin Ağdam şəhərinin işğal olunması ilə əlaqədar öz ***təəssüratlarını, xatirələrini, fikirlərini, mülahizələrini*** bildirdi" [VIIc.s.179]. Əgər burada təəssürat və mülahizə yüksək kitab leksikasına aiddirsə xatirə və fikir isə ümumişlək sözlər qrupuna aiddir.

Heydər Əliyev nitqlərində səslənən sinonim cərgələr məntiqi ardıcıllıqla düzülür. Cərgənin bir üzvü digərini izah edir: "Sizi və bütün Misir xalqını öz adımdan və Azərbaycan xalqı adından milli bayram – İnqilab gününün ildönümü münasibətilə səmimi-qəlbdən təbrik edir, şəxsən Sizə və qardaş Misir xalqına ***sülh, əmin-amanlıq*** və ***xoşbəxtlik*** arzulayıram" [Ic.s.43].

"Sülh, əmin-amanlıq, xoşbəxtlik" sinonim cərgəsində xoşbəxtliyin yolunun əmin-amanlıqdan keçməsi, əmin-amanlığa isə sülh yolu ilə nail olunması məntiqi təfəkkürə əsaslanan bir ardıcıllıq yaradır. Sülh → əmin-amalıq → xoşbəxtlik cərgəsindəki əmin-amanlıq özlüyündə toplu mənalı mürəkkəb sözdür ki, sinonim yaratmışdır.

Sinonim cərgələr özlüyündə nitqin təsir gücünü artırır. Bu cərgələr təkrarlandıqca təsir gücü daha da yüksəlir: “Türkiyə Azərbaycanın ***haqq***, ***ədalət*** işini ***dəstəkləyib, müdafiə edibdir***. Türkiyə Minsk qrupunun, ATƏT-in üzvü olaraq bütün beynəlxalq təşkilatlarda Azərbaycanın ədalətli işini daim ***dəstəkləyib, müdafiə edibdir***” [IXc.s.371].

Bir-birinə əks olan sinonimlər böyük natiqin nitqində işə düşür, nitqin əlvanlığını artırır: “O vaxtdan indiyə qədər, – bir neçə gündən sonra üç il tamam olacaqdır, – ***atəş*** yoxdur, yəni ***savaş*** yoxdur, ***müharibə getmir***. Amma eyni zamanda ***sülh, barış*** da yoxdur, torpaqlarımız ***işğal altında*** qalır” [IXc.s.369].

Sinonimlər Heydər Əliyevin hadisələlərə tənqidi münasibətini auditoriyalara daha da açıqlaması baxımından nitqlərin emosionallığını gücləndirir: “Həmin dövrdə iqtisadi islahatlar ***sürətlə, dayanmadan*** həyata keçirilməli, onların səmərəliliyi təmin olunmalıdır. Bu sahədə müəyyən işlər görülür, ancaq bunu ***kafi, qənaətbəxş*** hesab etmək olmaz. Biz ***gecikirik, ləngiyirik***.” [IIc.s.124].

Heydər Əliyev nitqində təkrarlar mühüm yer tutur ki, o cümlədən sinonimlər də böyük natiqin çıxışlarında təkrarlanaraq nitqin ekspressivliyini artırır: “Dünən də, bu gün də mən xalqa müraciət edərək vətəndaşlarımızın bütün təbəqələrini, hamını ***birliyə, həmrəyliyə*** dəvət etdim. Bütün siyasi partiyaları, ictimai-siyasi təşkilatları, hər bir vətənpərvər insanı ***birliyə, vətəndaş həmrəyliyinə*** çağırdım” [IIc.s.362-363].

Böyük natiqin nitq və çıxışlarında sinonim cərgədə isimlər cəm halında da işlənir: “Eyni zamanda onlar da öz ***qeyrətləri, namusları, cəsarətləri*** ilə bu ağır dəqiqələrdə həmrəyliklərini bildirməlidirlər” [IIc.s.359-360].

Heydər Əliyevin nitqlərində *lı, -li, -lu, -lü* şəkilçiləri sinonim isimlərdən sinonim sifətlər əmələ gətirməsi nöqteyi-nəzərindən maraqlıdır: “Bu məqsədlərə nail olmaq üçün hər bir

***namuslu, qeyrətli vətəndaş, vətənini sevən hər bir azərbaycanlı*** səy göstərməlidir” [IIc.s.285-286].

Böyük natiqin dilində sinonimlər antonimlərlə də çulğalaşır. Məhz antonimlər sinonimləri möhkəmləndirmək yolunda mühüm leksikoloji vahidlərə çevrilir: “Onlar bu işi mütəşəkkil apara bilsələr, hərbi hissələrdə lazımi iş görərək ***tərbiyə, əxlaq, mənəviyyat*** məsələlərini döyüşçülərə aşılaya bilsələr, onların mənəviyyatını, iradəsini möhkəmləndirə bilsələr, bu bizim həm siyasi, həm də ideoloji işimiz olacaqdır. Lakin bu iş ***pərakəndə*** şəkildə deyil, ***mütəşəkkil*** aparılmalıdır” [Ic.s.252].

“Pərakəndə” və “mütəşəkkil” ifadələri əkslik yaradaraq mütəşəkkiliyin əsasında “tərbiyə, əxlaq, mənəviyyat” sinonim cərgəsinin durduğunu auditoriyalara izah edir. Başqa bir məqamda “dərhal, təcili” sinonimləri harmoniya yaradaraq nitqin təsir gücünü artırır: “Bundan sonra səfir və səfirlik bu məsələlərlə məşğul olacaqdır. Belə halları ***dərhal, təcili*** aradan götürmək mümkün deyildir. Bunlar ***tədricən*** ola bilər. Güman edirəm ki, bunları tədricən aradan götürmək mümkün olacaqdır” [IXc.s.75].

Böyük natiqin çeşidli auditoriyalarda söylədiyi nitqlərində tez-tez təsadüf edən sinonim cərgələrdəki sözlərin mütləq mənada olmasa da, məna çalarları baxımından sinonimliyinə şübhə yeri qalmır: “Azərbaycanın ***mərd, cəsur, qeyrətli, qəhrəman*** oğulları torpaqlarımızın müdafiəsi uğrunda döyüşüb həlak olmuşlar” [IIc.s.392-393].

Ad günləri ilə bağlı, doğum günləri ilə bağlı böyük natiqin nitqlərində sinonim cərgələr ilk baxışda təkrarlanır, diqqətlə qulaq verən auditoriya cərgədəki sinonim sözlərin birinin digər sinonim sözlə əvəzləndiyini anlayır: “Bizim hamımız buraya böyük ***sevgi, məhəbbət, hörmət*** hissi ilə gəlmişik” [IIc.s.483].

Bu kiçik nitq parçasında birinci sinonim cərgə “sevgi, məhəbbət, hörmət” dən ibarətdirsə, ikinci cərgədə “sevgi”ni “eh-

tiram" əvəzləyir, nitq ecazkarlığını özündə saxlayır: "Siz böyük ***hörmət, ehtiram və məhəbbət*** qazanmısınız" [IIc.s.483].

Nitqin ekspressivliyini yüksəldən sinonim cərgənin təşkil olunduğu sözləri ədatlarla qüvvətləndirmək Heydər Əliyev nitqinin məziyyətlərindən biridir: "Ancaq biz hesab edirik ki, Azərbaycan Respublikasının ərazisində olan qaçqınların, məcburi köçkünlərin vəziyyəti ***ən ağırdır, ən çətindir, ən dözülməzdir***. Ölkəmizdə qaçqınların, köçkünlərin əmələ gəlməsi səbəbləri də başqa regionlardakından çox fərqlidir və bunlar hamısı Azərbaycan Respublikası üçün – kiçik bir ***ölkə, dövlət*** üçün olduqca ***çətin və ağır*** problemlər yaradır" [IIc.s.503]. "Ən" qüvvətləndirici ədatı ilə "ağır, çətin, dözülməz" sinonim cərgə qüvvətlənir.

Toplu mənalı mürəkkəb sözlərdən sinonimlər düzəldilməsində böyük natiq yeri gəldikcə yararlanır: "Ancaq bu xəyanətkar qüvvələr bilməlidir ki, bütün ***ağrı-acılara, əzab-əziyyətlərə*** mətanətlə sinə gərən ***döyüşkən və mübariz*** xalqımızın iradəsi qarşısında gücsüzdürlər" [IIc.s.510].

"Döyüşkən" və "mübariz" sifətlərindən əmələ gələn sinonim cərgənin birinci sözü "döyüş" feli sifət şəkilçisi olan – *ğan, -qan, -yən, -kən* qrupundan *-kən* şəkilçisinin köməyilə düzəlmişdir.

Heydər Əliyevin nitqlərində sinonimlər sözlərə eyni bir şəkilçi artırılmaqla əmələ gəlir: "Azərbaycan xalqı ***dözümlü, dəyanətli*** xalqdır. Sizin hamınıza daha da ***dözümlülük, dəyanətlilik*** arzulayır, hamınızı ***milli həmrəyliyə, milli birliyə*** dəvət edirəm" [IIc.s.42]. Bu parçada dözüm və dəyanət isimlərinə *lü* və *li* şəkilçiləri artırmaqla sinonim sifətlər əmələ gəlmişdir. Heydər Əliyevin nitqindəki sinonimlərin bir mühüm xüsusiyyəti sinonim sifətlərdən *lıq-lik-luq-lük* şəkilçiləri vasitəsilə mücərrəd isimlər yaradır – "dözümlülük", "dəyanətlilik". Eləcə də "həmrəylik" və "birlik" mücərrəd isimlər bu qəbildəndir.

HeydərƏliyev nitqindəki sinonimlər məna çalarları eyni olan, eyni anlamda səslənən söz və ifadələrdən düzəlir: "Şübhəsiz ki, bunlar Yeni Azərbaycan Partiyasını ***zəiflətmək istəyən***, onun ***gücünü azaltmaq*** istəyən ***rəylər, fikirlərdir***" [IIc.s.527].

Böyük natiqin dilində sinonim cərgələr antonimlərlə üzləşir: "Azərbaycan xalqı öz tarixinin ***ən ağır, ən çətin, keşməkeşli*** və eyni zamanda şərəfli mərhələsini yaşayır" [IIc.s.547]. "Ağır, çətin, keşməkeşli" sinonim cərgəyə "şərəfli" antonimi qarşı qoyularaq nitqin məna gücü artırılır.

Sinonimlərdən düzəldilmiş toplu mənalı sözlər Heydər Əliyevin nitqlərində sinonim cərgənin bir üzvünə çevrilə bilir: "Güman edirəm ki, tədqiqatçılarımız, tarixçilərimiz, siyasətçilərimiz bütün bunlara ***doğru-düzgün, obyektiv, dəqiq*** təhlil və qiymət verəcəklər" [IIc.s.550].

Bir sıra hallarda sinonim cərgənin əmələ gəlməsində böyük natiqin özünəməxsus ifadələrinə təsadüf edilir və bu zaman Azərbaycan dilinin zənginliyindən istifadə olunur ki, bu istifadə qarşılıqlı bir şəkildə baş verir. Belə ki, Azərbaycan dili də böyük natiqin nitqində zənginləşir: "Bu, ancaq öz şəxsi mənafeləri, yəni qanunsuz olaraq ***sərvətlənmək, zənginləşmək, qanunsuz pul, imkan ələ keçirmək*** məqsədi daşıyırdı" [IIc.s.550-551].

Sinonim cərgələr mürəkkəb hallarda inkarlıq bildirən ifadələrlə düzəlir: "Bu gün fevralın 12-dir, düz doqquz aydır ki, ***müharibə getmir, atəş açılmır, güllə atılmır, qan tökülmür, şəhidlər yoxdur***" [IIIc.s.182-183].

Heydər Əliyevin nitqlərinin mühüm bir xüsusiyyəti ondan ibarətdir ki, nitq elementləri, nitq hissələri, leksikoloji vahidlər həmişə harmoniya təşkil edir: "Müstəqillik, milli azadlıq yolu ***asan, hamar*** olmayıb, çox ***əzab-əziyyətli*** olub. Həmin yol bundan sonra da çətin olacaqdır. Ancaq itkilərimizlə bərabər, əldə etdiyimiz dövlət müstəqilliyi, suverenliyi, milli azadlıq bizi ***sevindirir, hamımızda qürur hissi yaradır*** və bu bay-

ramı böyük nikbinliklə qeyd etməyə imkan verir" [IIIc.s.221-222]. "Asan, hamar" sinonimi əzab-əziyyətli sinonimi ilə antonim kimi verilmişdir. Eləcə də əzab-əziyyətli sinoniminə də "bizi sevindirir, hamımızda qürur hissi yaradır" sinonimi antonim kimi harmoniya yaradır.

Azərbaycanın müstəqilliyi ilə bağlı insanların məruz qaldığı emosionallıq bir sıra sinonimlərlə çatdırılır: "Ola bilsin ki, bu hadisə bəzi adamlarda ***təlaş, qorxu***, bəzilərində də ***narahatlıq*** hissi doğurur. Bunlar müəyyən qədər təbii hallardır. Lakin bu gün mən sizin qarşınızda çıxış edərək bildirirəm ki, qoy heç kəs narahat olmasın. Müstəqil Azərbaycanın qarşıdakı yolunda hələ çox çətinliklər olacaqdır. Azərbaycanın prezidenti kimi, mən bunları qabaqcadan ***görürəm, dərk edirəm***" [IIc.s.284].

XX əsrin 90-cı illərindəki müstəqilliklə bağlı taleyüklü dövrlərdə həmin mərhələ "ağır, məsuliyyətli, çətin" sinonimləri ilə xarakterizə olunur: "Azərbaycan Respublikası öz tarixinin ağır mərhələsini keçirir. Bu mərhələnin nə qədər ***ağır, məsuliyyətli, çətin*** olduğu aydındır və əsas səbəbləri də məlumdur" [Ic.s.138].

"Çətin, ağır" sinonimi ilə müstəqilliyin ilk illərindəki iqtisadi vəziyyət xalqa çatdırılır: "Bu yol ***çətin, ağır*** yoldur. On illər boyu yaranmış iqtisadi-sosial sistemdən sərbəst iqtisadiyyat sisteminə keçmək böyük çətinliklərlə bağlıdır" [Ic.s.205].

Müstəqilliklə bağlı sinonimlər müxtəlif çeşidli auditoriyaları bəzəyir: "Ona görə də bu bayram günündə bütün Azərbaycan vətəndaşlarına üzümü tutaraq bir daha deyirəm: indi Azərbaycanın müstəqilliyi xalqımızın öz əlindədir. Bu gün bir daha bəyan etməliyik ki, Azərbaycanın müstəqilliyi ***daimidir, əbədidir, dönməzdir*** və bu yolda hamımız əl-ələ verərək çalışmalıyıq" [IIc.s.11-12].

"Ancaq son illərdə böyük fürsət əldə olunmuş, Azərbaycan müstəqil dövlət kimi dünyada tanınmış və Azərbaycanla

Türkiyə arasındakı ***sədlər, sərhədlər, qadağalar, yasaqlar*** götürülmüşdür" [Ic.s.392].

Müstəqilliklə bağlı sinonimlər müxtəlif auditoriyalarda işlədilir: "Sizin qarşınızda məsuliyyətlə bəyan edirəm ki, Azərbaycanın dövlət müstəqilliyi ***əbədidir, dönməzdir, sarsılmazdır***" [IXc.s.312].

Müstəqillik yolunda ictimai-siyasi vəziyyətin mənfi təzahürləri də auditoriyalara sinonim cərgələrin köməyi ilə çatdırılır: "Biz bunları ***ağır, çətin*** şəraitdə yaradırıq. Xaricdən olan cürbəcür təxribatlar və təcavüz şəraitində yaradırıq. Azərbaycanın daxilində olan cürbəcür ***qarışıqlıqlar, çarpışmalar, hakimiyyət mübarizəsi*** şəraitində yaradırıq" [IXc.s.303].

Bir sıra sinonim cərgələr bir-birinə əks olan situasiyalarda işlədilir. Belə ki, "niyyət, istək, arzu" kimi sinonim cərgə müstəqilliyimizə qarşı çıxan qüvvələrə münasibətdə də işlədilir: "Bəli, Azərbaycanı parçalamaq Azərbaycanın daxilində və xaricində olan düşmənlərin uzun illərdən, bəlkə də əsrlərdən bəri ən bəd ***niyyəti, istəyi, arzusu*** olmuşdur" [Ic.s.76].

Müstəqilliyin ilk illərində sinonimlər həm siyasi – həm də iqtisadi məsələlərdə auditoriyaları işıqlandırır: "Siyasətdə və iqtisadiyyatda ***sərbəstlik, hürriyyət, insan azadlığı, insan hüquqlarının qorunması və sərbəst iqtisadiyyat, bazar iqtisadiyyatı*** prinsipləri bərqərar olmalıdır. Yəni bizim respublikamız bir il bundan öncə başladığı yolla getməkdə davam etməlidir. Bu, ***düzgün yoldur, doğru yoldur***, bu yolla bizim respublika daha qətiyyətlə getməlidir" [Ic.s.9]. Təkcə bu üç cümlədə iki-iki olmaqla dörd yerdə sinonimlər işlədilir. Bu sinonimlərdə böyük natiq kökündən uzaq düşmüş, sanki əsarətdə olan "hürriyyət" sözümüzü özümüzə qaytarır, bu sözün lüğətimizdəki yerini bərpa edir. İkinci sinonim sırada insan hüquqlarının qorunmasını elə insan azadlığı kimi başa düşülməsini auditoriyalara izah edir. Bazar iqtisadiyyatı dedikdə dövlətin iqtisadiyyatı sərbəst buraxması kimi anlaşılmasını açıqlayır.

Azərbaycanın müstəqilliyi ilə bağlı sinonimlər həmişə özünə yer tapır: "Bu gün mən sizə, əziz bacı-qardaşlarımıza bildirmək istəyirəm ki, biz dövlət müstəqilliyini günü-gündən möhkəmləndirəcəyik, inkişaf etdirəcəyik, qoruyub saxlayacağıq. Azərbaycanın dövlət müstəqilliyi ***dönməzdir, əyilməzdir, əbədidir***" [IXc.s.393].

Azərbaycan xalqının müstəqilliyə gedən yolda qəhrəmanlığını əks etdirən 20 Yanvar faciəsinin Azərbaycan insanında yaratdığı hissiyyatlar sinonimlər şəklində əks olunur: "Doğrudur, yanvarın 19-dan 20-nə keçən gecə Azərbaycan xalqında bir ***təlatüm, coşqunluq, həyəcan*** əmələ gətirdi, elə bil vulkan püskürdü. İnsanların qəlbində güclü hissiyyat oyandı. Məhz bunlara görə yanvarın 22-də Azərbaycan Respublikasının o vaxtkı rəhbərlərinin iradəsinə zidd olaraq ölkəmizin qeyrətli adamları, deputatları, ziyalıları Azərbaycan Ali Sovetinin fövqəladə sessiyasını topladılar. ***Ağır şəraitdə, böyük təzyiqlər, qorxu altında, böyük təhlükə qarşısında*** bu məsələ müzakirə olundu" [IIIc.s.122].

Yüksək dövlətçilik əxlaqının formalaşması yolunda işlədilən sinonimlər: "Bir halda ki, sizin burada belə bir cəmiyyətiniz var, gərək siz özünüz də, cəmiyyətiniz də azərbaycanlıların ***əxlaqı, mənəviyyatı*** haqqında çox ciddi düşünəsiniz, bu işlərə fikir verəsiniz, çalışasınız ki, azərbaycanlılar hər yerdə özlərini ***yüksək əxlaqlı, mədəniyyətli, dövlət qayda-qanunlarına riayət edən*** insanlar kimi göstərsinlər" [IXc.s.76].

Hüquqi dövlət quruculuğu yolunda işlədilən sinonimlər: "Bunlar nəinki dövlət qanun-qaydalarını pozmuş, dövlətə qarşı cinayətlər etmişlər, hətta ayrı-ayrı adamlara qarşı ***zorakılıq etmişlər, onları incitmişlər, reketçiliklə məşğul olmuşlar.*** Son üç ildə biz respublikamızı cinayətkarlardan təmizləmişik" [IXc.s.76].

Normal iqtisadi islahatları aparmaq yolunda maneçilik törətmək, islahatlara mane olmaq məqamlarında "plansız,

qaydasız, özbaşınalıq yolu ilə" sinonim cərgəsindən istifadə olunur: "Bizim bu müşavirələrdə də həm islahatların əleyhinə olan fikirlər, həm də islahatları ***plansız, qaydasız, özbaşınalıq*** yolu ilə həyata keçirmək barədə təkliflər və çıxışlar olmuşdur" [IXc.s.166].

İqtisadi sahədə qanunsuzluq hallarında aşağıdakı sinonim cərgə işə düşür: "Bu ***dağıntıların, qanunsuzluqların, özbaşınalığın, hərc-mərcliyin*** nəticəsində bəziləri həddindən artıq ***zənginləşib***, bəziləri isə həddindən artıq ***kasıblaşıb***, ***müflisləşib*** və respublikanın iqtisadiyyatına böyük zərbələr vurulubdur" [IXc.s.167].

Heydər Əliyevin prezident yanındakı müşavirələrdə etdiyi çıxışlarda bir sıra sinonimlər işlədilir. Bu sinonimlər cərgəsinə aşağıdakılar aid edilə bilər: "Bizim işimizdə bu prinsip həmişə əsas olmalıdır. Biz hər bir məsələni obyektiv ***qiymətləndirməli***, obyektiv ***araşdırmalı***, obyektiv ***təhlil etməliyik***. Şübhəsiz ki, biz hər bir məsələnin dərindən, daha ətraflı təhlil olunması səviyyəsinə qalxa bilmədik və bu da bu müddətdə mümkün deyildi. Ancaq hər halda respublikanın sosial-iqtisadi həyatının son illərindəki vəziyyət və xüsusən 1993-94-95-ci illərdə və 1996-cı ilin birinci yarısında olan vəziyyət, mövcud olan problemlər və eyni zamanda ***nöqsanlar, çatışmazlıqlar*** və bizi narahat edən başqa məsələlər müzakirə olundu" [VIIc.s.116-117].

Böyük natiqin dilində təəssüf olunacaq işlər və əməllərlə bağlı sinonimlər işə düşür: "Yenə deyirəm, mən çox təəssüf edirəm ki, bəzi adamlar yüksək vəzifəyə təyin olunandan altı ay, bir il sonra dəyişirlər. Onların həyat tərzində də, duruşunda-oturuşunda da, geyimində də bir də görürsən ki, cürbəcür xoşagəlməz dəyişikliklər əmələ gəlir, cürbəcür ***iddialara düşürlər***, cürbəcür ***ambisiyalarla yaşamağa başlayırlar***" [VIIc.s.154].

Azərbaycanın müstəqilliyini qəbul etməyən siyasi dairələrə, mühafizəkar qüvvələrə yönələn çıxışlar da sinonim cərgələrlə zəngindir. Böyük natiqin təəssüflə dolu nitqləri də sino-

nimlərsiz keçinmir: "Təəssüf ki, Azərbaycandan olan, onun hüdudlarından kənarda yaşayanlar da, daxildə yaşayanlar da onlara ***rəvac, dəstək*** verirlər. Bütün bu mühafizəkar qüvvələr, Azərbaycanın müstəqilliyinə təcavüz etmək əzmində olan bütün bu qüvvələr birləşirlər. Çünki görürlər ki, Azərbaycan artıq dördüncü ildir müstəqil dövlət kimi yaşayır, bütün bu təzyiqlərə ***sinə gərir*** və ***möhkəm dayanmışdır***" [IIIc.s.263].

XX əsrin 90-cı illərindəki mənfi dəyişikliklərin aradan götürüləcəyi inamı auditoriyalara aşılanır. Bu mənfi dəyişikliklərin nədən ibarət olduğu sinonimlərlə dinləyicilərə çatdırılır: "Ümidvar olduğumu bildirmək istəyirəm ki, Azərbaycanın ali təhsil, ümumi orta təhsil sistemində indi baş verən müsbət dəyişikliklər ***möhkəmlənəcək, güclənəcək*** və məktəblərin, ali təhsil ocaqlarının işində olan ***nöqsanlar, çatışmazlıqlar, qüsurlar, bəzi qanun pozuntuları*** ardıcıl surətdə aradan götürüləcəkdir" [XIIc.s.141].

Böyük natiqin dilində ölkədaxili çəkişmələrlə, inriqalarla bağlı aşağıdakı sinonimlər işə düşür: "Digər tərəfdən isə Azərbaycanın daxilində adamlar hakimiyyəti ələ almaq və vəzifələri tutmaq üçün bir-biri ilə mübarizə aparmağa başlayıblar. Bax, içimizdə olan bu ***ixtilaflar, davalar, vəzifə və hakimiyyət mübarizəsi*** Azərbaycanı bu günə gətirib salmışdır" [IIIc.s.189]. Burada "bax" əmr ədatı auditoriyada xəbərdarlıq yaratmaqla iki cərgə sinonimlə uzlaşır.

Müstəqilliyin ilk illərində ölkədəki neqativ hallara təəssüf edərək belə halları sinonim cərgələrlə xarakterizə edir: "Təəssüflər olsun ki, müəyyən dövrdə Azərbaycanda ***özbaşınalığa, hərc-mərcliyə***, deyə bilərəm ki, ***sahibsizliyə*** görə ölkənin bu cür sərvətləri ayrı-ayrı nadan adamların əlinə keçmişdir və bəziləri hələ bu gün də onların əlindədir" [VIIc.s.9].

Sinonim cərgələr Azərbaycan gənclərinin formalaşması ilə bağlı nitq və çıxışlarda da özünü büruzə verir. 29 iyun 1996-cı ildə XXVI yay olimpiyadasında (Atlanta, ABŞ) işti-

rak edəcək Azərbaycan idmançıları ilə görüşdə üzünü sinonim cərgələrlə gənclərə tutur: "Müstəqil Azərbaycanı gələcəkdə də ***yaşatmaq***, onu daha da ***möhkəmləndirmək***, dünya miqyasında böyük dövlətə çevirmək üçün gənclərimiz bu gündən hazırlaşmalıdırlar. Həm ***şüuri, zehni, mənəvi*** cəhətdən, həm də fiziki cəhətdən hazırlaşmalıdırlar" [VIIc.s.10].

Sabitliyin pozulmasının, ölkədaxili qanunların yerinə yetirilməməsinin hansı nəticələrə gətirib çıxarması böyük natiqin dilində sinonim cərgələrlə, məntiqi ardıcıllıqla verilir: "Valideynlər uşaqlarını küçəyə buraxa bilmirdilər. Çünki bir tərəfdən Ermənistanın təcavüzü və gedən ***döyüşlər, tökülən qanlar***, ikinci tərəfdən də Azərbaycanın daxilində, o cümlədən Bakıda hökm sürən ***özbaşınalıq***, ***qanunsuzluq***, ayrı-ayrı silahlı, cinayətkar dəstələrin ardıcıl olaraq cinayətlər törətməsi insanlara təcavüz, təzyiq etməsi, onların öldürülməsi, ***mülkünün, varının*** zorla əlindən alınması bizim həyatımızı narahat edən hallar idi" [XIIc.s.119]. "Özbaşınalıq, qanunsuzluq" sinonimi sonda məntiqi olaraq "mülkün, varın" itirilməsinə gətirib çıxarır. Bu bir cümlədə dörd cərgə sinonimin sığışdırılması Azərbaycan dilinin dərin laylarına böyük natiqin bələdliyindən xəbər verir.

Qanunsuzluğun həyatın digər sahələrinə, o cümlədən təhsil sahəsinə də sirayət etməsini Heydər Əliyev nitqində sinonimlərlə görə bilərik: "Ona görə bunu xüsusi qeyd edirəm ki, 1988-89-cu illərdən bəri respublikamızın başına gələn bəlalar, Ermənistanın Azərbaycana etdiyi hərbi təcavüz ilə əlaqədar olaraq, eyni zamanda ölkəmizin daxilində yaranmış ***qarmaqarışıqlığa, özbaşınalığa, qanunsuzluğa*** görə həyatımızın çox sahəsində, o cümlədən təhsil sahəsində də işlər pozulmuşdu. Mən məmnuniyyətlə qeyd edirəm ki, respublikamızı bu əzab-əziyyətə salan belə hallar artıq keçmişdə qalıbdır. Biz o halları aradan götürdük, respublikamızda ***əmin-***

***amanlıq***, insanlara ***rahatlıq yaratdıq***, cinayətkar qrupları ***aradan götürdük***” [XIIc.s.135].

Heydər Əliyevin nitqində səslənən sinonimlər bayram şənliklərində, dövlətçiliyimizin təbliğində yüksək ustalıqla işlədilir. 21 mart 1996-cı ildə Bakının Gənclər meydanında Qoşa Qala Qapısı önündə Novruz şənliyində olduğu kimi: “Ancaq Novruz bayramı hər bir azərbaycanlı demək olar ki, anadan olandan onun ***qəlbində, ürəyində, ruhunda, fikrində*** yaşayan bayramdır. Bu bayram əsrlərdən əsrlərə bizim milli, dini adət və ənənələrimizi yaşadıb bu günlərə gətirib çıxaran bayramdır. Buna görə də Novruz bizim ümumdövlət, ümummilli bayramımızdır, ümumxalq bayramımızdır. O da məlumdur ki, ***ümumxalq, ümumdövlət, ümumölkə*** amilləri hər bir insan ilə, hər bir vətəndaşla bir olanda bayram da daha yüksək səviyyəyə qalxır, insanlar da bir-biri ilə daha sıx ünsiyyətdə olurlar. Bu bayram bizim adət-ənənələrimizi əsrlər boyu yaşadıb bu günlərə gətirdiyi kimi, bu gün də bizi ***birləşdirir***, daha da ***həmrəy edir***, xalqımızda daha möhkəm ***birlik yaradır*** və birlik yaratmağa xidmət edir. Biz tariximizin həm şərəfli bir dövrünü, həm də ən ***çətin və ağır*** dövrünü yaşayırıq. Ona görə şərəflidir ki, biz ***azadıq, müstəqilik, sərbəstik*** və bu bayramımızı, ola bilər, tarixdə indiyədək olmayan qədər yüksək səviyyədə və geniş bayram edirik. Deməli, bu bizim ***azadlığımızın, sərbəstliyimizin, müstəqilliyimizin*** ən ***yüksək***, ən ***parlaq*** təzahürüdür” [VIc.s.10-11]. Burada Heydər Əliyevin nitqində özünəməxsus sinonimlik yaranır. Əgər bu cümlədə “azad, müstəqil, sərbəst” sırası səslənirsə, digər bir yerdə “azadlıq, sərbəstlik, müstəqillik” sinonimləşir.

Xalqla dövlət arasındakı müəyyən münasibətləri əks etdirən sinonimlərə də yer ayrılır: “Çox vaxt ***dövlətlər, hökumətlər, hakimiyyət orqanları*** bu qərarları insanların ***istəyinə, arzusuna*** görə edirlər” [IXc.s.295].

Diplomatik məsələləri əhatə edən sinonimlər sırasına aşağıdakılar aiddir: "Məhz bu konsulluğun əsasında da dərhal Türkiyənin Azərbaycanda ***səfirliyi***, ***böyük elçiliyi*** yarandı. Azərbaycan da dövlət müstəqilliyini əldə edən kimi öz ***səfirliyini, öz böyük elçiliyini*** birinci növbədə Türkiyədə, Ankarada açdı" [IXc.s.299].

Növbəti sinonimlərlə zəngin cümlə yuxarıdakı xalqa zidd situasiyanı normallaşdırmağın yollarını göstərir: "Əgər bu vətəndaş müharibəsinin qarşısı alınmasaydı, əgər o dəstələr, qruplar – Azərbaycanı bu günə salan, bu cür faciələrə gətirib çıxaran dəstələr, qruplar, şəxslər aşkar olunmasaydı, ***zərərsizləşdirilməsəydi, sıradan çıxarılmasaydı***, təsəvvür edin, Azərbaycanı nə qədər böyük faciələr gözləyirdi" [VIIc.s.275],

Ölkələrarası əlaqələrdə bir sıra sinonim və sinonim cərgələr işə düşür: "Hazırlanmış ***sazişlər, müqavilələr, anlaşmalar*** tarixi sənədlərdir və bizim gələcək əlaqələrimiz üçün ***yeni yollar, yeni cığırlar*** açır" [Ic.s.373-374].

Dövlətlərarası münasibətlərdə işlədilən məişət çalarlı sinonimlər: "Problemlər, ən əvvəl, ölkələrimizin qarşılıqlı münasibətləri ilə bağlı problemlər barəsində, əməkdaşlığımız barədə, eyni zamanda ölkələrimizin istər Avropada, istər dünyada, istərsə də üzv olduğumuz MDB-də qarşılaşdığımız problemlər barəsində bu gün Ukrayna prezidenti, möhtərəm Leonid Daniloviçlə mənim aramda çox ***açıq***, ***səmimi*** və ***mehriban*** söhbət oldu" [IXc.s.51].

"Sıx, səmimi, yaxın" – "Mən bir daha deyirəm, bizim dövlətlərarası münasibətlərimiz indi o qədər ***sıxdır***, ***səmimidir***, ***yaxındır***, xüsusən şəxsən Leonid Kuşma ilə mənim münasibətlərim o qədər yaxşıdır ki, hesab edirəm, bu, dövlətlərarası münasibətlərə gərək heç bir xələl dəyməsin".

"Sülh, əmin-amanlıq, xoşbəxtlik" sinonim cərgəsi ən çox ölkələr arasındakı münasibətləri əhatə edən görüşlərin sonluqlarına təsadüf edir: "Sizi və bütün Misir xalqını öz adımdan və

Azərbaycan xalqı adından milli bayram – İnqilab gününün ildönümü münasibətilə səmimi-qəlbdən təbrik edir, şəxsən Sizə və qardaş Misir xalqına ***sülh, əmin-amanlıq*** və ***xoşbəxtlik*** arzulayıram" [Ic.s.43].

Dost və qardaş ölkələrlə münasibətləri möhkəmlətmək yolunda işlədilən sinonimlər: "Dünəndən bəri keçirdiyimiz görüşlər, apardığımız danışıqlar, bizi burada səmimi və qardaşcasına qarşılamağınız bir daha göstərir ki, bu dostluğumuz və qardaşlığımız ***qırılmazdır, sarsılmazdır*** və gündən-günə daha da ***möhkəmlənəcək, qüvvətlənəcəkdir***" [Ic.s.381-382].

İkitərəfli, eləcə də çoxtərəfli müqavilələrin bağlanması ilə əlaqədar bir qisim sinonimlər tez-tez işlədilir: "Bir daha demək istəyirəm ki, ***görüşlərimiz, söhbətlərimiz, danışıqlarımız*** səmimilik və dostluq şəraitində keçdi və bu gün ötən saatlar ərzində baş verənlərin hamısı sübut edir ki, Qırğızıstan ilə Azərbaycan arasında sıx münasibətlər, dostluq münasibətləri möhkəm zəminə və yaxşı perspektivə malikdir" [IXc.s.202].

Ölkə prezidentləri ilə, dövlət başçıları ilə söhbətlərinin sonunda Heydər Əliyevin səmimiyyətə söykənən sinonimləri auditoriyada səslənir: "Əziz dost, mən Qırğızıstanın başçısı kimi, qardaş xalqın rəhbəri kimi Sizə ***cansağlığı, firavanlıq, xoşbəxtlik*** və yeni böyük uğurlar arzulayıram" [IXc.s.211].

Sinonimlər türkdilli xalqların ölkə başçıları ilə söhbətlərdə də mühüm yer tutur: "Bu gün böyük razılıq hissilə demək olar ki, bütün bu beynəlxalq təşkilatlarda, beynəlxalq görüşlərdə və məclislərdə ölkələrimiz bir-birini ədalətli prinsiplər əsasında, beynəlxalq hüquq normalan əsasında dəstəkləyərək dostluğumuzun ənənələrini, keçmişdə bizi ***yaxınlaşdırmış, qovuşdurmuş*** və ***birləşdirmiş*** olan və bu işdə indi də xidmət edən tarixi köklərimizi əsas tuturuq [IXc.s.220].

Dünyada, yaşadığımız regionda sülhün bərqərar olması ilə bağlı Heydər Əliyev etdiyi çıxışlarda sinonimlərdən geniş istifadə edir: "Orada mən bütün prezidentlərlə görüşdüm və

biz yenə də yekdil fikirdə olduq ki, Qafqazda, bütün regionda, bütün dünyada ***sülh, əmin-amanlıq*** və ***firavanlıq*** yaratmaq lazımdır" [IXc.s.241].

Dost və qardaş ölkələrə olan səfərlərdə qəlbləri riqqətə gətirən sinonim cərgələr işə düşür, qardaş ölkələrlə gələcək münasibətlərin təməli, bünövrəsi qoyulur: "Çünki uzun illər biz Türkiyədən ayrı düşmüşük, xalqlarımız 70 il birbirindən ayrı düşmüşdür. Bu illər ərzində tək biz yox, bizdən əvvəl yaşamış nəsillər də Türkiyənin həsrətində olublar, Türkiyə ilə ***qovuşmaq, görüşmək, əl-ələ vermək***, Türkiyənin ***əlini sıxmaq*** həsrəti ilə yaşayıblar" [IXc.s.280]

Başqa bir məqamda "diyar" və "ölkə" sinonimləri əvəzlənir: "Türkiyə hər bir azərbaycanlı üçün, bizim üçün dəyərli ***ölkədir,*** əziz ***diyardır***" [IXc.s.286]

Türk cümhuriyyətlərini özününkü hesab edən böyük natiq bu hisslərini sinonimlərlə auditoriyaya çatdırır: "Ona görə də demokratik Türkiyə, Atatürk Türkiyə Cümhuriyyəti bizim üçün doğma bir ölkədir. Biz buranı öz ***diyarımız, məmləkətimiz*** hesab edirik" [IXc.s.280].

Türkdilli xalqlar arasında münasibətləri əks etdirən çıxışlar, mərasimlər sinonimlərlə zəngindir. Məhz bu sinonim cərgələrlə zəngin olan nitq və çıxışlar xalqlarımız arasındakı münasibətlərin daha da möhkəmlənməsinə xidmət edir: "Türkiyə ilə Azərbaycan arasındakı dostluq, qardaşlıq əlaqələrinin böyük tarixi var. Keçmiş zamanlarda, əsrlərdən-əsrlərə xalqlarımız bir-biri ilə sıx bağlı olduğuna görə heç bələdiyyə başqanı olmadan da, hökumətin qərarı olmadan da öz dəyərli ***yerlərinə, küçələrə, meydanlara*** öz sevdikləri, bir-birini ***birləşdirən***, ***bağlayan***, bir-birinə daha da ***yaxınlaşdıran*** adları veriblər" [IXc.s.294].

Qardaş Türkiyə, Türkiyə şəhərlərinə münasibətdə tariximizin oxşarlığını əks etdirən sinonimlər səslənir: "1922-ci il 9 Eylüldə məhz burada qurtuluş savaşının böyük qələbəsi əldə

edilmiş və bu, Türkiyənin tarixinə daxil olmuşdur, bizim də tariximiz üçün, ***ümumi, müştərək***, ***birgə*** tariximiz üçün çox dəyərli səhifədir" [IXc.s.359].

Heydər Əliyevin nitqlərindəki sinonimlər həm də türk və Azərbaycan dilində eyni sözlərin sinonimləşməsi ilə baş verir: "Bu təşəbbüs, hadisə münasibətilə İzmirin ***başçılarına, başqanlarına*** təşəkkürümü bildirir, sizin hamınızı təbrik edirəm. Ümidvar olduğumu bildirmək istəyirəm ki, bugünkü bu ***törən, mərasim, bayram*** başqa şəhərlərdə də davam edəcək, biz Türkiyə-Azərbaycan qardaşlığını ***addım-addım, gündən-günə genişləndirəcək, inkişaf etdirəcəyik***" [IXc.s.363]. Bu mətndə "başçı-bakan", "törən-mərasim, bayram" sinonimləri ilə böyük natiq Azərbaycan dilinin ən böyük təəssübkeşi olduğunu hər birimizə anladır, hər birimizi Azərbaycan dilinin müdafiəsinə səsləyir, türk-azərbaycan dillərinin bir qrupa daxil olduğunu "dil millətçilərinə" öyrədir.

Başqa bir məqamda "müstəqillik, bağımsızlıq, ərazi bütövlüyü" sinonimi işə düşür: "Biz torpaqlarımızın bir qarışını, bir metrini də heç kəsə verməyəcəyik və Azərbaycanın ***müstəqilliyini, bağımsızlığını, ərazi bütövlüyünü*** daim qoruyacağıq" [IXc.s.365].

Türk dünyası, onun dahi şəxsiyyətləri barəsində böyük natiqin sinonimləri ecazkardır: "Bu gün bir daha böyük iftixar hissi ilə demək olar ki, türk xalqı cümhuriyyət qurulandan indiyədək bu cümhuriyyətin ***qurucusu, yaradıcısı, banisi*** böyük Mustafa Kamal Atatürkün tutduğu yol ilə gedir və biz hesab edirik ki, bu yol, yalnız bu yol türk xalqmı bundan sonra daha da ***yüksəklərə qaldıracaq***, ***qələbədənqələbəyə aparacaqdır***" [IXc.s.394].

Dövlətlərarası münasibətlərdə əlaqələrin inkişafı ilə bağlı bir qisim sinonimlər arasında "müqavilə", "anlaşma" kimi sinonimlərə yol verilir: "Səfərimizin ən böyük əhəmiyyəti ondan ibarətdir ki, bütün sahələrdə Türkiyə-Azərbaycan əlaqə-

lərinin dərinləşdirilməsi və inkişaf etdirilməsi haqqında həm danışıqlar apardıq, həm də bizi təmin edən normativ hüquqi sənəd olaraq böyük bir ***müqavilə***, ***anlaşma*** imzaladıq. Bu ***anlaşma, müqavilə*** Türkiyə-Azərbaycan strateji əməkdaşlığının, iş birliyinin dərinləşdirilməsi haqqındadır. İndiyə qədər Türkiyə ilə Azərbaycan arasında çox ***müqavilələr, anlaşmalar, sazişlər, sənədlər*** imzalanıbdır" [IXc.s.406]. Heydər Əliyevin dilində bir məqamda "müqavilə" öndə durursa, ikinci məqamda "anlaşma" önə keçir, üçüncü məqamda isə "müqavilə və anlaşmaya", "saziş" və "sənəd" də qoşulur, auditoriya yeknəsəqlikdən xilas olaraq böyük natiqin nitqinin sehrinə düşür.

Ölkələrarası münasibətlərlə bağlı söylənilən nitq və çıxışlarda yenə də özünəməxsus Heydər Əliyev sinonimləri auditoriyaları öz nitq cazibəsinə salır: "Mən əmin olduğumu bildirmək istəyirəm ki, bu bəyannamə həyata keçiriləcəkdir. Biz, Azərbaycan tərəfi bu ***bəyannamənin, anlaşmanın, sazişin*** ardıcıl olaraq həyata keçirilməsinə çalışacağıq və əlimizdən gələni əsirgəməyəcəyik" [IIc.s.407].

Qardaş Türkiyə dövləti ilə ikitərəfli münasibətlərdə də bir sıra sinonimlər üzə çıxır: "Həmişəki kimi, indi də söhbətlərimiz ***dostluq, mehribanlıq, səmimilik*** şəraitində keçdi. Bizim dostluq və qardaşlıq əlaqələrimiz ***möhkəmdir, qırılmazdır, əbədidir***" [IIc.s.432].

Siyasi vəziyyətlərlə bağlı nitqdə işlədilən sinonimlər: "Təbiidir ki, Qafqazda vəziyyətin qeyri-sabitliyi Avropada ***sülh, əmin-amanlıq və təhlükəsizlik*** üçün mənfi amildir" [IXc.s.57].

XX əsrin 90-cı illərində Azərbaycanın ictimai-siyasi vəziyyətini nəzərə çarpdırmaq üçün "ağır, mürəkkəb, gərgin" sinonim cərgəsini işlədir. Eləcə də bu sinonim cərgənin arxasınca nə etməli olduğunu bilən rəhbər bunları kütlələrə bəyan edir: "Bildirmək istəyirəm ki, Azərbaycan Respublikasının bugünkü ***ağır, mürəkkəb və gərgin*** vəziyyətini tam məsuliy-

yətlə dərk edirəm. Bu vəzifəni üzərimə götürərkən məsuliyyətimi anlayıram və bunların hamısını rəhbər tutaraq əlimdən gələni edəcəyəm" [Ic.s.6-7].

Ölkənin XX əsrin 90-cı illərindəki düşdüyü vəziyyət bir sıra sinonimlərlə auditoriyaya çatdırılır: "Bildirmək istəyirəm ki, Azərbaycan Respublikasının bu günkü ***ağır, mürəkkəb və gərgin*** vəziyyətini tam məsuliyyətlə dərk edirəm" [Ic.s.6-7].

İctimai-siyasi sahədə, eləcə də iqtisadiyyatla bağlı çətinliklər aşağıdakı sinonimlərlə auditoriyalara çatdırılır: "Altıncı ildir biz bu yolla gedirik. Ancaq bu yolla getməkdə çox maneələrlə də rastlaşmışıq. Azərbaycanın daxilində çox ***çətinliklər, maneçiliklər*** vardı. Azərbaycan xalqının ***birliyi, yekdilliyi, həmrəyliyi*** nəticəsində və apardığımız düzgün siyasət nəticəsində bu çətinlikləri aradan götürə bildik" [IXc.s.289].

İctimai-siyasi dövrlə səsləşən, dövrü xarakterizə edən Heydər Əliyevə xas sinonimlər də auditoriyalarda canlanır: "Azərbaycan Respublikasının daxilində tam ***sabit ictimai-siyasi vəziyyət, əmin-amanlıq*** yaranıbdır" [IXc.s.303].

XX əsrin 90-cı illərində ölkədaxili gərgin vəziyyət, ictimai-siyasi şərait aydınlaşdırıcı, izahedici sinonim cərgələrlə təqdim olunur: "Bir tərəfdən bacarıqsızlıq, millətə, xalqa qayğısızlıq, ikinci tərəfdən isə bütün bu şəraitdən ayrı-ayrı qrupların öz mənafeləri üçün istifadə cəhdləri və bunların nəticəsində Azərbaycanın daxilində gedən ***çəkişmələr, toqquşmalar, hakimiyyət mübarizəsi*** Azərbaycanı belə ***ağır, dəhşətli*** vəziyyətə gətirib çıxarıbdır" [VIIc.s.275].

İctimai-siyasi vəziyyəti xarakterizə etmək baxımından bir sıra sinonimlər işlədilir: "Bir sözlə, vəziyyət ***ağırdır, gərgindir***. Ancaq bu o demək deyil ki, biz vəziyyəti çıxılmaz hesab edirik. Xeyr" [Ic.s.241].

Cəmiyyətdə baş verən hadisələri öyrənmək baxımından istifadə olunan sinonimlər: "Ona görə də mən bu son bir il içərisində bu barədə aparılan işləri, ***araşdırmaları, təhlilləri***,

***tədqiqatları*** bəyənirəm və bizim mətbuatın, xüsusən Azərbaycan televiziyasının son günlərdə hazırlayıb geniş tamaşaçı kütləsinə çatdırdığı verilişləri bəyənirəm” [IXc.s.113].

Xalqın dözümünü əks etdirən sinonim cərgə: “Amma eyni zamanda, bizim xalqımızın ən yüksək mənəvi dəyərlərindən biri də odur ki, azərbaycanlılar heç vaxt ***əyilmirlər***, ***sınmırlar***, ***dözümlüdürlər***” [IXc.s.41].

Hadisələrə düzgün, hüquqi qiymət verilməsi ilə bağlı böyük natiqin işlətdiyi sinonimlər bu gün də auditoriyalarda natiqlərin istifadəsindədir: “Çünki biz keçmiş hadisələri**,** faciələri xatırlayaraq, onlara ***doğru-düzgün, ədalətli, obyektiv*** qiymət verərək, eyni zamanda irəliyə baxmalıyıq, bu vəziyyətdən çıxmaq üçün tədbirlər görməliyik, bunun üçün daha sıx birləşməliyik, həmrəy olmalıyıq, əl-ələ verməliyik, keçmişdə buraxılan səhvlərə, xəyanətlərə bundan sonra daha yol verməməliyik” [IXc.s.111].

Xalqa, vətənə necə xidmət etməyi göstərən sinonimlər: “Öz torpağında, vətənində xalqına, millətinə ***sədaqətlə***, ***namusla***, ***şərəflə*** xidmət et, müstəqil dövlətini möhkəmlətməyə çalış, milli ***həmrəylik*** yarat, dövlətlə, hökumətlə, xalqla ***əlbir*** ol” [IXc.s.123].

Azərbaycan xalqının xarakterini açmaq yolunda Heydər Əliyevin tez-tez işlətdiyi sinonimlərə aşağıdakıları misal çəkmək olar: “Xalqımız yüksək ***mənəviyyata***, böyük ***zəkaya*** malik olan bir xalqdır. Xalqımız ***qəhrəman***, ***şücaətli*** xalqdır. Xalqımız ***məğrur***, ***yenilməz*** xalqdır” [IXc.s.36].

Azərbaycan xalqının xarakteri başqa bir sinonim cərgədə belə açılır: “Azərbaycan xalqı ***dözümlü, dəyanətli*** xalqdır. Sizin hamınıza daha da ***dözümlülük, dəyanətlilik*** arzulayır, hamınızı ***milli həmrəyliyə, milli birliyə*** dəvət edirəm” [IIc.s.42].

Xalqımızın maariflənməsi yolunda, təhsil səviyyəsinin artırılması yolunda böyük natiqin işlətdiyi sinonimlər özünəməxsusluğu ilə seçilir: “O vaxtın şəraitinə uyğun olaraq Cəlil

Məmmədquluzadə "Molla Nəsrəddin" jurnalını xalqın əksər təbəqələri üçün ***oxuna bilinən, anlaşıqlı*** səviyyədə nəşr edirdi. Təsadüfi deyildir ki, tanınmış rəssamlar Şmerlinqin, Rotterin, Azərbaycanın böyük rəssamı Əzim Əzimzadənin və başqalarının istedadından istifadə edərək demək olar ki, yazılarla bərabər həcmdə ***şəkillər, karikaturalar*** da verilirdi. Mən bunu belə anlayıram ki, o vaxt xalqımızın əksəriyyəti ***savadsız olduğuna görə***, çoxunun ***oxumaq imkanı olmadığına görə*** karikaturalar və şəkillər savadsız adamlara da çox təsir bağışlayırdı, sözləri oxumadan da fikirləri çatdırıb bildirirdi" [IIIc.s.77]. Maraqlı hal kimi burada biz Heydər Əliyevin nitqində cümlə tipli sinonimlərə təsadüf edirik. Burada da nitq izahedicilik funksiyasını özündə saxlayır.

Heydər Əliyevin nitqindəki sinonimlər xalqı səfərbər etməkdə ən güclü vasitəyə çevrilir: "Əgər adam ***öz evini, öz ocağını, öz torpağını, yaşayış yerini*** qorumursa, onun əvəzinə kim gəlib qoruyacaqdır?" [Ic.s.232]. "Evini-ocağını", "torpağını-yaşayış yerini" sinonimləri ciddiliklə auditoriyalara səslənir.

Çətin məqamlarda ölkənin taleyüklü məsələlərinin həllində Azərbaycan xalqının xarakterik cizgiləri sinonim cərgələrin köməyi ilə auditoriya üçün açılır: "Nəhayət, oktyabrın 4-də dövlət çevrilişi başlandı. Ancaq xalqımızın ***birliyi, həmrəyliyi, qüdrəti və cəsarəti*** dövlət çevrilişinin, cinayətkarların hərəkətlərinin qarşısını aldı" [IIIc.s.96-97].

Erməni işğalçıları ilə bağlı, eləcə də ilhaqçılıqla bağlı məsələlərin müzakirəsində frazeoloji birləşmələr şəklində işlədilən sinonimlər öz layiqli yerini tutur: "Biz ***işğalçılıq***, ***qəsbkarlıq*** siyasəti yeritmirik. Biz sadəcə olaraq torpaqlarımızı ***özümüzə qaytarmalıyıq***, işğal edilmiş ərazilərimizi ***geri almalıyıq***, Azərbaycanın ***ərazi bütövlüyünü təmin etməliyik***. Bu, haqq işidir. Biz bu haqq yolda bütün imkanlardan istifadə etməliyik" [Ic.s.233].

Xalqlar arasına nifaq salanlara, milli münasibətləri kəskinləşdirənlərə, millətçilik ideyalarını yayanlara qarşı Heydər Əliyevin ittihamedici sinonimləri işə düşür: “Mart ayının axırlarında “Nezavisimaya qazeta”da hansısa bir mərkəzin aşkar ***fitnəkar, qızışdırıcı,*** açığını deyim, ***faşistpərəst*** hesabatı dərc edilmişdi. Məgər belə şey etmək olar? Rusiyanı xilas etmək üçün Azərbaycanı, Gürcüstanı məhv etməyə çağırırlar. Yaxud başqa bir misal. Bu yaxınlarda hansısa təşəbbüslərin Ermənistan-Rusiya mərkəzi “Zavtra" qəzetində xalqların ***arasını vurmağa***, onların arasına ***nifaq salmağa*** çağıran dəhşətli bir məqalə dərc etmişdi. Bu, heç yaxşı olan işdir? Onlar nə kimi məqsəd güdürlər?” [IXc.s.256]

Sinonim cərgələr böyük natiqin dilində Ermənistanın təcavüzünü pisləməkdə, dünyaya bəyan etməkdə mühüm leksikoloji vahidlərdir: “Ermənistanda olan ***ektremist, terrorçu, separatçı, təcavüzkar*** qüvvələr çoxdankı niyyətlərini həyata keçirmək üçün 1988-ci ildə böyük fürsət əldə etdilər, bu fürsətdən məharətlə istifadə etdilər” [VIIc.s.274].

Heydər Əliyevin ecazkar nitqində sinonimlər mənanı daha dəqiq ifadə etmək üçündür. Sinonimlərin köməyi ilə böyük natiq Azərbaycan-Ermənistan münaqişəsinin dəqiq təsvirini verir: “Ancaq eyni zamanda bu elə bir böyük müharibə deyildir ki, beş il müddətində ona ***əncam, çarə tapılmasın***, ***son qoyulmasın.*** Demək istəmirəm ki, bu, asan məsələdir. Bu müharibə təkcə Ermənistanla Azərbaycan arasında gedən müharibə deyil. Bu müharibəyə böyük xarici qüvvələr qoşulmuşdur. O, böyük siyasi proseslərlə bağlıdır. Bu müharibə başıbəlalı Azərbaycanı ***parçalamaq, yenidən dağıtmaq*** məqsədi güdən böyük siyasi qüvvələr tərəfindən başlanıb” [Ic.s.164].

Erməni xislətini açmağa xidmət edən sinonimlərə aşağıdakı cərgə uyğundur: “Rusiya Müdafiə Nazirliyinin səhih məlumatına cavab olaraq Yerevanda söylənilmiş fikirlər ***ağ ya-***

***landır, uydurma və böhtandır***. Mən bunu qəti şəkildə deyirəm” [IXc.s.67].

Heydər Əliyevin nitqində işlədilən sinonimlər müxtəlif üslublarda öz yerini tapır. “Torpaq islahartı haqqında” Azərbaycan Respublikası qanunu layihəsinin müzakirəsinə həsr edilmiş iclasda ilk baxışda sinonimlər çox da gözlənilmir. Amma nitqin gedişində spontan olaraq sinonimlərin axını başlayır, auditoriya ciddi publisistik üslubdan sinonimlərlə zəngin bədii-publisistik üsluba qulaq kəsilir:

“Bilirsiniz, əgər Oktyabr inqilabından, 1920-ci ildən sonra, ***zorla, inqilabi yolla, repressiyalarla*** insanları kolxoza getməyə məcbur ediblərsə, torpaqları zorla, repressiyalarla insanların əlindən alıblarsa, indi biz həmin işlərin əksinə apardığımız tədbirlərdə ***nə zor işlətməliyik, nə də təzyiqlər etməliyik***. Biz çalışmalıyıq ki, insanlar ***dərk etsinlər, anlasınlar***. Məsələn 70-ci illərin sonunda Sovetlər İttifaqında aqrar sektorda yaranmış vəziyyəti, gedən prosesləri və o vaxt görülən tədbirləri yada salın. Ola bilər, adi adamlar bunu ***bilmirdilər, dərk etmirdilər.*** Amma bu işlərin içində olan adamlar, o cümlədən mən də o illərdə bilirdim ki, artıq bu sistem işləmir, biz nə isə düşünməliyik, nə isə etməliyik” [VIIc.s.91].

Bədii-publisistik ruhlu çıxışlarında böyük natiqin dilində sinonimlər aşıb-daşır, frazeoloji söz birləşmələrindən yaranan sinonim cərgələr auditoriyaları bəzəyir. Dahi Azərbaycan şairi Məhəmməd Füzulinin 500 illik yubileyi üzrə dövlət komissiyasının 23 iyul 1996-cı ildəki iclasında olduğu kimi: “Füzulini ən əvvəl öz ölkəmizdə daim təbliğ etmək lazımdır. Bizim ***xalqımız***, xüsusən ***gənc nəsil***, ***yeni həyata qədəm qoyanlar***, Füzulini nə qədər oxusalar, ***dərk etsələr***, onun yaradıcılığı ilə ***yaxından tanış olsalar***, Füzuli şəxsiyyətinin ***böyüklüyünü hiss etsələr*** adamlarımız bir o qədər saf mənəviyyat istiqamətində yaşayacaq və həyatlarını da bu ruhda quracaqlar. Çünki Füzulinin həyatı da, bütün yaradıcılığı da həm yüksək

***mənəviyyat***, həm yüksək ***fəlsəfədir***, həm də insanlara ***mənəvi, estetik qida verən böyük bir mənbədir"*** [VIIc.s.165]. Burada da özünəməxsus Heydər Əliyev sinonimləri üzə çıxır. Belə ki, "gənc nəsil" ifadəsi "yeni həyata qədəm qoyan"larla sinonimləşir. Növbəti cümlədə isə mürəkkəb frazeologizmlər sinonimləşərək Füzuli ruhuna layiq cərgə yaradır. "Dərk etmək" → yaxından tanış olmaq → böyüklüyünü hiss etmək.

Milli-vətənpərvərlikə bağlı sözə ehtiyac duyulduğu anlarda böyük natiq sinonim cərgələr yaradır, milli şüurun oyanması yolunda auditoriyaları səfərbər edir: "O vaxtlar, "Qobustan" jurnalı həyatımızda çox böyük rol oynayırdı. Bizim bu ***milli dirçəliş, milli oyanış, milli özünütanıma*** prosesində "Qobustan"ın rolu çox böyük olubdur" [VIIc.s.175].

Məişətdə işlənən sinonimlər, eləcə də ciddi dövlət tədbirlərində işlənir: "Cənab Şerman, sizdən və idarəetmə komitəsinin üzvlərindən xahiş edirəm ki, belə çətinliklərlə rastlaşan zaman siz ***utanmayın, çəkinməyin,*** mənə, xüsusən baş nazirə müraciət edin" [IXc.s.9].

Sadə məişət üslublu sinonimlər insanları əxlaqi cəhətdən tərənnüm etmək anlarında, məqamlarında istifadə oluna bilir: "Əlli il müddətində mən Tamerlanı yaxşı tanımışam, onun həyatını, fəaliyyətini həmişə müşahidə etmişəm. Burada onun haqqında deyilən sözlər tam həqiqətdir. O özü çox istedadlı bir insan, fitri istedada malik adam olubdur. Bununla yanaşı çox ***fədakar***, ***əməksevər***, ***işgüzar*** adam olubdur" [IXc.s.144].

Bir sıra sinonimlər cərgəsi müxtəlif auditoriyalarda işlədilir. "Dinclik, səadət və firavanlıq" kimi cərgə bu qəbildəndir: "Əminəm ki, keçirilən bu məclisin həsr olunduğu iqtisadi əməkdaşlığın inkişafı regionlarımızın və xalqlarımızın yaxınlığına xidmət edəcək, onlara ***dinclik, səadət və firavanlıq*** bəxş edəcəkdir" [Ic.s.18].

Dini-fəlsəfi, dini-əxlaqi çıxışlarında Heydər Əliyevin işlətdiyi sinonim cərgələr Azərbaycan nitq mədəniyyətinin for-

malaşması yolunda əvəzsiz incilərdir. Bu sinonim cərgələr bir daha Azərbaycan dilinin zənginliyindən və böyük natiqin dilimizin dərin qatlarına bələdliyindən xəbər verir: "Adamları ***humanizmə, şəfqətə, nəcibliyə, yüksək mənəvi dəyərlərə*** səsləyən dinlərin bəşər tarixində rolu əvəzsizdir. Bəşəriyyət üçün ***sülhə, barışığa*** nail olmağın yolu ***Tanrı nuruna tapınmaqdan, mənəvi, ruhani kamillikdən*** keçib gedir" [Ic.s.356-357].

Dini auditoriyalarda böyük natiqin fərqli sinonim cərgələrinin şahidi oluruq: "İnsanların mənəvi sərvətlərinin hamısından dinin fərqi ondadır ki, o, dini mənsubiyyətindən asılı olmayaraq həmişə insanları ***dostluğa, həmrəyliyə, birliyə*** dəvət etmişdir" [Ic.s.386-387].

"Bu bir ay müddətində dini ənənələrə görə hər bir müsəlman mənəviyyatca daha da ***paklaşır, təmizləşir,*** eyni zamanda öz torpağına, öz Vətəninə, öz xalqına, dininə daha da sədaqətlə xidmət edir, saf niyyətlə yaşayaraq ibadət edir, oruc saxlayır" [Ic.s.479-480].

Dini auditoriyalarda sinonimlərin köməyi ilə vətəndaşların birliyinə nail olmaq baxımından Heydər Əliyevin nitqi mühümdür: "Çalışmalıyıq ki, dini, milli mənsubiyyətindən asılı olmayaraq, Azərbaycanın bütün vətəndaşları eynihüquqlu olsunlar və onların hamısının ***birliyini, vəhdətini*** təşkil edək. Bu da Allahtəalanın buyuruğu, bizim yolumuzdur" [IIc.s.147-148].

Dəfn mərasimlərində böyük natiqin dini səpkidə sinonimləri işə düşür: "Demək istəyirəm ki, Neftçi Qurban və onun kimiləri xalqımızın qəlbində, tarixində daim yaşayacaqlar. Allah xalqımıza ***dözüm, səbir*** versin. Allah Qurban Abasova rəhmət eləsin" [IIc.s.225-226].

Təbiətlə insanın harmoniyasını əks etdirən sinonimlər: "Kəlbəcərdə yaşayan insanlar da o gözəl təbiətin, məğrur qayaların, dağların təsiri altında daim ***cəsur olublar***, ***qəhrəman və rəşadətli*** olublar" [IXc.s.111].

“Fikirlər”, “mülahizələr” sinonimləri bir sıra məqamlarda işlədilir: “Bilirsiniz, bu təhlili genişləndirmək, bu barədə daha geniş ***fikirlər***, ***mülahizələr*** söyləmək olar. Ancaq mən bu məqamları xatırladıram ki, Səməd Vurğunun yaradıcılığının nə qədər dərin iz buraxdığını bu gün biz bir daha dərk edək” [IXc.s.19].

Məsələlərə fəlsəfi yanaşma baxımından Heydər Əliyevin nitqlərində özünəməxsus sinonim cərgələr mövcuddur: “Torpaqdan səmərəli istifadə prosesini təşkil etmək lazımdır. Bu prosesin də bir çox ***komponentləri, ünsürləri, elementləri*** vardır. Hər bir element ayrılıqda və hamısı bir yerdə kompleks surətdə müəyyən edilməlidir” [IXc.s.179]. “Tam hissələrdən təşkil olunmuşdur” fəlsəfəsinə görə “hissə” anlayışı şüurlara-kənd təsərrüfatı sahəsində çalışan insanların şüuruna komponent, ünsür, element təkin çatdırılır.

Nitqin gedişində böyük natiq gah ümumişlək, loru, gah da yüksək kitab leksikasında olan sözləri sinonim kimi istifadə edir. Dinləyicilər üçün əlavə izaha, şərhə ehtiyac qalmır: “Ancaq biz nə edək ki, Qərbi Almaniya kimi iqtisadi cəhətdən güclü, dövlətli Qərbi Azərbaycanımız olmayıb ki, bizi – Azərbaycanı öz ***yedəyinə, himayəsinə*** alsın, öz təcrübəsini bilavasitə versin ki, necə edək” [VIIc.s.96]. Burada “yedək” loru, “himayə” isə kitab leksikasıdır ki, auditoriya belə sinonimləri maraqla qarşılayır.

Heydər Əliyevin nitqində sinonimlər tamın əks hissələri kimi çıxış edir: “Bütün bu proseslər, bir neçə il ərzində yığılmış bu günahlar***, nöqsanlar, çatışmazlıqlar, ayrı-ayrı yerlərdə mənəviyyat pozğunluğu, cinayətkarlığın artması, cinayətkar ünsürlərin üstün mövqe tutması*** – bunların hamısı bütövlükdə ***qəhrəman, mərd, mətanətli, cəsarətli*** Azərbaycan xalqını belə ***ağır, çətin*** vəziyyətə salmışdır” [Ic.s.232]. “Ağır, çətin vəziyyət” tamı təşkil edirsə, əks hissələr kimi bir tərəfdə,

“günahlar, nöqsanlar, çatışmazlıqlar”, digər tərəfdə isə “qəhrəman, mərd, mətanətli, cəsarətli” sinonim cərgəsi dayanır.

Sinonim cərgələr Heydər Əliyevin nitqində əksliklərin vəhdəti və ziddiyyəti qanunu kimi görsənir: “Bakını əsrlər boyu ***quranlar, yaradanlar*** bugünkü və gələcək nəsillər üçün gözəl bir şəhər salıblar. Bakını ***quranlar, yaradanlar*** bu işi doğrudan da, namusla görüblər. Şübhəsiz ki, burada ***pərakəndəlik də, səhvlər də*** olubdur” [VIIc.s.76].

Həyatın inkişafı, quruculuğu ilə bağlı yox, həm də əksinə gedən proseslərdə də böyük natiq sinonimləri yerli-yerində işlədir: “Dayandırılan tikinti də, şübhəsiz ki, nəinki gecikir, hətta tikilənlər də get-gedə ***dağılır, xarab olur, keyfiyyətini itirir***” [VIIc.s.74].

Cəmiyyətimizə zidd hərəkətlərə qarşı mübarizədə bir sıra sinonimlər bu zidd hərəkətlərə əks olan sinonimlərlə birgə işlədilir: “Bilirsiniz, bu ***rüşvətxorlar***, ***korrupsiyaçılar*** bir-biri ilə nə qədər həmfikir olacaqlarsa, o qədər də mən onlara zidd olacağam. Mən tək deyiləm, bütün xalqımız bu hallara ziddir. Heç vaxt bu rüşvətxorlar öz həyatlarında müvəffəq olmayıbdır. ***Mənəvi paklıq, saflıq***, həmişə insanları ucaldıbdır, həmişə insanlara hörmət gətiribdir. Ola bilər, belə insanlar ***əziyyət, zillət*** içərisində yaşayıblar. Ola bilər, cürbəcür məhrumiyyətlərə məruz qalıblar” [VIIc.s.156].

Etik-fəlsəfi dəyərlərin tez-tez sinonim cərgələrlə böyük natiqin dilindən eşidilməsini izləyirik: “Ancaq bununla belə, inanın, Bakıda, Azərbaycanda bizim Azərbaycan xalqı Sizinlə idi, çünki Siz bu addımı ***həqiqət, ədalət, şərəf, vicdan*** naminə atmışdınız” [IXc.s.269].

Heydər Əliyevin nitqlərində əksliklərin vəhdəti və ziddiyyəti qanunu sinonim cərgələrlə özünü büruzə verir: “Görkəmli musiqiçi, bəstəkar, dirijor kimi, vətəndaş hüquqları, ***azadlıq, demokratiya*** uğrunda, ***zorakılığa və totalitarizmə*** qarşı böyük mübariz kimi Sizi Azərbaycanda yüksək qiymət-

ləndirir, ehtiramınızı saxlayır, sevir, Sizə hörmət bəsləyirlər" [IXc.s.269]. "Azadlıq", "demokratiya" sinonim cərgəsinin əksi kimi "zorakılıq", "totalitarizm" sinonim cərgəsi işlədilir

Başqa bir məqamda Heydər Əliyev nitqində əksliklər yenidən gündəmə gəlir: "Mən bu gün sizi dinləyərkən özüm üçün bir nəticə çıxartdım ki, Vahid nə qədər ***çətin*** həyat tərzi keçiribsə, ***ağır*** yaşayıbsa, ona nə qədər ***diqqətsizlik*** olubsa, qayğı göstərilməyibsə də, o, çox ***nikbin*** adam olubdur" [VIIc.s.257].

"İnsanın həyatda yaratdıqları onun qabiliyyəti ilə ölçülür" prinsipini əsas götürən böyük natiq bu prinsipi sinonimlərlə kütlələrin şüuruna yönəldir: "Mütəxəssislərimizin, alimlərimizin, mədəniyyət xadimlərimizin bir çoxu Ağdamdan olubdur. Bu da təbiidir, bunu heç kəs yaratmayıbdır, ağdamlılar özləri yaradıblar, ağdamlılar bunu özlərinin ***ağlı, zəkası, fədakarlığı, zəhmətkeşliyi***-məhz bunların nəticəsində əldə ediblər. Bu da həm ağdamlıların sərvətidir, həm də bütün Azərbaycan xalqının sərvətidir" [VIIc.s.194].

Quruculuğun, inkişafın əleyhinə olan məqamlar üçün necə deyərlər Heydər Əliyev sinonimləri həmişə mövcuddur. Bu sinonimlər destruktiv halları auditoriyalar üçün işıqlandıra bilir: "Təəssüflər olsun ki, bu gözəl bina Azərbaycanda özbaşınalıq hökm sürdüyü-zaman tamamilə ***sıradan çıxmış, dağıdılmış, tamamilə bərbad vəziyyətə salınmışdı"*** [VIIc.s.250].

Sinonimlər milli-mənəvi dəyərlərimizi dilə gətirərkən, müəllim anlayışını izah edərkən səslənir: "Məktəb, müəllimlər həmişə xalq, insanlar arasında, ictimaiyyətdə hörmət, ehtiram qazanmışlar və buna layiq olmuşlar. Müəllim adı yüksək addır. Azərbaycanda müəllimə daim böyük hörmət olmuşdur. Müəllim cəmiyyətdə ***tanınan, seçilən, hörmət edilən şəxs*** olmuşdur" [IIc.s.170].

İnsanları əxlaqi dəyərlərə səsləyən sinonimləri biz böyük natiqin dilində tez-tez dinləyirik: "Lakin biz nə qədər mübarizə aparsaq da, – mən bunu öz həyat təcrübəmə əsasən deyi-

rəm, – əgər insanların mənəviyyatında dəyişiklik olmasa, pozulmuş mənəviyyat bərpa edilməsə, insanlarda ***vətənpərvərlik, namus, şərəf, qeyrət*** hissi baş qaldırmasa, biz heç nə edə bilmərik" [Ic.s.234-235]. İlk baxışda "namus, şərəf, qeyrət" sinonim cərgəsi "vətənpərvərlik" sözü ilə heç bir sinonimlik əlaqəsinə daxil olmur. Vətənpərvərlik anlayışının yuxarıdakı sinonim cərgənin elementləri ilə sıx əlaqəsinə gəlincə dörd sözdən ibarət sinonim cərgə alınır.

Müdrikliklə bağlı, elm və təhsillə bağlı söhbətlərdə Heydər Əliyevin nitqi sinonim cərgələrsiz keçinmir. Bu sinonimlər sadə zəhmət adamları ilə söhbətlərdə həm yüksək kitab leksikasına aid, həm də ümumişlək sözlərlə yaranır. Qurban Bayramı günü Lerikli fermer Xanış Şahıyevlə görüşdəki kimi: "Ancaq xalqımızın çoxəsrlik tarixində dəyərli, müdrik sözləri müdrik insanlar deyiblər. Müdriklik təkcə o insanların ***elmi, biliyi, təhsili*** ilə bağlı deyildir. Müdriklik insanın fitri istedadıdır, müdriklik həm də insanın həyatı dərk etməsi, gedən proseslərə düzgün qiymət verə bilməsi və ondan özü üçün lazımi faydalar götürməsidir" [IXc.s.187].

Heydər Əliyevin nitqində insanın etik-əxlaqi xüsusiyyətləri, bir fərd olaraq insanın hansı dəyərlər daşıması sinonimlərlə auditoriyaya çatdırılır: "Biz bilirik ki, haqq-ədalət uğrunda mübarizənizdə o sizinlə birlikdə özünü cəsarətli aparırdı və həmişə sizinlə birlikdə idi. Bu, insanın ***etibarlı, vəfalı və sədaqətli*** dostu olmasına layiqli misaldır" [IXc.s.237].

Vətənin ağır anlarında etik dəyərləri əks etdirən ifadələr sinonimlik qazanaraq auditoriyanı əfsunlayır: "Bir sözlə, hamıya müraciət edirəm və bu ağır gündə hamıdan ***mətanət, dəyanət, cəsarət, qəhrəmanlıq, namus, qeyrət*** gözləyirəm. Azərbaycan xalqı ***qeyrətli xalqdır, mətin xalqdır***" [IIc.s.360-361].

Müstəqillik yolunda ictimai-siyasi vəziyyətin mənfi təzahürləri də auditoriyalara sinonim cərgələrin köməyi ilə çatdırılır: "Biz bunları ***ağır, çətin*** şəraitdə yaradırıq. Xaricdən olan

cürbəcür təxribatlar və təcavüz şəraitində yaradırıq. Azərbaycanın daxilində olan cürbəcür ***qarışıqlıqlar, çarpışmalar, hakimiyyət mübarizəsi*** şəraitində yaradırıq" [IXc.s.303].

Sinonimlər Azərbaycan xalqının ermənilər qarşısında qətiyyən zəif xalq olmadığını auditoriyalara izah edir: "Mən hesab etmirəm ki, bizim xalqımız aciz xalqdır. Əsrlər boyu, dəfələrlə xalqımız yadelli ***qəsbkarlarla üzləşib, qarşılaşıb və dəfələrlə döyüşə qalxıb, torpaqlarımızı müdafiə edib, öz milli mənliyini qoruyub saxlaya bilibdir***" [VIIc.s.274].

Məğrurluq, əyilməzlik tələb olunan məqamlar üçün Heydər Əliyevin bu gün bizlərə ərmağanı olan hazır sinonimləri var: "Səməd Vurğun çox dərin məzmunlu və həyəcanlı bir nitq söylədi. Həmin nitq yəqin, haradasa dərc olunub və onu oxuyanlar bunları bilirlər. Onun o nitqi də məhz Azərbaycanın ədəbiyyatına, mədəniyyətinə, ziyalılarına aid qayğılarla dolu idi. O vaxt ona iki-üç dəfə replika verdilər, amma Səməd Vurğun heç bir dəfə də ***əyilmədi***, ***sınmadı***, ***iradəsini itirmədi***, öz nitqini mərdi-mərdanə, böyük iftixar hissi ilə başa çatdırdı" [IXc.s.22].

20 Yanvar şəhidlərinin xatirəsini əbədiləşdirmək baxımından işlədilən sinonim cərgələrin müəyyən ifadələri frazeologizmdən ibarətdir: "Ona görə də qəhrəman Azərbaycan balalarının tankın altına düşüb əzilməsi faktını göstərməklə kifayətlənməyib, onların ***qəhrəmanlığını, cəsurluğunu, ölümün gözünə dik baxaraq təcavüzkarın qarşısına çıxmalarını*** da təsvir etmək lazımdır" [IIIc.s.127-128].

Burada qəhrəmanlıq və cəsurluq kimi sinonimlər sifətlərə *-lıq, -luq* şəkilçilərinin əlavə olub mücərrəd isimlər əmələ gəlmişdir. Elə buradaca böyük natiqə xas olan sinonimləşmə yaratmaq nəzərə çarpır. Belə ki, "qəhrəmanlıq", "cəsurluq" cərgəsinə "ölümün gözünə dik baxaraq təcavüzkarın qarşısına çıxmaq" qoşularaq sinonim cərgəni tamamlayır.

Heydər Əliyev nitqində sinonimlər poetik ovqat yaradır. Sadə ümumişlək sinonimlərlə yanaşı kitab leksikasının köməyi ilə poetiklik auditoriyanı növbəti nitq mərhələlərinə səfərbər edir. 21 mart 1997-ci ildə Bakının Gənclər Meydanında Qoşaqala qapıları önündə Novruz şənliyində çıxış bu sıradandır: "Bu bayram günlərində xalqımız Azərbaycanın dövlət müstəqilliyinin, milli azadlığının nə qədər qiymətli, hər bir şəxs üçün tarixi əhəmiyyətli bir hadisə olduğunu daha da dərindən dərk edir. Ona görə də bu bayram indi artıq Azərbaycanın dövlət müstəqilliyinin və milli azadlığının rəmzidir. Bu bayram ölkəmizin ***azadlığının, sərbəstliyinin*** rəmzidir. Bu bayram ***əmin-amanlığın, ictimai-siyasi sabitliyin*** rəmzidir. Bu bayram ölkəmizdə gedən ***hüquqi, demokratik, dünyəvi, sivil*** dövlət quruculuğunun rəmzidir" [IXc.s.38].

"Bu bayram" anaforası və "rəmzidir" epiforası beş yerdə təkrarlanaraq "azadlıq", sərbəstlik", "əmin-amanlıq", "ictimai-siyasi sabitlik", "dünyəvi", "sivil", "haqq", "hüquq" sinonimləri ilə poetikcəsinə işlədilmiş bir nitq nümunəsi yaradır.

Şair və yazıçılarımızın təntənəli yubiley gecələrində sinonimlər nitqin poetikliyinə xidmət edir. Bədii gecəyə toplaşan auditoriya Heydər Əliyevin sinonimlərlə zəngin çıxışının sehrinə, cazibəsinə düşür. 1996-cı il 30 avqustda Əliağa Vahidin 100 illik yubiley gecəsində olduğu kimi: "Aktyor Ramiz Əzizbəyli:

*Vətən diyarında Vahid, nə xidmət eylərsək,*
*Bu şanlı iş gələcək nəslə yadigar olacaq!*

Heydər Əliyev: Vahid bu sözləri həm bu gün üçün, həm də bu gün yaşayanların gələcəyə nikbin baxmaları üçün deyib. Bunlar nə qədər dəyərli sözlərdir! Yenə də deyirəm, o qədər ağır vəziyyətdə yaşayan, o qədər ***çətinliklər keçirmiş, qayğısız, diqqətsiz qalmış*** insan gərək dünyadan küsəydi, nə gələ-

cək, nə də başqa şey haqqında düşünməyəydi. Amma görün nə qədər gözəl sözlər deyib! Bu sözlər məni həddindən artıq heyran elədi. Bu tədbir mənə elə təsir bağışlayıb ki, heç getmək istəmirəm. Bu gecə çox gözəl idi. Mən hiss etdim ki, bu gecə hər bir şəxs nə qədər ***ürəkdən, candan, dərin hissiyyatlarla*** çıxış edirdi" [VIIc.s.258].

İnsanların emosional – psixi hallarını göstərən sinonim cərgələr də Heydər Əliyevin nitqində öz yerini alır: "Bizə məlum olduğuna görə, bu, orada yerli əhali arasında, ***hiddət, təşviş, narahatlıq*** doğurmuşdur" [Ic.s.125]

Sənət əsərlərinə qiymət verərkən sinonimlərdən istifadə olunur. Akademik Zərifə xanım Əliyevanın xatirəsinə həsr edilmiş "Elegiya" əsərində olduğu kimi: "Görürsünüz, bu heykəlin çox ***incə, nazik, zərif*** fraqmentləri vardır. Yenə də deyirəm, bunların hamısı bir tərəfdən bir heykəltəraş kimi Ömər Eldarovun əsərinin dəyərini nümayiş etdirir, amma eyni zamanda, mənim üçün bu, mücərrəd əsər deyil" [IXc.s.156].

Sinonimlər Heydər Əliyevin nitqində yazıçı və şairlərimizlə bağlı məqamlarda işlədilir: "Mən düşünürəm ki, Azərbaycan xalqının müsbət xüsusiyyətlərindən biri də odur ki, mədəniyyətə, ədəbiyyata daim ***diqqət, qayğı*** göstərib və hörmət edibdir. Bilmirəm, bəlkə səhv edirəm, ancaq ***yazıçıya, şairə, mədəniyyət xadiminə*** bizim Azərbaycandakı kimi hörmət və ehtiram bəlkə də az yerlərdə tapılar" [XIIIc.s.5]. Bu zaman xalqın ruhuna yaxın olan sinonimlər özünə mühüm yer alır.

Böyük natiq müəllim peşəsinə olan sevgisini müəllimlər auditoriyasında sinonimlərlə çatdırır: "Mənim üçün müəllim adı həmişə ***ən ülvi, ən şərəfli*** bir məfhum olubdur. Mən bu gün müəllim qarşısında ***baş əyirəm, müəllimə hörmət və ehtiramımı bildirir***, Azərbaycan müəllimlərinə bundan sonra da öz işlərində ***uğurlar arzulayır, cansağlığı, səadət diləyirəm***" [VIIc.s.262].

Təhsil işçiləri qarşısında təhsilimizlə bağlı, müəllimlərlə bağlı, ölkənin gələcək təhsil sistemi ilə bağlı sinonimlərə geniş yer verilir: "Azərbaycan xalqı yüksək ***elmə,*** yüksək ***biliyə, savada*** malik olan xalqdır" [VIIc.s.261].

Başqa bir məqamda Azərbaycan müəlliminin xidmətləri sadalanır: "Demək olar ki, cəmiyyətimizin əksəriyyəti bu ***iqtisadi, maddi çətinliklər*** içərisində yaşayır. O cümlədən müəllimlərimiz də. Ancaq müəllim, həqiqi müəllim adını daşıyan insan həmişə, tarixin ən çətin dövrlərində ***dəyanətli, dözümlü*** olublar və öz mənəviyyatını hər şeydən yüksək tutubdur" [VIIc.s.261].

Müəllim mənəviyyatı barədə yenə də sinonimlərlə böyük natiq öz sözünü deyir: "Mənim xatirimdədir, 1941-1945-ci illərdə, İkinci dünya müharibəsi, Böyük Vətən müharibəsi zamanı məktəblərin, müəllimlərin vəziyyəti indi də gözümün qabağındadır. ***Aclıq içində, çətinlik içində, böyük iqtisadi problemlər içində*** məktəblər öz işini davam etdirirdi, müəllimlər də müəllimliyini edirdi" [VIIc.s.262].

Gələcəyimizin elmə, təhsilə bağlı olduğunu sinonimlərlə bildirən böyük natiq belə diqqətə çatdırır: "Lakin biz bu günümüz, müstəqil Azərbaycanın gələcəyi haqqında düşünsək, gənc nəslin tərbiyəsinə ciddi fikir versək, ən əvvəl ali təhsil almağa qadir, yəni buna öz ***biliyi, zəkası, fitri istedadı*** ilə layiq olan gənclərin ali məktəblərə qəbul olunmasını təmin etsək, onda gələcəyimiz üçün böyük işlər görmüş olarıq" [IIc.s.105].

Heydər Əliyevin nitqində sinonimlər heç də nitqə əlvanlıq vermək məqsədinə xidmət etmir. İzahedicilik bu sinonim cərgələrin mühüm əlamətlərindəndir: "Hesab edirəm ki, bunlar yetərli deyil və hesab edirəm ki, Cəlil Məmmədquluzadənin yaradıcılığı, onun əsərləri haqqında elmi əsərlər, fundamental monoqrafiyalar yaratmaqla yanaşı, onun yaradıcılığını, əsərlərini populyar şəkildə ***geniş kütlələrə, camaata, xalqa*** çatdırmaq lazımdır" [IIIc.s.81-82]. Təkcə "geniş kütlə, camaat,

xalq" sinonim cərgəyə diqqət yetirsək "camaat"ın bir qədər arxaikləşmiş, "geniş kütlənin" isə yüksək kitab leksikasına aid olduğu məlum olar.

Sinonimlər böyük natiqin dilində mədəniyyətimizin, incəsənətimizin gələcəyinə yönəlir, auditoriyaları nikbinliyə çağırır: "Ancaq bura dönəndən sonra, xüsusən Vətənimizin, torpağımızın müdafiəsi ilə məşğul olduğumuz dövrdə, respublikamızda ictimai-siyasi proseslərin gərgin olduğu bir vəziyyətdə mən vaxtaşırı mədəniyyətimizdə, incəsənətimizdə gənc istedadları görərkən həddindən artıq sevinirəm və bir daha özüm-özümə deyirəm ki, doğrudan da, xalqımız nə qədər ağır vəziyyətdə də olsa mədəniyyəti, incəsənəti unutmayacaq və nə qədər çətin şəraitdə yaşasa da, o istedadlar ***cücərəcək***, ***meydana çıxacaqlar***. Necə ki, bəzən qarın altından çiçək çıxır" [IIIc.s.319].

Uşaqlar auditoriyasında gələcəyə səsləyən nikbinliklə dolu sinonimlər nitqin ekspressivliyini gücləndirir: "Qarşımızda duran bu çətinliklər aradan götürüləndən sonra ***müstəqil, azad, sərbəst*** Azərbaycanın gələcək vətəndaşları olacaqsınız. Biz bu çətinlikləri aradan götürəcəyik. Həyat gündən-günə ***rahatlaşacaq***, ***yaxşılaşacaqdır***. Mən buna sizi tam əmin edirəm. Siz də çalışmalısınız bu həyatdan özünüz üçün daha da çox götürəsiniz ki, gələcəkdə müstəqil Azərbaycanın inkişafını ***yaradan, quran***, təmin edənlər olasınız" [IXc.s.36].

Uşaqlarla görüşlərdə söylədiyi nitqlərin sonluğundakı sinonimlər aşağıdakılardır: "Mən sizi ***öpürəm, qucaqlayıram***, ***bağrıma basıram***. Sizə yeni-yeni uğurlar arzulayıram" [IXc.s.37].

Uşaq auditoriyasında, xüsusilə şəhid uşaqları və kimsəsiz uşaqlar üçün təşkil olunmuş bayram şənliklərində bir sıra sinonim cərgələr səslənir: "Bizim hər birimizin ən böyük sevinci, ən çox istədiyimiz – ***balalarımız, uşaqlarımız***, ***gənclərimizdir***, əziz ***balalar***, əziz ***övladlar***, sizlərsiniz. Mən sizin hamınızı ***qucaqlayıram, öpürəm, bağrıma basıram***" [VIc.s.6].

Uşaqlarla bağlı başqa bir məqamda aşağıdakı sinonim cərgə auditoriyaya ünvanlanır: "Mən buna sevinirəm. Ona görə də sizin hər birinizi, hamınızı bir daha ***təbrik edir, qucaqlayıram, öpürəm, bağrıma basıram***. Hamınıza ***cansağlığı, xoşbəxt, firavan*** həyat arzulayıram. Arzu edirəm ki, həmişə belə ***şən olasınız, güləsiniz, çalıb-oynayasınız***" [VIc.s.9].

Azərbaycan qadınına yönələn sinonimlər: "Azərbaycan qadınları da öz ***ağıllarına***, ***zəkalarına*** görə, ***biliklərinə***, ***istedadlarına*** görə, eyni zamanda gözəlliklərinə görə dünya qadınları içərisində özünəməxsus və çox yüksək yer tuturlar" [IXc.s.25]

"Onların içərisində qadınları görəndə, yaşlı, gənc qadınları, qucağında təzəcə doğulmuş, yenicə dünyaya gəlmiş uşaqla, südəmər uşaqla o meydana ayaqyalın gələn qadınları görəndə mən bir daha düşündüm ki, qadınlar nə qədər vətənpərvər, ***millətinə, ölkəsinə, dövlətinə*** nə qədər sədaqətlidirlər, eyni zamanda nə qədər ***cəsur***, ***qorxmaz***, ***qəhrəmandırlar***" [IXc.s.26].

"Ümumiyyətlə, qadın cəmiyyətin ən hörmətli üzvüdür. Hamı qadının qarşısında ***baş əyməlidir***, hamı qadına ***hörmət etməlidir***. Mən bütün həyatım boyu qadına hörmət etmişəm və cəmiyyətimizi, millətimizi, xalqımızı qadına hörmət etməyə dəvət etmişəm" [IIIc.s.128].

İqtisadiyyatla bağlı məsələlərin müzakirəsində bir sıra sinonimlər özünə yer tapır: "1995-ci ildən indiyə qədər aparılan ***tədqiqatlar, təhlillər, müzakirələr*** nəticəsində belə qərara gəlmişik ki, Azərbaycanın ərazisində olan bir qrup qızıl, mis və gümüş yataqlarının Amerika Birləşmiş Ştatlarının şirkəti ilə müştərək istifadə edilməsinin vaxtı gəlib çatıbdır" [XIIc.s.13].

29 avqust 1997-ci ildə Prezident sarayında Azərbaycanın və xarici ölkələrin ali məktəblərinə qəbul olunmuş tələbələrin bir qrupu və onların valideyinləri ilə görüşdə gənclərin öz fikirlərini sərbəst ifadə etmələri ilə bağlı ümumişlək sinonimlərdən istifadə olunur: "Səciyyəvi hal ondan ibarətdir ki,

gənclər sərbəstdirlər, öz fikirlərini sərbəst ifadə edə bilirlər və heç bir şeydən ***çəkinməyərək, utanmayaraq*** öz sözlərini demək üçün müraciət edirlər" [XIIc.s.112]. Elə həmin görüşdə gələcəyimizin kimlərin çiynində olacağını sinonimlərlə böyük natiq auditoriyaya bəyan edir: "Müasir həyat və dünyanın gələcəyi insanlardan daha da çox bilik tələb edir. Gələcək ***bilikli, elmli*** insanların çiyinləri üstündə qurulacaqdır" [XIIc.s.113].

Diaspor nümayəndələri ilə, diaspor təşkilatlarla görüşlərdə onları təşkilatlandırmaq baxımından işlədilən sinonimlər:

"Əminəm ki, indi burada Azərbaycanın Ukraynadakı səfirliyi ətrafında daha çox toplaşacaqsınız, bir-birinizlə daha yaxşı ***ünsiyyət, əlaqə*** yaradacaqsınız, ***birləşəcəksiniz***, ***həmrəy olacaqsınız,*** bir-birinizə ***kömək*** edəcəksiniz, ***dayaq*** olacaqsınız. Eyni zamanda Azərbaycanın qayğıları ilə yaşayacaqsınız" [IXc.s.78].

Diaspor təşkilatlar qarşısındakı çıxışlarda birliyə çağıran sinonimlərdən istifadə edilir: "Amma bu təbii qanunlar içərisində də ***bir olmaq, daha da sıx olmaq, bir-birinə dayaq olmaq, əl uzatmaq*** üçün imkanlar çoxdur" [VIIc.s.17-18].

Yenə də diaspor təşkilatları qarşısında frazeoloji birləşmələrdən əmələ gələn başqa bir sinonimlər səslənir: "Bilirsiniz, bir millətik, hamımız bir kökdənik. Ona görə də gərək azərbaycanlılar da, türkiyəlilər də bir-birinə ***dayaq olsun, əl-ələ versinlər***" [VIIc.s.18].

Heydər Əliyev dilində sinonimlər Azərbaycanın təbii sərvətlərinə də yönəlir. Almaniyanın iş adamları ilə görüşdəki kimi: "Bir vaxtlar almanlar Azərbaycanda mis hasilatı ilə məşğul olurdular. Bizdə Gədəbəy və Daşkəsən mis mədənlərində alman şirkətləri işləyirdilər. Əgər bu, yüz il əvvıl olmuşdursa bəs nə üçün indi əməkdaşlıq etməyək? Həmin yataqlar ***öz əhəmiyyətini, öz potensialını və aktuallığını*** bu gün də saxlayır" [VIIc.s.45].

İqtisadiyyatdakı inkişafla bağlı sinonimlər auditoriyalara yönəlir: "Birincisi, iqtisadiyyatda bir neçə il – 7-8 il ardıcıl mövcud olan tənəzzülün qarşısı alınıbdır, bunun özü böyük bir ***haldır, hadisədir, böyük bir nailiyyətdir***. Amma təkcə tənəzzülün qarşısının alınması deyil, ***dirçəliş, inkişaf, artım*** da vardır" [IXc.s.168].

Sahibkarlığın inkişafı ilə bağlı toplantılar da sinonimlərsiz keçinmir: "Dünyada hər şey ***hallalıq*** istəyir, ***təmizlik, düzlük*** istəyir. İndi biz özəlləşdirməyə gedirik. İstəyirik ki, insanlar ***mülk sahibi*** olsunlar, ***əmlak sahibi*** olsunlar, ***sahibkar*** olsunlar. Yaxşı olar ki, qanuni yolla gedəsən, az qazanasan; nəinki qanunu o tərəfdən, bu tərəfdən keçəsən, bir az çox qazanasan. Onu onsuz da itirəcəksən, bir az kobud desəm qusacaqsan. Amma halal yolla getsən ***nə itirəcəksən, nə də qusacaqsan***" [VIIc.s.230].

Qaçqınların tarixən məskunlaşdığı ərazilərə qaytarılması məsələləri müzakirə olunarkən ümumişlək, xalq ruhunun hopmuş olduğu sinonimlər işə düşür: "İşğal olunmuş torpaqlarımızı azad etmək, bu torpaqlardan zorla çıxarılmış vətəndaşlarımızı öz ***yurdlarına, evlərinə, obalarına*** qaytarmaq istəyirik" [VIIc.s.10].

Heydər Əliyevin nitqində frazelogizm kimi işlədilən ifadələr öz sinonimini də tapır. Aşağıdakı misalda "əlimizdən gələni etmək" frazeoloji söz birləşməsi "çalışmaq" la sinonimlik təşkil edir: "Bilirik ki, belə vəziyyətdə yaşamaq çətindir. ***Əlimizdən gələni edirik*** ki, sizin yaşayışınızı müəyyən qədər yüngülləşdirək, vəziyyətinizdə müəyyən müsbət halların əldə edilməsinə nail olaq. Bunun üçün bu gün də ***çalışırıq***, sabah da çalışacağıq" [IXc.s.217].

"Allah dözümlüləri sevir" kəlamı Heydər Əliyevin "xalqımız dözümlü xalqdır" ifadəsinə uyğundur. Bu dözümlülük mövcud icyimai-siyasi ab-havaya uyğun gələn dözümlülükdür. Bu dözümlülük dəyanətə söykənir. Bu dözümlülük sino-

nim cərgələrin köməyi ilə qaçqın auditoriyalarına çatdırılır: "Xalqımız dözümlü xalqdır. Biz keçən dövrlərdə də çox ***əzab-əziyyətlərə, çətinliklərə, məhrumiyyətlərə*** dözmüşük. İndi də sizin aqibətiniz belə gətirib. Bu ***ağırlıqlara, çətinliklərə, məhrumiyyətlərə*** dözürük, dözməliyik. Sizə və bütün xalqımıza, xüsusən yerindən-yurdundan didərgin düşmüş soydaşlarımıza bu ***dözümlülüyünüzə, dəyanətinizə*** görə təşəkkür edirəm" [IXc.s.217].

Sinonimlərdən istifadə edərkən əksər hallarda böyük natiq cərgənin birinci sözünü növbəti sinonim cərgədə dəyişir. Bu dəyişmə nitqin əlvanlığını, təsir gücünü daha da artırır. "Əzab-əziyyətlərə, çətinliklərə, məhrumiyyətlərə" və "ağırlıqlara, çətinliklərə, məhrumiyyətlərə" cərgələrində olduğu kimi.

Qaçqın və köçkün auditoriyalarını tərk edərkən Heydər Əliyevin nitqində gələcəyə tuşlanan, nikbinlik yaradan sinonim cərgələr səslənir: "Sizə cansağlığı arzu edirəm. Bunu bilin, mənim qəlbim sizinlədir. Sizə dözümlülük, xalqımıza ***vüqar, cəsarət, qəhrəmanlıq*** arzu edirəm" [IXc.s.218].

Köçkün və qaçıqın auditoriyasını ələmli şəkildə poetik bir deyimdə sinonimlər bəzəyir: "Ancaq bu üç prinsipin əsasını işğal olunmuş torpaqlarımızdan Ermənistan silahlı qüvvələrinin çıxması və sizin – yerindən-yurdundan ***didərgin düşmüş, köçkün, ağır vəziyyətdə yaşayan*** Azərbaycan vətəndaşlarının öz ***yerlərinə, yurdlarına, elinə-obasına*** qayıtması təşkil edir" [IXc.s.217]. Burada frazeoloji söz birləşməsi ilə yanaşı nitq hissələrinin birgə işləndiyi sinonim cərgə nəzərə çarpır. "Didərgin düşmək", "ağır vəziyyətdə yaşamaq" frazeologiyaları "köçkün" isim nitq hissəsi ilə sinonim cərgə yaradır.

Xalqımızın məğrurluğu ilə bağlı frazeoloji söz birləşmələrinin yaratdığı sinonimlər xüsusilə qaçqınlar və köçkünlər auditoriyasında daha çox səslənir: "Bizim xalqımızı ***sındırmaq***, ***əzmək*** istəyənlər olubdur. Xalqımız ***itkilər də, qurbanlar da, şəhidlər də*** verib, ancaq heç vaxt ***sınmayıbdır, iradə-***

***sindən dönməyibdir, iradəsini itirməyibdir***. Xalqımız məğrur xalqdır" [IXc.s.216].

Qaçqın və köçkün auditoriyasında Heydər Əliyevin istifadə etdiyi sinonimlər: "Dəfələrlə keçirdiyimiz görüşlərdən, danışıqlardan sizin ***arzunuzu, istəyinizi*** bilirəm. Bilirsiniz ki, ***eviniz-eşiyiniz dağılıb, varınız, varidatınız viran olub***, amma sizə doğma torpaq, eliniz-obanız lazımdır. Bu, bizə də lazımdır" [IXc.s.216].

İşğal olunmuş rayonların əhalisi ilə görüşlərdə həmin rayonların camaatına müraciətdə bir sıra sinonimlər işlənir: "Ağdam rayonu o vaxtdan indiyədək Ermənistanın hərbi təcavüzünə qarşı aparılan mübarizədə ön cərgədə olmuşdur. Ağdam ***vuruşmuşdur, döyüşmüşdür, böyük itkilər vermişdir***" [VIIc.s.177].

Qaçqın və köçkün auditoriyalarında Azərbaycan xalqının nəyə qadir olduğu pessimizmə yer qoymayan sinonimlərin köməyilə səslənir: "Eyni zamanda Dağlıq Qarabağda yaşayan ermənilər daim Ağdamla əlaqədə olmuşdular, Ağdamın ***tarixini də, keçmişini də***, Ağdamın nə olduğunu da yaxşı bilirdilər. Ağdamın insanlarının ***nə qədər dəyanətli, nə qədər cəsarətli*** olduqlarını da yaxşı bilirdilər" [VIIc.s.180].

Qaçqın və köçkün uşaqların yaşayış şəraiti sinonim cərgələrlə auditoriyalara izah olunur. Onların qayğısına qalan insanlar və təşkilatlar həmcins üzvlər kimi təkrarlanır, sonda bu uşaqların gələcəyi ilə bağlı sinonimlər uşaqların yaddaşlarına həkk olunur: "Mən bu gün bildirmək istəyirəm ki, Azərbaycan Respublikasında uşaqlar respublikamızın son illərdə düşdüyü ***ağır, bəlalı, əzab-əziyyətli*** günlər içində yaşayaraq, eyni zamanda öz valideynlərinin, onlara qayğı göstərən insanların, təşkilatların, xeyriyyə cəmiyyətlərinin köməyi ilə dərs keçirlər, tərbiyə alırlar, böyüyürlər və inkişaf edirlər. Mən əminəm ki, bu ***ağır, çətin*** dövrdə dünyaya gəlib böyüyən uşaqlar ***cəsarətli, mətin, vətənpərvər*** olacaqlar" [IIIc.s.4-5].

Qaçqınların vəziyyətini daim diqqət mərkəzində saxlayan Heydər Əliyev qaçqın auditoriyasında bu vəziyyəti dəqiqliklə əks etdirən sinonimlərdən yerindəcə, situasiyaya uyğun istifadə edir: "Ancaq mən bu gün buraya, sizin yanınıza gəlmişəm, bu bayramı sizinlə birlikdə qeyd etmək istəyirəm. Ona görə ki, siz Azərbaycanın bütün başqa vətəndaşlarından fərqli olaraq daha ***ağır, çətin*** günlər keçirmisiniz" [VIc.s.212].

Şəhidliklə bağlı işlədilən sinonimlər: "Kəlbəcər torpaqlarını qoruyarkən, müdafiə edərkən canlarını ***qurban vermiş, şəhid olmuş*** oğullarımızın, qızlarımızın xatirəsi qarşısında baş əyirəm" [IXc.s.111].

Heydər Əliyevin nitq və çıxışlarınən təhlili göstərir ki, dilimizin, nitqimizin inkişafı ilə bağlı istifadə edilən sinonimlər həmişə cazibə gücünü özündə saxlayır:

Sinonim cərgələr əksər vaxtlarda böyük natiqin çıxışlarının giriş hissələrinə təsadüf edir. Auditoriya elə giriş hissədə Heydər Əliyevin nitq cazibəsinə düşür;

Heydər Əliyevin çıxışlarında özünəməxsus sinonimlər üzə çıxır ki, bu Azərbaycan dilinin sinonimlər yaratmaq imkanının genişliyini bir daha göstərir;

Heydər Əliyev nitqində səslənən sinonimlərin bir məziyyəti, bir özünəməxsusluğu ondan ibarətdir ki, sinonimin ikinci və üçüncü tərəfləri izah xarakterində olur. Məsələn, böyük natiq "vətəndaş müharibəsi" deyirsə, sonrakı sinonim "qardaş qanının axıdılması" kimi səslənir;

Nitqin gedişində böyük natiq gah ümumişlək, loru, gah da yüksək kitab leksikasında olan sözləri sinonimləşdirir. Dinləyicilər üçün əlavə izaha, şərhə ehtiyac qalmır;

Bir ictimai-iqtisadi formasiyadan digərinə keçid bütün sahələrdə olduğu kimi dilçilik sahəsində də özünü göstərir. Belə ki, keçid dövründə həyatımızın bütün sahələrində olduğu kimi iqtisadiyyat sahəsində də yeni terminlər, yeni sinonim cərgələr işə düşür;

Heydər Əliyev nitqində təkrarlar mühüm yer tutur ki, o cümlədən sinonimlər də böyük natiqin çıxışlarında təkrarlanaraq nitqin ekspressivliyini artırır;

Heydər Əliyev nitqində sinonimlərin özünəməxsus bir xüsusiyyəti sinonim cərgələrdə beynəlxalq mənşəli sözü sinonim kimi işlətməsidir;

Heydər Əliyevin nitqlərində sinonimlər müxtəlif söz birləşmələri şəklində təzahür edir. İzahedicilik qabiliyyətinə malik Heydər Əliyev nitqi sinonim cərgələrdə də öz əksini tapır;

Heydər Əliyev nitqlərindəki sinonim cərgələrin ayrı-ayrı tərkib hissələri birbaşa sinonim olmasa da, çıxışlarda auditoriya bunları bir-birindən ayrılmaz, bir-birini gücləndirən və nitqin auditoriyaya olan təsirini artıran sinonimlər olduğunu qəbul edir;

Heydər Əliyevin nitqlərindəki özünəməxsusluğun bir səciyyəvi cəhəti də ondan ibarətdir ki, frazeoloji söz birləşmələrinin köməyi ilə, güclü analitik məntiqlə sinonim sıralar yaradılır;

Çox hallarda sinonimləri deyərdik ki, böyük natiq özü yaradır, ən maraqlı cəhət kimi bu sinonimlər şifahi nitqdə spontan alınaraq natiqin qarşıya qoyduğu məsələni həll etməyə imkan verir;

Heydər Əliyev sinonim cərgələrində neologizmlərdən istifadə necə deyərlər yaddan çıxmır;

Heydər Əliyev nitqində sinonimlərin bir xüsusiyyəti də ondan ibarətdir ki, Azərbaycan dilində olan sözlə türkdilli xalqların dilindən götürülmüş sözlərin paralel işlədilməsidir;

Sinonimlər ədatların təkrarı ilə harmoniya yaradaraq nitqin ekspressivliyini yüksəldir;

Böyük natiqin dilində sinonimlər təkrarlarla çulğalaşa, yüksək nitq effekti yarada bilir;

Böyük natiqin dilində sinonimlər antonimlərlə də çulğalaşır. Məhz antonimlər sinonimləri möhkəmləndirmək yolunda mühüm leksikoloji vahidlərə çevrilir;

XX əsrin 90-cı illərindəki müstəqilliklə bağlı taleyüklü dövrlərdə həmin mərhələ "ağır, məsuliyyətli, çətin" sinonimləri ilə xarakterizə olunur;

Heydər Əliyevin nitqlərindəki sinonimlər həm də türk və Azərbaycan dilində eyni sözlərin sinonimləşməsi ilə baş verir;

Heydər Əliyevin nitqində işlədilən sinonimlər müxtəlif üslublarda öz yerini tapır, bədii-publisistik ruhlu çıxışlarında böyük natiqin dilində sinonimlər aşıb-daşır, frazeoloji söz birləşmələrindən yaranan sinonim cərgələr auditoriyaları bəzəyir;

Sadə məişət üslublu sinonimlər insanları əxlaqi cəhətdən tərənnüm etmək məqamlarında istifadə oluna bilir. Məişətdə işlənən sinonimlər eləcə də ciddi dövlət tədbirlərində istifadə olunur;

Dini-fəlsəfi, dini-əxlaqi çıxışlarında Heydər Əliyevin işlətdiyi sinonim cərgələr Azərbaycan nitq mədəniyyətinin formalaşması yolunda əvəzsiz incilərdir. Bu sinonim cərgələr bir daha Azərbaycan dilinin zənginliyindən və böyük natiqin dilimizin dərin qatlarına bələdliyindən xəbər verir;

Dini auditoriyalarda sinonimlərin köməyi ilə vətəndaşların birliyinə nail olmaq baxımından Heydər Əliyevin nitqləri mühümdür;

Məsələlərə fəlsəfi yanaşma baxımından Heydər Əliyevin nitqlərində özünəməxsus sinonim cərgələr mövcuddur;

Heydər Əliyevin nitqlərində əksliklərin vəhdəti və ziddiyyəti qanunu sinonim cərgələrlə özünü büruzə verir;

Etik-fəlsəfi dəyərlərin də tez-tez sinonim cərgələrlə böyük natiqin dilindən eşidilməsi müşahidə olunur;

Müdrikliklə bağlı, elm və təhsillə bağlı söhbətlərdə Heydər Əliyevin nitqi sinonim cərgələrsiz keçinmir. Bu sinonim-

lər sadə zəhmət adamları ilə söhbətlərdə həm yüksək kitab leksikasına aid, həm də ümumişlək sözlərlə yaranır;

Heydər Əliyevin nitqində insanın etik-əxlaqi xüsusiyyətləri, bir fərd olaraq insanın hansı dəyərlər daşıması sinonimlərlə auditoriyaya çatdırılır;

Heydər Əliyev nitqində sinonimlər poetik ovqat yaradır. Şair və yazıçılarımızın təntənəli yubiley gecələrində sinonimlər nitqin poetikliyinə xidmət edir. Bədii gecəyə toplaşan auditoriya Heydər Əliyevin sinonimlərlə zəngin çıxışının sehrinə, cazibəsinə düşür;

Heydər Əliyev nitqində sinonimlər heç də nitqə əlvanlıq vermək məqsədinə xidmət etmir. İzahedicilik bu sinonim cərgələrin mühüm əlamətlərindəndir;

Qaçqınların vəziyyətini daim diqqət mərkəzində saxlayan Heydər Əliyev qaçqın auditoriyasında bu vəziyyəti dəqiqliklə əks etdirən sinonimlərdən yerindəcə, situasiyaya uyğun istifadə edir.

Gələcəkdə Heydər Əliyevin nitqlərində sinonimləri öyrənərək bunu Azərbaycan dilində sinonimlərin araşdırılmasına tətbiq etmək nə qədər mühümdürsə, Azərbaycan dilindəki sinonimləri tədqiq edib onu Heydər Əliyevin nitqlərilə uzlaşdırmaq da o qədər vacibdir.

# V FƏSİL
# HEYDƏR ƏLİYEV NİTQİNDƏ ƏLAVƏLƏR

Bəzən danışan və ya yazan şəxs cümlə strukturunda yer tutan bir sözün, ifadənin, birləşmənin mənası ilə kifayətlənməyərək, həmin söz, ifadə, birləşmə haqqında əlavə məlumat vermək, onu izah edib aydınlaşdırmaq məqsədi güdür və buna görə də cümləyə əlavə sözlər, birləşmələr daxil edir.[1]

Əlavələr iki növə ayrılır: xüsusiləşən və xüsusiləşməyən əlavələr. Xüsusiləşən əlavələrin bir sıra xüsusiyyətləri vardır: fərqli intonasiya ilə tələffüz edilir; asılı olduğu üzvdən sonra işlənir və ondan aydın fasilə ilə ayrılır; istər temanın, istərsə də remanın əlavəsi olduqda aid olduğu üzvdən daha aydın nəzərə çarpdırılır; asılı olduğu üzvün qrammatik xüsusiyyətlərini qəbul edir; əlavəsi olduğu üzvün mənasını aydınlaşdırır, konkretləşdirir və onun mənasına bərabər məna ifadə edir;asılı olduğu üzvün suallarına cavab verir.[2] Əlavələrlə bağlı bir sıra müəlliflərin diqqətəlayiq elmi işləri işıq üzü görmüşdür.[3]

Heydər Əliyevin nitqlərində cümlə üzvlərinə əlavələri tədqiq etmək üçün bu əlavələrin işləndiyi çıxışların mövzusu ilə yaxından tanış olmaq zərurəti ortaya çıxır. Əlavələr və Heydər Əliyev nitqinin ana xətti arasındakı vəhdəti tapandan sonra əlavələrin nitqdəki rolu aydınlaşır.Əks təqdirdə əlavələr quru bir nitq elementinə çevrilmə təhlükəsi ilə üzləşir. Məsələn, 29 avqust 1997-ci ildə Prezident Sarayında Heydər Əliyevin Azərbaycanın və xarici ölkələrin ali məktəblərinə qəbul olunmuş tələbələrin bir qrupu və onların valideynləri ilə görüşündə əlavələrin mətndəki yeri araşdırılmışdır.

---

[1] Kazımov Q.Ş. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Ünsiyyət, 2000. səh.155-162.

[2] Yenə orada. səh.156

[3] Seyidov Y. Azərbaycan ədəbi dilində əlavə sözlər və əlavə cümlələr. Bakı, 2000,

Ənənəvi olaraq böyük natiq çıxışın baş verdiyi zamanı xarakterizə edir: "Məlumdur ki, respublikamızın bugünkü gəncləri çətin bir dövr yaşayır, – ***eyni zamanda çox şərəfli bir dövr*** yaşayırlar" [XIIc.s.118].

Sonra gənclərə tövsiyə xarakterli tapşırıqlar verilir: "Ona görə də sizə – ***xarici ölkələrə təhsil almağa gedən gənclərimizə*** mənim tövsiyəm ondan ibarətdir ki, siz Azərbaycanın səlahiyyətli nümayəndələrisiniz, hər yerdə respublikamız haqqında həqiqətləri çatdırmalısınız, təbliğ etməlisiniz" [XIIc.s.125].

Nitqin növbəti mərhələsində ana dili və xarici dillər barəsində gənclərə bir ağsaqqal öyüdü verilir: "Şübhəsiz ki, siz xarici ölkələrdə dil öyrənməlisiniz. Mən keçmişdə də demişəm və bu gün də deyirəm, şəxsən arzum ondan ibarətdir ki, hər bir azərbaycanlı çox dil bilsin. Ancaq birinci növbədə öz ana dilini – ***dövlət dilini*** yaxşı bilsin. Bizim çox gözəl, zəngin, cazibədar dilimiz var" [XIIc.s.126].

Ağsaqqal öyüdü ilə yanaşı dövlət başçısının əlavələrlə müşayiət olunan qətiyyətli nitqi gəlir: "Amma ən əsası ondan ibarətdir ki, hər bir Azərbaycan vətəndaşı, hər bir azərbaycanlı öz ana dilini – ***Azərbaycan dilini, dövlət dilini*** mükəmməl bilməlidir" [XIIc.s.127].

Çıxışın sonluğu isə məktəb və müəllimə ehtiramla bitir ki, burada da əlavələr mətnlə vəhdət təşkil edir: "Çünki bizim hamımız – ***mən də, siz də*** Azərbaycan məktəbinə, Azərbaycan müəlliminə borcluyuq" [XIIc.s.129].

Yeni Azərbaycan Partiyasının yaradılmasının 5-ci ildönümü münasibətilə keçirilən təntənəli yığıncaqdakı nitqində Heydər Əliyev 28 yerdə əlavədən istifadə etmişdir. Əlavələrin aydınlaşdırma, konkretləşdirmə xüsusiyyəti daşıdığının fərqinə varsaq bu nitq elementinin belə çox istifadə olunması məlum olar. Çıxışın əvvəlində partiyanın yaranmasından söhbət gedir: "Ancaq mən bu gün bildirmək istəyirəm, – ***bunu əvvəllərdə də demişəm***, – mən bu partiyanın yaranmasının təşəb-

büskarı olmamışam. Partiyanın yaranmasının təşəbbüskarı o vaxt Azərbaycanda ölkəmizi ağır vəziyyətdən çıxarmağa çalışan insanlar olmuşlar” [XIIIc.s.263].

Elə həmin təntənəli yığıncaqda əlavəli iki cümlə ilə Heydər Əliyev onun xalq tərəfindən seçildiyini dilə gətirir. Bu gün “Heydər – Xalq” deyiminin özülünü, kökünü auditoriyalara anladır: “Mən bunu demişəm, – ***şübhəsiz ki, mən Azərbaycanın prezidenti seçilərkən Yeni Azərbaycan Partiyasının seçkisi nəticəsində seçilməmişəm***. Siz bunu bilməlisiniz. O vaxt bütün xalq – ***Yeni Azərbaycan Partiyasının üzvü olan da, olmayan da*** – hamısı Heydər Əliyevin Azərbaycana, Bakıya gəlməsini tələb etdi və oktyabr ayında Heydər Əliyevin prezident seçilməsinə səs verdi” [XIIIc.s.273].

Çıxışın sonuna yaxın yenə də əlavələrlə YAP üzvünün sanki əxlaq kodeksini yada salır, Yeni Azərbaycan Partiyasının necə bir partiya olduğunu kütlələrin şüuruna yeridir: “Mən çıxışımın əvvəlində bu partiyanın yaranması prosesini ona görə bir daha yada saldım ki, hamı bilsin, – ***bu partiyaya hər kəs öz könlü, vicdanı, qəlbi ilə gəlməlidir.*** Hamı bilsin ki, bu partiya saflıq, saf mənəviyyat üzərində qurulmuş bir partiyadır. Bu partiya Azərbaycanın tarixi köklərinə, milli-mənəvi dəyərlərinə söykənən, ümumbəşəri dəyərlərdən bəhrələnən ümumxalq partiyasıdır” [XIIIc.s.291].

Heydər Əliyevin 30 oktyabr 1997-ci ildə Prezident Sarayında Azərbaycan Yazıçılarının X qurultayındakı nitqində 21 yerdə əlavə işlənmişdir. Əlavələrin köməyi ilə qurultayda Yazıçılar Birliyi ilə köhnə əlaqələrini auditoriyaya açıqlayır. Auditoriya Dövlət xadiminin ədəbiyyata olan qayğısını böyük natiqin özündən eşidir: “Birinci mərhələ həmin illərdir ki, xatirimdədir, bir dəfə biz o vaxtkı Siyasi Maarif evində qurultay keçirdik, sonra başqa yerdə keçirdik. Xatırladılar 1981-ci ildə burada, bu salonda keçirdik, – o mərhələ idi ki, mən

Azərbaycana rəhbərlik edirdim və qurultayın işində Azərbaycanın rəhbəri kimi iştirak etməyimdir” [XIIIc.s.100].

Həmin qurultayda başqa bir əlavə ilə müstəqillik dövrünün yazıçılar qurultayına qiymət verir: “İndi isə bizim bu qurultayımız tamam başqa bir şəraitdə keçir. Keçmiş zamanlarda nə qədər böyük nailiyyətlər əldə etmişiksə də, mən hesab edirəm ki, bu qurultay indiyə qədər olan bütün qurultaylardan, yazıçıların toplantılarından, konqreslərindən – ***hamısından qiymətlidir”*** [XIIIc.s.104].

Əlavələrlə iqtisadi potensialımızla yanaşı intelektual potensialımızı da qurultay iştirakçılarının diqqətinə çatdırır: “Bizim iqtisadi potensialımız olduğu kimi, bir potensialımız da – intelektual potensialımız da vardır. Bizim mənəvi potensialımız – ***ədəbiyyatımız, mədəniyyətimiz*** intelektual potensialımızın əsasını təşkil edir” [XIIIc.s.106]

Sonrakı nitq prosesində əlavə ilə böyük natiq müstəqilliyin qiymətini bilməyə, müstəqilliyi dəyərləndirməyə çağırır: “Ancaq tərəziyə qoyanda – ***hansı ağır gəlir, hansı yüngül gəlir,*** – hamı bir səslə deyəcəkdir ki, bəli, müstəqillik naminə hər çətinliyə, hər əzab-əziyyətə dözməliyik” [XIIIc.s.111].

Qurultayda axırıncı əlavəli cümlələr Azərbaycan dilinə olan sevgi ilə sonuclanır: “Biz artıq dünyaya qovuşmuşuqsa, Dünya Birliyinə daxil olmuşuqsa, gərək insanlarımız bir neçə dil bilsinlər – ***ingilis dilini də bilsinlər, rus dilini də bilsinlər, fransız dilini*** də bilsinlər. Bunu yasaq etmək olmaz, bunun qarşısını almaq lazım deyil. Amma birinci növbədə öz ana dilini bilməlidirlər” [XIIIc.s.136].

Əlavələrin bir nitq elementi kimi nitqdə öyrənilməsinə az fikir verilmişdir. Bu natiqlərin şifahi nitqdə əlavələrdən əsasən az istifadə etməsi, yaxud istifadə etməməsidir. Bir qisim hallarda əlavəli cümlələr bir-birini necə deyərlər təqib edir: “Ancaq bununla yanaşı, – bunu bizim sərhədçi veteranlarımız yaxşı bilirlər, – vaxtilə Azərbaycan Respublikasının rəhbərliyi

öz daxili imkanlarından istifadə edərək, Azərbaycanın ərazisində yerləşən sərhəd dəstələrinin ərazisinin abadlaşması, yaşayış evlərinin tikilməsi, maddi-texniki bazanın möhkəmləndirilməsi üçün çox işlər görübdür. Məsələn, Naxçıvanda olan böyük sərhəd dəstəsinin binasının, – ***onun gözəl binası var, maddi-texniki bazası var***, – o binanın tikilməsi üçün Azərbaycan Respublikası öz vəsaitindən nə qədər pul və ayrı-ayrı başqa vəsaitlər ayırmışdı və ondan istifadə edirdi" [VIIIc.s.193].

Əlavələr Heydər Əliyevin nitqində auditoriyanı monotonluqdan, yeknəsəqlikdən çıxarmaqda mühüm nitq elementi kimi çıxış edir: "Mən yenə də deyirəm: baxmayaraq ki, referenduma yarım milyard rubl xərclənmişdir, baxmayaraq ki, bu ağır vəziyyətimizdə həm mərkəzdə, həm də yerlərdə olduqca çox adamlar bu işə cəlb olunublar, yəni belə vəziyyətimizdə adamlar daha zəruri işlərlə məşğul olmaq əvəzinə referenduma hazırlaşırlar, seçki komissiyalarında işləyirlər, bülletenlər hazırlayırlar, yazırlar, pozurlar, vətəndaşlara dəvətnamələr göndərirlər və sairə – ***təsəvvür edin ki, bu Azərbaycana nə qədər zərər vurur***, – ancaq biz bunların hamısına dözürük, xalq da dözür" [Ic.s.115].

Heydər Əliyevin nitqində əlavələr cümlənin bütün üzvlərinə aid ola bilir. Bunların içərisində tamamlığın əlavələri mühüm yer tutur: "Özü də dünyanın ən böyük, nüfuzlu təşkilatlarından – ***BMT və ATƏT-dən***, Qarabağ münaqişəsi deyilən məsələnin həlli üçün ATƏT çərçivəsində xüsusi olaraq yaradılmış Minsk qrupundan söhbət gedir" [Ic.s.212].

Heydər Əliyevin nitqlərində əlavələr ən çox cümlə üzvü kimi tamamlığa qoşulur. Lakin burada mübtədaya qoşulan əlavələr də az deyil: "XIX əsrin ortalarında Azərbaycan yazıçıları, mütəfəkkirləri, filosofları – ***Abbasqulu ağa Bakıxanov və Qurtqaşınlı*** Polşada yaşayıb yaratmış və polyak həmkarları ilə əməkdaşlıq etmişlər" [XIIc.s.42].

Mübtədaya əlavələr də böyük natiqin nitqlərində mühümdür: “Bununla yanaşı, hamımız birlikdə – ***informasiya orqanları, televiziya, nazirlər, icra hakimiyyəti başçıları, nazirliklərin əməkdaşları, maliyyə işçiləri*** qəbul olunmuş qərarların mahiyyətini və zəruriliyini izah etməli, xalqa çatdırmalıdırlar” [Ic.s.270].

Əlavələrlə nitqi zənginləşdirməyi bacarmaq tək-tək natiqlərə xas olan xüsusiyyətdir. Bir cümlədə cümlənin iki üzvünə əlavələr vermək də böyük natiqə – Heydər Əliyevə xasdır: “Ümumiyyətlə – ***hüquq-mühafizə orqanları*** – həm polis, həm prokurorluq, həm də milli təhlükəsizlik orqanları bu tədbirlərin, – ***bunlar isə həm iqtisadi xarakter, həm də öz nəticələrinə görə çox böyük sosial-siyasi məzmun daşıyır,*** – həyata keçirilməsini təmin etməlidirlər” [Ic.s.27].

Burada həm mübtədaya, həm də tamamlığa əlavənin şahidi oluruq. Əlavələr “həm”, “həm də” iştirak bağlayıcılarının köməyi ilə auditoriyalara ünvanlanır.

Heydər Əliyevin nitqində əlavələr bəzən yer zərflərinə də qoşulur: “Burada, ***bu salonda*** sizin əhval-ruhiyyənizi, sevincinizi, istedadınızı görəndə mən bir daha inanıram ki, belə də olacaq və siz bunlara nail olcaqsınız” [IXc.s.36].

Əlavələrin zaman zərflərini də izah etdiyinin şahidi oluruq: “Mən bu gün – bizim xalqımız, millətimiz üçün müqəddəs olan Novruz bayramı günü bir daha dünyaya bəyan edirəm ki, Azərbaycan Respublikası bundan sonra da atəşkəs rejiminə riayət edəcəkdir” [IXc.s.42].

Böyük natiqin dilində əlavələr bir qisim hallarda “görə” qoşmasının qoşulduğu cümlə üzvünü izah edir: “Biz bu günümüzə görə – ***xalqımızın mədəniyyətinin, ədəbiyyatının, elminin, təhsilinin ümumi səviyyəsinin bu mərtəbəyə qalxmasına görə*** Səməd Vurğuna minnətdarlığımızı bildirməliyik” [IXc.s.21].

Əlavələr ”həm”, “həm də” iştirak bağlayıcılarının köməyi ilə Heydər Əliyevin qətiyyətli nitqlərini daha da gücləndirir: “Bilin ki, qəti, ciddi addımlar atacağıq. Azərbaycanda – ***şəhərlərdə, rayonlarda, qəsəbələrdə, kəndlərdə*** sabitlik yaratmağa çalışacağıq, cinayətkarlarla mübarizəni gücləndirəcəyik” [Ic.s.116].

Əlavələrlə nitqi zənginləşdirməyi bacarmaq tək-tək natiqlərə xas olan xüsusiyyətdir. Bir cümlədə cümlənin iki üzvünə əlavələr vermək də böyük natiqə – Heydər Əliyevə xasdır: “Ona görə də mən bu gün həm ürək ağrısı ilə deyirəm ki, fərmanımız indiyədək həyata keçirilməmişdir, həm də xəbərdarlıq və tələb edirəm ki, o fərmanın icrası ilə məşğul olanlar – ***istər Nzirlər Kabineti, istərsə də nazirliklər, müəssisələr*** öz məsuliyyətini bilsinlər və bu məsələlərlə ciddi məşğul olsunlar” [IIc.s.30].

Böyük natiq iştirak bağlayıcılarının köməyi ilə yartadığı əlavələrlə nitqini yaddaqalan edir: “Biz həmin illərdə daim böyük iftixar hissi ilə qeyd etmişik ki, Azərbaycanın neftçiləri – ***həm alimləri, həm də neft sənayesində çalışanlar*** böyük sovetlər ölkəsinin hər yerində fəaliyyət göstəriblər və öz təcrübələrini, bilik və bacarıqlarını yeni-yeni neft yataqlarının aşkara çıxarılamsına sərf ediblər və bununla da, Azərbaycan neftçilərinin şan-şöhrətini aləmə yayıblar” [Ic.s.83]

Heydər Əliyevin nitqində əlavələr bəzən cümlə həcmində olur ki, şifahi nitqdə belə nümunələrə çox az rast gəlinir, yaxud da rast gəlinmir. Bu bir daha fenomenal Heydər Əliyev nitqindən xəbər verir: “Ancaq bundan ötrü Azərbaycan tərəfindən maneələr, əngəllər varsa, – ***mənim dostum Əli Hücət bunların bir neçəsi barədə burada məlumat verdi, mən onun nitqinin mətnini götürüb Azərbaycana qayıdandan sonra orada müzakirə edəcəyəm***, – bu işlərin hamısını qaydaya salacağıq” [IIc.s.464].

Bir çox hallarda bir cümlədə iki dəfə cümlə üzvlərinə əlavələrlə tanış oluruq ki, bu şifahi nitqdə bir daha Heydər Əliyev fenomenallığından xəbər verir: "Ancaq bunların hamısından ən önəmlisi odur ki, Füzuli əsərinə, Füzuli yaradıcılığına, Füzuli irsinə əsrin əvvəlində – ***hələ o vaxt, xalqımızın, demək olar, çox qaranlıqda yaşadığı bir dövrdə, bilik, savad çox az adama qismət olduğu dövrdə*** dahi bəstəkar Üzeyir Hacıbəyov Füzulinin "Leyli və Məcnun" əsəri əsasında Şərq aləmində, türk dünyasında ilk dəfə böyük klassik, professional opera" – ***"Leyli və Məcnun" operası*** yaradıbdır [IIc.s.478].

Aydınlaşdırma mövqeyində olan əlavələrlə Heydər Əliyev əlavədən öncəki cümlə üzvünün tutduğu statusu, daşıdığı mənanı auditoriyalar üçün incələyir: "Sovet İttifaqı dağıldıqdan sonra burada tezliklə Tatarıstanın tutduğu mövqeyin – ***prinsipial, düzgün və tatar xalqının milli mənafelərinə uyğun olan mövqeyin*** də böyük əhəmiyyəti var" [VIIIc.s.67].

Əlavə kimi qəbul edilən nitq elementi mahiyyəti açmaqda böyük natiqin istifadə etdiyi: "Sizə məlumdur ki, xarici neft şirkətləri Azərbaycanın neft və qaz yataqlarına təqribən üç il bundan əvvəl maraq göstərmişlər. Lakin bu gün bir daha qeyd etməyi lazım bilirəm ki, biz ölkəmiz üçün çox mühüm və məsuliyyətli olan bu addıımı atarkən başlıca prinsipi – ***Azərbaycan Respublikasının milli mənafelərini, həm bizim dövlətimiz üçün, həm də iqtisadiyyatımıza investisiya qoymağı qərara almış neft şirkətləri üçün qarşılıqlı faydanı təmin edən prinsipi*** əsas götürürük" [Ic.s.595]. Burada başlıca prinsipin nədən ibarət olduğu əlavənin köməyi ilə müəyyənləşir.

Heydər Əliyevin çıxışlarının girişləri bəzən əlavələrin qoşulduğu cümlələrlə başlayır. İzahedicilik elə başlanğıcda özünü göstərir: "Hörmətli xanımlar və cənablar! Sizi səmimi-qəlbdən salamlayır, mühüm hadisə – ***Azərbaycanda, Xəzər hövzəsində neft və qaz hasilatına həsr olunmuş sərginin açılışı münasibətilə*** təbrik edirəm" [Ic.s.594].

Əlavələr qoşulduğu cümlə üzvünün mənasını aydınlaşdırır, konkretləşdirir, əlavələrin köməyi ilə böyük natiq kütlələri səfərbər edir: “Bununla əlaqədar mən xalqa, hamıya – ***bütün siyasi partiyalara, siyasi qüvvələrə, Azərbaycanı sevən, vətəninə hörmət bəsləyən bütün adamlara*** bir daha müraciət edirəm: hamı qüvvələri toplayıb bir hədəfə vurmalıdır, Azərbaycanı müdafiə etmək, bu ağır vəziyyətdən çıxarmaq lazımdır” [Ic.s.239].

Heydər Əliyevin nitqində əlavələr özü də sonrakı nitq mərhələsində izah olunur. İzaha izah vermək kimi nitq fenomenliyi yalnız tək-tək natiqlərə müyəssər olur: “Tarixçilərimizin xatirində olmalıdır ki, mən Azərbaycanda işləyən dövrdə – ***70-ci illərdə və 80-ci illərin əvvəllərində*** dəfələrlə onlara müraciət etmişdim ki, bizim tariximiz – ***həm qədim tariximiz, həm də son dövrlərin, yəni XVIII, XIX, XX əsrlərin tarixi*** istənilən səviyyədə yazılmayıb” [Ic.s.154].

İzahedici əlavələrin köməyi ilə Heydər Əliyev qarşısına qoyduğu məqsədi izah edir. Əlavələr burada da fikri qüvvətləndirmək, mənanı auditoriyaya çatdırmaq məqsədi güdür: “Bakıya qayıdıb Ali Sovetin təklifini qəbul etdim və iyunun 15-də sədr vəzifəsinə seçildim. Mən bunu yalnız bir məqsədlə – ***vətəndaş müharibəsi təhlükəsini sovuşdurmaq məqsədi ilə*** etdim” [Ic.s.60].

Heydər Əliyevin nitq və çıxışlarında auditoriya əlavəyə qədər diqqətini cəmləyir, izahı eşidən auditoriya rahatlıqla nəfəs alır, rahatlanır: “1990-cı il yanvarın 19-da gözlənilmədən Qorbaçov zəng etdi. Məni qəbul etmək, dinləmək barədə təkidlə etdiyim xahişlərə üç il məhəl qoymamışdı. Xahişlərim isə şəxsi məsələlərlə bağlı deyildi – ***məni Qarabağdakı hadisələr narahat edirdi...”*** [Ic.s.51].

Aparılan araşdırmalar əlavələrin Heydər Əliyevin nitqində əsasən izahedicilik xüsusiyyətinə malik olduğunu göstərir. Hər bir çıxışında bir neçə yerdə belə əlavəyə rast gəlirik.

Müəyyən məqamlarda isə əlavələrin mövcud olduğu cümlələr bir-birinin ardınca gəlir: "Buraya Bakı şəhərinin bir çox sənaye müəssiələrinin – ***zavodların, fabriklərin nümayəndələri*** də toplaşmışlar. Ona görə də mən bu görüşü Bakı şəhərinin sənaye əməkçiləri ilə – ***mütəxəssislərlə, mühəndislərlə, iqtisadçılarla, texniklərlə, fəhlələrlə, sənaye sahəsində çalışan bütün adamlarla, paytaxtın vətəndaşları ilə*** görüş kimi qəbul edirəm və zəhmət çəkib, əziyyət çəkib buraya gələnlərə öz minnətdarlığını bildirirəm" [Ic.s.194]. Sənaye əməkçiləri burada mütəxəssisdən tutmuş sadə fəhləyə qədər sadalanır, auditoriyada adı çəkilməyən əməkçi qalmır. Natiq üçün bu sadalama zəhmət tələb edən bir iş, auditoriya üçünsə böyük zövqdür. Elə böyük natiqliyin bir məziyyəti də budur.

Əlavə böyük natiqin dilində müəyyən terminlərə verilən anlayışları xatırladır: "Neft – ***Azərbaycanın ən böyük sərvəti olub, xalqa, özü də təkcə indiki nəslə deyil, həm də gələcək nəsilllərə məxsusdur***". Burada "neft" kimyəvi maddə kimi yox, Azərbaycanın rifahına yönəlmiş sərvət kimi xarakterizə olunur.

Bəzən bir söz bütöv bir fikrə yekun vura bilir. Elə böyük natiqlik üçün də mühüm şərtlərdən biri budur: "– Deməli, kadrlar kütləvi surətdə təzələnəcəklər? – Bu çox mürəkkəb və kifayət qədər ağrılı sualdır. Çünki elə köhnə kadrlar arasında da hamı öz yerində deyildir. Bəlkə də yeni kadrlar arasında da öz vəzifələrinə layiq olanlar var. Yaxşı məlum olan bir meyar var – ***praktika***. Yeri gəlmişkən, mənim bu barədə ayrı heç bir fikrim yoxdur" [Ic.s.49]. "Praktika" sözü ilə kadrların işə cəlbi, vəzifəyə təyini məsələlərinə düzgün, dəqiq, sərrast cavab verilir.

Bəzən də inkar və təsdiq ədatları ilə məsələlərə münasibət bildirilir: "Lakin bu gün adamlar mənə baxırlar. Özü də ümidlə baxırlar. Hərçənd mən o adamlardan deyiləm ki, deyəm: Siz

məni seçin, dərhal müharibəni qurtarım və yarım ildən sonra yağ-bal içində yaşayacaqsınız, – yox! ” [Ic.s.53].

Heydər Əliyevin nitqində izahedici sözlər tamın hissələrə bölünməsi kimi verilir. Auditoriya tamı hissələri ilə birgə qəbul edir: “Mən iyunun 18-dən 24-dək Əbülfəz Elçibəylə telefonda daim danışıqlar aparmışam, Azərbaycan Elmlər Akademiyasının prezidenti başda olmaqla ziyalıların nümayəndələrinin böyük bir qrupu – ***akademiklər, professorlar, yazıçılar, ağsaqqallar*** mənim təşəbbüsümlə oraya getmişlər” [Ic.s.23]. Bu cümlədə auditoriya ziyalıların böyük bir qrupunu “tam” kimi başa düşürsə, akademiklər, professorlar, yazıçılar, ağsaqqalları isə “hissə” kimi qəbul edir.

Əgər əlavələrin köməyi ilə böyük natiq tamı hissələrinə bölüb auditoriya üçün aydınlıq gətirirsə, başqa məqamlarda hissələri bütövləşdirərək yekunlaşdırıcı çıxış edir: “Demokratiyaya imkan yaradılmalıdır və insan azadlığı, söz azadlığı, din azadlığı, dil azadlığı – ***bunların hamısı*** bərqərar edilməlidir” [Ic.s.196].

Digər bir məqamda bu əlavə bir qədər fərqli olsa da mahiyyət dəyişmir: “Azərbaycanda insan azadlığı, söz azadlığı, din azadlığı, dil azadlığı, vicdan azadlığı – ***bunların hamısı*** demokratik, sivilizasiyalı cəmiyyətin yaranmasına imkan verən şərtlərdir” [Ic.s.204].

Bölüşdürmə bağlayıcılarının köməyi ilə böyük natiq tamı hissələrə bölərək auditoriyanın diqqətini konsentrasiyalaşdıra, toplaya bilir: “Mən istərdim ki, onlar – istər ***azərbaycanlılar, istərsə də Azərbaycanın sabiq və ya indiki vətəndaşları*** onun (Azərbaycanın – red.) həyatına böyük maraq göstərsinlər” [Ic.s.30].

Əlavələr vasitəsilə böyük natiq öz şəxsi xarakterini ortaya qoyur: “Mən öz iradəmdən, – ***bu isə xalqın iradəsidir, bir namuslu vətəndaş kimi mənim şəxsi iradəmdir,*** – istifadə edərək Azərbaycanın bu vəziyyətdən çıxması üçün

son damla qanıma qədər çalışacağam və heç kəs də məni qorxuda bilməz" [Ic.s.110].

İctimai-siyasi sahədə Heydər Əliyev xarakterinin açılmasında da əlavələr nitq elementi kimi mühüm rol oynayır: "Əgər həmin xadimlər – ***mən belə başa düşdüm ki, siz məni də onların sırasına aid edirsiniz*** – bu gün öz ölkələrinin ictimai-siyasi həyatına fəal təsir göstərmək imkanına malikdirsə və əgər onları öz xalqları çağırmışlarsa, buna kim etiraz edə bilər?" [Ic.s.134].

Böyük natiqin nitqlərində əlavələr auditoriyaları səfərbər etmək baxımından mühümdür: "Lakin bununla yanaşı, bax, həmin strukturlar – ***həm dövlət müəssisələri, həm də xüsusi bölmə, şirkətlər, firmalar, assosiasiyalar, iş adamları*** qaçqınlara kömək etməlidirlər" [Ic.s.237]. Bu cümlədə mübtədanı aydınlaşdıran əlavədə adları çəkilən strukturlara göstəriş verilir, onlar məsuliyyətlərini dərk edirlər.

Auditoriyanın səfərbər olması başqa bir cümlədə tamamlığa əlavə ilə həyata keçirilir: "Mən bütün rayonların, bütün şəhərlərin icra hakimiyyəti başçılarına, bütün nazirliklərin rəhbərlərinə, bütün iş adamlarına, firma rəhbərlərinə, – ***hamıya*** müraciət edirəm ki, gücümüzü, imkanlarımızı toplayıb qaçqınlara lazımi kömək göstərməliyik" [Ic.s.237].

Əlavələr vasitəsilə Heydər Əliyev öz qətiyyətini, dəyanətini çıxışlarında bəyan edir: "Ancaq eyni zamanda, mən bunu Nyu-Yorkda və İstanbulda da dedim, bu gün sizə də deyirəm, – ***bütün bunlar heç vaxt bizim iradəmizi, Azərbaycan xalqının iradəsini, Azərbaycan dövlətinin iradəsini, mətanətini qıra bilməz***" [IIc.s.335].

Əlavələr Heydər Əliyevin nitqində həyatımızın müxtəlif tərəflərinin xalqa çatdırılmasında əlavəlikdən çıxaraq məsul bir nitq elementinə çevrilir: "Tarixi keçmişimizin çoxu ədəbiyyatda əks olunub. Azərbaycan xalqının zəngin ədəbi irsi var. Ona görə də ədəbi irsimizin bütün gənclərə – ***bu gənclər***

***hansı istiqamətdə işləyəcək, çalışacaqlarsa, ondan asılı olmayaraq*** – çatdırılması, bildirilməsi, tədris olunması çox mühüm bir işdir” [IIc.s.174].

Burada əlavə ilə ədəbi irsimizi aydınlaşdırırsa başqa bir nitq məqamında Azərbaycan dilinin tədrisindən söhbət açır: “Bildiyiniz kimi, 10-20 il bundan qabaq biz çalışırdıq ki, Azərbaycan dili bütün məktəblərimizdə tədris olunsun və gənc nəsil məktəblərdə ilk təhsil addımlarını atarkən öz dilini – ***ədəbi dilini, milli dilini*** yaxşı bilsin” [IIc.s.174].

Milli ideologiyamız, onun hissələri yeri gəldikcə cümlədə tamamlığı əlavə kimi auditoriyalara açıqlanır: “Deməli, bizim ideologiyamız bundan ibarətdir. Həmin ideologiyanın bir hissəsini mənəvi dəyərlərimiz, milli ənənələrimiz təşkil edir. Biz bunların hamısına – ***mədəniyyətimizə, dinimizə, milli əxlaqımıza, bütün milli ənənələrimizə, tariximizə*** sadiqik” [Ic.s.250].

Əlavələr Azərbaycan elminin inkişafı ilə də bağlı özünü göstərir: “Elm, təhsil, mədəniyyət sahəsində əldə etdiyimiz nailiyyətlər, Azərbaycan xalqının bugünkü yüksək təhsil, elm, mədəniyyət səviyyəsi, şüur səviyyəsi – ***bunların hamısı ilk növbədə müəllimlərin, məktəbin səyi ilə olub,*** onların xidmətlərinin nəticəsidir” [IIc.s.170].

Tarixi hadisələri bu günlə bağlayan əlavələr də böyük natiqin nitqini tərk etmir: “Müharibədən sonrakı illərdə, – ***mən İkinci Dünya Müharibəsini nəzərdə tuturam***, – Polşa ilə Azərbaycan arasında çox sıx iqtisadi, elmi, mədəni, ədəbi əlaqələr mövcud olmuşdur” [XIIc.s.43].

“O vaxtlar”, “xatirimdədir” birləşmələri ilə başlayan əlavələrlə Heydər Əliyev keçmiş tariximizi auditoriyalara çatdırırır: “Halbuki biz o zaman iki il ərzində, 1971-ci ilin əvvəlindən 1972-ci ilin sonunadək saray adlanırdı, indi Respublika sarayı deyilir”

Böyük natiqin nitqindəki əlavələr Respublika əhalisini müstəqillik yolunda bir olmağa çağıran əlavələrdir: “Respub-

likanın bu ağır dövründə hamı birləşməli, hər yerdə – ***həm cəbhədə, həm arxada hamı bir istiqamətdə*** – Azərbaycanın müstəqilliyini daha da möhkəmləndirmək, ərazi bütövlüyünü təmin etmək, respublikanı müharibə vəziyyətindən, Azərbaycan xalqını ağır sosial-iqtisadi böhrandan çıxarmaq istiqamətində fəaliyyət göstərməlidir" [IIc.s.43].

Əlavələr müxtəlif çeşidli auditoriyalarda dövlətçiliyimizin güclənməsinə xidmət edir. Dini auditoriyalarda da bu əlavələr böyük natiqin nitqini bəzəyir: "Sizin də, bizim də borcumuz ondan ibarətdir ki, hər bir vətəndaşı – ***gəncləri də, yaşlı adamları da, sizin kimi müdrik ağsaqqalları da, dindarları da*** – hamını agah edək ki, bu ağır dövrümüzdə hər bir vətəndaşın, hər bir azərbaycanlının mövqeyindən, fəaliyyətindən, cəmiyyətə göstərdiyi xidmətdən dövlətimizin, cəmiyyətimizin müqəddaratı, bu günü və gələcəyi asılıdır" [IIc.s.84].

26 avqust 1994-cü ildə Mövlud bayramı münasibətilə Təzəpir məscidində söylədiyi nitqində də əlavələrin köməyi ilə dinimizi kütlələrə öyrətməklə yanaşı, dini dəyərlərimizə sahib çıxmağı da tövsiyə edir: "Bu müqəddəs gündə Allahın evində – ***Təzəpir məscidində*** bir daha deyirəm ki, Azərbaycan Respublikasının ərazi bütövlüyü, suverenliyi, xalqımızın milli azadlığı uğrunda şəhid olanların xatirəsi qəlbimizdə əbədi yaşayacaqdır" [IIc.s.146].

Hüquqi dövlət quruculuğu yolunda da Heydər Əliyevin işlətdiyi əlavələr auditoriyada konkretlik yaradır: "Çünki respublikanın daxilində aparılan siyasət – ***demokratiya, sərbəstlik, insan hüquqlarına hörmət, azadlıq, siyasi plüralizm*** – bunların hamısı Azərbaycanda hüquqi cəmiyyət yaradılmasına yönəldilmiş prinsiplərdir" [IIc.s.122].

Əlavələrin vasitəsilə böyük natiq Azərbaycan xalqının hansı potensiala malik olmasını göstərir: "Mən bəzi acı həqiqətləri sizə çatdıraraq, eyni zamanda bildirmək istəyirəm ki, doğrudan da, Azərbaycan xalqının potensialı – ***həm qəhrə-***

***manlıq, həm döyüşkənlik, həm də intellektual potensialı*** böyükdür" [Ic.s.241].

Heydər Əliyevin xalqa, onun öndə gedən ziyalı hissəsinə etdiyi müraciətlərdə də əlavələr özünə yer tutur: "Mən bütün Azərbaycan xalqına müraciət edirəm, Azərbaycanın hörmətli şəxslərinə – ***ziyalılara, alimlərə, mədəniyyət xadimlərinə, yazıçılara, xalqımızın və cəmiyyətimizin önündə gedənlərə*** müraciət edirəm: İndi Azərbaycanın bu vəziyyətinə biganə qalmaq olmaz" [IIc.s.343].

Müxtəlif nitq məqamlarında, xüsusilə Azərbaycan dili ilə bağlı məqamlarda əlavələr geniş yer alır: "Azərbaycanlılıq bir ondan ibarət olub ki, kim elə Azərbaycan dilini bilirsə – ***hətta o qədər də yaxşı bilmirsə***, öz kəndinin, şəhərinin mahnısını bilirsə, bu, elə əsl azərbaycanlıdır. Ancaq azərbaycanlı əgər öz ölkəsini, öz xalqını bilirsə, öz mədəniyyətini bilirsə, bəziləri bunu mənfi bir şey kimi qəbul ediblər. Mən belə hallarla rastlaşmışam" [Ic.s.169].

Heydər Əliyevin nitqində əlavələr təhsilimizin problemlərini çözməyə imkan verir: "Ona görə deyirəm ki, ədalətsizlik olmasın, gələcəyimiz saydığımız gənclər – ***bu il ali məktəblərə qəbul edilən gənclərimiz*** təhsil almağa doğrudan da layiq olsunlar" [IIc.s.108].

Böyük natiqin dilində əlavələr Azərbaycan poeziyasının incələnməsi yolunda nitq elementinə çevrilir, auditoriyaları heyran qoyur, reallıqları anlada bilir: "Səməd Vurğun Azərbaycan klassiklərinin ənənələrini davam etdirərək, bizim dövrümüzdə – ***məhz 20-ci, 30-cu, 40-cı ildə*** Azərbaycan şeirini daha da yüksək səviyyələrə qaldırdı" [IXc.s.17].

Mədəniyyətimizlə bağlı tədbirlərdə də əlavələrin köməyi ilə bir sıra fikirlər auditoriyalara çatdırılır: "Mən sizi – ***Azərbaycan Respublikasının bütün mədəniyyət xadimlərini, Azərbaycan xalqını bu əlamətdar hadisə*** – yeni bir mədəniyyət ocağının açılması, Niyazinin ev-muzeyinin fəaliyyətə baş-

laması münasibətilə təbrik edirəm, muzeyə gələcək fəaliyyətində uğurlar diləyirəm" [IIc.s.251].

Əlavələrlə böyük natiq cəmiyyətimizə zidd olan, yabançı olan fikir və ideyaları tənqid edir: "Güman edirəm ki, son illərdə biz hər şeyi gördük. Gənclərimiz də çox şeyi – ***bəzi "yenilikləri", bəzi yeni fikirləri, əhval-ruhiyyəni*** daddılar. Loru dildə desək, biz çox şeyi dişimizə vurduq və nəyin nə olduğunu artıq anlamağa başladıq" [Ic.s.166].

Hüquqi dövlət quruculuğu yolunda əlavələr Heydər Əliyevin nitqində auditoriyalara işıq saçır, beyinlərdəki qaranlıqları, ətaləti yox edir: "Daxili İşlər Nazirliyinin təərkibində, onun şəxsi heyətinin tərkibində, birinci növbədə rəhbər işçilərin fəaliyyətində mənəvi dəyərləri möhkəmləndirməlisiniz, inkişaf etdirməlisiniz və beləliklə də, Daxili İşlər Nazirliyinin bütün sistemlərində, yuxarıdan aşağıya qədər – ***nazirliyin rəhbərliyindən polis nəfərinə qədər*** sağlam əhval-ruhiyyə, sağlam mənəviyyat yaratmalısınız" [Ic.s.143].

Əlil rəssamların sərgisində insan fəlsəfəsini əlavələrin köməyi ilə auditoriyalara ünvanlayır: "Siz qəhrəman insanlarsınız, – ***mən sərgi iştirakçılarını nəzərdə tuturam,*** – siz qəhrəman, şücaətli insanlarsınız. Belə çətinliklərin öhdəsindən gələrək bu cür gözəl işlər görürsünüzsə, siz böyük hörmətə və ehtirama layiq insanlarsınız" [XIIIc.s.163].

Ermənistan-Azərbaycan münaqişəsi ilə bağlı nitqlər əlavələrlə zəngindir. Münaqişə nəticəsində Azərbaycan tərəfə dəyən maddi və mənəvi ziyan auditoriyaların diqqətinə çatdırılır: "Azərbaycan xalqının indi işğal olunmuş torpaqlarda əsrlər boyu qurduğu, yaratdığı hər şey – ***yaşayış evləri, tarixi abidələr, istehsal müəssisələr***i – fabriklər, zavodlar, elektrik stansiyaları, eləcə də xəstəxanalar, məktəblər, mədəniyyət ocaqları dağıdılıb, viran edilibdir" [VIIc.s.57]. Sonra ermənilərin konstruktiv addımlar atacağı təqdirdə Dağlıq Qarabağda yaşayan ermənilərə hansı güzəştlər olması əlavələrin köməyi

ilə anladılır: “Belə olan şəraitdə Azərbaycan Dağlıq Qarabağda yaşayan ermənilərin – ***orada yüz minədək erməni yaşayır***, – təhlükəsizliyinin təmin olunmsını öz üzərinə götürür, eyni zamanda Azərbaycan Respublikasının tərkibində Dağlıq Qarabağa müasir yüksək muxtariyyət statusu verməyə hazırdır” [VIIc.s.58].

İşğal edilmiş rayonlarımızla bağlı çıxışlarda əlavələr məntiqi-fəlsəfi fikirlər təkin ortaya qoyulur: “Məsələn, Ermənistandan Qafana gedən dəmir yolu da Zəngilandan keçirdi və ona görə də bunun əhəmiyyəti çox böyük idi. Bunların hamısına görə Zəngilanın müdafiəsi – ***bu söz deyiləndə Azərbaycan Respublikasının müdafiəsi kimi anlamaq lazımdır*** – lazımi səviyyədə təşkil olunmalı idi” [VIIIc.s.214].

Qaçqın və köçkünlərimizin düşdüyü ağır vəziyyətini əlavələrlə dünyaya bəyan etmək Heydər Əliyevin bir nömrəli borcudur: “Amma bizim borcumuz odur ki, bütün bu mənzərəni – ***Azərbaycanın həyatında olan, qaçqınlarla və köçkünlərlə əlaqədar yaranmış mənzərəni*** bütün dünyaya çatdıraq” [XIIIc.s.156]. Qaçqınların problemləri ilə bağlı əlavələrlə aydınlaşmalar verilir. Bu bir daha böyük natiqin qaçqınlar və köçkünlər auditoriyasının daha çox aydın nitqə ehtiyacını bilməsindən irəli gəlir: “Sizin problemlərlə əlaqədar yerli icra hakimiyyəti orqanları, – ***mən bunu bir daha deyirəm, televiziya ilə də veriləcəkdir, bilsinlər***, – öz fəaliyyətlərini gücləndirməlidirlər, bütün rayonlarda, şəhərlərdə məskunlaşmış köçkünlərin problemlərinə qayğı və ciddi münasibət göstərməlidirlər” [VIIIc.s.222].

Araşdırmalar Heydər Əliyevin nitq və çıxışlarında əlavələrin tez-tez təsadüf etdiyini göstərdi ki, bu bizi əlavələri öyrənməyə sövq edən başlıca səbəblərdəndir. Türkçülük ideyaları ilə bağlı əlavələr müxtəlif çıxışlarda özünə yer tapır: “500 ildir ki, Məhəmməd Füzulinin törəmələri – ***onun ideyaları ilə yaşayan, onun əsərlərindən ilham alan türklər, türk***

***xalqları*** öz həyatını sürür və bugünkü xoşbəxt bir səviyyəyə gəlib çatmışlar” [IIc.s.478].

Xaricdə yaşayan Azərbaycan icmaları ilə, diaspor təşkilatlarla apardığı dialoqlarda yenə də əlavələr nitqin təsir gücünü artırmağa xidmət edir: “Beləliklə, ölkələrimiz arasında, yəni dövlət səviyyəsində – prezident, baş nazir və başqa səviyyələrdə çox dost, mehriban münasibətlər yaranıbdır. Deyə bilərəm ki, bəlkə də bu başqa dövlətlərə nisbətən müsbət cəhətdən fərqlənir. Ona görə də belə bir halda mən təəccüblənirəm – deyirsiniz ki, burada azərbaycanlılara münasibətdə nə isə var. Sizi dinlədikcə mən belə bir nəticəyə gəlirəm ki, əgər belə hallar varsa, – bir halda siz deyirsiniz var, – bu, dövlət siyasətinə aid deyil, bu, Ukrayna hökumətinin siyasəti deyildir” [IXc.s.74].

Əlavələrin köməyilə ulu öndər dünya ictimaiyyətini, beynəlxalq təşkilatları Ermənistanın təcavüzü ilə tanış edir, məlumatlandırır və ayıldır. Bu əlavələrlə problemin ciddiliyini, təcavüzün miqyasını anladır: “Keçmiş Dağlıq Qarabağın ərazisi və Azərbaycanın daha yeddi rayonu – ***Laçın, Kəlbəcər, Ağdam, Füzuli, Cəbrayıl, Zəngilan və Qubadlı rayonları*** işğal olunmuşdur. Ağdam rayonunun çox hissəsi işğal olunub, bir hissəsi isə Azərbaycanın hakimiyyəti altındadır. Füzuli rayonunun da bir qismi işğal olunandan sonra geri qaytarılıb. Ancaq o birisi rayonlar tamamilə işğal altındadır” [IIc.s.291].

Əlavələr Heydər Əliyevin nitqində beynəlxalq islam təşkilatlarının auditoriyalar üçün sadalanması funksiyasını yerinə yetirir: “Ciddə də yerləşən və islam dünyasını təmsil edən beynəlxalq təşkilatların – ***İslam Konfransı Təşkilatının, İslam Birliyi Təşkilatının, Beynəlxalq İslam “Nicat” Təşkilatının, İslam inkişaf Bankının, İslam Rabitə Təşkilatının*** rəhbərləri ilə də görüşlərim oldu” [IIc.s.66].

Dünyanın qlobal məsələlərinə münasibətə gəlincə burada da əlavələr işə düşür: “İkinci məsələyə – ***XXI əsrdə təhlü-***

***kəsizlik modeli məsələsinə*** gəldikdə isə, yəqin ki, siz bilirsiniz, ATƏT-in Lissabon Zirvə görüşündə dövlət başçılarının bu barədə xüsusi qərarı qəbul olunmuşdur, biz bu qərara səs vermişik. Hesab edirəm ki, XXI əsrdə Avropa təhlükəsizliyi modeli haqqında sənəddə şərh olunmuş prinsiplər real və həyata keçirilə bilən prinsiplərdir. Biz bu prinsipləri dəstəkləyirik" [IXc.s.70].

Neft hasilatı ilə bağlı çıxışlarda yeri gəldikcə istifadə olunan əlavələr bu sahədəki problemləri, uğurları auditoriyalara çatdırmaqda böyük natiqin köməyinə çatır: "Bilirsiniz ki, indi "Günəşli" yatağını biz istismar edirik və oradan təxminən 6,5 milyon ton neft hasil edirik. Ancaq "Günəşli" yatağının bir hissəsindən – ***dənizin çox dərin sahəsində yerləşən hissəsindən*** istifadə edə bilmirik" [IIc.s.229].

Sonrakı nitq mərhələsində uğurlardan – neft yataqlarından çoxlu miqdarda neft alınmasından söhbət gedir: "30 il müddətində o yataqlardan – "Azəri", "Çıraq" yataqlarından və "Günəşli" yatağının da bir hissəsindən 500 milyon tondan artıq neft çıxaracağıq" [IIc.s.243].

Əlavələr böyük natiqin texniki məsələlərlə bağlı çıxışlarında da özünə yer tapır: "Burada deyildi ki, "Şelf-5" qurğusunun hazırlanması və modernləşdirilməsi, – ***verilən məlumata görə, onun əsas hissəsindən az bir şey qalacaq***, – həmin qurğunun tamamilə yeni texnika və texnologiya ilə quraşdırılması üçün 115 milyon dollar vəsait lazımdır" [IXc.s.8].

Əlavələr Heydər Əliyevin məişət üslublu çıxışlarını da tərk etmir. Televiziyanın insanların həyatındakı rolu əlavələrlə 6 iyul 1996-cı ildə Bakıda Yeni Teleqüllənin təntənəli açılışı mərasimindəki iştirakçılara izah olunur: "Məsələn, ərazi cəhətdən Azərbaycandan müəyyən qədər aralı düşmüş, Azərbaycanın tərkib hissəsi olan Naxçıvan Muxtar Respublikasında son illər baş vermiş hadisələrlə, telekommunikasiya xətlərinin kəsilməsi ilə əlaqədar, televiziya verlişlərinin ötürülməməsi, –

***mən orada yaşadığım illərdə bunu hiss edirdim,*** – oranın əhalisini nə qədər şeylərdən məhrum edirdi. Orada yaşayan insanların, – ***mən bunu öz şəxsi həyatımda hiss etdim,*** – televiziya verlişlərinə ola bilər ki, çörək, su kimi ehtiyacları var idi" [VIIc.s.72].

Aparılan tədqiqat Heydər Əliyevin nitqində əlavələrlə bağlı aşağıdakı nəticələrə gəlməyə əsas verir:

– Nitq mədəniyyətimizin öyrənilməsində bir nitq elementi kimi əlavələrə az diqqət yetirilmişdir.

Əlavələrin bir nitq elementi kimi nitqdə öyrənilməsinə az fikir verilmişdir. Bu natiqlərin şifahi nitqdə əlavələrdən əsasən az istifadə etməsi, yaxud istifadə etməməsidir;

Əlavələr Heydər Əliyevin nitqində auditoriyanı monotonluqdan, yeknəsəqlikdən çıxarmaqda mühüm nitq elementi kimi çıxış edir;

Heydər Əliyevin nitqində əlavələr cümlənin bütün üzvlərinə aid ola bilir. Bunların içərisində tamamlığın əlavələri mühüm yer tutur;

Əlavələrlə nitqi zənginləşdirməyi bacarmaq tək-tək natiqlərə xas olan xüsusiyyətdir. Bir cümlədə cümlənin iki üzvünə əlavələr vermək də böyük natiqə – Heydər Əliyevə xasdır;

Heydər Əliyevin nitqində əlavələr bəzən cümlə həcmində olur ki, şifahi nitqdə belə nümunələrə çox az rast gəlinir, yaxud da rast gəlinmir. Bu bir daha fenomenal Heydər Əliyev nitqindən xəbər verir;

Heydər Əliyevin çıxışlarının girişləri bəzən əlavələrin qoşulduğu cümlələrlə başlayır. İzahedicilik elə başlanğıcda özünü göstərir;

Əlavələr vasitəsilə böyük natiq öz şəxsi xarakterini ortaya qoyur;

İctimai-siyasi sahədə Heydər Əliyev xarakterinin açılmasında da əlavələr nitq elementi kimi mühüm rol oynayır;

Əlavələr vasitəsilə Heydər Əliyev öz qətiyyətini, dəyanətini çıxışlarında bəyan edir.

Beləliklə, ulu öndərin nitq və çıxışlarında cümlə üzvlərinə qoşulan, həmin cümlə üzvlərini izah edən əlavələrin araşdırılması maraqlı faktları ortaya qoyur. Məhz belə araşdırmalar vasitəsilə aydınlaşır ki, Heydər Əliyevin nitqində az əhəmiyyətli, çox əhəmiyyətli, əhəmiyyətsiz nitq elementi yoxdur. Əksinə onların hamısının ulu öndərin nitqində özünəməxsus yeri var.

# VI FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ TƏKRARLAR

Təkrarlar Heydər Əliyevin nitqində çıxışın həsr olunduğu məsələlərin daha dəqiq əks olunması, auditoriyanın nəzər-diqqətini cəlb etmək baxımından mühüm nitq ünsürüdür. Böyük natiqin çıxışlarında təkrarlardan istifadə ilə yanaşı o özü də "təkrar edirəm" ifadəsi ilə təkrarların nitqdəki rolunu bir daha gündəmə gətirir: "Ali Sovetin sədri seçiləndə də məndən soruşdular ki, nə ***vəd edirəm***? Cavab verdim ki, mən peyğəmbər deyiləm. Azərbaycanın bu vəziyyətdən necə çıxacağını deyə bilmərəm. Ancaq əgər mən bu vəzifəni öz üzərimə götürürəmsə, deməli, Azərbaycanı bu vəziyyətdən çıxarmağın yollarını arayıb-axtarmağı bacararam. İndi də ***təkrar edirəm ki,*** mən heç bir ***vəd vermirəm***. Yalnız bir şeyi ***vəd edə*** bilərəm: Azərbaycan xalqına, millətimə, torpağıma sadiq olmuşam və ömrüm boyu da sadiq olacağam. Həyatımın son dəqiqəsinədək xalqıma xidmət edəcəyəm və ömrümün bundan sonrakı illərini də xalqıma bəxş edirəm" [Ic.s.163]. "Vəd etmək" frazeoloji birləşməsini üç yerdə təkrar etməklə böyük natiq auditoriyada yüksək psixoloji mühit, poetik ovqat yarada, nitqi yaddaqalan edə bilir.

Heydər Əliyevin nitqində subyektlər təkrara məruz qalır ki, bu təkrarlar haqqında danışılan subyektləri auditoriyalara tanıtmaq baxımından mühüm nitq elementinə çevrilir: "***Gənclərimiz*** bu beş illik müharibə dövründə Azərbaycan torpaqlarının müdafiəsində fəal iştirak edirlər. Sizə məlumdur ki, müharibədə həlak olanların 95 faizi ***gənclərdir***, yəni 30 yaşına çatmayan, 30 yaşına qədər olan ***gənclərdir***. Lakin təəssüflər olsun ki, ***gənclərdən*** Milli Qəhrəmanlar azdır. Milli Qəhrəmanlarımızdan yeddi nəfəri ***gənclərdir***, hamısı da bu adı ölümündən sonra alıb. Əgər həlak olanların 95 faizindən çoxu

***gənclərdirsə***, deməli, döyüşənlər, torpaqlarımızı müdafiə edənlər də ***gənclərdir***. İtkin düşənlərin də təxminən bir o qədəri ***gənclərdir.***

Odur ki, indi bu müharibənin hansı vəziyyətdə olmasına baxmayaraq Azərbaycan xalqı ***gənclərə*** minnətdar olmalıdır. ***Gənclər*** bizim cəbhə bölgələrində əsas qüvvədir, ***gənclər*** döyüşürlər, torpaqlarımızı müdafiə edirlər, canlarını şəhid edirlər". Yuxarıdakı nitq parçasında 11 yerdə subyekt kimi gənclərdən danışılır. Auditoriya statistikaya söykənən rəqəmlərin dili ilə gənclərin nəyə qadir olduğunu, gənclərin Azərbaycan xalqı qarşısındakı xidmətlərini böyük natiqdən eşidir. "Gənclər döyüşürlər", "gənclər əsas qüvvədir", "Azərbaycan xalqı gənclərə minnətdar olmalıdır" ifadələri gənclərimizdə vətənpərvərlik hissləri aşılayır. Heydər Əliyevin nitqlərindəki təkrarlar sözçülüyə yer verməyən, nitqə xüsusi rövnəq verən, nitqi yaddaqalan edən təkrarlardır. Onun dilində təkrarlar mahiyyətin auditoriyaya çatdırılması yolunda mühüm nitq ünsürü əhəmiyyəti kəsb edir.

Söz sənətkarları bədii əsərlərin dilində obrazlılıq, emosionallıq və ekspressiya yaratmaq üçün rəngarəng bədii priyomlardan istifadə edirlər. Onlar arasında bir üslubi fiqur – təkrar öz işləkliyi baxımından xüsusilə fərqlənir. Təkrarın bədii əsərlərdə daha çox işlənən növlərindən biri sərbəst və ya "qaydasız" təkrardır. Tatar dilçisi X.R.Kurbatov bu təkrar növünə belə tərif vermişdir: "Bu eyni söz və ya ifadənin ardıcıl şəkildə, yaxud bir cümlənin və ya bir neçə qonşu cümlənin müxtəlif yerlərində təkrarıdır".[1]

Klassik ədəbiyyatda da sərbəst təkrarın maraqlı nümunələri kifayət qədərdir.

---

[1] Курбатов Х.Р. Татарская лингвистическая стилистика и поэтика. М. Наука, 1978.

Gər ***çox*** istərsən, Füzuli, izzətin az et sözü
Kim, ***çox*** olmaqdan qılıbdır ***çox*** əzizi xar söz.

Bu beytdə çox sözü üç dəfə: birinci dəfə zərf, ikinci dəfə tərkibi felin birinci tərəfi, üçüncü dəfə isə qeyri-müəyyən miqdar sayı kimi təkrarlanmışdır.

Klassik şeirlərdə sərbəst təkrarın başqa təkrar növləri ilə paralel şəkildə işlənən formasına da rast gəlinir ki, Füzuli qəzəllərində daha geniş yayılan bu forma şərti olaraq qarışıq tipli təkrar adlandırıla bilər:

***Canı*** kim ***cananı*** üçün ***sevsə***, cananın ***sevər***,
***Canı*** üçün kim, ***cananın sevər*** canın ***sevər***.

Göründüyü kimi, bu nümunədə bir beyt daxilində təkrarın həm qaydasız (*sevər* sözünün beytin üç yerində təkrarı), həm leksik anafora (hər iki misranın əvvəlində *canı* sözünün təkrarı), həm də epimona (*can*, *canan*, *sev* sözlərinin kiçik variasiyalarla – qrammatik dəyişmələrlə təkrarlanması) növündən istifadə edilmişdir.[1] Elə buradaca klassik Azərbaycan dili və müasir Azərbaycan dili, Füzuli şeirləri və Heydər Əliyev çıxışlarının vəhdətini görürük.

Böyük natiq təkrarların köməyi ilə bir sıra məsələlərin fəlsəfi məzmununu auditoriyalara açıqlayır: “Kənd təsərrüfatı çox həssas bir sahədir. Bu, zavod deyil, fabrik deyil, ***torpaqdır***, ***torpağın*** üstündə işləyən ***insandır***. Zavodda, fabrikdə işçinin cihazı var, avtomatı var, düyməsi var, filanı var – o, düyməni basır, yaxud da ki, aləti işə salır, iş gedir. Amma ***torpaq*** canlı

[1] Bəylərova Aytən. Bədii əsərlərin dilində təkrir. AMEA Xəbərlər, Humanitar elmlər seriyası, 2008. №2, s.69-76.

bir məfhumdur. Bitki də ***canlıdır***, heyvanlar da ***canlıdır***. Kənd təsərrüfatında ***insan canlı*** bir həyata qovuşur” [VIIc.s.127].

Burada“torpaq”, “insan”, “canlı” ifadələri təkrarlanaraq insanla torpaq arasında dialektik vəhdət yaradır, bir daha hər bir istehsalın fəlsəfi xüsusiyyətlərini dinləyicilər qarşısında açıqlayır.

Heydər Əliyevin nitqində təkrarlar auditoriyanın diqqətini müəyyən bir məsələyə cəlb etmək baxımından mühümdür. Təkrar olunan söz, söz birləşməsi, cümlə auditoriyanın, dinləyicilərin yaddaşına həkk olunur. Və böyük natiq təkrarların köməyi ilə nitqin təsir gücünü dəfələrlə artırmış olur: “Güman edirəm ki, bu müzakirə səmərəli olmalıdır. Əvvəlcədən xəbərdarlıq edirəm ki, çıxış edən şəxslər ***konkret*** məlumatlar versinlər, ***konkret*** təkliflər irəli sürsünlər, ***konkret*** sözlər desinlər. Çünki bəzi rəhbər vəzifəli şəxslərimiz ümumi danışıqlarla çox vaxt mənim də vaxtımı alırlar və ümumi müzakirənin də vaxtını aparırlar. Ona görə də mən əvvəlcədən xəbərdarlıq edirəm: ***konkret*** təklif vermək, fikir söyləmək istəyən adam üçün hər bir imkan yaradılacaqdır. Bugünkü iclasımız ***konkret*** iqtisadi xarakter daşıyır. Buna görə də çox ***konkret*** və əsas iqtisadi məsələlərimizlə əlaqədar həm çıxışlar qurulmalı, həm də təkliflər verilməlidir” [VIIc.s.113]. Konkret sözünün çıxışın əvvəlində altı yerdə təkrarlanması dövlət başçısı Heydər Əliyevin vaxta, zamana göstərdiyi sayğının təzahürüdür.

Böyük natiqin nitqləri təkrarlarla zəngindir ki, bu təkrarlar müxtəlif nitq hissələrinə, o cümlədən qoşmalara da tətbiq edilir: “Bura gəlib işə başlayandan ***sonra*** bu barədə Ali Sovetdə məlumat almışam. Mən Ali Sovetin sədri kimi, işə başlayandan ***sonra*** Ali Sovetə bu məlumatlar vaxtaşırı gəlirdi, ancaq bilirsiniz ki, o vaxtlar bizim başımız həddindən artıq qarışıq idi” [Ic.s.63].

Təkrarlar Heydər Əliyevin nitqlərində ekspressivlik yaradan nitq elementidir. Böyük natiqin nitqində sifətlər isimlərlə

birgə təkrarlanaraq nitqi cazibəli edir: "Mən güman edirəm ki, ***sağlam əhvali-ruhiyyəli*** gənclər Azərbaycan Respublikası gənclərinin böyük əksəriyyətini təşkil edirlər. Buna görə də ***sağlam düşüncəli***, ***sağlam fikirli*** gənclər öz yolundan sapmış gəncləri düz yola çəkməli, düz yola çağırmalı, ayrı-ayrı qanunsuz hərəkətlərdən uzaqlaşdırmalı və respublikada, o cümlədən Bakı şəhərində əmin-amanlıq yaranmasına çalışmalıdırlar" [Ic.s.181].

Təkrarlarla nitqdə necə bir ekspressivlik yaratmaq yalnız Heydər Əliyev dühasına xasdır.

Azərbaycan MTN əməkdaşlarının bir qrupu ilə görüşdəki nitqdə (28.03.1998-ci il) Respublika Sarayındakı çıxışın bir məqamında "iqtidar" sözü təkrarlanır.

"İqtisadi islahatları həyata keçirən ***iqtidardır***. Torpaq islahatını həyata keçirən ***iqtidardır***. Torpağı şəxsi mülkiyyətə verən və cəsarətli addımlar atan ***iqtidardır***. Siyasi, sosial islahatları həyata keçirən ***iqtidardır***. Azərbaycanda ictimai-siyasi sabitliyi təmin edən ***iqtidardır***. Konstitusiyanın tələblərini həyata keçirən, qəbul olunan qanunları həyata keçirən ***iqtidardır***. Azərbaycanda demokratiyanı inkişaf etdirən ***iqtidardır***. Hüquqi dövlət yaradan və insanların hüquqlarının qorunmasını təmin etməyə çalışan ***iqtidardır***. Budur. Bəs siz kimsiniz?".

9 yerdə "iqtidardır" təkrar olunur. 5 yerdə "həyata keçirən", "addımlar atan", "inkişaf etdirən", "təmin edən", "təmin etməyə çalışan" frazeoloji birləşmələr sinonim şəklində təkrarlanmışdır.

Əvəzlik nitq hissəsinin böyük natiqin nitqlərində tez-tez təkrarının şahidi oluruq: "Mən əminəm ki, ***hər bir*** imkanlı adam, ***hər bir*** xeyirxah insan, ***hər bir*** imkanlı iş adamı bu nəcib işdən kənarda qalmayacaq, buna münasibətini göstərəcəkdir" [IIIc.s.7].

"***Öz*** dilimiz, ***öz*** adət-ənənələrimiz, ***öz*** milliliyimiz bəzən itib gedirdi: O, (C.Məmmədquluzadə – red.), rus dilini mü-

kəmməl bilib, Avropa mədəniyyətini çox dərindən öyrənib, ümumbəşəri dəyərləri dərk edib, onları ***öz*** milliliyi ilə, ***öz*** ana dili ilə, ***öz*** milli kökləri ilə birləşdirərək Mirzə Cəlil olubdur, Cəlil Məmmədquluzadə olubdur [IIIc.s.8].

Heydər Əliyevin nitqində təyin əvəzliklərinin təkrarlanması da müşahidə olunur. Anafora şəklində bu təkrarlar böyük natiqin nitqinə xüsusi bir rövnəq verir. Heykəltəraş Ömər Eldarovun sənətinə verdiyi qiymət bu qəbildəndir: "Çünki həqiqi incəsənət əsəri yaratmaq çox çətin işdir. ***Hər bir adam*** həqiqi rəssamın yaratdığı rəsm əsərini yarada bilməz. ***Hər bir adam*** həqiqi bəstəkarın bəstələdiyi musiqini bəstələyə, yarada bilməz, onun müəllifi ola bilməz. ***Hər bir adam*** böyük şairin, yazıçının yazdığı əsərlər kimi əsərlər yarada bilməz. Şübhəsiz ki, ***hər bir adam*** yüksək istedada malik musiqiçi ola bilməz. Eləcə də ***hər bir adam*** Ömər Eldarov kimi və başqa heykəltəraşlar kimi heykəltəraş ola bilməz" [IXc.s.156].

Böyük natiqin dilində şəxs əvəzlikləri də təkrarlanır, ikinci şəxsin cəmi kimi "siz" şəxs əvəzliyi müraciət şəklində təkrarlanır. "Üzümü tuturam" frazeologizmı ilə başlayan nitq bir neçə yerdə "siz" təkrarları ilə davam edir: "İşğal olunmuş torpaqlarımızdan didərgin düşmüş qaçqınlarımız, ***sizə*** *üzümü tuturam*. ***Sizin*** nə qədər ağır vəziyyətdə yaşadığınızı bilirik. ***Sizin*** yaşayışınız üçün əlimizdən gələni edirik və bundan sonra da edəcəyik. ***Sizin*** dözümünüz, dəyanətiniz bütün Azərbaycan xalqı üçün nümunədir. Əziz həmvətənlər, bayram münasibətilə ***sizi*** təbrik edir və əmin olduğumu bildirmək istəyirəm ki, öz evinizə, obanıza qayıdacaq və doğma yurdunuzun sahibi olacaqsınız" [IIc.s.12].

Təkrarlar Heydər Əliyev nitqinin güclənməsinə səbəb olan dil vahidləridir. Aşağıdakı təkrarlarda böyük natiq məntiqi ardıcıllığa söykənərək fikirləri sadəcə təkrar etmək yox, fikirləri qüvvətləndirmək yolunu seçir: "***Biz fəxr edirik ki***, xalqımız belə qədim, zəngin mədəniyyətə malikdir. ***Biz fəxr***

***edirik ki***, xalqımız öz böyük şəxsiyyətləri vasitəsilə Azərbaycanın milli-mənəvi dəyərlərini daim qoruyub saxlamış, zənginləşdirmiş və bu gün ümumbəşəri dəyərlərin bir hissəsinə çevirmişdir. ***Biz fəxr edirik ki***, Məhəmməd Füzuli kimi dahi şairimiz var, böyük alimimiz var, böyük filosofumuz var" [VIIIc.s.29]. Təkrarlarda öncə xalq → xalqın şəxsiyyətləri → Məhəmməd Füzuli ardıcıllığı ciddi şəkildə gözlənilir.

Gerçəkliyə uyğunluğun qəti təsdiqini bildirən "inanıram ki" modal sözü Heydər Əliyevin nitqində auditoriyada inam və nikbinlik yaradır. Təkrarlar, xüsusilə də modal sözlərin təkrarlanması nitqi cazibədar edir: "***İnanıram ki***, xalqlarımızın, ölkələrimizn qarşısında xoşbəxt gələcək durur. ***İnanıram ki***, biz bu çətinliklərdən müvəffəqiyyətlə çıxacağıq. ***İnanıram ki***, Gürcüstanın və Azərbaycanın ərazi bütövlüyü bərpa olunacaqdır. ***İnanıram ki,*** biz ümumi səylərimizlə Qafqazda sülhə, əmin-amanlığa nail olacağıq. ***İnanıram ki***, bizdən sonra gələcək nəsillər də bizim tutduğumuz bu yolu davam etdirəcəklər, Gürcüstan-Azərbaycan dostluğunu, əməkdaşlığını, müstəqil dövlətlərimizin gələcək inkişafını təmin edəcəklər" [VIIIc.s.442-443]. Burada anafora tipli təkrarlardan böyük ustalıqla istifadə olunmuşdur.

Heydər Əliyev nitqində işarə əvəzlikləri də təkrarlanır: "Biz ***o*** quruluşda, ***o*** həyatda, ***o*** dövlətdə, ***o*** şəraitdə yaşamışıq, təhsil almışıq, böyümüşük və respublikamızı, xalqımızı yaşatmışıq. Ona görə də ***o*** dövrlərdə əldə olunan nailiyyətləri inkar etmək olmaz, – bu, cinayət olardı. Onu unutmaq da olmaz" [XIIIc.s.101].

Böyük natiqin nitqindəki təkrarlar şifahi nitq üçün xarakterik sayılan, qabaqcadan sistemləşdirilməyən, daha doğrusu qısa zaman kəsiyində təfəkkürdən "spontan" qopan nitq parçalarıdır: "Səfəri sona çatdırarkən Türkiyənin prezidenti hörmətli cənab Süleyman Dəmirələ bu rəsmi səfərə dəvətə ***görə*** və burada bizə göstərilən qonaqpərvərliyə, dost, qardaş müna-

sibətinə ***görə***, bizimlə aparılan çox səmərəli işlərə, əldə olunan nəticələrə və imzalanmış sənədlərə ***görə*** təşəkkürümü, minnətdarlığımı bildirirəm" [IXc.s.405].

Heydər Əliyevin nitqində modal sözlər cümlənin əvvəlində anaforalar şəklində təkrarlanır. 24 mart 1997-ci ildə Kiyev şəhərində Ukrayna prezidenti ilə söhbətdə olduğu kimi: "***Əminəm ki***, biz həmin sənədlərdə şərh edilmiş razılaşmaları həyata keçirə biləcəyik. ***Əminəm ki,*** biz əməkdaşlığın daha geniş yoluna çıxacağıq. ***Əminəm ki,*** Ukrayna və Azərbaycan bu çətinlikləri və ölkələrimizin qarşısında sosial – iqtisadi sahədə duran problemləri aradan qaldıracaqdır. Onlar həll ediləcəkdir, başlıcası budur ki, biz malik olduğumuzu-suverenliyi və dövlət müstəqilliyini qiymətləndiririk" [IXc.s.56].

Böyük natiq daxili birlik və həmrəyliyin nə üçün lazım olduğunu "üçün" qoşmasının təkrarlanması yolu ilə açıqlayır. Auditoriya bu birliyə çatmağın yollarını "üçün" təkrarlarının köməyi ilə öyrənir: "Biz ölkəmizi bu ağır mərhələdən keçirmək ***üçün***, ölkəmizin ərazi bütövlüyünü bərpa etmək ***üçün***, işğal olunmuş torpaqlarımızı azad etmək ***üçün***, ölkəmizdə demokratik prosesləri inkişaf etdirmək ***üçün***, ölkəmizin dünya birliyində özünə layiqli yer tutması ***üçün***, onu daha da irəliyə aparmaq ***üçün*** daxilimizdə olan birliyi, həmrəyliyi möhkəmləndirməliyik" [IIc.s.8].

Müstəqilliklə bağlı çıxışlarda təkrarlar nitqə xüsusi bir rövnəq verir. Müstəqillik yolundan dönməməyi qətiyyətli dövlət başçısı kimi auditoriyaya çatdırır: "Azərbaycanın tutduğu ***yol*** müstəqil Azərbaycan Respublikası, demokratik-hüquqi cəmiyyət qurmaq yoludur. Biz bu ***yolla*** gedirik və gedəcəyik.. Bizi bu ***yoldan*** heç kəs döndərə bilməyəcəkdir" [IIc.s.8].

Dini üslublu çıxışlarında da təkrarlar geniş işlənir. Heydər Əliyevin nitqində təkrarların bir cəhəti də ondan ibarətdir ki, təkrar olunan fikirlər, ifadələr sinonim şəklində işlənir, auditoriyanı yeknəsəqlikdən, monotonluqdan qoruyur: "Arzularım-

dan biri də bu oldu ki", "bir arzum da bu oldu ki", "Allahdan arzum, diləyim bu oldu ki", "Allah-təaladan arzu etdim ki" sinonimləri ilə dindarlar auditoriyası fəth olunur. Sonda isə "güman edirəm ki" modal söz iki yerdə təkrarlanaraq yuxarıdakı arzuların həyata keçəcəyi inamını yaradır. Məsciddə səslənən "Amin" və "inşallah" duaları təkrarların yaratdığı ovqatı əks etdirir: "O, müqəddəs yerlərdə ***arzularımdan biri də bu oldu ki,*** vətən, torpaq yolunda, Azərbaycanın müstəqilliyi yolunda şəhid olanlara Allah bir daha rəhmət eləsin (Yerdən səslər: Amin). ***Bir arzum da bu oldu ki***, şəhidlərin ailələrinə, qohum-əqrəbasına Allah səbir versin, onlara bundan sonra da edəcəyimiz köməyin daha çox olmasına şərait yaratsın (Yerdən səslər: Amin). Mənim ***Allahdan arzum, diləyim bu oldu ki,*** Vətən yolunda yaralanmış, xəsarət almış, əlil olmuş adamların sağalmasına kömək etsin, onların gələcəkdə sağlam yaşamasının təmin olunmasına yardım etsin (Yerdən səslər: Amin). Mən o müqəddəs yerlərdə ***Allah-təaladan arzu etdim ki***, Azərbaycan xalqını hifz etsin, xalqımızın bundan sonra heç vaxt heç bir bəlaya düçar olmasına yol verməsin" [IIc.s.83]

Ulu öndərin nitqində "da", "də" qüvvətləndirici ədatlarının da tez-tez təkrarlanmasının şahidi oluruq: "Yerli hakimiyyət orqanları öz ərazilərində hər şeyə cavabdehdirlər: sənayeyə ***də***, tikintiyə ***də***, sosial sahəyə ***də***, nəqliyyata ***da***, şübhəsiz ki, kənd təsərrüfatına ***da***, eləcə də ərazidə ictimai-sosial vəziyyətə ***də***" [IIc.s.118].

Qaçqınlığı böyük faciə hesab edən Heydər Əliyev dünya ictimaiyyətini, beynəlxalq təşkilatları bu faciəyə qiymət verməyə çağırır. Bu faciənin hər bir ailənin, hər bir vətəndaşın və nəhayət Azərbaycan xalqının faciəsi olduğunu təkrarlayır: "Dediyim kimi, indi Azərbaycanda bir milyondan artıq qaçqın var. Bu qaçqın olmuş hər bir ailənin ***faciəsidir***. Qaçqın vəziyyətinə düşmüş hər bir vətəndaşın ***faciəsidir***. Bu Azərbaycan xalqının, Azərbaycan Respublikasının ***faciəsidir***. Şübhəsiz ki,

dünya ictimaiyyəti, beynəlxalq təşkilatlar Azərbaycanın düşdüyü bu vəziyyətə, ölkəmizin bu faciəli halına gərək daha diqqətli olsunlar, daha da kömək etsinlər" [IIc.s.505].

Bölüşdürmə bildirən "istər", "istərsə də" bağlayıcıları böyük natiqin dilində təkrarlanaraq nitqdə ekspressivlik yaradır: "Harada işləməsinin fərqi yoxdur, – ***istər*** yerli hakimiyyət orqanlarında, ***istər*** iqtisadiyyat sahəsində, ***istər*** sənaye və kənd təsərrüfatında, ***istərsə*** də nazirliklərdə və inzibati orqanlarda olsun, fərqi yoxdur, bunların hamısı dövlət strukturlarıdır" [IIc.s.119].

Heydər Əliyev nitqində "öz" təyin əvəzliyi fikri qüvvətləndirmək və dəqiqləşdirmək baxımından tez-tez işlədilir. Bu təyin əvəzliyinin təkrarlanması isə auditoriyada qətiyyət hissi aşılanır: "Biz ***öz*** torpaqlarımızı, ***öz*** ərazimizi, ***öz*** Vətənimizi qoruyuruq. Biz başqa ölkələrin, xüsusən də Ermənistanın bir qarış da olsun torpağını istəmirik, ancaq ***öz*** torpaqlarımızın hamısını geri qaytarmalıyıq. Bu, bizim müqəddəs vəzifəmizdir və bu yolla axıra qədər gedəcəyik" [IIc.s.43].

Xitabların da təkrarlanması böyük natiqin nitqində özünə yer alır: "***Yaşasın*** Bakı Dövlət Universiteti! ***Yaşasın*** elm, yaşasın mədəniyyət, yaşasın təhsil! ***Yaşasın*** müstəqil Azərbaycan Respublikası! Sağ olun" [IIc.s.547].

Heydər Əliyev nitqində "ilə" qoşması təkrarlanaraq nitqin ecazkarlığını artırır: "Cəlil Məmmədquluzadə öz yaradıcılığı ***ilə***, əsərləri ***ilə,*** publisistikası ***ilə***, böyük mətbuatçılıq fəaliyyəti ***ilə*** Azərbaycan xalqının milli oyanışında, milli dirçəlişində əvəzsiz rol oynamışdır" [IIIc.s.77]. Burada "ilə" milli oyanışın, milli dirçəlişin formalaşmasına xidmət göstərir.

Auditoriyanı sabahkı günlərə "əminəm ki" modal sözü ilə hazırlayan ulu öndərin nitqlərində bu modal sözün təkrarına da tez-tez rast gəlinir: "***Əminəm ki***, 1995-ci ildə qarşımızda duran iqtisadi məsələlərin bir çoxu həll olunacaq və xalqımızın rifah halı yüksələcəkdir. Mən ***əminəm ki***, 1995-ci ildə

respublikamızın dünya miqyasında hörməti, nüfuzu daha da artacaq, müstəqilliyi, daha da möhkəmlənəcəkdir. Mən buna ***əminəm*** və buna əsas verən xalqımızın mənəvi kökləri, mənəvi dayaqları, tarixi keçmişi, adət-ənənələri və qüdrəti, xalqın tarixi qəhrəmanlığı və bugünkü birliyidir” [IIIc.s.99].

Heydər Əliyevin nitqində təkrarlara məruz qalan nitq hissələri içərisində bir mühümü də təyin əvəzliyidir. Bu zaman “hər bir” təyin əvəzliyinə böyük natiqin nitqində tez-tez təsadüf edirik: “Ağır vəziyyətdə yaşayanlar o kəslərdir ki, biz müharibə şəraitinə düşdüyümüz vaxtdan indiyədək respublikanın ağırlıqlarını öz üzərlərində aparırlar. Ona görə də bu hadisələr, bu faciə ***hər bir*** kəsə, ***hər bir*** siyasi quruma, ***hər bir*** ictimai təşkilata, ***hər bir*** siyasi partiyaya xəbərdarlıq kimi qəbul olunmalıdır” [IIIc.s.150].

Ulu öndərin nitqlərində modal sözlərin təkrarlanmasına çox təsadüf edilir: “***Doğrudan da*** çox təqdirəlayiq bir tarixdir. ***Doğurdan da*** Suraxanı neftçiləri və bütün suraxanılılar Azərbaycanının tarixində özünəməxsus yer tutmuşlar” [IIc.s.123].

Heydər Əliyevin nitqində sinonimlər də təkrarlanır. Nitqin ecazkarlığını yüksəldən sinonimlər təkrarlandıqca onun auditoriyalara təsir gücü daha da artır: “Bax biz ***bu arzu ilə, bu istəklə*** 1994-cü ilin mayında atəşkəs haqqında saziş imzalamışıq və ***bu arzu, bu istəklə*** də o vaxtdan indiyədək dünyanın beynəlxalq təşkilatları çərçivəsində, ATƏT, onun Minsk qrupu çərçivəsində, dünyanın böyük dövlətlərinin – Rusiyanın, Amerikanın, Türkiyənin və başqa dövlətlərin iştirakı ilə tam sülhə nail olmaq istəyirik” [Vc.s.487].

Heydər Əliyev nitqində qoşmalar da təkrarlanır. “Qarşı” qoşması aşağıda bir neçə dəfə təkrarlanmışdır: “Nəhayət, ***belə bir*** cinayət, ***belə bir*** terror, ***belə bir*** qətl xalqımıza qarşı qətldir. Bu, Azərbaycanın dövlətçiliyinə ***qarşı***, Azərbaycanın müstəqilliyinə ***qarşı*** olan terrordur. Bu, Azərbaycanın iqtida-

rına ***qarşı*** olan terrordur. Ona görə də bu, bizim üçün ağırdır" [VIIIc.s.159].

Böyük natiqin dilində tabelilik bildirən səbəb bağlayıcıları "ona görə", "ona görə ki" təkrarlanaraq nitqə xüsusi məna verir, nitqin əlavanlığını artıraraq, təsir gücünü yüksəldir: "Mən sizə inanıram. ***Ona görə ki***, siz döyüşlərdən, tufanlardan, sınaqlardan keçmiş adamlarsınız. ***Ona görə inanıram ki,*** siz o ağır müharibədən keçib öz vətəninizə qayıtmısınız. ***Ona görə inanıram ki***, siz Vətənini sevən adamlarsınız " [Ic.s.155-156].

Heydər Əliyev nitqində tez-tez təsadüf olunan, bu gün modal söz kimi qəbul olunan bir ifadə "Allaha şükür olsun ki" bir çox məqamlarda təkrarlanaraq xüsusi effekt yaradır: "***Allaha şükür olsun ki***, müstəqil dövlətimiz var. ***Allaha şükür olsun ki***, ictimai-siyasi sabitlik yaranıbdır. ***Allaha şükür olsun ki***, tam sülh olamasa da, sülh şəraitində yaşayırıq. ***Allaha şükür olsun ki***, hamımız bir yerdəyik. Vaxtilə kimin başına nə gəlib, nə təhər olub, filan olub – bunlar keçmişdə qalıbdır. Mən bunları unuduram, xahiş edirəm siz də unudasınız" [XIIIc.s.19].

Heydər Əliyevin nitqində "ilə", "üçün" qoşmalarının da təkrarı daha çox təsadüf edilir: "Cəlil Məmmədquluzadə öz yaradıcılığı ***ilə***, əsərləri ***ilə***, publisistikası ***ilə***, böyük mətbuatçılıq fəaliyyəti ***ilə*** Azərbaycan xalqının milli oyanışında, milli dirçəlişində əvəzsiz rol oynamışdır" [IIIc.s.78].

Auditoriyalarda nitqin təsir gücünü artırmaq vasitəsi kimi təkrarlar Heydər Əliyev nitqində yerli-yerində işlənir. "Təkcə" məhdudlaşdırıcı ədatının təkrarlanması kimi: "Cəlil Məmmədquluzadə öz yaradıcılığı ilə Azərbaycanın ictimai-siyasi həyatının inkişafında, milli ruhun yüksəlməsində rol oynamışdır. Bu, ***təkcə*** ədəbiyyat deyil, ***təkcə*** mədəniyyət deyil, bu, siyasətdə böyük xidmətdir, ictimai həyatımızda böyük xidmətdir" [IIIc.s.43].

Təkrarlar təyin əvəzliklərinə də tətbiq olunur: "Azərbaycan dövlətinin uşaqlar haqqında siyasəti məhz bundan ibarət-

dir. Dövlətin qayğısı ilə ***hər bir*** təşkilatın qayğısı, xeyriyəçilik edən ***hər bir*** adamın qayğısı birləşməlidir, qovuşmalıdır" [IIIc.s.9].

Böyük natiqin dilində işarə əvəzlikləri təkrarlanır: ""Ona görə də bundan bir il sonra Moskvada, Kremldə partiyadan çıxmaq barədə bəyanat verdim və onun birinci bəndində Kommunist Partiyasının rəhbərliyini Azərbaycan xalqına qarşı etdiyi təcavüzə görə və ***o təcavüzü*** boynuna almadığına görə, pisləmədiyinə görə, ***o təcavüz*** üçün özü-özünü cəzalandırmadığına görə məhkum etdim" [IIIc.s.70].

"Ona görə də biz Cəlil Məmmədquluzadəyə sadəcə bir ədəbiyyatçı ***kimi***, yazıçı ***kimi***, publisist ***kimi*** yox, eyni zamanda böyük ictimai xadim ***kimi***, böyük siyasətçi ***kimi*** yanaşmalıyıq" [IIIc.s.78].

Aşağıdakı nitqdə də kəmiyyət zərfləri təkrarlanaraq fikrin auditoriyaya aydın şəkildə çatdırılmasını gücləndirir: "Xalqımız ***nə qədər*** tez birləşərsə, Azərbaycan xalqı bir-biri ilə ***nə qədər*** həmrəy olsa, ***nə qədər*** hamının sözü bir olsa, ***o qədər*** də tez bu çətinliklərdən çıxacağıq, ***o qədər*** də tez torpaqlarımızı geri qaytaracağıq, azad edəcəyik, ərazi bütövlüyümüzü təmin edəcəyik" [VIc.s.13].

Auditoriyada əminlik yaratmaq baxımından "əminəm ona görə ki" ifadəsi təkrarlandıqca, hər dəfə "ona görə ki"nin arxasınca izahının gəlməsi auditoriyanı bir daha təkrarlara inandırır: "Mən buna əminəm. ***Əminəm ona görə ki***, haqq işi, ədalət işi həmişə qələbə çalıb. ***Əminəm*** ona görə ki, Azərbaycan xalqı tarix boyu böyük sınaqlardan keçib və bu sınaqlardan keçəcəkdir. ***Əminəm*** ona görə ki, Azərbaycan xalqının zəkası, iradəsi, qəhrəmanlığı buna əsas verir. ***Əminəm ona görə ki,*** biz Azərbaycan dövləti xalqın əmin-amanlığının, xoşbəxt gələcəyinin keşiyində durmuşuq" [VIc.s.13].

Heydər Əliyev nitqində bağlayıcılar təkrarlanaraq nitqə xüsusi bir ahəngdarlıq verir: "Əminəm ki, əməli işimiz bu mü-

qavilənin müddətini uzadacaq, ***çünki*** yeni böyük imkanlar meydana çıxacaqdır, ***çünki*** bizdə neft və qaz ehtiyatı var" [VIc.s.24]. Elə bu cümlədə səbəb bağlayıcısı "çünki" iki yerdə təkrarlanır. Birinci halda "çünki" bağlayıcısı "müqavilənin müddətinin uzadılması" səbəbini izah edirsə, ikinci halda işlədilən "çünki" birinci "çünki" ni izah edir.

Heydər Əliyevin nitqlərində təkrar olunan söz və ifadələr nitq hissələrinin əsası saxlanılmaqla formalar təkrarlanır. Əgər felin məsdər forması təkrarlanırsa sonrakı nitq mərhələsində həmin felin feli sifət formasından istifadə olunur: "Bir daha deyirəm ki, ***dağıtmaq*** asan işdir, amma ***yaratmaq*** çox çətindir. Tarixdə insanlar isə həmişə quranları, ***yaradanları*** qiymətləndirir. ***Dağıdanlar*** həmişə tarixdən silinmişlər, yaxud da tarixə mənfi rol oynamış adamlar kimi daxil olmuşlar" [Ic.s.162].

"Dağıtmaq", "qurmaq" kimi felin məsdər formaları "***dağıdan***", "quran" feli sifət şəklində təkrarlanaraq nitqin cazibəsini artırır.

Heydər Əliyevin nitqində qoşmalar, felin lazım şəkilləri harmonik şəkildə təkrarlanır: "Azərbaycanın müdafiə qüdrətini yaratmaq ***üçün***, müstəqilliyini qorumaq ***üçün*** və respublikanın müharibə vəziyyətindən çıxması ***üçün*** ona nizami ordu lazımdır. Bu ordunun dəyərli, bilikli, savadlı zabit heyəti ***olmalıdır***, hərbi mütəxəssisləri ***olmalıdır***, hərbi texnikadan istifadə etməyi bacaran mütəxəssislər, əsgərlər, zabitlər ***olmalıdır***. Biz bunlara nail olacağıq. Onların hamısı isə gənclərdən ***olmalıdır***" [Ic.s.178].

Heydər Əliyevin nitqində ən çox təkrarlara məruz qalan söz və söz birləşmələri mövzunun açar sözü rolunu oynayır ki, bu da gələcəkdə dilçi alimlərin tədqiqat işi ola bilər. Heydər Əliyevin 21 sentyabr 1993-cü ildə Azərbaycan Respublikası Elmlər Akademiyasında ziyalılarla görüşündə ən çox təkrar olunan söz və ifadələr aşağıdakılar olmuşdur: tarix, tarixçilər-50, müstəqil və müstəqillik – 43, ziyalı, ziyalılar – 19, elm –

17, akademiya – 13. Böyük natiqin nitqində təkrarlar çıxışın mahiyyətini açmaqda mühüm rol oynayır.

Bu çıxışda mətndaxili və cümlədaxili təkrarlardan geniş istifadə olunmuşdur. Müstəqilliklə bağlı ən çox mətndaxili təkrarlardan istifadə olunmuşdur: "Biz ***müstəqilliyi*** silahla, dava ilə, üsyanla əldə etməmişik. Bu ***müstəqillik*** tarixi prosesdir, onu ictimai-siyasi proseslər əsasında əldə etmişik. Qoy heç kəs deməsin ki, kimsə bir qəhrəman kimi bu ***müstəqilliyin*** sərkərdəsidir, yaxud ***müstəqilliyi*** əldə edən bir siyasi xadimdir. ***Müstəqillik*** heç kəsə, heç bir təşkilata mənsub deyildir. ***Müstəqillik*** xalqa mənsubdur" [Ic.s.151].

Tarix və tarixçilərlə bağlı həm mətndaxili, həm də cümlədaxili təkrarlardan istifadə olunur: "Bununla əlaqədar olaraq mən ***tarixçilər*** haqqında bir neçə kəlmə demək istəyirəm. ***Tarixçilərimizin*** xatirində olmalıdır ki, mən Azərbaycanda işləyən dövrdə – 70-ci illərdə və 80-ci illərin əvvəllərində dəfələrlə onlara müraciət etmişəm ki, bizim ***tariximiz***, həm qədim ***tariximiz***, həm orta əsrlər ***tariximiz***, həm də son dövrlərin XVIII, XIX, XX əsrlərin ***tarixi*** istənilən səviyyədə yazılmayıb. ***Tarixçilərin*** yadındadır ki, mən alimlərlə dəfələrlə görüşmüşdüm, hər dəfə də öz narahatlığımı bildirirdim" [Ic.s.154].

"Elm" və "Elmlər Akademiyası" ifadələri də təkrarlanaraq çıxışın ana xəttinin elmdən ibarət olduğunu akademiya auditoriyasına çatdırır: "Mənə sədalar gəlir ki, ***Elmlər Akademiyasını***, İnstitutları dağıtmaq istəyirlər, ***elm*** ocaqlarına biganə münasibət var... Hansı iqtisadiyyat olursa olsun, ***elm*** inkişaf etməlidir. ***Elmlər Akademiyası*** Azərbaycan xalqının tarixi nailiyyətidir. 1945-ci ildə bu ***akademiyanı*** yaradan adamlar, Azərbaycanın böyük alimləri çox böyük şücaət göstərmişlər. Ötən dövrdə bu akademiyanın çərçivəsində Azərbaycan ***elmi*** çox inkişaf etmişdir. ***Akademiyanın*** fəaliyyətini tənqid etmək də olar, naqis cəhətlər də var. Ancaq ümumən götürüldükdə

şübhəsiz ki, ***elmin*** keçdiyi inkişaf yoluna yüksək qiymət verməli, onu əldə saxlamalı, itirməməliyik" [Ic.s.162].

Təkrarlar çıxışın yaddaqalan olmasında xüsusi ekspressivlik qazanır. Heydər Əliyevin nitqlərində əsas və köməkçi nitq hissələri, eləcə də cümlə üzvləri tez-tez təkrarlanır. Bu təkrarlar nitqin təsir gücünü artırmaqla yanaşı nitqdə sözçülüyə yer qoymur: "Son illərin ən əcaib hadisəsi ondan ibarətdir ki, Azərbaycanın bu ağır dövründə birləşib torpaqlarımızı ***qorumaq***, tariximizi ***qorumaq*** əvəzinə ayrı-ayrı qruplar, ayrı-ayrı şəxslər bu fürsətdən istifadə ediblər, vəzifə, məqam hərisliyinə düşüblər, öz şəxsi mənafelərinə, şəxsi məqsədlərinə nail olmağa çalışıblar" [Ic.s.149]. Yuxarıdakı cümlədə "qorumaq" felin məsdər forması təkrarlanaraq Azərbyacan xalqına hansı dəyərləri qorumağı ünvan verir.

Heydər Əliyevin nitqlərinin söyləndiyi zaman və məkana uyğun olaraq təkrarlar özünə yer tapır. Belə ki, "müstəqillik", "müstəqil" ifadələri müxtəlif çeşidli auditoriyalarda həmişə təkrarlanır. 28 sentyabr 1993-cü ildə Bakı Kondisoner zavodunda paytaxtın sənaye müəssisələri, əmək kollektivləri nümayəndələrinin mitinqində 16 yerdə "müstəqillik", 14 yerdə "müstəqil" ifadələrinin işlənməsi bir daha ulu öndərin nitqlərində müstəqilliyin önəmli yer tutması nəzərə çarpdırılır.

Beləliklə, Heydər Əliyevin nitqlərində təkrarların geniş yer aldığının fərqinə varsaq gələcəkdə təkrarların dərin elmi-tədqiqat işi kimi araşdırılmasına ehtiyac duyulur. Təkrarlara məruz qalan söz və ifadələri çeşidli auditoriyalar üzrə qruplaşdırmaq ehtiyacı yaranır. Və nəhayət təkrarlarla bağlı fikirlərimizi aşağıdakı kimi yekunlaşdırmaq mümkündür:

– Təkrarlar Heydər Əliyevin nitqlərində ekspressivlik yaradan nitq elementidir;

– Heydər Əliyevin nitqində barəsində söhbət gedən subyektlər təkrara məruz qalır ki, bu təkrarlar həmin subyektləri

auditoriyalara tanıtmaq baxımından mühüm nitq elementinə çevrilir;

– Gerçəkliyə uyğunluğun qəti təsdiqini bildirən "inanıram ki" modal sözünün təkrarlanması auditoriyada inam və nikbinlik yaradır;

– Heydər Əliyevin nitqində modal sözlər əsasən cümlənin əvvəlində anaforalar şəklində təkrarlanır;

– Böyük natiqin nitq və çıxışlarında qoşmalar da təkrarlanır. Bütün bu təkrarlar şifahi nitq üçün xarakterik sayılan, qabaqcadan sistemləşdirilməyən, daha doğrusu qısa zaman kəsiyində təfəkkürdən qopan "spontan" nitq parçalarıdır;

– Heydər Əliyevin nitqində təkrarların bir özünəməxsus cəhəti də ondan ibarətdir ki, təkrar olunan fikirlər, ifadələr sinonim şəklində işlənir, auditoriyanı yeknəsəqlikdən, monotonluqdan qoruyur;

– Heydər Əliyevin nitqində təkrarlara məruz qalan nitq hissələri içərisində bir mühümü də təyin əvəzlikləridir. "Öz" təyin əvəzliyi fikri qüvvətləndirmək və dəqiqləşdirmək baxımından tez-tez işlənir;

– Heydər Əliyevin dilində müstəqillik dövründən üzü bəri tez-tez təsadüf olunan, bu gün modal söz kimi qəbul olunan "Allaha şükür olsun ki" ifadəsi bir çox məqamlarda təkrar olunaraq xüsusi bir effekt yaradır;

– Heydər Əliyevin çıxışlarında mətndaxili və cümlədaxili təkrarlardan geniş istifadə olunur. Müstəqilliklə bağlı ən çox mətndaxili təkrarlardan istifadə olunmuşdur.

# VII FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ RİTORİK SUALLAR

Polemikada istifadə olunan sintaktik vasitələrdən biri də ritorik suallardır. Ritorik suallar, adətən, nitqdə həm emosionallıq yaradır, həm də ona kəskin tənqidi ton verir, intonasiyanın yüksəlməsinə zəmin hazırlayır[1]. Ritorik suallar nitqin dinləyicilərə təsir gücünü artırır, hissiyyatları oyadır, böyük məna və emosional yük daşıyır. Ritorik sualların yaranma zərurəti fikrin, hissin ifadə tərzi ilə sıx bağlıdır. Belə ki, eyni bir məzmun sadə cümlə və mürəkkəb cümlə strukturu ilə deyilərkən bunlar arasındakı semantik fərq duyulmaya bilər, lakin üslubi effektdəki fərq özünü bariz şəkildə göstərəcəkdir.[2]

Heydər Əliyevin nitqlərinin araşdırılması ritorik sualların öyrənilməyə layiq nitq elementi olduğunu göstərir. Belə ki, nitqin auditoriyalara olan təsir gücünün artırılmasında ritorik suallar mühüm rol oynayır. Məlum olmuşdur ki, ritorik suallar sual ədatları və sual əvəzliklərinin köməyi ilə formalaşaraq dinləyicilərə səfərbəredici təsir göstərir.

Ritorik suallar Heydər Əliyevin ciddi elmi dəlillərlə zəngin nitqlərinin başlanğıcında özünə yer tutur, auditoriya həmin sualların cavabını səbirsizliklə, böyük bir maraqla eşitmək istəyir. Adətən belə cavablar modal sözlərlə, qüvvətləndirici ədatlarla bəzənir ki, bu da nitqin ekspressivliyini, məna tutumunu gücləndirir: ***“Məsələn, indi biz Orta Asiya ölkələrində olarkən, yaxud oradakı soydaşlarımız buraya gələrkən maraqlanırıq, – necə oldu ki, azərbaycanlılar Qazaxıstanda da, Özbəkistanda da, Qırğızıstanda da, Türkmənistanda da***

---

[1] Axundov Ağamusa və b. Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili. Bakı, “Elm”, 1998. 196 səh.

[2] Vəliyeva Xatirə. Ritorik sualların işlənmə özəllikləri, Filologiya məsələləri №3, 2009. səh.156-161.

***yaşayırlar?*** Onların böyük əksəriyyəti hələ o dövrdə repressiyalar nəticəsində və *xüsusən* kənd təsərrüfatının kollektivləşdirilməsi ilə əlaqədar yerlərindən kütləvi surətdə sürgün edilmiş, mal-mülkü əlindən alınmış adamlardır. Bu kollektivləşdirmə proqramı *bax*, belə böyük itkilərlə, böyük məhrumiyyətlərlə, cəmiyyətə, xalqımıza, millətimizə vurulan ağır zərbələrlə həyata keçirildi və kolxoz-sovxoz sistemi yaradıldı" [VIIc.s.87]. "Məsələn" aydınlaşdırma bağlayıcısı ilə başlayan ritorik suala "xüsusən" fərqləndirici modal söz və "bax" qüvvətləndirici ədatın da iştirak etdiyi cavab gözəl nitq nümunəsi yaradaraq XX əsrin 30-cu illərindəki kollektivləşmə siyasətinin iç üzünü təkzibolunmaz dəlillərlə auditoriyaya çatdırır.

Ritorik sual cümlələri Heydər Əliyev üçün incə, dərin mətləbləri çatdırmaq yolunda mühüm vasitədir. Yazıçıların X qurultayında şair və yazıçıların dövlət qayğısı ilə əhatə olunmasına münasibət bildirilir. Yazıçı və şairləri yeni dövrdə yeni təfəkkürlə fəaliyyət göstərməyə, öz istedad və qabiliyyətlərinə güvənməyə çağırır: "Məsələn, götürək bizim qonşu dövlətləri – Türkiyəni, İranı. ***Orada dövlət hansı yazıçının əsərini çap edir, yaxud hansı yazıçıya, şairə ev verir?*** İndi biz böyük şairimiz Şəhriyarın 90 illiyini qeyd edəcəyik. Biz bu yubileyi Azərbaycanda geniş qeyd etməliyik. Mənim bu barədə də xüsusi sərəncamım olacaqdır. Ola bilər mən onu bu gün imzalayım. Ancaq Şəhriyarın həyatı və vəziyyəti hamıya məlumdur. ***Bilmirəm dövlət ona orada bir ev vermişdi, yoxsa yox? Siz bunları yaxşı bilərsiniz. Yaxud onun yazdığı əsərləri özü çap elətdirirdi, yoxsa kim?"*** [XIIIc.s.93].

Heydər Əliyevin nitqində ritorik suallar auditoriyanı fikirləşməyə, düşünməyə, nəticə çıxarmağa sövq edən suallardır. "Bəli" təsdiq ədatı ilə auditoriyanı fikrinə qoşan böyük natiq sonda ritorik suallarla vəziyyəti izah edir: "Mənim fikrim belədir. Qiymətim də budur. Burada dedilər, mən yenə də qeyd edirəm: Bəli, həmin zonada, həmin bölgədə sosial-iqti-

sadi problemlər var. ***Ancaq gəlin fikirləşək: Azərbaycanın hansı zonasında sosial-iqtisadi problemlər yoxdur? Dedilər Lənkəranda işsizlər var. Azərbaycanın hansı zonasında işsizlər yoxdur?***" [Ic.s.78].

Heydər Əliyevin nitqində ritorik suallar əksər hallarda sual ədatları ilə formalaşsa da, bir sıra hallarda sual intonasiyası ilə yaradılır. Onun nitqində sual cümlələrinin köməyilə açıq, səmimi bir polemika yaranır: "Yenə də deyirəm, hər bir partiya, hər bir təşkilat fəaliyyət göstərir və fəaliyyət göstərə bilər. Ancaq gəlin açıq danışaq. ***Bu partiyaların-filanların məqsədi nədir? Azərbaycanın müstəqil dövlət olması?*** Azərbaycan müstəqil dövlətdir. Dəfələrlə demişəm, Azərbaycanın müstəqilliyini qorumaq Prezident kimi mənim və mənim rəhbərliyim altında olan strukturların hamısının birinci vəzifəmizdir və onu qoruyuruq, qoruyacağıq. Müharibənin qurtarması məsələsi? Bu barədə nə işlər gördüyümü bilirsiniz. ***Ərazimizin bütövlüyünün təmin olunması, işğal edilmiş torpaqlarımızın azad olunması, qaçqınların öz yerlərinə qayıtması? Bu məsələlərlə də məşğul oluruq. Yəni, o dövlətin götürdüyü prinsipial xətlə bu partiyaların, təşkilatların prinsipial xətləri arasında fərq nədən ibarətdir?"*** [IIc.s.565].

Böyük natiq ritorik sualla auditoriyaya müraciət edir, eyni zamanda "deyin görək" ifadəsi ilə auditoriyadan kömək istəyir. "Axı" qüvvətləndirici ədatının köməyi ilə dolğun cavab verərək, dinləyiciləri səfərbər edir: *"**İndi biz bütün çatışmazlıqları, nöqsanları və kənd təsərrüfatı istehsalının bu dərəcədə aşağı düşməsini gördüyümüz bir halda, deyin görək, yeni sistemə necə keçəcəyik?*** Axı, bütün bunlarla yeni sistemə keçmək çətindir. Odur ki, bu çətinliklərə, ağır problemlərə baxmayaraq, biz bütün iqtisadiyyatda olduğu kimi, kənd təsərrüfatının da mövcud imkanlarından, potensial imkanlarından səmərəli istifadə etməliyik və başlanmış cari kənd təsərrüfatı

ilində bol məhsul yetişdirməliyik. Bunun üçün var qüvvə ilə çalışmalıyıq" [Ic.s.487].

Heydər Əliyev nitqində ritoik suallar ardıcıl şəkildə "birincisi" və "ikincisi" davamiyyət bildirən modal sözlərlə birgə təsadüf edir: "Amma Türkiyə bunu istədi və biz də inandıq ki, bəli, doğrudan da belədir. ***Amma bu hava yolunu açdınız, nə oldu? Birincisi, bəs bu əsas haradadır, ondan nə üçün istifadə etmirsiniz? İkincisi, Ermənistanın yumşalması baş verdimi? Olmadı, yoxdur. Ona görə də indi Ermənistanla Türkiyə arasında ticarət əlaqələri lazımdırmı?***" [IXc.s.331].

Ritorik sual bəzi hallarda "xatırlayın" ifadəsi ilə keçmiş zamana aid olur. Belə ritorik sualla böyük natiq keçmişdə baş verən hadisələri auditoriyanın gözü qarşısında canlandırır: ***"Xatırlayın, o vaxt vəziyyət nə cür idi?*** O vaxt sərhəd yox dərəcəsində idi, kim haradan istəyirdi, oradan da keçirdi. İndi bu sahədə vəziyyət xeyli yaxşılaşıbdır, nizam-intizam yaranıbdır" [VIIIc.s.195].

Ritorik suallar Heydər Əliyev nitqində qarşılaşdırma bağlayıcıları ilə başlayır, elə həmin bağlayıcılarla da cavablandırılır: "Azərbaycanın böyük dövlət xadimləri olubdur. ***Amma indi onların hansının heykəli, yaxud məqbərəsi var? Amma şairlərin, yazıçıların var və olmalıdır, olacaqdır***" [XIIIc.s.110].

Heydər Əliyev nitqində "nə üçün" ritorik sualına verilən cavabla milli sərvətlərimizə sahib olmağın yollarını izah edir: "Çox düşündük, nəhayət, mən o binanın Akademiyanın Əlyazmalar Fonduna verilməsi haqqında qərar qəbul etdim. ***Nə üçün?*** Çünki Əlyazmalar Fondu, əsrlərdən bəri qalmış o kitablar bizim üçün böyük bir sərvətdir" [Ic.s.155].

"Bəs" sual ədatı, "əgər" şərt bağlayıcısının vasitəsilə düzələn ritorik sual cümlələri böyük natiqin dilində çeşidli auditoriyalarda işlənir. Bu suallar Azərbaycan iqtisadiyyatına investisiyalar qoyulması məsələlərində özünü bariz şəkildə gös-

tərir: "İndi Azərbaycan dünyanın bütün ölkələrinin iqtisadi maraq mərkəzinə çevrilibdir. ***Bəs Amerika Birləşmiş Ştatlarının o qədər neft şirkətləri Azərbaycana nədən ötrü gəliblər? Əgər Azərbaycanda siyasi sabitlik, iqtisadi qanunlar, xarici sərmayənin gəlməsi üçün imkanlar olmasaydı, onlar Azərbaycana gələ bilərdilərmi?*** Onlar bizdən xahiş edirlər, bizə müraciət edirlər" [XIIc.s.95].

Ritorik suallar bəzən qısa ifadələr şəklində auditoriyaya yönəlir, bu zaman cavablar da yığcam, lakonik, tutumlu olur: *"**Eşidirsən, bilirsən, duyursan ki, bəziləri respublikada yaranmış bu sabit ictimai-siyasi vəziyyəti pozmaq istəyir. Nə üçün? Nəyə görə? Yalnız və yalnız öz şəxsi məqsədlərini, öz çirkin niyyətlərini həyata keçirmək üçün. Bəli, aramızda beləlari də var***" [IIc.s.245]. Qısa ritorik suallara qüvvətləndirici ədatlarla müşayiət olunan qısa cavablar verilir.

Bir sıra hallarda ritorik sual cümlələrindən sonra qətiyyətli ifadələr – "buna yol vermək olmaz", "heç vaxt yol verməyəcəyəm" – auditoriyaya yol açır: "Azərbaycanın dənizdə zəngin neft yataqları var: "Azəri", "28 Aprel" və s. Bu yataqların hamısı burada əyləşmiş alimlərimizin, geoloqlarımızın, neftçilərimizin böyük əməyi sayəsində kəşf olunub. ***İndi imkan vermək olarmı ki, yüz minlərlə adamın illər boyu çəkdiyi zəhmətin nəticəsindən ayrı-ayrı üzdəniraq işbazlar istifadə etsinlər? Buna yol vermək olmaz!*** Mən buna heç vaxt yol verməyəcəyəm" [Ic.s.86].

Ritorik sual cümlələrindən böyük natiq bir pedaqoq kimi deyilən fikrin yaddaşlarda möhkəmləndirilməsi məqsədi ilə istifadə edir. Yazıçıların X qurultayında ritorik suallarla keçmişə səyahət edir, üzü Füzulidən bəri ta Mirzə Cəlilə qədər şair və yazıçı həyatının çətin, amma şərəfli olduğunu anladır: "Bu günlər yazıçıya, ədəbiyyata qayğılar haqqında danışıldı. Siz bilirsiniz ki, keçmiş dövlət çərçivəsində bu qayğıları göstərmək çox çətin bir şey deyildi. Biz bunu edirdik və sizin ha-

mınız da o qədər öyrənmişdiniz, elə bilirdiniz ki, şair anadan gələndən belə qayğı ilə əhatə olunmalıdır. Amma unutmuşdunuz ki, Füzuli də çox ağır vəziyyətdə yaşamışdır. Füzuli o şəraitdə yaşayıb-yaratmışdırsa, heç kəs deyə bilməz ki, onun çox böyük imkanları olmuşdur. ***Yaxud, götürün Mirzə Ələkbər Sabiri. O, hansı şəraitdə yaşayıb-yazmışdır – məlumdur, elədirmi? Yaxud, götürək Mirzə Cəlil Məmmədquluzadəni. O, hansı şəraitdə yaşayıbdır?*** Siz də bilirsiniz ki, ömrünün son illərində o, qəzetləri, bəzi kitablarını qış vaxtı peçdə yandırıb, onun istisinə qızınırmış. Bunu ki, bilirsiniz. Bu, bizim dövrümüzdə, 1932-ci ildə olubdur. Belə də olubdur" [XIIIc.s.110].

Ritorik sual cümlələrinin köməyi ilə Heydər Əliyev xarakteri milyonlar üçün açılır: ***"Bakıda hər şey dağıdıldığı, viran qoyulduğu halda buraya gəlmək üçün sakit, dinc həyatımı narahat, təlatümlü həyata dəyişmək mənim nəyimə gərək idi?*** Axı vətəndaş müharibəsi gedirdi, adamlar bir-birini öldürürdülər. O yanda Ermənistanla müharibə gedirdi. Burada isə hələ bir daxili müharibə aparırdılar. Rəhbərlərin hərəsi bir tərəfə qaçmışdı. Məni Bakıya çağırdılar, parlamentin sədri vəzifəsini təklif etdilər. Mən razılaşmadım. Bir həftə mənimlə danışıqlar apardılar. Sonra gördüm ki, ürəkdən sevdiyim xalqın vəziyyəti ağırdır..." [XIIc.s.80]. "Ürəkdən sevdiyi xalqın" ağır vəziyyəti ulu öndəri "dinc" həyatından ayırır, elə xalqı üçün də təlatümlü, mübarizələrlə dolu həyata atılır.

Heydər Əliyevin nitqində ritorik suallar ulu öndərin təvazökarlığını əks etdirir. Azərbaycan ədəbiyyatının inkişafında yüksək xidmətlərini səmimi bir təvazökarlıqla dilə gətirir: "Yenə də Mirələsgər Mirqasımovun tələbləri mənim qarşımda durdu və mən də dedim ki, yox, nə edirsiniz edin, vəzifə yerinə yetirilməlidir. Biz buna nail olduq. ***O heykəlin qoyulmasından neçə il keçir? 1980-ci ildə qoyulub? 1981-ci ildən 16 il keçir ki, biz o heykəli qoymuşuq***. Hesab edirəm ki, Cəfər Cabbarlıya layiq olan heykəl Bakının gözəl guşələrindən bi-

rində yüz illər yaşayacaq və bizdən sonra gələn nəsillər də birinci növbədə Mirələsgər Mirqasımova dua edəcəklər. Ola bilər duanın bir hissəsi də bizə çatsın" [IXc.s.158].

Azərbaycan insanı, Azərbaycan torpağı Heydər Əliyev üçün əvəzolunmazdır. Bu insanın, bu torpağın başına "iş gətiriləndə" böyük natiq dözmür. XX əsrin 20-30-cu illərində Sovetlər dönəmində aparılan kollektivləşmənin ağırlaşmaları, acı nəticələri ritorik suallarla auditoriyaya çatdırılır: "20-30-cu illərdə kollektivləşdirmə aparılan zaman torpağın başına bir iş gətirdilər. Həmin o illərdə, kollektivləşdirmə aparılan zaman nə qədər insanlar qurban gedibdir. Eyni zamanda torpaq əsrlər boyu olduğu vəziyyətdən başqa bir vəziyyətə, özü də qısa bir müddətdə keçdiyinə görə nə qədər itkilər olubdur. ***Bəs, 30-cu illərin əvvəllərində olan aclıq – Rusiyada, təkcə Rusiyada yox, Sovetlər İttifaqının hər yerində, o cümlədən, Azərbaycanda da bu aclıq var idi – nə ilə bağlı idi? Axı, bunlar tarixdən məlumdur. Yaşlı adamlar o aclığı xatırlamalıdırlar. Mənim özüm, məsələn, 1930-1931-ci illərdə Azərbaycanda olan aclığı xatırlayıram. Bu nə ilə bağlı idi?***" [IXc.s.175].

Böyük natiqin dilində ritorik sual cümlələri əksər təsadüflərdə ictimai-siyasi vəziyyət və yaxud sadəcə hansısa situasiya tam aydınlaşandan sonra sonda işlədilir. Bütöv bir məzmun bir-iki ritorik sualla auditoriyanın beynində daha da möhkəmlənir, çıxış yaddaqalan olur: "Belə də oldu. İndi burada çıxış eləyən natiq dedi ki, orada 5 min ton üzüm olmuşdu, amma orada 5000 tondan da artıq üzüm olmuşdu. Mən 82-ci ildə Azərbaycandan gedəndə, ondan sonra 83-84-cü illərdə Lerik rayonunda, səhv etmirəmsə, 20 min tona qədər üzüm istehsal olunurdu. 17 min ton, bağışlayın***. Kiçik bir rayon üçün 17 min ton üzüm bilirsiniz nədir? Bunlar hamısı diqqət deyilmi?***" [Ic.s.74].

Böyük natiqin dilində "nəyə görə" ritorik sualı tez-tez təkrarlanır: "1992-ci ildə Amerika konqresi Azərbaycana kö-

məyə embarqo, yəni qadağan qoyubdur. ***Nəyə görə?*** Guya Azərbaycan Ermənistanı blokadaya alıbdır. Amma həqiqətdə Ermənistan Azərbaycanın ərazilərini işğal edibdir, respublikamızı blokadaya alıbdır" [IXc.s.392].

Əksər hallarda sual ədatları ilə düzələn sual cümlələri bir qisim hallarda sual intonasiyası ilə düzəlir: "Bunların əsasında Azərbaycan elminin inkişafının strategiyası yaranmalıdır**. *Həmin işləri həyata keçirmək üçün hansı vəsait lazımdır, bunu haradan əldə etmək olar? Bunu dövlət büdcəsindən almaq, yaxud başqa ölkələrlə inteqrasiya, başqa elmi mərkəzlərlə əlaqə nəticəsində əldə etmək olar?*** İndi belə imkanlar çoxdur. Keçmişdə, biz Sovetlər İttifaqının tərkibində olarkən yalnız bu ittifaq çərçivəsində hərəkət edə bilərdiksə, indi bütün dünya ilə əlaqə qururuq və qura bilirik" [VIIIc.s.366].

Dinləyicilərin peşə tərkibindən asılı olaraq auditoriyaya verilən ritorik suallar böyük natiqin auditoriyaya sevgisini əks etdirir, dinləyiciləri riqqətə gətirə bilir: "1950-60-cı illərdə, hətta 70-ci illərdə neft sənayesinə dövlət tərəfindən, bütün ictimaiyyət tərəfindən böyük diqqət vardı. Neftçilərin adı hörmətlə, şərəflə çəkilirdi və onlar böyük qayğı ilə əhatə olunmuşdular. ***Bəs indi? Hanı o şöhrət, hanı o qayğı?*** Naşı adamlar belə böyük sahəyə, böyük bir elmə, böyük bir sənayeyə rəhbərlik edə bilməzdilər. Məhz onlar bizi belə bir vəziyyətə gətirib çıxarıblar" [Ic.s.85].

Bir qisim hallarda Heydər Əliyevin nitqində situasiyalardan öncə ritorik suallar gəlir. Bir qisim hallarda isə öncə situasiya auditoriya üçün aydınlaşdırılır, sonra bu situasiyanın yaddaşlarda möhkəmlənməsi üçün ardıcıl olaraq ritorik suallar verilir: "Burada çıxış edənlər qeyd etdilər ki, 600 minə qədər qaçqın var. Evi yox, eşiyi yox, çöllərdə yaşayır. Biz getdik Qarabağa. Ağcabədidə olduq. Bərdədə olduq. İnsanlar çöllərə tökülüb. İndi hələ ki, hava istidir, yaşamaq olur. Ağac altında, çadır altında yaşayırlar. İlan vurur onları. ***Bəs onlar***

***insan deyildirlərmi? Onlara sosial-iqtisadi təminat lazım deyilmi? Belə çıxır ki, onlar da respublika yaratmalıdırlarmı? Onlar da silahlı dəstələr qurub cürbəcür cinayət etməlidirlərmi?"*** [Ic.s.78].

Bəzən Heydər Əliyevin dilində səslənən ritorik suallar cavabı məlum olan suallar şəklində olur: "***Bilirsiniz***, Ermənistan tərəfindən torpaqlarımızın 20 faizinin işğal edilməsinə dözə bilmirəm. Dözə bilmirəm ki, Azərbaycan əsgəri erməni əsgərindən gücsüz olubdur, geri çəkilibdir. Bu, daim mənə əzab verir. ***Nə üçün, nəyə görə? Bizim xalqımız ermənilərdən zəifmi xalqdır? Və yaxud respublikamız Ermənistan Respublikasından kiçikdirmi?*** Doğrudur, bunun başqa səbəbləri var. Mən bunu dəfələrlə demişəm" [XIIIc.s.129]. Burada "bilirsiniz" modal sözünün köməyi ilə torpaqlarımızın işğalına qarşı öz emosional münasibətini bildirən böyük natiq ardıcıl ritorik suallarla auditoriyaya müraciət edir. "Doğrudur" modal sözü ilə ritorik suallara cavab verilir.

Bir sıra hallarda qısa ritorik suallara elə lakonik cavablar da verilir. Auditoriya cavabı bilavasitə böyük natiqin elə özündən alır və növbəti ritorik sualı eşidir, növbəti cavab da verilir: "O vaxt ki, – 1992-ci ildə – dövlətçiliyi pozurdular onda siz bu fürsətdən istifadə edib bunu pozmusunuz***. Elə bildiniz ki, bu, sizə xeyir gətirəcəkdir? Xeyr, gətirməyəcəkdir. Görürsünüz gəlib nə günə düşdünüz?*** Ona görə öz səhvlərinizin bəlasını çəkirsiniz və mən bu səhvlərə yol verə bilmərəm" [VIIIc.s.371].

Ritorik suallar neqativ hallara qarşı yönəlmiş müşavirələrdə ittiham kimi səslənir. Həmin ritorik suallardan sonra kəskin, qətiyyətlilik bildirən ifadələr işə düşür, nitq tamamlanır: *"**Xalqımız belə ağır, çətin vəziyyətdə yaşadığı bir zamanda, iqtisadiyyatımızda belə çətin proseslər keçirdiyimiz zaman bir pambıq zavodunda bir əməliyyatdan 400 min dollar pul, valyuta mənimsəsinlər – bu, yarayarmı? Bu, bizim bugünkü***

***günümüzə yaraşarmı?*** Mən göstəriş vermişəm və bu gün də deyirəm – belə hallarla kəskin mübarizə aparılır və aparılacaqdır. Prokurorluq istintaq aparmalıdır, cinayətkarlar qısa müddətdə məsuliyyətə cəlb olunmalıdır” [IXc.s.181].

Ritorik suallar müxtəlif auditoriyalarda Heydər Əliyev tərəfindən mahiyyətin dərki üçün istifadə olunur. Kadrların işə cəlbi, kadrların mənəvi keyfiyyəti, iş qabiliyyətlərinin qiymətləndirilməsi ilə bağlı müşavirələrdə ritorik suallara cavab verilməsə belə auditoriya cavabı elə ritorik sualın özü ilə də alır. Növbəti ritorik sualla ondan qabaqkı ritorik suala cavab tapılması Heydər Əliyev nitqinə xas olan məziyyətdir ki, biz bunlara digər natiqlərdə təsadüf etmirik: ***“Ancaq belə bir səhvdən sonra yenə də mən bilmirəm kimdir vitse-prezident. Əgər o, adam yararlıdırsa siz nə üçün onu mənə təqdim etmirsiniz? Əgər yararlı deyilsə, niyə onu işə buraxmısınız? Nə üçün özbaşına bu işləri görürüsünüz? Ona görə də mənim haqqım var, əsasım var deyəm ki, siz bu sahəni tamamilə nəzarətdən buraxmısınız. Niyə? Vaxtınız çatmır, yoxsa hesab edirsiniz ki, bu, lazım deyil?*** Amma bu böyük səhvdir. Siz özünüz məlumat verdiniz ki, həmin o neftayırma zavodlarında nə qədər böyük nöqsanlar var” [VIIc.s.135].

“Əgər”, “yoxsa” bağlayıcıları, “nə üçün” sual əvəzliyindən istifadə yolu ilə ardıcıl ritorik suallar, “kadrların vəzifələrə irəli çəkilməsində nöqsanlara yol verilə bilməz” prinsipini ortaya qoyur.

Ritorik suallar Heydər Əliyevin nitqində beynəlxalq təşkilatlara ünvanlanır. 14 noyabr 1994-cü ildə Bakıda keçirilən “Qaçqınlar haqqında qanunvericilik, insan hüquqları və miqrasiya” məsələlərinə dair beynəlxalaq konfransdakı kimi: “Bugünkü konfransda yəqin müqayisə etmək mümkün olardı ki, əgər bir adamı sözdən məhrum edirlərsə və ya o, müəyyən məhdudiyyətlərə məruz qalırsa, onun hüquqları pozulur: ancaq bir milyon insan – azərbaycanlı öz yerindən, yurdundan

qovulmuşdur, evini, əmlakını itirmişdir, dədə-babalarının qəbirlərindən məhrum olmuşdur, əsrlər boyu yaşadığı yerlərdən məhrum olmuşdur. ***Bəs bu, insan hüquqlarının kütləvi surətdə, dəhşətli şəkildə pozulması deyilmi?***" [IIc.s.509]. Elə həmin konfransda "nə üçün" sual əvəzliyinin üç dəfə təkrarlanması yolu ilə böyük natiq auditoriyada yüksək nitq effekti yaradır. Beynəlxalq təşkilatları süstlük göstərməkdə ittiham edir, bu təşkilatları insan hüquqlarının qorunmasına səfərbər edir: *"**Belə olan halda bir milyon vətəndaşın-azərbaycanlının hüquqlarının kütləvi surətdə pozulması haqqında nə üçün həyəcan təbili vurulmur, nə üçün hay-küy qalxmır, nə üçün bu, parlamentlərdə müzakirə olunmur? Beynəlxalq təşkilatlar nə üçün bu barədə öz cəsarətli fikirlərini bildirmirlər? Bunu anlamaq mümkün deyildir***" [IIc.s.509].

"Məgər" bağlayıcıları ilə başlayan ritorik suallar vasitəsilə Heydər Əliyev Dağlıq Qarabağ məsələsinə münasibət formalaşdırır: "***Məgər, cəmi 80 min erməni yaşayan bir yerdə ikinci erməni dövləti yaratmaq olarmı? Ermənistanda və Dağlıq Qarabağda nəhayət, dərk etməlidirlər ki, bu mümkün deyildir. Onlar bunu dərk etdikdə, zənnimcə, biz tez bir zamanda razılığa gələ biləcəyik***" [XIIc.s.70]. Bu ritorik sualın ardınca "nəhayət" modal sözü ilə fikrə yekun vurulur, "zənnimcə" modal sözünün köməyi ilə hadisələrin gələcək inkişafı auditoriyalara çatdırılır.

Klassiklərin yaradıcılığında nitq hissələrini araşdıran müəlliflərin elmi-tədqiqat işlərinə hörmətlə yanaşaraq Nəsimi divanında və Heydər Əliyevin nitqlərində cavabı özündə olan yüksək emosional mənalı ritorik sual ədatlarının – "mı, -mi, -mu, -mü" – müqayisəli öyrənilməsi bir daha "dili Allah yaşadır, dili böyük sənətkarlar, görkəmli dövlət və siyasi xadimlər yaşadır" müddəasının doğruluğunu sübuta yetirir.

Nəsimi dilində:

Yüzündür gülüstan, billah değil***mi***?
Sözündür, gün-fəkan, billah, değil***mi***?
Saçındadır Xətavü Çinü Rumə,
Səba ənbərəfşan, billah, değil***mi***?[1]

Heydər Əliyevin dilində: "İndiki dövrümüzdə vətənpərvərlik ən aktual məsələdir. ***Məgər*** Azərbaycan xalqı bu qədər acizdir***mi***, məgər Azərbaycan gəncləri bizə təcavüz edən qüvvələrdən, həm fiziki, həm mənəviyyat, həm vətənpərlik cəhətdən zəifdir***mi***? Hesab edirəm ki, yox".

Ritorik suallarla Heydər Əliyev auditoriyanı dinləməyə sövq edə bilir, auditoriya böyük maraqla çıxışı dinləyir. Məsələn, 1 iyul 1996-cı ildə Almaniyadakı Azərbaycan diasporunun nümayəndələri ilə görüşdəki çıxış kimi: ***"Bu əməkdaşlığın əsası nədən ibarətdir?*** Birincisi, ondan ibarətdir ki, Azərbaycan müstəqil dövlətdir və öz müstəqilliyini daim qoruyub saxlayacaqdır. Azərbaycanda demokratik, hüquqi dövlət qurulur. Azərbaycan iqtisadiyyatı bazar iqtisadiyyatı yolu ilə inkişaf etdirilir, dünya iqtisadiyyatı ilə birləşir. Azərbaycanın zəngin təbii sərvətləri, zəngin iqtisadi potensialı var. Azərbaycan zəngin elmi potensiala malikdir. Azərbaycanın çox mühüm coğrafi-siyasi və strateji əhəmiyyəti var" [VIIc.s.25].

Auditoriyaya qısa və yığcam ritorik suallar yönəlir. Bu suallara lakonik cavablar verilir: "***Almaniyada nə qədər azərbaycanlı yaşayır? Yüz əlli min. Nə qədər türk yaşayır? İki milyon. Bilirsiniz, bir millətik, hamımız bir kökdənik. Ona görə də gərək azərbaycanlılar da, türkiyəlilər də bir-birinə dayaq olsun, əl-ələ versinlər***" [VIIc.s.21]. Belə sual-cavab mərhələsindən sonra "bilirsiniz" modal sözü ilə azərbay-

[1] Əlizadə Afina. Nəsimi əsərlərində kəmiyyət bildirən söz və ifadələr // AMEA-nın humanitar və ictimai elmlər seriyası, 2002. №1-2, s.117-126.

canlıların Almaniyada yaşayan iki milyonluq türk əhalisinə qaynayıb-qarışacağına işarə vurulur, diaspor təşkilatların "bir-birinə" dayaq olmaları tövsiyə olunur.

Ritorik suallar Heydər Əliyev niqində milli təəssübkeşlik məqamlarında üzə çıxır, auditoriyanı səfərbər edir. Heydər Əliyev Türkiyə Böyük Millət Məclisində səlis Azərbaycan dilində danışaraq bu dilin türk dillərinin biri olduğunu məclisə ünvanlayır: "***Mənim sözlərimi anlayırsınızmı? Mən sizin ləhcədə də danışa bilərəm. Ancaq qəsdən danışmıram ki, siz də bizim ləhcəni öyrənəsiniz***" [IXc.s.316].

Heydər Əliyev tarix fəlsəfəsinə sadiqliyini hər an dilə gətirərək ritorik sullarla tarixi saxtalaşdırmaq istəyənlərə kəskin cavab verir. Bu cavablar inkar ədatları ilə güclənərək tarixi təhrif edənləri ayıldır.

Ritorik suallar tariximizi təhrif etmək istəyənlərə cavab verilmə məqamlarında da üzə çıxır: "Bütün bunlarla mən öz fikrimi açıq demək istəyirəm: tarixi təhrif etmək olmaz. Tarixi təhrif edənlər xalqa xəyanət edir, onu çaşdırırlar. Buna son qoymaq lazımdır. Gələcəkdə buna yol vermək olmaz. Biz Bakıda Nəriman Nərimanovun ev-muzeyini yaratmışıq, özü də böyük bir çətinliklə düzəltmişik. Eşidirəm ki, sonra vəzifəyə gələn adamlardan kim isə gözünü bu evə dikib. Muzeyi dağıdaraq özləri üçün mənzil edirlər. ***Bəs bu hansı mənəviyyata sığışar? Nəriman Nərimanov elm, mədəniyyət xadimi kimi Azərbaycan tarixində olan bir adamdırsa, böyük bir ədəbi irs qoyub gedibsə, belə etmək olarmı?*** Şübhəsiz ki, belə hallara yol verilməməlidir" [Ic.s.159]. Sual ədatları "bəs", "mı"nın köməyi ilə auditoriyaya yönələn ritorik suallar yekun kimi səslənir.

Ritorik suallar tariximizin təhrif olunmamasına, tariximizin doğru-düzgün yazılmasına yönəlir: "Yenə də mən sizi günahlandırmıram. Çünki bizə qalmış miras o idi. Siz də, bizim o yaşlı tarixçilərimiz də, 1970-ci illərdən fəallıq göstərən

tarixçilərimiz də onlardan istifadə edirdilər. Ona görə də biz onların hamısını o ideologiyanın konsepsiyasında bizə verilən kimi əks etdirirdik. ***Sonra nə oldu?*** 1990-cı ildən başladılar ki, hamısı pisdir. Başqa adamları qaldırdılar və onları bir tarixi şəxsiyyət kimi şişirtdilər. Yəni o kommunist ideologiyasının vaxtında buraxılan səhvlər indi də təkrar edilir. Həmin səhvlər o vaxtlar bir istiqamətdə, indi başqa istiqamətdə buraxılır. Belə subyektivliyə və tariximizin bundan sonra da təhrif edilməsinə yol verməmək üçün mən bir neçə dəfə təklif verdim ki, XX əsrin tarixi necə var, elə də yazılsın" [VIIIc.s.369].

Heydər Əliyev nitqində ritorik sual cümlələri gənclərin milli-dini zəmində tərbiyə işinə yönəlir. 1 fevral 1997-ci ildə Azərbaycan Respublikası Gənclərin I forumunun birinci ildönümü münasibətilə forum nümayəndələrinin bir qrupu ilə görüşdə olduğu kimi: "Sizin əsas vəzifələrinizdən biri gəncləri zərərli və pis adət və ənənələrdən çəkindirmək və qorumaqdan ibarətdir. ***Bunlar hansılardır****?* Spirtli içkilərə meyl, nəhayət, alkoqolizm, narkotik maddələrdən istifadə olunması, nəhayət, narkomaniya" [VIIIc.s.392]. Yenə də həmin görüşdə xalqımıza "dövri-qədimdən" spirtli içkilər və narkotik maddələrin yad olması fikri ortaya qoyulur. Ritorik suallarla bütün bu mənfiliklərə qarşı mübarizənin əsası qoyulur, sonda "bunların qarşısı alınmalıdır" qətiyyətli ifadə ilə fikir yekunlaşır: "Xalqımız dövri-qədimdən bu mənfi meyllərdən uzaq olmuşdur. Keçmişdə bizim millətimizdə spirtli içkilər istifadə olunmayıbdır. Bu, bizim dini, milli ənənələrimizə uyğun deyil. ***Nəyə lazımdır ki, indi gənclər araq içsinlər? Nə üçün, nəyə görə öz səhhətlərini korlasınlar və bunun da nəticəsində müxtəlif yollara getsinlər?*** Yaxud, narkotik maddələrdən istifadə olunması tarixi keçmişimizə, xalqımıza xas olan bir xüsusiyyət deyildir" [VIIIc.s.393].

Keçmiş illərə verilən qiymət böyük natiqin ritorik sualları ilə həyata keçirilir. "Şübhəsiz ki", qəti təsdiq modal sözünün

köməyi ilə verilən cavab lakonik şəkildə 1988-ci ildən bəri düşdüyümüz vəziyyəti analiz edir: "Bilirsiniz, keçmiş illəri, o illərdə baş vermiş hadisələri hər dəfə təkrarən yada salarkən – bu gün də biz bunları ətraflı yada saldıq – insan dəhşətə gəlir. ***Nə üçün bizim respublikamız belə günə düşməli idi? Nə üçün biz belə ağır vəziyyətdə olmalıydıq? Nə üçün xalqımız belə ağır faciələrlə üzləşməli idi?*** Şübhəsiz ki, bunun bir tərəfi bizdən asılı deyil. Ermənistanda olan ekstremist, terrorçu, separatçı, təcavüzkar qüvvələr çoxdankı niyyətlərini həyata keçirmək üçün 1988-ci ildə böyük fürsət əldə etdilər, bu fürsətdən məharətlə istifadə etdilər. Onlar əvvəl münaqişəyə başladılar, sonra isə bunu hərbi təcavüzə çevirdilər. ***Amma məsələnin ikinci tərəfi ondan ibarətdir ki, nə üçün Azərbaycan Respublikası, Azərbaycan dövləti, Azərbaycan hökuməti və Azərbaycan xalqı öz torpağını qoruya bilmədi, öz hüquqlarını qoruya bilmədi, öz respublikasını qoruya bilmədi?*** Əgər bu faciənin birinci tərəfi bizdən asılı deyildisə, ikinci tərəfi tamamilə bizdən asılı idi" [VIIc.s.274].

Böyük natiqin dilində səslənən ritorik suallar insanları sabahkı günə inama səsləyir, Azərbaycan xalqının elmi potensialının tükənmədiyi fikrini auditoriyalara aşılayır: "Mən hesab etmirəm ki, xalqımızın, bəstəkarlarımızın yaradıcılıq potensialı tükənibdir, yox. ***Bu gün də, sabah da əsərlər yaranacaq. Bəzən insanlar düşünürlər ki, bu olmasa biz necə yaşayacağıq?*** Amma sabah yeni bir istedad meydana çıxar. Əlbəttə, dahilər hər il yetişmir. Bu da təbiidir" [VIIc.s.165].

Ritorik suallarla Heydər Əliyev auditoriyanı keçmişə aparır, keçmişdəki vəziyyəti, situasiyanı göz önünə gətirir, müqayisələr aparmaq yolu ilə situasiyaya aydınlıq verə bilir: "Doğru deyirsiniz, mən bu işə qarışdım. Qraniti Ukraynadan çox çətinliklə gətirdik, bu abidəni qurduq, yaratdıq. İndi, sən deyirsən ki, orada bazardır. Ola bilər. ***Ancaq oradakı Sabunçu dəmir yol vağzalı vaxtilə nə vəziyyətdə idi?*** O zaman biz oranı

abadlaşdırdıq, yenidən qurduq, dəmir yol vağzalı ilə meydanı birləşdirdik. Tarixi abidə olan Sabunçu vağzalının binasını bərpa etdik" [VIIc.s.163].

Başqa bir məqamda ritorik sualla bazar iqtisadiyyatının nə dərəcədə faydalılığını sübuta yetirir, müstəqilliyin nə dərəcədə iqtisadiyyatımızın inkişafına kömək göstərdiyini bəyan edir: "Yaxud, indi mən buraya Dərnəgül yolu ilə ilə gəldim. Yolun o tərəfində də, bu tərəfində də xeyli taxta materialı satırlar. ***O vaxt biz bu qədər taxta gətirə bilərdikmi?*** Heç bir vaxt gətirə bilməzdik" [VIIc.s.216].

Ritorik suallardan öncə mövcud vəziyyət araşdırılır. Auditoriya bütün təfərrüatlarınadək vəziyyətlə tanış olur. Auditoriya ritorik suala hazırlanır. Ritorik suallara isə çox vaxt "yox" inkar ədatı ilə cavab verilir ki, natiqin tutduğu mövqeyin qətiyyətliliyindən və ciddiliyindən xəbər verir: "Yaxud elə üzümçülüyü götürək. Biz 1970-ci ildə 250 min ton üzüm toplamışdıq. Bu, mənim yaxşı yadımdadır. Sonra qalxdı 2 milyon tona, 1 milyon 800 min, 1 milyon 700 min tona. İndi bu il 192 min ton üzüm toplanıb. ***Belə şey olarmı?*** Tutaq ki, bəzi səbəblər olub. 1985-ci ildə sərxoşluğa qarşı mübarizə adı ilə üzüm bağlarını qırdılar, dağıtdılar. Amma indi mövcud olan bağlardan biz 2-3 dəfə bundan artıq üzüm götürə bilərdik. Götürə bilmirik. ***İndi yenidən o sistemə qayıdaq?*** Yox, dəfələrlə demişik ki, bu olmayacaq" [IIc.s.491]. Burada 90-cı illərdə sərbəst bazar iqtisadiyyatına keçidin zəruriliyindən xəbər verilir.

Ritorik suallarla çaşqınlıq içində olan tərəf-müqabillər sanki ayılır, bu suallar zülmət gecədə parlayan şimşək kimi inamsız qəlbləri işıqlandırır. "Bəs" sual ədatı, "əgər" şərt bağlayıcısından istifadə edərək Azərbaycandakı iqtisadi durumu Polşada yaşayan diaspor nümayəndələri üçün açıqlayır: "İndi Azərbaycan dünyanın bütün ölkələrinin iqtisadi maraq mərkəzinə çevrilibdir. ***Bəs Amerika Birləşmiş Ştatlarının o qədər neft şirkətləri Azərbaycana nədən ötrü gəliblər? Əgər Azər-***

***baycanda siyasi sabitlik, iqtisadi qanunlar, xarici sərmayənin gəlməsi üçün imkanlar olmasaydı, onlar Azərbaycana gələ bilərdilərmi?*** Onlar bizdən xahiş edirlər, bizə müraciət edirlər" [XIIc.s.95].

Heydər Əliyev müstəqilliyimizlə bağlı ictimai-siyasi vəziyyəti araşdırmağa xidmət edən ritorik suallar verir və bu ritorik suallara "ona görə ki" səbəb bağlayıcısının köməyi ilə cavab verir: "Tarixçilər yaxşı bilirlər ki, 23 ay ərzində bu dövlətin tərkibi beş dəfə dəyişib, bu dövlətdə, bu parlamentdə beş partiya iştirak edib: Müsavat Partiyası, İttihad Partiyası, Əhrar Partiyası, Sosialist Partiyası, hətta Daşnaksütyun Partiyası. Bu parlament sistemi dövlətin yaşamasına imkan vermədi və ayrı-ayrı qruplar, partiyalar arasında gedən çəkişmələr, çarpışmalar, intriqalar özü-özlüyündə bu dövlətin adına ləkə vurdu. ***Mən bunu nə üçün deyirəm?*** Ona görə ki, biz bundan ibrət dərsi almalıyıq" [Ic.s.154].

Heydər Əliyevin nitqində hər bir ritorik suala verilən cavab müstəqilliyimizin uğurunu göstərir, sanki bu suallarda müstəqilliyə gedən yol ehtiva olunur: "***Keçmiş dövrdə Olimpiya oyunlarında Sovetlər İttifaqının yığma komandasında heç vaxt Azərbaycandan 21 nəfərdən ibarət komanda iştirak etməmişdir. Nə üçün***? Əgər həmin Azərbaycan xalqıdırsa, gəncləridirsə, 15-20-30 il bundan qabaq da bu qədər ola bilərdi. Bu, onu göstərir ki, müstəqillik bütün başqa sahələrlə yanaşı, Azərbaycan xalqının, gənclərimizin idman, fiziki hazırlıq sahəsində də imkanlarını açır, geniş nümayiş etdirir" [VIIc.s.7].

Heydər Əliyevin nitqində ritorik suallar xüsusilə nöqsanlarla, çatışmazlıqlarla və neqativ hallarla bağlı keçirilən müşavirələrdə ortaya kəskin çalarlı ritorik suallar şəklində qoyulur. Sanki nöqsanların dərəcəsinə uyğun ritorik sualların sərtliyi arasında uyğunluq yaranır. Prezident sarayında əhalinin çörəklə təminatı sahəsində yaranmış çətinliklərin aradan qaldırılması məsələlərinə həsr olunmuş müşavirədəki (16 oktyabr 1994-

cü il) kimi: “Ancaq burada tamamilə doğru deyildi ki, baş nazir gündə üç dəfə müşavirə yığanda, orda boş-boş sözlər danışanda, axmaq işlərlə məşğul olarkən onun yanında oturan müavinlər ya ağızlarına su alırdılar, ya da ki, “baş üstə, baş üstə” deyirdilər. ***Məgər siz bu işləri görmürdünüz? O cümlədən, məgər nazirlər bu işləri, bu biabırçılıqları görmürdülər? Hesab edirdiniz ki, bütün bunlar belə davam edəcək və axırda da belə olacaq? Axırı gəlib çıxdı bu vəziyyətə: cəmiyyəti qarışdırdılar. Bu adamların işi nəyə lazımdır? Vəzifə də vermişik, səlahiyyət də vermişik – hər bir şey vermişik***” [IIc.s385]. “Məgər” sual ədatları ilə ritorik suallar daha da güclənərək situasiyanın ciddiliyini göstərir.

“Bəs” sual ədatlarının təkrar olunduğu ritorik sual cümlələri ardıcıl çaxan şimşəklər kimi qaranlıqların, yaramazlıqların üstünə düşür: “***Yaxşı, ziyalı da, yaxud şair, yazıçı da səsini qaldırmayanda bəs nə olsun? Bəs belə adamlarla yalnız Heydər Əliyev mübarizə aparmalıdır, hamı ilə Heydər Əliyev döyüşməlidir? Belə şeymi olar? Sən yazıçısan, bilirsən ki, rəhmətlik Nazim Hikmətin bir sözü vardır. Azərbaycanda onu dəfələrlə deyirdilər, ancaq bu gün yerinə düşür, yenə deyim: sən yanmasan, mən yanmasam, o yanmasa, bəs kim yanacaq? Bəs sənin yanmağın haradadır?***” [IIc.s.387].

Heydər Əliyevin nitqində xüsusilə Prezident Sarayında keçirilən müşavirələrdə ritorik suallardan geniş istifadə olunur, bu müşavirələrin hansı məqsədlə keçirilməsi auditoriyaya açıqlanır: “Məqsəd də ondan ibarətdir ki, görək bizim aqrar sektorda bu iqtisadi islahatlar necə gedir. Çünki artıq ilin 9 ayı qurtarıb, ilin sonuna 3 ay qalıbdır**.** ***İslahatlar necə gedir? Nə əldə etmişik, nəyə nail olmuşuq? Eyni zamanda, cari işlər necə gedir?*** Ona görə də belə bir müşavirənin keçirilməsini təklif etdim və bu gün belə fikirdəyəm ki, çox vaxtında çağrılmış, doğrudan da, lazımi, zəruri bir müşavirə idi” [VIIc.s.351].

Ritorik sual cümləsi ilə Heydər Əliyev Azərbaycan xalqının qeyri-azərbaycanlılara münasibətdə tolerantlığını dilə gətirir. Azərbaycanın ərazisində yaşayan hər bir şəxs üçün vətən olduğunu anladır: "***Dünən mənə sual verdilər, ruslar haqqında – 500 minə qədər rus var, ruslar sıxılıb indi, nə üçün? Axı, bunlar əsrlərlə burada yaşayan adamlardır, bunlar, Azərbaycanın vətəndaşıdırlar. Rus üçün, burada yaşayan, burada doğulmuş, dədəsi, babası burada doğulmuş, qəbri burada olan rus üçün bura vətəndir axı. Nə üçün indi hesab eləyək ki, bura kimin üçünsə vətəndir, kimin üçünsə vətən deyil?*** Azərbaycan bir respublika kimi, indi bir müstəqil dövlət kimi, öz ərazisində yaşayan hər bir şəxs üçün vətəndir" [Ic.s75]. "Nə üçün" sual əvəzliyi ilə başlayan ritorik suala "axı" qüvvətləndirici ədatı ilə emosional cavab verilir.

"Bəs" sual ədatı ilə böyük natiq cəmiyyətdəki deformasiya doğura biləcək məsələləri qınağa çəkir, ritorik sualla belə məsələləri tənqid atəşinə tutur. Sonra da "bax" qüvvətləndirici ədatla sualın cavabını verir: "***Mən onda düşünməyə başladım ki, belə halda bizdə deformasiya baş verə bilər, bəs həqiqətən yaxşı hüquqşünas ola biləcək istedadlı, qabiliyyətli insanlar nə etsinlər ki, onların valideynləri raykom katibləri, prokuror, milis rəisləri deyil?*** Bax, onda mən ixtiyarı öz əlimə alıb yüksək vəzifəli adamların uşaqlarının Azərbaycan Dövlət Universitetinin hüquq fakültəsinə qəbul edilməsinə qadağa qoydum" [IXc.s.100].

Ritorik suallar insanları düz yola çağırmaq, ağıla söykənməyə dəvət etmək məqamlarında ortaya çıxır. Mətbuat konfranslarında ulu öndərə verilmiş suallar elə ritorik suallarla cavablandırılır. Kütləvi informasiya vasitələrinin xalqı çaşdırmasına qarşı ciddi mübarizə aparır. Bu mübarizə ritorik sualların köməyilə həyata keçrilir: "Sual: İndi bəzi politoloqlar deyirlər ki, nəsə müəyyən bir ox, "Bakı-Tbilisi-Kiyev" üçlər ittifaqı yaranır. Belə üçlər ittifaqı haqqında nə demək olar?

Cavab: Deməliyəm ki, təəssüflər olsun, Rusiyanın bəzi kütləvi informasiya vasitələrində hər cür uydurma fikirlər söylənilir və bu fikirlər ölkənin ictimaiyyətini çaşdırır. Mart ayının axırlarında "Nezavisimaya qazeta"da hansısa bir mərkəzin aşkar fitnəkar, qızışdırıcı, açığını deyim, faşistpərəst hesabatı dərc edilmişdi. ***Məgər belə şey etmək olar? Rusiyanı xilas etmək üçün Azərbaycanı, Gürcüstanı məhv etməyə çağırırlar. Yaxud başqa bir misal. Bu yaxınlarda hansısa təşəbbüslərin Ermənistan-Rusiya mərkəzi "Zavtra" qəzetində xalqların arasını vurmağa, onların arasına nifaq salmağa çağıran dəhşətli bir məqalə dərc etmişdi. Bu, heç yaxşı olan işdir? Onlar nə kimi məqsəd güdürlər? Bəlkə bunun sayəsində sadəcə olaraq nəsə qazanmaq istəyirlər?*** Əgər onlar pul qazanmaq istəyirlərsə, onda qoy başqa, daha normal bir işdə pul qazansınlar" [IXc.s.256].

Siyasi məsələlərin çözülməsi yolunda ritorik suallar xüsusi önəm daşıyır. Öncə siyasi vəziyyət təkzibolunmaz dəlillərlə auditoriyaya çatdırılır, sonda isə ritorik sualla deyilən fikirlərə yekun vurulur: "Mən buna etirazımı bildirmişəm. Hətta Rusiyanın prezidentinə – dövlət başçısına da rəsmi olaraq bildirmişəm ki, biz Ermənistanda Rusiyanın hərbi bazasının yerləşməsinə etiraz edirik, Gürcüstanda da yerləşməsinə etiraz edirik. Çünki onlar bizimlə qonşu ölkələrdir. Biz Ermənistanda Rusiyanın hərbi bazasının yerləşməsinin heç bir mənası olmadığını deyirik. ***Yəni əgər Rusiya burada doğrudan da sülhsevər siyasət aparırsa, Ermənistan işğalçılıq siyasətindən əl çəkirsə, o hərbi bazaları orada yerləşdirmək nəyə lazımdır?*** " [IXc.s.410].

Nitqdə ritorik suallardan yeri gəldikcə istifadə etmək Heydər Əliyevin natiqliyinin bir xüsusiyyətidir. 20 sentyabr 1997-ci il tarixdə Azərbaycan Milli Dram Teatrında İlyas Əfəndiyevin "Hökmdar və qızı" tamaşasına baxdıqdan sonra teatrın yaradıcı kollektivi ilə görüşdə böyük natiq ritorik

suallardan çox istifadə edir. Hətta "Vaqif" pyesindən gətirdiyi nümunələrdə belə ritorik sualları məqamında işlədir: "***Vaqif, əlindəki o əsa nədir?" Cavabında isə Vaqif deyir ki, "Rusiya padşahı, o zülmkardan – Yekaterinadan bir hədiyyədir". Yenə də İbrahim xan deyir: De, sən hara, Rusiya hara, yoxsa satılmısan o kafirlara?"*** Bilirsinizmi, belə də yazılıbdır. Ona görə də bizim xalqımızı, millətimizi birləşdirmək üçün, bu çəkişmələrə son qoymaq üçün də bu əsər çox ibrətamizdir" [XIIc.s.161].

Səməd Vurğunun "Vaqif" pyesindəki xanlar arasındakı çəkişmələr ritorik suallarla auditoriyaya çatdırılır. Növbəti nitq mərhələsində 1988-ci ildən bəri üzləşdiyimiz siyasi çəkişmələr xanlıqlar dövrü ilə müqayisə edilir, buraxılmış səhvlər və nöqsanlar analiz olunur. Bu müqayisələr, bu analizlər ritorik suallarla möhkəmləndirilir: "***Bu çəkişmələr dünən də vardı, bu gün də var. 1988-ci ildən xalqımızın başına gələnlər, ermənilərin Azərbaycana təcavüz etməsi, Dağlıq Qarabağ məsələsini qaldırması nəyin nəticəsində oldu? Azərbaycanın içində gedən çəkişmələrin nəticəsində oldu. Əgər o vaxt Azərbaycan xalqı birləşsəydi, hamı bir olsaydı, ermənilərin qarşısını almaq mümkün olmazdımı? Onda torpaqlarımız işğal oluna bilərdimi?***" [XIIc.s.161].

Yuxarıda üç yerdə ritorik sual verilir. Sonda isə 4-5 cümlə ilə bütöv bir dövrə, bütöv bir ictimai-siyasi dövrə qiymət verilir: "Bunun bir qismi mənim həyatımla da bağlıdır. Məlumdur ki, mən Moskvada oturmuşdum və Azərbaycanı da müdafiə edirdim. Ancaq ermənilər bir tərəfdən, bizim Azərbaycandakı bədbəxtlər də bir tərəfdən Heydər Əliyevi Kremldən kənarlaşdırdılar. Məni kənarlaşdırandan 20 gün sonra bu hərəkat başlandı, üç aydan sonra Qarabağ faciəsi baş verdi. Məlumdur, mən demirəm ki, çox şey edə bilərdim. Çox şey də etmişdim. Bu Qarabağ hadisələri dəfələrlə qalxmışdı. Vaxtilə

mən, məndən qabaqkı insanlar da bunun qarşısını almışdıq. Almağa da imkanımız var idi” [XIIc.s.161].

Sonra yenə də qısa ritorik sual və qısa lakonik cavab verilir: “***Bəs nə üçün belə oldu?*** Çəkişmələr nəticəsində” [XIIc.s.162].

Ritorik sual cümlələri işgüzar xarakterli məişət üslublu nitqlərdə də özünü göstərir. 23 dekabr 1997-ci ildə Prezident sarayında “Sosial-iqtisadi problemlərin həllinə, əhalinin təchizatını yaxşılaşdırma məsələlərinə həsr olunmuş” müşavirədə ritorik suallar icra strukturunda çalışan dövlət məmurlarına yönəlir. Təkcə bu ritorik suallar bu gün də icra strukturları üçün örnək, nümunə sayıla biləcək nitq nümunələrinin əsasını təşkil edə bilir: “Bakı şəhəri hər şeydə nümunə olmalıdır. Yenə də deyirəm, böyük-böyük rayonlar var, onların hər birində böyük-böyük təşkilatlar yerləşir. ***Rayon icra hakimiyyətləri nədən ötrüdür? Mən onların başçılarını buraya dəvət etmişəm, onlar bunu bilməlidirlər. Bu vəzifəni niyə, nədən ötrü daşıyırlar? Əgər elektrik, qaz, su təchizatı, nəqliyyat, kommunal xidmətini təmin edə bilmirlərsə, onlar orada nə iş görürlər? Sənaye planı yoxdur ki, deyək, onu yerinə yetirirblər, başqa plan da yoxdur. Onlar nə iş gorürlər?***” [XIIIc.s.448].

Məişət üslublu nitqlərdə belə Heydər Əliyev dilində ritorik suallar işə düşür. Belə ki, 25 mart 1997-ci il tarixində Ukraynadakı Azərbaycan diasporunun nümayəndələri ilə görüşdə sadə, ümumişlək sözlər əsasında yaradılan ritorik suallarla auditoriyaya müraciət edir: “***Dedilər ki, burada yaşayan azərbaycanlıları bəzən incidirlər. Onları kim, necə incidir? Bu gün mən Ukrayna Prezidenti ilə görüşəcəyəm, ona nə deməliyəm? Deməliyəm ki, kimi, necə incidiblər?***” [IXc.s.72].

Ritorik sual cümlələri məişət üslublu nitqlərdə bir ağsaqqal qınağı kimi səslənir. 15 yanvar 1997-ci il tarixdə Parisdə Azərbaycan icmasının nümayəndələri ilə görüşdəki kimi: “Deyilənə görə, Fransada çox az azərbaycanlı yaşayır. Mən

müxtəlif ölkələrdə səfərə gedəndə həmişə azərbaycanlılarla görüşürəm. ***Soruşuram ki, niyə bəs az görüşürsünüz? Cavab verirlər ki, bir-birimizlə əlaqələrimiz o qədər də yaxşı deyil. Mən hər yerdə – Almaniyada da, Belçikada da, İngiltərədə də və başqa ölkələrdə də azərbaycanlıların bir-biri ilə əlaqəsinin zəif olduğunu gördüm***" [VIIIc.s.322].

Nəhayət, Heydər Əliyevin nitqlərində ritorik sulların bir sıra xüsusiyyətlərini aşağıdakı kimi göstərmək olar:

– Ritorik sual cümlələri Heydər Əliyev üçün incə, dərin mətləbləri çatdırmaq yolunda mühüm vasitədir;

– Heydər Əliyevin nitqində ritorik suallar auditoriyanı fikirləşməyə, düşünməyə, nəticə çıxarmağa sövq edən suallardır;

– Heydər Əliyevin nitqində ritorik suallar əksər hallarda sual ədatları ilə formalaşsa da, bir sıra hallarda sual intonasiyası ilə yaradılır;

– Ritorik sual cümlələrin köməyi ilə Heydər Əliyev xarakteri milyonlar üçün açılır;

– Böyük natiqin dilində ritorik sual cümlələri əksər təsadüflərdə ictimai-siaysi vəziyyət və yaxud sadəcə hansısa situasiya tam aydınlaşandan sonra sonda işlədilir;

– Bir qisim hallarda Heydər Əliyevin nitqində situasiyalardan öncə ritorik suallar gəlir. Bir qisim hallarda isə öncə situasiya auditoriya üçün aydınlaşdırılır, sonra bu situasiyanın yaddaşlarda möhkəmlənməsi üçün ardıcıl olaraq ritorik suallar verilir;

– Ritorik suallarla Heydər Əliyev auditoriyanı keçmişə aparır, keçmişdəki vəziyyəti, situasiyanı göz önünə gətirir, müqayisələr aparmaq yolu ilə situasiyaya aydınlıq verə bilir;

– Ritorik sual bəzi hallarda "xatırlayın" ifadəsi ilə keçmiş zamana aid olur. Belə ritorik sualla böyük natiq keçmişdə baş verən hadisələri auditoriyanın gözü qarşısında canlandırır;

– Ritorik suallardan öncə mövcud vəziyyət araşdırılır. Auditoriya bütün təfərrüatlarınadək vəziyyətlə tanış olur, auditoriya ritorik suala hazırlanır;

– Böyük natiqin auditoriyaya ünvanladığı ritorik suallar çaşqınlıq içində olan tərəf-müqabilləri sanki ayıldır və bu suallar zülmət gecədə parlayan şimşək kimi inamsız qəlbləri işıqlandırır;

– Heydər Əliyev müstəqilliyimizlə bağlı ictimai-siyasi vəziyyəti araşdırmağa xidmət edən ritorik suallar verir və bu ritorik suallara "ona görə ki" səbəb bağlayıcısının köməyi ilə cavab verir;

– Heydər Əliyevin nitqində ritorik suallar xüsusilə nöqsanlar, çatışmazlıqlarla və neqativ hallarla bağlı keçirilən müşavirələrdə ortaya kəskin çalarlı ritorik suallar şəklində qoyulur;

– Siyasi məsələlərin çözülməsi yolunda ritorik suallar xüsusi önəm daşıyır. Öncə siyasi vəziyyət təkzibolunmaz dəlillərlə auditoriyaya çatdırılır, sonda isə ritorik sualla deyilən fikirlərə yekun vurulur;

– Ritorik sual cümlələri işgüzar xarakterli məişət üslublu nitqlərdə də özünü göstərir;

Beləliklə, Heydər Əliyevin nitqlərində və çıxışlarında istifadə edilən ritorik sualların araşdırılması göstərir ki, ulu öndər belə sualları istifadə edərkən onlara cavab almaq məqsədi güdmür. Verilmiş ritorik sualların təsdiqi və ya inkarı nitqin emosionallığını daha da artırmaq və gücləndirmək üçün bir vasitə rolunu oynayır.

# VIII FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ MÜRƏKKƏB CÜMLƏ

Təfəkkür abstraksiyası, hissi-emosional – bir sözlə insan ağlı ilə dərk olunmuş bütün reallıq öz maddi formasını dildə tapır. Hər hansı bir dilin qrammatik quruluşu öyrənilərkən onun müxtəlif yaruslarına iki cəhətdən yanaşmaq tələb olunur: bunlardan birincisi, həmin dildə mövcud olan semantik imkanların məcmusu, ikincisi isə həmin imkanlıarı reallaşdıran müxtəlif strukturlarda ifadə edən qrammatik formalardır.

Ümumiyyətlə qrammatikaya qeyri-semantik münasibət, qrammatik formanın semantikadan təcrid olunmuş şəkildə götürməyin mümkün olmadığı əksər tədqiqatçılar tərəfindən qeyd edilir. Mürəkkəb cümlələrin, o cümlədən tabeli mürəkkəb cümlələrin qrammatik təbiətinə məhz semantik-qrammatik mövqedən yanaşılması onun quruluş tiplərinin daha düzgün müəyyənləşdirilməsini şərtləndirir.[1]

Nitqin kamilliyi, zənginliyi dedikdə natiqin böyük həcmdə aktiv söz ehtiyatına malik olması, eləcə də, morfoloji formalar və sintaktik konstuksiyalardan yerindəcə yararlanması başa düşülür[2] ki, Heydər Əliyevin nitqində mürəkkəb cümlələrin hansı zaman və məkan kontekstində, auditoriyanın çeşidindən asılı olaraq işlənməsi dilçilik sahəsində maraqdoğuran məsələlərdəndir.

---

[1] Məmmədova X.İ., Cavadova Ə.H. Tabeli mürəkkəb cümlələrin semantik-qrammatik xüsusiyyətləri. Bakı, Mütərcim, 2000. səh. 76.

[2] Введенская Л.А., Павлова Л.Т., Кашаева Е.Ю. "Культура речи государственного служащего". – Ростов н/Д: Феникс, 2011. 473 с.
Исмаилова Лариса. Основные проблемы культуры речи в СМИ // Filologiya məsələləri, №7, 2007. səh. 101.

Araşdırmalar Heydər Əliyevin nitqlərində mürəkkəb cümlənin üstün yer tutduğunu göstərir. Professor Adil Babayevə görə, fonosintaksisin əsas problemlərindən biri də mürəkkəb cümlələr arasındakı informasiyanın qurulmasından ibarətdir. Məlumdur ki, pauzanın böyüklüyündən, intonasiyadan asılı olaraq mürəkkəb cümlə tabeli və tabesiz ola bilər. Pauza kiçik olduqda isə budaq cümləli tabeli mürəkkəb cümlə üstünlük təşkil edir.

Komponentlərinin istər sintaktik-qrammatik, istərsə də məntiqi cəhətdən qarşılıqlı əlaqə və münasibətlərinə görə mürəkkəb cümlələri iki qrupa bölmək olar:[1]

1. Tabesiz mürəkkəb cümlələr
2. Tabeli mürəkkəb cümlələr

Bərabər hüquqlu sadə cümlələrin birləşməsindən yaranan mürəkkəb cümlələrlə tabesiz mürəkkəb cümlələrin tərkib hissələri arasında, əsasən, aşağıdakı məna əlaqələri olur:

1. Zaman əlaqəsi
2. Ardıcıllıq əlaqəsi
3. Səbəb-nəticə əlaqəsi
4. Aydınlaşdırma əlaqəsi
5. Qarşılaşdırma əlaqəsi
6. Bölüşdürmə əlaqəsi

Müasir Azərbaycan dilində, eləcə də türk dilli xalqların dilçılərinin bu gün mühüm əhəmiyyət verdikləri bir məsələ də dilçilikdə mürəkkəb cümlə məsələsidir: "Sintaksislə məşğul olanlar belə nəticəyə gəlmişlər ki, tabeli mürəkkəb konstruksiyanın hissələri məna və intonasiya bitkinliyinə görə müstəqil

---

[1] Babayev Adil. Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, "Elm və təhsil", 2011. 620 səh.

işlənən cümlələrdən təbii olaraq fərqlənsə də, cümləyə xas əsas əlamətləri mühafizə edib saxlayır "[1]

Azərbaycan dilinin zəngin ifadəlilik imkanlarını özündə əks etdirən, geniş, əhatəli məzmuna və quruluş xüsusiyyətlərinə malik mürəkkəb cümlələr bədii fikrin estetik tələblərə müvafiq ifadəsini şərtləndirən amillərdəndir.[2]

Məntiqi ardıcıllığın bütün nitqlərinə hakim kəsildiyi Heydər Əliyevin dilində ardıcıllıq əlaqəli tabesiz bağlayıcılı mürəkkəb cümlələr heç də az işlənmir: "Mən sizi səmimi qəlbdən salamlayıram və yazıçılar qurultayının işinin müvəffəqiyyətlə getməsi münasibətilə sizi ürəkdən təbrik edirəm" [XIIIc.s.97].

Başqa bir çıxışda intonasiya ilə özünü göstərən tabesiz mürəkkəb cümlə işə düşür: "Mən inşaat işləri aparılan yerlərə gedirdim, çox vaxt keyfiyyətin aşağı olması ilə əlaqədar ən ciddi tədbirlər görürüdüm" [XIIIc.s.204].

Tabesiz mürəkkəb cümlənin komponentləri bir-biri ilə semantik (məna əlaqələri) qrammatik (bağlayıcılar, işarə əvəzlikləri, mənsubiyyət şəkilçiləri və s.) və fonetik (vahid intonasiya və s.) vasitələrlə əlaqələnir.

Heydər Əliyevin nitqində müşahidə olunmuş tabesiz mürəkkəb cümlə konstruksiyaları göstərilən qanunauyğunluqlar əsasında formalaşsa da bir çox özünəməxsusluqlarla zəngindir.[3]

---

[1] Abdullayev Ə.Z. Sintaksisin aktual məsələləri (tabeli mürəkkəb cümlənin tədqiqi). Dərs vəsaiti. Bakı, 1987. 84 səh

[2] İslamzadə Məsudə. Bədii nəsrdə mürəkkəb konstruksiyaların üslubi-semantik xüsusiyyətləri. AMEA-nın xəbərləri, Humanitar elmlər seriyası, 2007. №2, səh.81-93.

[3] Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili. Bakı, "Elm", 1998. 196 s.

### *Tabesiz mürəkkəb cümlə zaman əlaqəli*

Bu tip cümlələr böyük natiqin məişət üslublu söhbətvari nitqləri üçün xarakterikdir: "Ailə özövladını əsgərliyə göndərəndə məclis qururdu, onu təntənə ilə yola salırdı, ona xeyirdua, sədaqətlə xidmət etmək nəsihəti verirdi" [VIIIc.s.390].

Bu tip mürəkkəb cümlələrdə hadisələr eyni zamanda baş verir: "İndi bu məsələ bütün dünyanın işgüzar dairələrinin diqqət mərkəzindədir və Xəzər dənizinin energetika ehtiyyatları dünyanın bütün ölkələrinin diqqətini cəlb edir" [XIIc.s.255].

"İndi" sadə zaman zərfi ilə cümlənin başlaması indiki zamanda cərəyan edən ictimai-siyasi hadisələri auditoriyalara çatdırmaqda mühümdür.

Zaman əlaqəli tabesiz mürəkkəb cümlələrin tərkib hissələrində eyni zamanda baş verən hadisələr sadalanır.

Heydər Əliyevin nitqində zaman əlaqəli tabesiz mürəkkəb cümlələri iştirak bağlayıcıları ən çox "həm", "həm də"-nin köməyi ilə həyata keçirilir: "Bu münaqişələr nəinki müstəqil dövlətlərin inkişafını ləngidir, hələ möhkəmlənməmiş demokratik cəmiyyətlərin varlığı üçün birbaşa təhlükə doğurur, həm də bütün dünyada sülh və təhlükəsizlik üçün qorxu yaradır".

Yuxarıdakı tabesiz mürəkkəb cümlə həm bağlayıcısız, həm də bağlayıcılı özünəməxsus çalarlar qazanır.

Tabesiz mürəkkəb cümlədə sadə cümlələr həm intonasiya, həm də "və" bağlayıcısı ilə birləşir: "Yusif Məmmədəliyev heç vaxt unudulmayacaq, zaman keçdikcə onun Azərbaycan xalqının tarixindəki yeri daha da açıq görünəcəkdir və insanlar, gələcək nəsillər Azərbaycanın belə şəxsiyyətləri ilə fəxr edəcəkdir" [VIIc.s.298].

"Və" bağlayıcısı ilə yaranan tabesiz mürəkkəb cümlələr Heydər Əliyevin nitqində müxtəlif çeşidli auditoriyalarda işlədilir: "Mən sizi bir daha salamlayıram və Azərbaycan ilə öz ölkələriniz arasındakı əlaqələrin inkişaf etməsi üçün sizdən daha böyük səylər göstərməyinizi xahiş edirəm" [IXc.s.285].

Mən inşaat işləri aparılan yerlərə gedirdim, çox vaxt keyfiyyətin aşağı olması ilə əlaqədar ən ciddi tədbirlər görürdüm [XIIIc.s.204].

Tabesiz mürəkkəb cümlələrin bir qismində onu əmələ gətirən sadə cümlələr yalnız intonasiya ilə bir-birinə bağlanır. Burada ardıcıllıq məna növündə istifadə olunmuşdur.

Heydər Əliyevin nitqində tabesiz mürəkkəb cümlələrdə ardıcıllıq və zaman əlaqələrini bəzən ayırmaq çətin olur: "Mən xalqın dəvəti və iradəsi ilə o vaxt Bakıya gəldim, Azərbaycandakı bu ağır vəziyyəti aradan qaldırmaq üçün fəaliyyətə başladım" [IIc.s.282].

Ardıcıllıq əlaqəli tabesiz mürəkkəb cümlələrdə qətiyyət bu ardıcıllığa hopur: "Biz bütün bu təbəqələrdən olan insanların yaşayışını nəzarət altında saxlamalıyıq, onların hər birinin sosial təminatını günü-gündən yaxşılaşdırmağa çalışmalıyıq" [XIIIc.s.210].

Heydər Əliyevin nitqlərində mürəkkəb kompozisiyalı tabesiz mürəkkəb cümlələrə təsadüf edilir: "Biz Azərbaycan neftçilərinin əmək fəaliyyəti, qəhrəmanlığı ilə, ağlı, zəkası, iş təcrübəsi, fədakarlığı ilə həmişə fəxr etmişik və müstəqil Azərbaycanın prezidenti kimi mən də Azərbaycan neftçilərinin həm tarixi keçmişi, həm də bugünkü fədakar, qəhrəman əməyi ilə fəxr edirəm" [IIc.s.150]. Bu nümunədə "və" birləşdirmə, eləcə də "həm", "həm də" iştirak bağlayıcılarının köməyi ilə üç cümlə işlənmişdir. Azərbaycan neftçilərinin qiyməti sinonim cərgələrlə – "ağıl, zəka", "fədakarlıq, qəhrəmanlıq" – auditoriyaya ünvanlanır. Bu böyük cümlə bağlayıcılarla, sinonimlərlə bəzənərək auditoriyanı növbəti nitq mərhələsinə hazırlayır.

"Naxçıvanın çox sərt iqlimi var, qışda güclü şaxta olur" [IIc.s.154].

### *İntonasiya ilə ayrılan mürəkkəb cümlə tipi*

“Həm Azərbaycanın daxilində, həm ölkəmizin xaricində olan, Azərbaycandan qaçmış, indi burada təxribat aparmaq istəyən qüvvələr, həm də Azərbaycanın daxilində onlarla əlbir olan qüvvələr, onların himayəsi altında olan qüvvələr bilsinlər, onların hamısı xalq qarşısında cavab verəcəklər” [IIc.s.379].

Bu tip cümlələrdə Heydər Əliyev “yəni aydınlaşdırma bildirən bağlayıcısından müvəffəqiyyətlə istifadə edir: “Əlbəttə, hər bir faydalı fikirdən, hər bir faydalı rəy və təklifdən istifadə edəcəyik, yəni Azərbaycanın hər bir sahibkarı özünü respublika iqtisadiyyatının bir hissəsi bilməli və ökənin iqtisadi tərəqqisi üçün səylər göstərməlidir” [IIc.s.313].

Zaman əlaqəli tabesiz mürəkkəb cümlələr çox vaxt iştirak bağlayıcılı olur: “45 il bundan öncə, 1949-cu ilin sonunda-noyabr ayında həm Azərbaycan neftinin tarixində, həm də, tam qətiyyətlə demək olar ki, dünya neft sənayesinin tarixində ilk dəfə Azərbaycan neftçiləri dənizdən yanacaq çıxarmağa başlamışlar, neft fantan vurmuşdur” [IIc.s.150].

Heydər Əliyev nitqində “beləliklə” yekunlaşdırıcı modal sözü tabesiz mürəkkəb cümlənin “və” bağlayıcı ilə özünü qabarıq göstərir: “Beləliklə, Azərbaycan altı ildir dövlət müstəqilliyi şəraitində yaşayır və belə bir böyük xarici təcavüz nəticəsində ölkəmiz çətin vəziyyətə düşmüşdür” [IXc.s.315].

“Hamınız şəxsi işlərlə məşğul ola bilirsiniz, lakin mədəniyyətimizin belə bir incisi bu günə düşmüşdür” [IIc.s.101].

Mürəkkəb cümlənin inkişafı mərhələlərində tabeli mürəkkəb cümlələr tabesiz mürəkkəb cümlələrə nisbətən kəmiyyətcə çoxluq təşkil etmişdir. Çünki təfəkkürün inkişaf prosesi tabesiz mürəkkəb cümlələrin semantikasında səciyyələnən cəhətlə: nəyin isə təsdiqi və ya inkarı, qarşılaşdırılması, müqayisəsi, nəticəsi ilə kifayətlənə bilməzdi; bu zaman həm də tabeli mürəkkəb cümlələrin yaranması zərurətə çevrilir ki, burada məsələnin şərti, səbəb-nəticə əlaqəsi, zamanı, məkanı göstə-

rilərək bu irəli sürülən səciyyə ilə əlaqədar ümumiləşmiş fikir söyləməyə də imkan yaranır.[1]

Böyük natiqin nitqlərində tabeli mürəkkəb cümlənin müxtəlif növləri ardıcıl şəkildə düzülərək, fikirlərin dolğun şəkildə şüurlara çatdırılması yolunda mühüm vasitəyə çevrilir: "Amma bir halda, ***əgər*** dünyada 40 milyon azərbaycanlı yaşayır***sa***, onlar azərbaycanlı adı daşıyırlar***sa***, onlarda azərbaycanlı qəlbi, qanı var***sa***, bu, hamımızın fəxridir. Mən demirəm ki, bu 40 milyon azərbaycanlının hamısı bir yerə yığışsın, bu heç də lazım deyil. Ancaq hamısının qəlbi, fikri, gələcəyə baxışı və Azərbaycan haqqında fikirləri bir olsa əlbəttə ki, respublikamız da öz müstəqilliyini bundan sonra da möhkəmləndirər, inkişaf yolunu məharətlə keçə bilər və ölkəmizin hüdudlarından kənarda yaşayan soydaşlarımız bundan da yaxşı həm yaşaya, həm işləyə, həm də Vətənimiz, xalqımız üçün çox işlər görə bilərlər. Ona görə də, birlik adi bir şey deyil. Bəzən bu "birlik" sözünü o qədər işlədirlər ki, o, hörmətdən düşür. Çünki elə hər bir adam deyir ki, birlik olsun. Mən Azərbaycan prezidenti kimi, xalqımızın mənə göstərdiyi etimada güvənərək respublikamıza başçılıq edən bir şəxs kimi bu gün deyirəm: Azərbaycanın özündə də bu günümüzün, gələcəyimizin zəmanəti rəhni birlikdir və bütün dünyada da soydaşlarımızın bir olması vacibdir" [VIIIc.s.17].

"Əgər" şərt bağlayıcısı və *-sa* (4) şəkilçisi ilə bağlanan şərt budaq cümləli tabeli mürəkkəb cümlə ilə başlanan yuxarıdakı nitq parçası sonda mübtəda budaq cümləli tabeli mürəkkəb cümlənin köməyi ilə diaspor nümayəndələrini səfərbər edir. Şərt budaq cümləli tabeli mürəkkəb cümlə ilə diaspor nümayəndələri "xalqımız üçün", "vətənimiz üçün" ciddi işlər görməyə dəvət olunurlar. Azərbaycan diasporu qarşısında qo-

---

[1] Əlizadə Z.Ə. Azərbaycan dilində tabeli mürəkkəb cümlə məsələləri (Elmi əsərlərin tematik məcmuəsi), Bakı, 1983. s.17-22.

yulan “birlik” ideyası məqsəd (ona görə də), kəmiyyət (o qədər) və mübtəda budaq cümləli tabeli mürəkkəb cümlələrlə yekunlaşır.

M.Hüseynzadə fel formalarından bəhs edərkən *-sa, -sə* şəkılçiləri ilə əmələ gələn şərt şəklinin o biri şəkillərdən fərqli olaraq yalnız tabeli mürəkkəb cümlələrdə işləndiyini və bir qayda olaraq budaq cümləlləri baş cümləyə bağladığını göstərmişdir.[1]

Heydər Əliyevin nitqlərinin əsasını elmi üslub təşkil edir ki, bu üslub mürəkkəb cümlələr üzərində qurulur.

Elmi üsluba aid ekstralinqivistik əlamətlərin meydana çıxmasında sintaktik vasitələrin də mühüm rolu vardır. Elmi üslubda bu təzahür formaları iki cəhətdən özünü göstərir: a) sözlərin sırası. b) elmi üsluba məxsus standart ifadələr.

Bu standart ifadələr içərisində Heydər Əliyevin nitqində cümlənin əvvəlində “məlumdur”, “qeyd edilməlidir”, “müəyyən edilmişdir”, “bütün bunlar göstərir”, “göründüyü kimi”, “doğurdan da”, “şübhəsiz”, “doğrudur”, “bunlardan əlavə” standart ifadələri cümlənin ortasında isə “çox ehtimal”, “göründüyü kimi” ifadələri işlənir. Cümlənin sonunda isə istifadə “istifadə etmək”, “təmin etmək”, “nəzərə çarpmaq” felləri standart ifadələri işlədilir.[2]

Böyük natiqin çıxışlarında səbəb və şərt budaq cümləli tabeli mürəkkəb cümlələr daha fəal müşahidə olunur. Bunlar Heydər Əliyevin hadisələri əsaslandırma meylindən irəli gəlir.

Klassiklərin yaradıcılığında şərt budaq cümlələrinin araşdırılması ilə Heydər Əliyevin nitqindəki mürəkkəb cümlələrin müqayisəsi müasir Azərbaycan dili ilə qədim dilimiz arasındakı varisliyin – dil tariximizin öyrənilməsi baxımından çox

---

[1] Hüseynzadə M. Müasir Azərbaycan dili, Bakı, “Maarif”, 1973. 358 səh.
[2] Ağayeva İ.S. Bədii və elmi üslub. Bakı, Maarif, 1988. səh. 22-30.

mühümdür. İlkin Quliyevə görə[1] XIV əsrdə yaşayıb-yaratmış Qazi Bürhanəddinin divanında şərt budaq cümləli tabeli mürəkkəb cümlələrin üç tipi ayırd olunur:

1) Sintetik şərt budaq cümlələri;

Ol dilbəri-ziba yenə bir naza düşər***sə,***
Tən etmə, saçunda könülüm aza düşər***sə.***

2) Analitik şərt budaq cümlələri; Şairin dilində işlənmiş bu tip budaq cümlələr ***əgər//gər, əgərçi, şimdi ki*** bağlayıcısı, “ki” ədatı vasitəsi ilə baş cümləyə bağlanmışdır:

Şəha, xəttin yazar gül səfhəsində
***Əgər*** bir nöqtə şərhindən yazaram.

Elə buradaca “əgər” bağlayıcısının ədəbi dilimizdə rolunun azalmasını qeyd edənlərin əksinə olaraq Heydər Əliyevin dilində bu nitq hissəsinin zənginliyinin şahidi oluruq.

3) Analitik-sintetik şərt budaq cümlələri; Bu tip cümlələr ***əgər//gər*** bağlayıcısı və ***-sa, -sə*** şəkilçisinin və ya “isə” köməkçi sözünün birgə işlənməsi ilə formalaşmışdır:

*Gər derlər isə ki, gözüm özgəyi görəsin,*
*İnanmagil ol sözə ki, düşmən xəbəridir.*[2]

Mübtəda budaq cümləli tabeli mürəkkəb cümlələrdə bir çox hallarda böyük natiqin nitqində budaq cümlənin xəbərində -*sa*, -*sə* şəkilçiləri olur: “Kim qəbul imtahanlarından keçə bilirsə, o da ali məktəb tələbəsi olur” [IIc.s.103].

“Kim isə hesab edir ki, iqtisadi islahatları bir günə, iki günə, bir aya, iki aya, üç aya həyata keçirmək, ondan istədiyimiz nəticəni əldə etmək olar” [IIc.s.489].

---

[1] Quliyev İlkin. Qazi Bürhanəddinin dilində şərt budaq cümləli tabeli mürəkkəb cümlələr. Filologiya məsələləri, №2, 2007, səh. 91-96.
[2] Bürhanəddin Qazi. Divan (Tərtib edəni: Ə.Səfərli). Bakı, Azərnəşr, 1998. 656 səh.

Xəbər budaq cümləsi baş cümlədə işarə əvəzliyi ilə ifadə olunan xəbəri izah edib aydınlaşdırır. Xəbər budaq cümləli tabeli mürəkkəb cümlələrin baş cümləsində xəbərin yerində, odur, budur, elədir, belədir, o idi, bu idi, elə idi, belə idi, o oldu, bu oldu, buradadır, oradadır, onun üçündür, bunun üçündür, ona görədir, buna görədir, ondan ötrüdür, bundan ötrüdür, ondan ibarətdir və s. kimi söz və ifadələr – qəlib sözlər işlənir.

Heydər Əliyevin nitqlərində aydınlaşdırmaq, izah etmək xarakterikdir: “Sevindirici hal ***odur ki,*** artıq Azərbaycanda dağıdıcı, pozucu proseslərə son qoyulubdur” [XIIIc.s.202].

Bu tip cümlələrdə auditoriya böyük natiqin “odur ki” ifadəsini eşidərkən özü-özünə “nədir” sualını verir və növbəti budaq cümlənin köməyi ilə cavab alır.

“Digər böyük nəaliyyət də ***odur ki,*** artıq üç ildir hərbi əməliyyatlar yoxdur, qan tökülmür” [IXc.s.105].

“Dövləti hüquqi, əsl demokratik dövlət etmək üçün qanunlar, digər tədbirlər gərəkdir. ***Odur ki,*** biz bu yolla gedirik” [IXc.s.103].

Heydər Əliyevin nitqlərində çox vaxt şərt bağlayıcısı və -sa şəkilçisi ilə bağlanan şərt budaq cümləli tabeli mürəkkəb cümlənin ardınca xəbər budaq cümləli tabeli mürəkkəb cümlə gəlir: “Əgər ideya gerçəkliyə ***uyğun gəlmirsə,*** bu hələ o demək deyil ki, ideya düzgün deyil. ***Odur ki,*** bütün dövlətlər, təşkilatlar və insanlar hərəsi öz səviyyəsində sülhün bərqərar olmasına və onun qorunub saxlanmasına çalışmalıdırlar” [XIIc.s.149].

Xəbər budaq cümləli tabeli mürəkkəb tabeli mürəkkəb cümlələrdə böyük natiq auditoriyanı “odur ki” ifadəsi ilə məlumatlandırır: “Bu jurnalın ən gözəl xüsusiyyətlərindən biri də odur ki, bizim çoxlarımızın həyatımızda olan, bəzən görmədiyimiz gözəl hadisələri gedir tapır, çıxarır, öz səhifələrində göstərir” [XIIIc.s.222].

“Məni sevindirən bir də ***odur ki,*** bu mükafat məhz Türkiyə Cümhuriyyətinin mükafatıdır” [IXc.s.280].

Xəbər budaq cüməli tabeli mürəkkəb cümlələrdə “odur ki” budaq cümləsi böyük natiqin nitqində özünə yer alır: “Odur ki, biz bunu müdafiə etməli, tətbiq etməli və daha da səmərəli şəklə salmalıyıq” [IIc.s.105].

“Odur ki” ifadəsi əksər təsadüflərdə yekunlaşdırmaq məqamlarında işlədilir: “Odur ki, bu tədbirlərimiz paralel surətdə həyata keçirilməlidir” [IIc.s.116].

Bəzən auditoriya tərəfindən ritorik sual təkin qavranıla biləcək xəbər budaq cümləli tabeli mürəkkəb cümlələr Heydər Əliyevin nitqlərində qüvvətləndirici ədatlarla başlayır: “Ən sevindiricisi, önəmlisi odur ki, bu yaşayış evi, mənzillər, vətənimizin torpaqlarımızın müdafiəsində şəhid olmuş qəhrəman insanların ailə üzvlərinə, vətənin müdafiəsində döyüşmüş, qəhrəmanlıq göstərmiş, şikəst, əlil olmuş insanlara verilir, onlar üçün tikilmişdir” [XIIIc.s.203].

“Xoşbəxtlik odur ki, insan 70 yaşında vəfat edib, amma 30 il də ondan sonra yaşayır” [VIIc.s.259].

Xəbər budaq cümləli tabeli mürəkkəb cümlə bir sıra hallarda böyük natiqin ritorik suallarına verilən cavablar kimi dəyərləndirilir: “İnsanın xöşbəxtliyi nədir?” [VIIc.s.259].

Tamamlıq budaq cümləsi ya baş cümlədə əvəzliklə ifadə olunmuş tamamlığı izah edir, ya da baş cümlədə olmayan tamamlığın vəzifəsini yerinə yetirir.

Heydər Əliyevin nitqlərinə izahediciliyin hakim olduğunu nəzərə alsaq yuxarıdakı tərifin birinci hissəsinə daha çox təsadüf edirik (tamamlığı izah edir): “Məlumat üçün bildirmək istəyirəm ki, Yaponiya artqı bizim iki böyük neft müqaviləmizdə iştirak edir və Azərbaycanın neft sənayesinin inkişafına investisiya qoyur” [XIc.s.258].

“Güman edirəm ki” ifadəsi ilə yanaşı “ümidvaram ki” ifadəsi də auditoriyanı nikbin bir əhval-ruhiyyəyə kökləyir: “Ümidvaram ki, müharibəyə son qoyulacaq, torpaqlarımız tamamilə azad edilərək ölkəmizin bütövlüyü təmin olunacaq və biz bu qələbəni sizinlə birlikdə bayram edəcəyik” [IIc.s.186].

Tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlədə baş cümlədə "mən tələb edirəm ki" ifadəsi qətiyyətli dövlət başçısının nitqləri üçün xarakterikdir: "Mən tələb edirəm ki, Nazirlər Kabineti, nazirlər – xüsusən iqtisadiyyat, maliyyə nazirləri və bu sahə ilə məşğul olan digər nazirlər, banklar, xüsusən Milli Bank fərmanın müddəalarının yerinə yetirilməsi üçün təcili, konkret tədbirlər görsünlər, yerinə yetirilməmiş tədbirləri qısa müddətdə həyata keçirək və onların nəticəsini əldə edək" [IIc.s.163].

Nitqin ekspressivliyini yüksəltmək məqsədi ilə istifadə olunan təkrarlar tamamlıq budaq cümləsinin baş cümlələrində də özünü büruzə verir: "Mən əminəm ki, xalqımız, ölkəmiz arasında dostluq, qardaşlıq əlaqələri bundan sonra da inkişaf edəcəkdir. Sizi əmin edirəm ki, biz – Azərbaycan xalqı və Azərbaycan prezidenti kimi mən bu dostluğa, qardaşlığa daim sadiq olacağıq" [IIc.s.189].

"Güman edirəm ki" baş cümləli tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlələrdə Heydər Əliyevin nikbinlik yaratmaq məqsədi güdən fikirləri özünə yer alır: "***Güman edirəm ki***, bugünkü görüşümüz öz nəticələrini verməlidir" [IIc.s.139].

Heydər Əliyevin nitq və çıxışlarında "güman edirəm ki" ifadəsi siyasi etikada populizmdən uzaq durmağın ən bariz nümunəsidir. Bu ifadəni eşidən auditoriyada güman yeri qalmır və bu ifadəni eşidənədək auditoriya, necə deyərlər, hazırlanır: "Əgər bu müqavilələrin bağlanmasına nail olsaq, Azərbaycan neft sənayesinin yeni inkişaf dövrü başlanacaqdır. Mən buna əminəm. Güman edirəm ki, bu sahədə və başqa sahələrdə görülən işlər yaxın vaxtlarda öz nəticəsini verəcəkdir" [IIc.s.157].

Auditoriya Heydər Əliyevin dilində cümlənin əvvəlindəki "güman edirəm ki" ifadəsini yox, sonda qəti gələcək zamanda səslənən ifadələri qəbul edir: "***Güman edirəm ki***, bu ilin axırında biz dənizdə neftçıxarmanın 45 illik yubileyini də təntənəli şəkildə qeyd edəcəyik" [IIc.s.159].

Heydər Əliyevin nitqlərində işlədilən tamamlıq mürəkkəb tabeli cümlələrdə baş cümlədə ən çox istifadə olan ifadələrdən biri də “hesab edirəm ki”dir: “Hesab edirəm ki, bu nəsillərdə inzibati yolla getmək olmaz, lakin hər bir ölkə bu gününü və gələcəyini düşünərək lazımi tədbirlər görməlidir” [IIc.s.198].

Tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlələrdə baş cümlədə bir qrup ifadələr Heydər Əliyevin nitqlərində üstünlük təşkil edir:

– “Güman edirəm ki, bu gün Təzəpir məscidinə toplaşanlar mənim Kəbədən – Məkkədən gətirdiyim “Zəmzəm” suyundan istifadə edəcəklər” [IIc.s.85].

– “Bir də təkrar edirəm, bütün bunları deməklə mən mətbuat söz azadlığının əleyhinə çıxmıram” [IIc.s.99].

– “Bir daha demək istəyirəm ki, ali və orta ixtisas məktəblərinə tələbə qəbulu respublikamızda həmişə böyük ictimai xarakter daşıyan tədbir olub” [IIc.s.103].

“Güman edirəm ki,” baş cümləsi bəzən müşavirələrin sonuna təsadüf edərək felin vacib şəkli ilə yekunlaşır: “Güman edirəm ki, bu günkü müzakirə lazım idi və hər kəs bundan irəli gələn vəzifələri yerinə yetirmək üçün vacib olan işləri görməlidir” [IIc.s.168].

Heydər Əliyevin nitqlərində mürəkkəb kompozisiyalı tabeli mürəkkəb cümlələrə tez-tez təsadüf olunur: “Tam əminəm ki, əgər biz aqrar sektorda iqtisadi islahatlar aparıb istədiyimiz prinsipləri həyata keçiririksə, 70-80-ci illərin nailiyyətləri ilə müqayisədə daha yüksək səviyyəyə qalxıb, insanların sərbəst istehsal ilə məşğul olması sayəsində respublikanın kənd təsərrüfatı məhsullarına tələbatını tamamilə ödəyə bilərik və aqrar sektorda əldə olunan məhsullar Azərbaycanın ixrac imkanlarını qat-qat artıra bilər” [IIc.s.585]. Burada ilk növbədə biz tamamlıq budaq cümləlı mürəkkəb cümlə + sadə cümlə tipini müşahidə edirik. İkinci növbədə isə bizim üçün tamamlıq budaq cümləli mürəkkəb cümlədə budaq cümlənin

şərt budaq cümləli tabeli mürəkkəb cümlədən ibarət olduğu anlaşılır.

Mürəkkəb cümlələr elmi üslubun əsasını təşkil edir ki, bu üslub hələ N.Nərimanovun elmi əsərlərində geniş yer almışdır: "Elmi üslubda izahedici vasitələrdən biri də "yəni" bağlayıcısıdır. N.Nərimanov bu və digər elmi fikrin bir daha anlaşıqlı olması üçün, "yəni" bağlamasından istifadə etmişdir. Məsələn, "Vərəm naxoşluğunun miqrobu əksər vəqt ağ ciyərdə olub ondan qeyri əzalarda tapılıyor. Yəni demək istəyirüz: miqrob havada olursa nəfəs alanda həmin miqrob çəkdiyimiz nəfəslə ağ cigərə daxil oluyor, məsəla, vərəm miqrobu"[1]

Elmi üslubun əsasını sintaktik vasitə kimi mürəkkəb cümlə təşkil edir ki, bunlar da Heydər Əliyevin nitqlərində özünü qabarıq büruzə verir. Bir sıra müəlliflər[2] göstərir ki, elmi üslub üçün aydın və dəqiq sintaksis mühümdür ki, burada da sözlərin ciddi məntiqi ardıcıllıq əsasında müəyyən sırasının mühafizəsi əsas şərtdir. Elmi üslubun ən mühüm cəhəti ondan ibarətdir ki, burada inversiyaya yol verilmir. Çünki bu üslubun morfoloji və leksik forsları kimi sintaktik formaları da ekspressivlik yaratmağa xidmət etmir.[3]

Heydər Əliyevin nitqində isə mürəkkəb cümlələr əsasında qurulan elmi üslublu çıxışlar ekspressivlik yaratmaq baxımından öyrənilməyə layiqdir.

Beləliklə, Heydər Əliyevin nitqində mürəkkəb cümlənin gələcəkdə araşdırılmasına ehtiyac göz qabağındadır.

---

[1] Əlizadə Afina. N.Nərimanov və Azərbaycan dilinin elmi üslubu // Azərbaycan Milli Elmlər Akademiyasının xəbərləri. Humanitar və ictimai elmlər seriyası, 2003. №1-4, s.267-272.

[2] Разинкина Н.М. Стилистика английской научной речи. "Язык научной литературы", М., 1975. с.29

[3] Ağayeva İ.S. Bədii və elmi üslub. Bakı, "Maarif", 1988. 88 səh.

# IX FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ NEOLOGİZMLƏR

Sənayenin, kənd təsərrüfatının elm və texnikanın, incəsənətin, ölkənin mədəni həyatının inkişafı əlaqədar olaraq yeni-yeni məfhumlar yaranır. Bu məfhumlar onları ifadə edən yeni sözlərin də meydana gəlməsinə səbəb olur. Dildə meydana gələn yeni sözlər – neologizmlər (yunanca – yeni, logos – təlim və ya anlayış deməkdir) adlanır.[1]

Neologizmlər yaranma mənbələrinə, dildə işlədilmə xüsusiyyətlərinə görə müxtəlif olurlar. Belə ki, neologizmlərin bir hissəsi üslubi məqsəd üçün, digər hissəsi isə yeni əşya və hadisələri adlandırmaq yaradılır. Bu xüsusiyyətlərinə görə neologizmlər iki qrupa bölünür: 1) ümumi neologizmlər. 2)fərdi-üslubi neologizmlər.[2]

Professor Buludxan Xəlilova görə neologizmlər aşağıdakı növlərə ayrılır:

1. Leksik-semantik neologizmlər. Bu cür neologizmlər həm formaca həm də məzmunca yeni olan neologizmlərdir.

2. Leksik neologizmlər ancaq formaca yeni olan neologizmlərdir.[3]

Semantik neologizmlər mənaca yeni olan neologizmlərdir.

Zamanın doğurduğu neologizmlərin bir qismi sürətlə, bəziləri isə tədricən dilimizə daxil olur. Qalır həmin neologizmləri Azərbaycan dilinin əsrlərlə formalaşmış qaydalarını pozmadan, yerli-yerində işlətmək, auditoriayalarda dinləyicilərə izah etmək, həmin sözləri dilimizin ahənginə uyğunlaşdırmaq. Məhz elə bu dövrdə, XX əsrin sonlarında ulu öndər Heydər

---

[1] Cəfərov Səlim. Müasir Azərbaycan dili. II hissə Leksika. Bakı. “Şərq-Qərb”, 2007, səh 69.

[2] Həsənov İ.Q. Müasir Azərbaycan dilinin leksikası, Bakı, 2006. səh 58.

[3] Xəlilov Buludxan. Müasir Azərbaycan dilinin leksikologiyası. Bakı, “Nurlan” nəşriyyatı, 2008. 442 səh.

Əliyev müxtəlif auditoriyalarda neologizmlərə sadə xalq dilində izah verməklə onlara necə deyərlər, "Azərbaycan pasportu" verir. Natiq çox ehtiyatla, belə demək mümükünsə, sanki bir filoloq, dilçi alim kimi yeni sözləri dilimizə uyğunlaşdırır, bu terminlərin köməyi ilə müstəqil respublikamızın, özünün dəqiq qeyd etdiyi kimi, "sivil dünyaya inteqrasiya prosesini" sürətləndirir.

Neologizmlər qloballaşma dövründə Heydər Əliyevin dil siyasətinə xidmət edə biləcək nitq vasitəsidir desək yanılmarıq. Vaxtı ilə bir partiyanın – Kommunist Partiyasının mövcud olduğu Sovetlər İttifaqının süqutundan sonra xeyli partiya yarandığından "çoxpartiyalılıq", "çoxpartiyalı" və digər neologizmlər siyasi səhnəyə ayaq açdı: "Dediyim kimi, bizdə ***çoxpartiyalı*** sistem elan edilmiş, 40-dan artıq siaysi partiya və ictimai təşkilat qeydə alınmışdır. Bütün bu partiyaların öz mətbuat orqanları var. Bütövlükdə Azərbaycanda, bir neçə milyon əhalisi olan kiçik bir dövlətdə 600-dən yuxarı qəzet və jurnal nəşr edilir" [Ic.s.423].

Başqa bir nitq məqamında bu neologizm yenidən səslənir: "Vacib olan budur ki, Azərbaycanın daxili həyatı, daxili siyasəti demokratiya, ***çoxpartiyalı*** sistem, siyasi ***plüralizm*** prinsipləri və şəxsiyyətin bütün azadlıqları əsasında qurulur" [Ic.s.423].

Böyük natiqin çıxışlarında Sovetlər İttifaqı dövründə işlənməyən sözlər, beynəlxalq mənşəli sözlər audidoriyalara yol açır: "İndi isə Beynəlxalq Əməliyyat Şirkətinin, cənab Terri Adamsın yeni ***ofisinin*** açılması münasibətilə sizi təbrik edir və bu gün bu mərasimdə iştirak etməkdən məmnun olduğumu bildirmək istəyirəm" [VIIc.s.251].

Beynəlxalq terminlər xüsusilə xaricdə olan görüşlərdə daha tez-tez işlədilir. 27 avqust 1997-ci ildə Varşavada, Polşanın "Jiçe Varşava" qəzetinin müxbirinə verilən müsahibə buna əyani sübutdur: "Bilirsinizmi, Çeçenistan müharibəsi Azər-

baycanın həyatına çox mənfi təsir göstərdi. Hərbi əməliyyatlar başlanan kimi Rusiya Azərbaycanın Rusiya ilə bütün nəqliyyat ***kommunikasiyalarına embarqo*** qoydu**,** onları tamamilə blokadaya aldı. Bizdə dəmir yolu, avtomobil yolu, bütün nəqliyyat ***kommunikasiyaları*** Çeçenistandan keçir" [XIIc.s.72].

"İntellektual potensial" deyilən neologizmin köməyi ilə böyük natiq ölkə əhalisinin, Azərbaycan insanının elmi gücünü yaxın və uzaq ölkələrin auditoriyalarına çatdırır. 9 fevral 1994-cü ildə Türkiyədə Bilkənd Universiteti İdarə Heyətinin sədri İhsan Doğramacı ilə görüşdəki çıxış bu sıradandır: "Azərbaycan elmi çox irəliyə getmiş və özünün nə qədər qüdrətli və güclü olduğunu bütün dünyaya göstərmişdir. Nəzərdə tutulan bütün islahatların və niyyətlərin həyata keçirilməsi üçün tam təminat, əsas var. Buna isə Azərbaycan Respublikasının malik olduğu böyük ***intellektual potensial***, böyük iqtisadi imkanlar əsas verir" [Ic.s.328].

22 fevral 1994-cü ildə Böyük Britaniya sənayeçiləri konfederasiyasındakı çıxışında intellektual potensial bir daha xatırlanır: "Azərbaycanın iqtisadi potensialı, yeraltı və yerüstü sərvətləri, elmi, "***intellektual potensialı"*** ilə yanaşı, onun digər dövlətlərlə iqtisadiyyat sahəsində əməkdaşlığı üçün daha əlverişli şərait yaradan cəhətlərdən biri də ölkəmizin coğrafi-siyasi mövqeyidir" [Ic.s.417].

Neologizmləri yerli auditoriyalarda çox işlətməyən böyük natiq Azərbaycan dilinin zənginliyindən maksimum istifadə edir. Bir sıra məqamlarda, xüsusilə beynəlxalq miqyaslı mətbuat konfranslarında Heydər Əliyevə tuşlanan sualları cavablandırarkən suallardakı neologizmləri təkrar etmək məcburiyyətində qalır: "Yoldaş Əliyev, indi belə bir fikir var ki, ***regionun*** gələcək taleyi slavyan və türk amilindən asılıdır. Sizin fikrinizcə, həmrəylik hansı ideologiyada mümkündür və tarixi keçmişə əsaslanaraq sizə elə gəlmirmi ki, indiki reallıq slavyan-türk alyansının yaranmasına imkan

verəcək? Çox sağ olun. Heydər Əliyev: Ola bilsin ki, bu sual sizin öz fikrinizdir, lakin əgər bizim ***region*** haqqında danışırsınızsa, şübhəsiz ki, Rusiya ilə Türkiyə arasında münasibətlərin yaxşı olması Azərbaycan ilə Ermənistan arasındakı hərbi münaqişənin həllinə çox kömək edəcəkdir. Ancaq bu ***regiondakı*** bütün məsələləri bu iki ölkənin alyansı ilə bağlamaq o qədər də doğru olmazdı" [Ic.s.137].

Böyük natiqin nitqində neologizmlər hüquq sahəsində də özünə yer alır: "***Narkomaniyaya*** qurşanmış gənclər əgər ondan müvəqqəti zövq alırlarsa belə, düşünməlidirlər ki, onlar öz nəsillərini zəhərləyir, itirirlər. Bütün bunlar cəmiyyətimizdə ümumi ***kriminogen*** vəziyyəti pisləşdirir" [Ic.s.173].

Böyük natiqin çıxışlarında səslənən neologizmlər elə televiziyalarda və qəzetlərdə istifadə edilməklə işləklik qazanır: "Burada qeyd olundu ki, bizim ***kommersiya*** strukturları, ümumiyyətlə, şirkətlər, ***kommersiya*** bankları çox böyük geniş maliyyə əməliyyatları aparırlar. Bu, həqiqətən belədir. Mən bu gün bütün ***kommersiya*** strukturlarına, ***kommersiya*** banklarına, özəl şirkətlərin hamısına müraciət edirəm ki, Azərbaycan Respublikasının maliyyə vəziyyətini tənzimləmək üçün, bu tədbirlərlə əlaqədar mənfi nəticələri aradan qaldırmaq üçün bütün fəaliyyətlərini nağd pulların banklara keçirilməsinə yönəltsinlər" [Ic.s.271].

Heydər Əliyev auditoriyalarda neologizmlərə izah verməklə nitqin ağırlığını aradan qaldırır: "1992-ci ildə Amerika konqresi Azərbaycana köməyə ***embarqo***, yəni qadağan qoyubdur. Nəyə görə? Guya Azərbaycan Ermənistanı blokadaya alıbdır. Amma həqiqətdə Ermənistan Azərbaycanın ərazilərini işğal edibdir, respublikamızı blokadaya alıbdır" [IXc.s.392].

Böyük natiq əgər bir yerdə "sivilizasiyalı" cəmiyyət haqqında söhbət açırsa başqa bir çıxışda sivilizasiya normaları terminini işlədir: "Dünya dövlətləri ilə bərabərhüquqlu və qarşılıqlı faydalanma prinsipləri əsasında başlanmış iqtisadi

əməkdaşlıq davam etdiriləcək, ayrı-ayrı xarici şirkətlərlə imzalanması nəzərdə tutulmuş bütün müqavilələrlə bağlı götürülmüş öhdəliklər ***sivilizasiya normaları*** çərçivəsində yerinə yetiriləcəkdir” [Ic.s.15].

Müstəqilliyə qədəm qoyduğumuz ilk illərdə, xüsusilə xarici teleşirkətlərə verdiyi müsahibələrdə böyük natiqin dilində neologizmlər özünə yer alır: “Bir vaxtlar ali təhsil almaq üçün Azərbaycandan Rusiyaya, Ukraynaya, Belorusiyaya, başqa respublikalara olduqca çoxlu adam göndərilmişdir. Onların bir çoxu böyük alim, mütəxəssis, ***biznesmen*** olmuş və indi hər biri öz ***bölgəsində*** layiqli yer tutur” [Ic.s.30].

15 iyun 1993-cü il Azərbaycan Respublikasının Milli Məclisinin iclasındakı çıxış neologizmlərlərlə zəngindir. Həmin çıxışda siyasi “plüralizm”, “sərbəst iqtisadiyyat”, “hürriyyət”, “sivilizasiya” kimi terminlər geniş istifadə olunur: “Beləliklə, Azərbaycan Respublikasının dövlət müstəqilliyi ən əsas məsələdir. Siyasi ***plüralizmə*** geniş yol verilməlidir. Siyasətdə və ***iqtisadiyyatda sərbəstlik***, ***hürriyyət***, insan azadlığı, insan haqlarıın qorunması və ***sərbəst iqtisadiyyat***, ***azad iqtisadiyyatın*** prinsipləri bərqərar olunmalıdır. Yəni bizim respublikamız bir ***sənə*** bundan öncə başladığı yolla davam etməlidir” [Ic.s.10].

“Hürriyyət” və “sənə” kimi sözlərimizi sanki 70 illik bir ayrılıqdan sonra böyük natiq dilimizə qaytarır. Sovetlər dövründə işlənməyən sivilizasiya sözünü də auditoriyalar elə ulu öndərin özündən eşidir: “Biz Azərbaycanda demokratik, müstəqil respublika quraraq ***sivilizasiyalı*** cəmiyyət uğrunda mübarizə apararaq, ümumi dünyəvi, bəşəri dəyərlərin hamısından istifadə etməliyik” [Ic.s.10].

“Rossiyski fermer” qəzetinin müxbirinə verdiyi müsahibədə (3 avqust 1993-cü il) də neologizmlər səslənir: “Gözəl bir mütəxəssis olan oğlum öz çörək pulunu ***kommersiya*** strukturlarında qazanmaq məcburiyyətində qaldı. Kürəkənim əks-

kəşfiyyatda xidmət edirdi, o da əla perspektivli mütəxəssis idi. Amma mənim gözdən salınıb qəzəbə düçar olmağım onun da ***karyerasının*** üstündən xətt çəkdi" [Ic.s.47].

Neologizmlərlə böyük natiq Azərbaycanın çağdaş dünyaya, sivil dünyaya inteqrasiyasını, qovuşmasını göstərir.

"Kommersiya" neologizmini böyük natiq müxtəlif məqamlarda işlədir. Milli sərvətlərimizə münasibətdə bu yeni söz qınaq obyekti kimi verilir: "Neftçilərimizin bu günkü nəsli tarixi nailiyyətlərindən, sələflərinin təcrübəsindən faydalanaraq mövcud şəraitdə neft sənayesini qaldırmalı, neftçıxrma prosesini inkişaf etdirməli, neft və qaz hasilatını artırmalıdırlar. Açıq demək lazımdır, neft bəzi rəhbərlərin əlində ***kommersiya*** vasitəsinə çevrilib, beləliklə ancaq öz mənfəətlərini güdürlər" [Ic.s.85].

XX əsrin 90-cı illərində yeni bazar iqtisadiyyatı şəraitində bir sıra sözlərin Azərbaycan dilində qarşılığını tapana kimi neologizmlər özünü çatdırır. İqtisadi neologizmlər içərisində "infrastruktur", "intellektual ehtiyatlar" kimi neologizmlər böyük natiqin müsahibələrində auditoriyalara yol açır. 24 avqust 1993-cü ildə "Nezavisimaya qazeta" ya verdiyi müsahibələrdə olduğu kimi: "Bəs, bu adi bazarı iqtisadi bazara necə çevirməli? Bax, məsələ də bundadır. Bax, burada yada salmaq lazımdır ki, vergi sistemlərini ardıcıl, sürətlə yaratmaq və bir çox digər məsələləri yoluna qoymaq lazımdır. Biz ***intellektual ehtiyatlar*** olmadığı təqdirdə də işin öhdəsindən gələ bilməyəcəyik" [Ic.s.123].

Sosialist təsərrüfat sistemi üçün xarakterik olmayan "azad sahibkarlıq", eləcədə "liberallaşdırma" kimi iqtisadi terminlər müstəqilliyin ilk illərində geniş işlənməyə başlayır: "Xarici ticarətdə ***liberallaşdırma*** prosesi davam edir. Ümumiyyətlə, Azərbaycanda artıq iqtisadiyyatda liberallaşdırma, sahibkarlığa geniş imkanlar yaradılması prosesi mövcuddur" [IXc.s.283].

Tarixlə bağlı neologizmlər Heydər Əliyevin nitqində özünə yer alır. Totalitar sistem olan Sovet İttifaqında "totalitar", "totalitarizm" terminlərinə qadağa qoyulmuşdur. Təkpartiyalı sistemə söykənən bir ölkədə totalitarizmdən danışmaq mümkün deyildi: "Azərbaycan xalqı öz müasir tarixinin ağır dövrünü keçirir. Bütün çətinliklərə baxmayaraq, biz müstəqil demokratik dövlət yaratmaq, bazar iqtisadiyyatına keçmək, ***totalitarizmlərdən*** və kommunist keçmişimizdən həmişəlik xilas olmaq arzusundayıq" [Ic.s.126].

Müstəqillik qazanandan sonra coğrafi əraziləri adlandırmaq üçün yeni terminlər işlənməyə başladı ki, auditoriyalar bu sözləri də ilk dəfə böyük natiqin dilindən eşitməyə başladı: "İqtisadi, sosial böhrandan danışarkən deyə bilərik ki, görünür, bu, vaxtı ilə Azərbaycanın da daxil olduğu keçmiş Sovet İttifaqının başqa ***regionları*** üçün də müəyyən dərəcədə xarakterikdir" [Ic.s.129].

"Konstruktiv" neologizmi müxtəlif məqamlarda işlədilir: "Ancaq bütün bunlara baxmayaraq biz Ermənistanla sülh yaratmaq, münaqişəni sülh yolu ilə aradan qaldırmaq istəyirik. Bundan ötrü də çox ***konstruktiv*** addımlar atırıq. Biz ədalət tələb edir və məsələnin həll olunmasını istəyirik" [VIIc.s.28].

"İnteqrasiya", "intellektual potensial", "lobbi", "diaspor" və s. neologizmlər Heydər Əliyevin nitqində, xüsusilə xarici ölkələrdə söylədiyi nitqlərində daha çox səslənir: "Azərbaycan isə müstəqil dövlət kimi dünya iqtisadiyyatına ***inteqrasiya*** üçün bu baxımdan ilk addımlarını atır. Azərbaycanın malik olduğu təbii ehtiyatlardan sənaye, elmi-texniki, ***intellektual*** potensialından əlavə xüsusən Almaniya kimi bir ölkə ilə əməkdaşlıq etməsi üçün bəzi başqa şərtlər də lazımdır" [VIIc.s.39].

Müstəqillik illərində ilk vaxtlarda xaricdə yaşayan soydaşlarımızla əlaqə saxlamaq imkanı yarandığından auditoriyalarda söylədiyi çıxışlarda Heydər Əliyev bu istiqamətə üstünlük verməyə başladı. Bu baxımdan "lobbi" neologizmi tez-tez səs-

ləndi: "Aydındır ki, erməni ***lobbisi*** çox güclüdür. Amerikada onların gücü çox böyükdür. Amma bu o demək deyil ki, hər şey ***lobbinin*** əlindədir, yox. Biz öz siyasətimizi aparırıq, siyasətimizi apararaq Azərbaycanın hüquqlarını dünyanın hər yerində tanıdacağıq və onların qəbul edilməsinə nail olacağıq".

"İntellektual" neologizmi böyük natqin dilində Azərbaycanın nələrə qadir olduğunu xarici auditoriyalara çatdırmaq məqsədi güdür: "Lakin diqqətinizi konkret problemlər üzərində saxlamaq istəmirəm. Ümumiyyətlə, deyim ki, Azərbaycan əməkdaşlıq üçün böyük imkanlara, bundan ötrü təbii ehtiyatlara, sənaye potensialaına, elmi-texniki və ***intellektual*** potensiala malikdir" [VIIc.s.46].

Müstəqilliyə qədəm qoyandan sonrakı illər üçün "modern", "modernləşdirmə" kimi neologizmlər dilimizə daxil oldu ki, bu tip neologizmlər böyük natiqin Avropa ölkələrinə olan işgüzar xarakterli çıxışlarında tez-tez təsadüf edir: "Gələcəkdə əgər Bakı, Türkmənbaşı və Poti limanlarını ***modernləşdirsək***, bizim dəmir yolunun nizama salınması sahəsində bəzi tədbirləri görsək, onda "İpək yolu" kimi, həmin yol da yüklərin Avropadan edilməsində çox böyük rol oynaya bilər" [VIIc.s.52]. Vaxtı ilə Sovetlər İttifaqı dünya iqtisadiyyatından uzaq düşdüyü üçün müstəqil dövlətlərin dünya iqtisadiyyatına qovuşması ilə bağlı "inteqrasiya" sözü dilimizdə özünə yer aldı. Bu tip sözlər Heydər Əliyevin nitqində xarici səfərlərdə və yaxud beynəlxalq əhəmiyyətli tədbirlərdə işlədilir: "Almaniyanın şirkətləri dünyanın müxtəlif regionlarında iş görmək, iqtisadi əməkdaşlıq sahəsində böyük təcrübə toplayıblar. Azərbaycan isə müstəqil dövlət kimi dünya iqtisadiyyatına ***inteqrasiya*** üçün bu baxımdan ilk addımlarını atır" [VIIc.s.39].

Heydər Əliyev beynəlxalq mənşəli sözlərdən əsasən peşəkarlar auditoriyasında istifadə etməklə gələcək iri və çoxtərəfli danışıqları normal məcraya yönəldir: "Eyni zamanda son illərdə biz iqtisadiyyatı müasir, ümumdünya tələblərinə uyğun

olaraq inkişaf etdirmək, onun dünya iqtisadiyyatına ***inteqra-siyasını*** təmin etmək üçün müvafiq hüquq normaları, qanunlar yaratmaq sahəsində də tədbirlər görürük" [VIIc.s.40].

Bir sıra çıxışlarda neologizmlər bir-birinin ardınca düzülərək, izah olunaraq nitqin təsir gücünü azaltmadan dinləyicilərə çatdırılır: "Konqresmen Peter erməni ***diasporunun*** təsiri altında Konqresə bir əlavə veribdir. O əlavə bizə qarşı olan ***embar-qonu***, o qadağanı götürmür, ancaq orada bir fırıldaq işlədirlər ki, Amerikada bəzi təşkilatlara, qeyri dövlət təşkilatlarına icazə verilsin ki, Azərbaycana kömək edilsin və Dağlıq Qarabağa da kömək edilsin. Halbuki Dağlıq Qarabağ Azərbaycanın tərkibindədir və heç bir beynəlxalq təşkilat, heç bir dövlət, o cümlədən Amerika Birləşmiş Ştatları Dağlıq Qarabağı müstəqil bir ***qurum*** kimi tanımır" [VIIc.s.187]. "Diaspor" və "qurum" sözünün 1996-cı ildə auditoriya tərəfindən mənasının aydın olduğunu, bu sözlərin ümumişlək forma aldığını bilən böyük natiq bu sözlərə aydınlıq gətirmir, əvəzində "embarqo" neologizmini izah edir.

İqtsadiyyatla bağlı bir sıra neologizmlərdən Heydər Əliyevin nitqində geniş istifadə edilir. Bu sıraya "konsorsium", "investisiya" kimi neologizmlər aiddir: "Böyük məmnuniyyət hissi ilə deyə bilərəm ki, 1994-cü ilin sentyabr ayında imzalanmış ilk böyük neft müqaviləsində – Əsrin müqaviləsi adlandırılmış müqavilədə ABŞ-ın çox böyük bir hissəsi var. Amerikanın "Amoko", "Yunokal", "Makdermot" şirkətləri bu ***konsorsiuma*** "Eksson" şirkəti də qoşulmuşdur. Beləliklə, ***konsorsiumda*** olan şirkətlərin əksəriyyətini Amerika şirkətləri təşkil edirlər" [XIc.s.196-197]. Elə həmin çıxışda "investisiya" neologizmi ilə bağlı fikirlər açıqlanır: "Azərbaycanın bütün müqavilələri üzrə hamısı birlikdə təxminən 30 milyard dollar miqdarında ***investisiya*** qoyulması nəzərdə tutulur. Yenə də deyirəm, iqtisadiyyatımızı, qapılarımızı xarici ***in-vestorlar*** üçün açmışıq" [XIc.s.196].

Müstəqillik dönəmindən sonra coğrafi anlamda "region" və "bölgə" neologizmləri böyük natiqin nitqində xüsusi yer tutur: "Nazir cənab Penya, Nazir cənab Deyli bu gün burada çıxış edərkən qeyd etdilər ki, Amerika Birləşmiş Ştatları, Qafqaz ***regionuna***, ümumiyyətlə Xəzər dənizi hövzəsi ***bölgəsinə*** və xüsusən Azərbaycana böyük əhəmiyyət verir, maraq göstərir. Bu fikirlər tam əsaslıdır. Mən hesab edirəm ki, bizim ***regionun***, o cümlədən Azərbaycanın həm coğrafi-siyasi, coğrafi-strateji vəziyyətinə görə, həm də Azərbaycanın və ***bölgələrimizin*** böyük təbii sərvətlərinə, bir çox səbəblərə görə Amerika Birləşmiş Ştatları bizim ***regiona***, xüsusən respublikamıza öz diqqətini daha da artırmalıdır, öz münasibətini daha da gücləndirməlidir" [XIc.s.211].

Kiçik bir mətndə üç yerdə "region", iki yerdə "bölgə" neologizminin təkrar olunması cümlənin izahedici aktivliyini daha da artırır.

Neologizmlər Heydər Əliyevin nitqində ən çox əcnəbi auditoriyalarında səslənir**:** "Dədə Qorqud" qazma qurğusunun bərpa olunması, ***modernləşdirilməsi*** üçün əvvəlcə 37 milyon dollar deyirdilər, indi isə bildirirlər ki, 40 mlyon dollar vəsait xərclənibdir. Burada deyildi ki, "Şelf-S" qurğusunun hazırlanması və ***modernləşdirilməsi*** üçün 115 milyon dollar vəsait lazımdır" [IXc.s.8].

Elə olur ki, Heydər Əliyevin nitqində bir neçə neologizmlər ardıcıl işlənir və bu ardıcıllıq nitqin təsir gücünü daha da yüksəldir: "Məsələn, nəqliyyat, energetika, rabitə sahələrində birgə fəaliyyət üçün, ***investisiya*** qoyuluşu üçün böyük imkanlar vardır. Qara dəniz iqtisadi əməkdaşlıq ***regionunun*** nəqliyyat ***infrastrukturunun*** layihələri böyük əhəmiyyət daşıyır. Bu ***infrastruktur*** Avropanın nəqliyyat sisteminə ***inteqrasiya*** olunacaqdır" [IXc.s.233].

Neologizmlər xüsusilə xarici şirkətlərlə bağlanan müqavilələrdəki yekun nitqlərdə daha çox təsadüf edir: "Bu məlu-

matlardan aydın görünür ki, "Şahdəniz" neft-qaz yatağı Xəzərin Azərbaycan ***sektorunda*** çox zəngin və perspektivli bir yataqdır və onun müştərək işlənməsi haqqında imzalanmış müqavilə çox böyük əhəmiyyət kəsb edir" [IXc.s.6].

Bir çox hallarda Heydər Əliyev nitqində bir cümlədə 2-3 neologizmə rast gəlinir: "Onu siz də, biz də nəzərə alırıq ki, bir çox işlərin görülməsi, yəni ***infrastrukturun*** yaranması, neft kəmərlərinin, ***terminalların*** tikilməsi yaxud bütün müqavilələrin həyata keçirilməsində gələcəkdə səmərəli istifadə olunacaq müəssisələrin yaradılması bu müştərək işi daha da çox tələb edir" [IXc.s.10].

"Bir tərəfdən biz Azərbaycanın həmin sahələrinə, o cümlədən də infrastruktura xarici ***investisiyalar*** qoyulması üçün açıq olduğunu bildiririk, digər tərəfdən isə mülkiyyətin özəlləşdirilməsinə fəal başlayaraq həm öz sahibkarlarımız üçün, həm də əcnəbi sahibkarlar üçün şərait yaradırıq ki, potensialımızdan iqtisadiyyatımızın inkişafı, Azərbaycan əhalisinin sosial tələbatının ödənilməsi üçün istifadə olunsun" [VIc.s.24].

Bir qisim neologizmlər böyük natiqin neft sənayesi ilə bağlı çıxışlarında səslənir: "Dədə Qorqud adına layiq səviyyəyə çatdırdıqlarına görə ***konsorsiumun*** Beynəlxalq Əməliyyat Şirkətinə, onun ***modernləşdirilməsi*** ilə məşğul olan "Sante-Fe" şirkətinə və Azərbaycan Dövlət Neft şirkətinə, bu qurğunun müasir vəziyyətə gətirilməsi üçün çalışmış bütün mütəxəssislərə, fəhlələrə və bu sahədə fəaliyyət göstərən insanların hamısına mən səmimi təşəkkürümü bildirirəm" [VIIc.s.246].

Kənd təsərrüfatı məsələləri ilə bağlı müşavirələrdə də neologizmlər işlədilir. Belə çıxışlarda həm sırf Azərbaycan, həm də Avropa mənşəli neologizmlər istifadə edilir: "Kənd təsərrüfatı məsələlərinə dair bir neçə böyük müşavirədə, müxtəlif səviyyələrdə keçirdiyimiz ***toplantılarda*** mən dəfələrlə bəyan etdim ki, bizim bütün iqtisadiyyatın inkişafında tutduğumuz strateji yol iqtisadiyyatı bazar iqtisadiyyatı yolu

ilə irəlilətməkdən, iqtisadi islahatlar aparılmasından, o cümlədən də aqrar ***sektorda*** islahatlar həyata keçirilməsindən ibarətdir" [VIIc.s.89].

Cəmiyyətdə baş verən ciddi dəyişikliklər dövründə dilə yeni sözlərin, neologizmlərin daxil olması başlayır. Bu baxımdan Sovet İmperiyasının süqutu siyasi, iqtisadi eləcə də mənəvi sahələrdə dəyişikliklərə səbəb oldu ki, bu da dilimizə çoxsaylı neologizmlər gətirdi. Məhz həmin dövrlərdə bu neologizmlər Heydər Əliyevin nitqində özünəməxsus tərzdə auditoriyalarda dinləyicilərə çatdırılmağa başlandı.

Böyük natiqin siyasi sahədə dilimizdə işlətdiyi neologizmlərin əksəriyyəti bu gün ümumişlək sözlərə çevrilmişdir. Bu neologizmlər sırasına "sivilizasiya", "mentalitet", "referendum", "konstruktivizm" və s. nümunə göstərə bilərik: "Əsrlər boyu inkişaf etmiş dünya ***sivilizasiyası*** möhkəm təhsil və elm üzərində qurulmuşdur".

Ulu öndər təhsilə, elmə, tərbiyəyə söykənən dünya sivilizasiyasının inkişafında islam dünyasının rolunu önə çəkir: "Biz haqlı olaraq fəxr edə bilərik ki, islam dünyası ümumbəşəri ***sivilizasiayaya*** öz layiqli töhfəsini vermişdir və neçə əsrdir ki, onun mənəvi inkişafına və təkmilləşdirilməsinə kömək edir".

İslam sivilizasiyasının erməni təcavüzünə məruz qalmasını dünyaya çatdırarkən də ulu öndər dilimizə yeni daxil olan sözlərdən məharətlə istifadə etmişdir: "Ən qədim müsəlman ***sivilizasiyasının*** bütün izləri yer üzündən silinir".

Həmçinin müstəqilliyə nail olmaq üçün xalqın ənənəyə qadir olmasını ifadə edərkən söylədiyi fikirlərə diqqət yetirsək, ümumişlək sözlər pasportu qazanmış neologizmlərə rast gələrik: "Müstəqil dövlət olmaq üçün xalqın gərək ***mentalitet*** səviyyəsi olsun. Xalqın mentalitetini qaldırmaq isə bir- iki günün işi deyil".

Yuxarıda qeyd etdik ki, neologizmlər Heydər Əliyev nitqində təsadüfi işlədilmir, məqamında işlənməklə yanaşı, öz izahını da tapır: "Bildiyiniz kimi, belə beynəlxalq toplantılarda qərar ***konsensus*** əsasında qəbul edilir. ***Konsensus*** olmadıqda, yəni dövlətlərdən birinin razılığı olmasa, qərar qəbul edilməyə bilər".

Bu izah konsorsium neologizminə də aid edilə bilər: "Demək, bu konsorsium həm yeddi neft şirkətini, həm də Amerika Birləşmiş Ştatları, Rusiya, Böyük Britaniya, Türkiyə, Norveç və Səudiyyə Ərəbistanı kimi ölkələri təmsil edir".

Müstəqilliyimizin möhkəmlənməsinə yönələn neologizmlər üzərində böyük natiq çox dayanır, həmin yeni sözlərin kütlələr arasında təbliğinə xüsusi yer ayırır. Bu qəbildən olan "diaspor", "lobbi", "soydaş" neologizmləri maraq doğurur: "Beləliklə, müstəqil Azərbaycan Respublikası dünyanın bütün ölkələrində, ilk növbədə, böyük ölkələrdə tədricən öz ***diasporunu*** yaradacaq, öz ***soydaşlarını*** bir yerə yığacaq, onların bir-biri ilə əlaqələrini yaradacaqdır. Buna bizim ehtiyacımız var".

Diaspor və lobbi kimi neologizmlərlə Heydər Əliyev xaricdə yaşayan azərbaycanlılara hamımızın bir ana vətəni olduğunu anladır: "İncimısəniz, deyə bilərəm ki, düşdüyünüz mühitdə bəziləri əriyib başqalarına qarışır, öz milli mənliyini saxlaya bilmir. Bu, bizim nöqsanımızdır. Bəzən azərbaycanlılar öz aralarında danışarkən fikirləşirlər ki, bizim də ermənilərinki kimi ***lobbimiz*** olsaydı, başqa ölkələrdə bizim də ***diasporumuz*** olsaydı, şübhəsiz onlar da bizdən ötrü çox iş görərdi. Bu, həqiqətdir".

Ümummilli lider Sovet imperiyası dövründə repressiyalara məruz qalmış sözlərimizə nitqi ilə yenidən həyat verir – Azərbaycan dilindən uzaq düşmüş ifadələrimizi sıraya qaytarır: "Ona görə də Azərbaycanın indi bu zirvə toplantısında iştirak etməsi və sözünü deməsi, eyni zamanda, Azərbaycan haqqında xüsusi qətnamə və qərarların qəbul olunması ölkə-

miz üçün önəmlidir və Azərbaycanın indiki durumu, vəziyyəti barədə beynəlxalq ictimaiyyətə həm məlumat verir, həm də onun diqqətini ölkəmizə, Ermənistanın Azərbaycana təcavüzünə cəlb edir".

Heydər Əliyevin nitqində neologizmlərlə bağlı aşağıdakı fikirləri deyə bilərik:

– Neologizmlər qloballaşma dövründə Heydər Əliyevin dil siyasətinə xidmət edə biləcək nitq vasitəsidir;

– Neologizmlər böyük natiqin ölkədən kənarda olan görüşlərində daha çox işlədilir;

– Heydər Əliyevin çıxışlarında səslənən neologizmlər televiziyalarda və qəzetlərdə istifadə edilməklə ümumişləklik qazanır;

– Heydər Əliyev auditoriyalarda neologizmlərə izah verməklə nitqin ağırlığını aradan qaldırır;

– Böyük natiqin dilində "intellektual" neologizmi Azərbaycanın nələrə qadir olduğunu xarici auditoriyalara çatdırmaq məqsədi güdür;

– Müstəqilliyə qədəm qoyandan sonrakı illər üçün "modern", "modernləşdirmə" kimi neologizmlər dilimizə daxil oldu ki, bu tip neologizmlər böyük natiqin respublikadan kənar işgüzar xarakterli çıxışlarında tez-tez təsadüf edir.

# X FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ ANTROPONİMİK SIRALANMALAR

Onomalogiya – nəzəri dilçiliyin xüsusi adları öyrənən şöbəsidir. Onomalogiya termini iki yunan sözünün – onomo (ad) və logiya (təlim, nəzəriyyə) sözlərinin birləşməsindən əmələ gəlib. Onomalogiyanın əsas və ən geniş yayılmış sahəsini antroponimika təşkil edir. Antroponimika yunan dilində antropos (insan) və onuma (ad) sözlərinin birləşməsindən əmələ gəlmişdir. Bu termin dilçilikdə insan adları haqqında elm mənasında işlədilir.[1]

Antroponimik sıralanma dedikdə isə biz natiqlərin nitqin gedişində insan adlarını sıralanmasını nəzərdə tuturuq.

Nitqdə sinonimlər, frazeoloji birləşmələr, təkrarlar kimi mühüm yer almayan antroponimik sıralanmalar böyük natiq Heydər Əliyevin nitqində xüsusi çəkiyə malik olaraq özünəməxsus məna çalarları kəsb edir. Ədəbiyyatda antroponimik sıralanmaların üslubiyyat yaratma xüsusiyyəti tək-tək işlərdə işıqlandırılmışdır.[2] Ölkəmizin və dünyanın həyatında mühüm rollara malik şəxsiyyətlərin dolğun şəkildə, xronoloji olaraq sıralanması Heydər Əliyev nitqində önəmli yer tutur və bu nitq elementinin araşdırılması diqqətə layiqdir. Böyük natiqin nitqində antroponimik sıralanmaları şifahi şəkildə eşidən dinləyicilər pərəstiş etdikləri şəxsiyyətlərin adlarını həmin sıradan tapa bilir. Sıra dolğun olduqca, şifahi şəkildə auditoriyaya çatdırıldıqca auditoriya fəth olunur, ürəklərə yol tapılır. Auditoriya böyük natiqin antroponimik sıralanmalardakı hər bir

---

[1] Çobanov Mədət. Azərbaycan antroponimiyasının əsasları. Ali məktəb tələbələri üçün dərs vəsaiti, Bakı, Maarif, 1998. 332 səh.

[2] Paşayev A.M. Azərbaycan antroponimiyasının leksik problemləri. Bakı, "Maarif" nəşriyyatı, 1997. 252 səh.

şəxsiyyət barəsində ciddi və səhih məlumata malik olduğunu anlayır, Heydər Əliyev yaddaşının, analitik təfəkkürünün, rabitəli məntiqə söykənən nitq ardıcıllığının şahidi olur.

Antroponimik sıralanmalarla Heydər Əliyev bir tarixçi alim kimi auditoriyani keçmiş tarixmizə apararaq onun şanlı səhifələrini açır:“İlk Azərbaycan Demokratik Respublikasının yaradıcıları, rəhbərləri ***Məmməd Əmin Rəsulzadə, Fətəli xan Xoyski, Əlimərdan bəy Topçubaşov, Nəsib bəy Yusifbəyov*** və başqaları Azərbaycan xalqının tarixində böyük xidmətlər göstərmişlər və Azərbaycanda ilk dəfə müstəqilliyin, müstəqil dövlətçiliyin, demokratiyanın əsasını qoymuşlar” [Ic.s.450].

Böyük natiq antroponimik sıralanmalarla həm tariximizin ibrətamiz, öyrənilməyə layiq, həm də təəssüf doğuran səhifələrini auditoriyaya çatdırır: ”Əsərin bir yerində o deyir ki, xanlar qorxurlar ki, mən şah olaram” bu da həqiqətdir. Çünki, ***İbrahim xan*** da istəyirdi şah olsun, ***Kəlbalı xan, Cavad xan, Quba xanı Fətəli xan da,*** Şəki xanı da şah olmaq istəyirdi”. Bu kiçik parçada antroponimik olaraq xanların adlarının Heydər Əliyev tərəfindən sıralanması o dövrdə onların birləşib vahid, qüdrətli dövlət yarada bilməməsi fikrini ortaya qoyur, bu gün də separatçılıq meyllərinə güclü zərbə vurur, vahid lider ətrafında sıx birləşməkdən başqa bir yolumuzun qalmadığını göstərir.

Heydər Əliyev nitqində antroponimik sıralanmada şəxslərin sıralanması auditoriyanın çeşidindən asılı olaraq özünəməxsus xüsusiyyətlər qazanır. Məsələn, Gənclərin Birinci Respublika Forumundakı nitqdə görkəmli şəxsiyyətlərimiz Azərbaycan ədəbiyyatındakı xidmətlərinə görə sıralanır: “Azərbaycan ədəbiyyatını, ana dilini bilməyən gənc ***Nizamini*** oxuya bilməz, ***Füzulini*** oxuya bilməz, ***Nəsimini*** oxuya bilməz, ***Vaqifi*** oxuya bilməz, ***Sabiri*** oxuya bilməz, ***Cəlil Məmmədquluzadəni*** oxuya bilməz və digərlərini oxuya bilməz” [IIc.s.89].

Bu nitqi dinləyən hər bir gəncin, hər bir kəsin yeddi dəfə təkrarlanan "oxuya bilməz" ifadəsindən sonra bu dili sevməməyi mümkünsüz görünür. Amma Azərbaycan müəllimlərinin qurultayında, necə deyərlər müəllimlər auditoriyasında şəxsiyyətlər tarixi xronologiya üzrə sıralanır. Bütün nitqlərində Nizamini öndə saxlayan böyük natiq filosof Əbülhəsən Bəhmənyarın adını birinci çəkir, şəxsiyyətlərin adlarını müfəssəl şəkildə açıqlayır:

"Azərbaycanın dünya söhrəti qazanmış dahi mütəfəkkirləri ***Əbülhəsən Bəhmənyar,Nizami Gəncəvi, İmadəddin Nəsimi, Nəsrəddin Tusi, Məhəmməd Füzuli, Şah İsmayıl Xətai*** və başqalarının yetişməsində mədrəsə təhsilinin müstəsna rolu olmuşdur".

Eləcə də, auditoriya böyük natiqin antroponimik sıralanmada adını çəkdiyi hər bir şəxs haqqında geniş və hərtərəfli biliyə malik olduğunu anlayır. Elə, anladığı üçün də nəfəsini çəkmədən bu rəvan, bu cəlbedici nitqi heyranlıqla dinləyir: "Azərbaycanda böyük tibb alimləri olubdur, onlar sizin xatirinizdədir.Azərbaycanda 1945-ci ildə Elmlər Akademiyası yarananda onun ilk prezidenti həkim, professor, alim ***Mirəsədullah Mirqasımov*** olubdur. Elmlər Akademiyasını yaradanlardan biri böyük cərrah, alim ***Mustafa bəy Topçubaşov*** olubdur. Azərbaycanda tibb elminin, səhiyyənin inkişafında böyük xidmətlər göstərmiş, uzun müddət tibb institutunun rektoru, səhiyyə naziri olmuş, Azərbaycan rəhbərliyində olmuş, Dağıstana rəhbərlik etmiş böyük tibb alimi, professor ***Əziz Əliyev*** olubdur".

Hələ imperiyanın kəshakəs dövründə müstəqillik ideyaları ilə dolu əsərlər yaradılırdı. Bu ideyaların kütlələrin şüuruna yeridilməsində teatr sənətinin rolunu səhih bilən, yüksək qiymətləndirən ulu öndər ideya daşıyıcıları olan sənətkarlara elə o dövrdə xüsusi dövlət qayğısı göstərildiyini, elə həmin dövlətin də yüksək mükafatlarının verilməsini dilə gətirir və

onları sıralayır: “Xatirimdədir, 1973-cü ildə bu teatrın 100 il-lik yubileyini böyük təntənə ilə keçirdik. Xatirinizdədirsə rəh-mətlik ***Mehdi Məmmədova, İsmayıl Dağıstanlıya, İsmayıl Osmanlıya*** böyük adlar verildi, nə qədər başqa insanlara bö-yük mükafatlar verildi”.

Hər bir xalq dünyaya öz musiqisi ilə çıxır prizmasından çıxış edən böyük natiq Azərbaycan musiqisinin inkişafına hə-mişə xüsusi diqqət və qayğı göstərmişdir. Xalqın görkəmli musiqiçilərinə həmişə qədirbilənliklə yanaşan ulu öndər sıra-lamaqla xalqın musiqi yaddaşının daim möhkəmlənməsinə ça-lışmışdır: ”Üzeyir Hacıbəyovun Azərbaycanda yaratdığı musi-qi məktəbi elə bir məktəb olub ki, ondan sonra xalqımız dün-yaya bir çox görkəmli bəstəkarlar, musiqiçilər verib. ***Qara Qarayev, Fikrət Əmirov, Niyazi, Cövdət Hacıyev, Bədəlbəyli*** və bu məktəbin yetişdirməsi olan görkəmli sənətkar ***Arif Məlikov***”.

Böyük natiqin dilində heykəltəraşlar-xalqımızın daş yad-daşlarını heykəllərə çevirərək küçə və meydanlarda tariximizi öyrədən şəxsiyyətlər-sıralanır. Uşaqlı-böyüklü, savadlı-savad-sız hamının tariximizi öyrənə bildikləri daş heykəllərə ciddi münasibət bəsləyən Heydər Əliyev heykəltəraşlara həmişə xüsusi ehtiram və qayğı göstərir: “Bu illər ərzində bizim bö-yük heykəltəraşlarımız yaranmışdır. Bu gün onların heykəl-lərinə baxarkən xalqımız bunları qiymətləndirir, xatırlayır. ***Fuad Əbdürrəhmanov*** gözəl əsərlər yaradıbdır. ***Cəlal Qar-yağdı, Tokay Məmmədov*** və başqaları da həmçinin. Bu gör-kəmli Azərbaycan heykəltəraşları içərisində ***Ömər Eldarov*** xüsusi yer tutur”.

Antroponimik sıralanmalar Heydər Əliyevin dilində müx-təlif çeşidli auditoriyaları bəzəyir. Hərbi-vətənpərvərlik möv-zusu ilə bağlı keçmiş tariximiz Azərbaycan Respublikası gənclərinin birinci forumundakı nitqdə generallarımızın sıra-lanması ilə özünü göstərir. Qurduğu müstəqil dövlətimizin gə-

ləcəyini gənclərə tapşıran ulu öndər antroponimik sıralanmalarla sanki vətənpərvərlik mövzusunda dərs verən müəllimə çevrilir: "Azərbaycan Çar Rusiyasının tərkibində olarkən xalqımızın çox dəyərli şəxsiyyətləri orduda yüksək rütbələrdə xidmət etmişlər, general rütbələri almışlar. Biz məsələn, general ***Əliağa Şıxlınski*** ilə, yaxud ***Talışxanovlar, Bakıxanovlar, Ağalarovlar, Naxçıvanskilər*** nəslindən olan generallarla fəxr eləyirik".

Natiqlik məharəti natiqin danışılan mövzunu dərindən bilməsində, məntiqi ardıcıllığa söykənməsindədir. Azərbaycan milli mətbuatının azad, demokratik inkişafına həmişə kömək edən ulu öndər milli mətbuatımızın yaradıcılarını sıralayır: "Milli mətbuatımızın bünövrəsi 1875-ci il iyulun 22-də "Əkinçi"qəzetinin ilk nömrəsinin nəşri ilə qoyuldu.Bütün Qafqazda böyük əks-səda doğuran bu qəzetin naşiri də, redaktoru da, korrektoru da Azərbaycan milli maarifçilik hərəkatının banilərindən biri, təbiətşünas alim ***Həsən bəy Zərdabi*** idi. Qəzetin ərsəyə gəlməsində ***Mirzə Fətəli Axundov, Seyid Əzim Şirvani, Nəcəfbəy Vəzirov, Əsgər ağa Gorani*** və başqa ziyalıların böyük xidmətləri olmuşdur".

Azərbaycan Respublikasında dövlət qadın siyasətinin həyata kecirilməsi haqqında 6 mart 2000-ci iltarixli fərmanda Heydər Əliyev cəmiyyətimizin həyatında qadınların müstəsna rolunu yüksək qiymətləndirir. Azərbaycanın siyasi, tarixi, mənəvi həyatında kişilərlə çiyin-çiyinə çalışan qadınlarımızı antroponimik olaraq sıralayır. Bu sıralanmalarda qadınlarımızın tarixdəki rolları araşdırılır: "Orta əsrlər tariximizdə ***Qızıl Arslanın arvadı Qətibə xanım, Özbək xanın arvadı Mehrcan xanım, Uzun Həsənin anası Sara Xatun, Şah İsmayıl Xətainin qızı Məhinbanu, Şirvanşah Xəlilullahın arvadı Pəri Xanım, Şah Abbasın anası Xeyransa Bəyim, əfsanəvi Tuti Bikə*** və başqaları kimi görkəmli siyasi və dövlət xadimlərinin adları hörmətlə yad edilir".

Böyük natiqin antroponimik sıralanmalarla zəngin olan xarici ölkələrdəki çıxışları auditoriyaları heyran qoyur. Almaniyaya olan işgüzar səfərdəki nitqdə alman xalqının görkəmli yazıçılarının adlarını şifahi şəkildə sıralaması ilə həmin xalqın nümayəndələrini özünə və mənsub olduğu xalqa-müstəqilliyə qədəm qoyan Azərbaycan xalqına hörmətə çağırır: “Alman xalqının nümayəndələri olan dahi yazıçılar ***Şillerin, Heynenin, Götenin*** və başqalarının əsərləri bütün dünyada oxunur. Bildirmək istəyirəm ki, onların əsərləri Azərbaycanda da Azərbaycan dilində oxunur”.

Antroponimik sıralanmalarla bir daha Heydər Əliyev auditoriyaya necə məsuliyyətlə yanaşmasını, analitik təfəkkürə əsaslanan nitqin ecazkarlığını göstərir: “Böyük alman bəstəkarları ***Bethoven,Vaqner, Motsart, Straus*** və başqaları bütün dünya xalqları üçün əziz bəstəkarlar, əziz musiqiçilər kimi tanınıblar”. Belə antroponimik sıralanmalar Azərbaycan-Almaniya siyasi münasibətlərinə incə, incə olduğu qədər də siyasi cəhətdən möhkəm, səbatlı, ikitərəfli münasibətlər yaratmağa, müstəqil Azərbaycanın dünya birliyindəki mövqeyinin möhkəmlənməsinə xidmət edir.

Fransa Respublikasının milli bayramı münasibətilə rəsmi qəbulda söylədiyi nitq bir daha Heydər Əliyev natiqliyinin geniş elmi dünyagörüşə söykənməsini ortaya qoyur. Dünya xalqlarının elminə, mədəniyyətinə maraq göstərmək, o xalqların dahi insanlarını yeri gəldikcə sıralamaqla necə deyərlər auditoriyaları fəth edir, qəlbləri fəth edir: “Fransanın mütəfəkkir insanları, böyük şəxsiyyətləri ***Jan Jak Russo, Monteskye, Didro*** və digər dahi insanların yaratdıqları demokratiya prinsipləri həm Fransada, həm də demokratiyanı qəbul etmiş digər ölkələrdə yayılmış, özünə hüquq qazanmışdır”.

Heydər Əliyev nitqində səslənən antroponimik sıralanmalarda islam-türk irsimizə hörmət öndədir: “Xalqlarımız çağdaş dünya sivilizasiyasına, təhsilinə, elminə qovuşmuşdur.

Sözlərimə misal olaraq 1921-ci ildə burada, Daşkənddə yaradılan belə bir universitet göstərə bilərəm. Əlbəttə, o, istər ***Mirzə Uluqbəyin***, istər ***İbn Sinanın, istər Fərabinin***, istərsə də Şərqin digər adamlarının yaratdıqlarının irsidir".

Böyük natiqin nitqində antroponimik sıralanmalar digər nitq ünsürləri, vahidləri ilə çulğalaşır: "Bir daha deyirəm, o vaxt Naxçıvan çox böyük sıxıntılar içərisində yaşayırdı, qışda insanlar donurdu, yemək yox idi. Amma bunlara baxmayaraq biz məscid məsələsini unutmurduq. Bir müddətdən sonra Ağayi Rəfiqdust Naxçıvana gəldi. Biz onunla görüşdük. Mən ona dedim ki, gərək biz məscidin təməlini ataq, külüngü vuraq. Dedi ki, harada vuraq? Bildirdim ki, yer seçmişəm. Bax, bu yeri seçmişdim. Nə üçün bu yeri seçmişdim? Çünki, birincisi, bu yer Naxçıvan şəhərinin gözəl bir guşəsidir. İkincisi də, naxçıvanlılar bilir, bu yerdə böyük bir seyidlər ailəsi yaşamışdır. Mircəfər Seyidov mənim müəllimim olubdur, onun qardaşı Əqil Seyidov müəllimlik edibdir, Mirhəsən Seyidov Naxçıvan teatrının aktyoru olubdur. Mən bu ailədən olanlara Seyidov dedim, çünki onlar seyid idilər. Amma əslində onlar ***Mircəfər Mirişli, Əqil Mirişli, Mirhəsən Mirişli*** və bu gün Azərbaycanın böyük bir bəstəkarı olan ***Ramiz Mirişlidir***".

Yuxarıdakı nitq parçasında "sıxıntılar içərisində yaşamaq", "qışda insanların donması", "təməl atmaq", arxaik "külüng vurmaq" kimi frazeoloji birləşmələrin, "bax" qüvvətləndirici ədatın, "nə üçün bu yeri seçmişdim" ritorik sualın, "birincisi" və "ikincisi" modal sözlərin köməyi ilə Həzrət Peyğəmbərimizin şəcərəsinə mənsub, xalqın inam və etiqad yeri olan seyidlərin sıralanmasına gəlib çıxır. Ritorik sual cavabını antroponimik sıralanmayla alır. Xalqı ilə eyni düşünən, eyni əziyyətə qatlaşan, eyni çətinliklərə sinə gərən natiq bir daha auditoriya tərəfindən sevilir. Elə xalqından uzaq düşməməsi Heydər Əliyevin digər bir yerdə işlətdiyi antroponimik sıralanmada özünü daha bariz şəkildə göstərir: "Ancaq insanların qəl-

bindən Heydər Əliyevi heç kəs çıxara bilmədi. Nə ***Qorbaçov hakimiyyəti, nə Vəzirov hakimiyyəti, nə Mütəllibov hakimiyyəti, nə Əbülfəz Elçibəy hakimiyyəti*** – heç birisi Heydər Əliyevi Azərbaycan xalqının qəlbindən çıxara bilmədi”.

Bir sıra hallarda antroponimik sıralanmalar Heydər Əliyevin fikirlərinin təsdiqinə çevrilir: “Naxçıvan çox böyük mütəfəkkirlər diyarı, böyük alimlər, sənətkarlar diyarı olubdur. Əgər yaşadığımız əsrin əvvəlini götürsək, böyük ***Cəlil Məmmədquluzadə, Hüseyn Cavid,*** Azərbaycan mədəniyyətinin, ədəbiyyatının fəxrinə çevrilmiş şəxsiyyətlər, onların əsərləri öz həyat yolunu buradan başlamışlar. Naxçıvanda təhsilin, ümumiyyətlə, mədəniyyətin inkişafında mütəfəkkir ***Məhəmməd Tağı Sidqinin*** çox böyük rolu olmuşdur”. Burada Naxçıvanın böyük mütəfəkkirlər diyarı olması fikri ortaya qoyulur. Sonrakı cümlədə Azərbaycan və sivil dünyanın qəbul etdiyi dahi şəxslərin adlarının sıralanması bu fikri təsdiqləyir. Bu təsdiq, bu izah auditoriya tərəfindən razılıqla, heyranlıqla, qədirbilənliklə qarşılanır, qəbul edilir.

Heydər Əliyevin çıxışlarında ədəbiyyat və fəlsəfə korifeylərini sıralamaqla yanaşı, xalqların yaratdığı dastanlar da sıralanır:

“Bu yaxınlarda qardaş Türkiyə Respublikasında Şərq ədəbiyyatının və fəlsəfəsinin korifeylərindən biri, dahi Azərbaycan şairi Məhəmməd Füzulinin anadan olmasının 500 illik yubiley toplantılarında və Almatıda qazax xalqının ləyaqətli oğlu, görkəmli mütəfəkkir, filosof, şair Abayın 150 illiyinə həsr olunmuş bayram şənliklərində, məmnuniyyətlə iştirak etdim. Bir daha qəti əmin oldum ki, ***İbn Sinanın, Nizaminin, Nəvainin, Yunis İmrənin, Füzulinin, Məhdumqulunun, Mahmud Kaşqarinin*** və Şərqin bir çox digər parlaq dahilərinin yaradıcılığı, “Dədə Qorqud”, “Koroğlu”, “Manas”, “Alpamış” kimi ölməz dastanlar təkcə bizim qohum xalqlarımıza mənsub deyil, onlar həm də bütün bəşəriyyətin sərvətidir”

[IVc.s.225]. Bayram şənliklərində iştirak edən rəsmi dövlət başçılarını tutduğu vəzifələri sadalamaqla sıralayır. 12 noyabr 1997-ci ildə "Gülüstan" sarayında Xəzər dənizinin Azərbaycan sektorunda ilkin neftin çıxarılması münasibətilə Azərbaycana gəlmiş qonaqların şərəfinə təşkil olunmuş rəsmi qəbuldakı kimi:

"Mən çox məmnunam ki, bizim bayram şənliklərində Gürcüstan Respublikasının prezidenti, bizim dostumuz ***Eduard Şevardnadze*** iştirak edir, Türkiyə Cümhuriyyətinin Baş naziri, bizim dostumuz ***Məsud Yılmaz*** iştirak edir, Rusiya Federasiyası Baş nazirinin birinci müavini, bizim dostumuz ***Boris Nemtsov*** iştirak edir, Amerika Birləşmiş Ştatlarından, okeanın o tərəfindən əziyyət çəkib Azərbaycana – bizim bölgəyə gəlmiş ABŞ-ın Energetika naziri, bizim dostumuz ***Federiko Penya*** iştirak edir, Ukrayna Respublikası Baş nazirinin birinci müavini, Özbəkistan Respublikası Baş nazirinin müavini, bir çox nazirlər və yüksək səviyyəli dövlət, hökumət nümayəndələri iştirak edirlər" [XIIIc.s 200].

Heydər Əliyevin nitqində dramaturgiyamızın baniləri yaratdıqları əsərləri ilə sadalanır:"Bizim ***Cəlil Məmmədquluzadə, Mirzə Fətəli Axundov, Cəfər Cabbarlı, Hüseyn Cavid*** kimi dramaturqlarımız – biz onların bulağından su içirik – çox xariqüladə əsərlər yaradıblar. Hüseyn Cavidin "İblis", Cəfər Cabbarlının "1905-ci ildə", "Almaz" pyesləri nə qədər böyük əsərlərdir" [XIIIc.s.174].

Azərbaycan professional vokal sənətinin banisi kimi Bülbülün anadan olmasının 100 illiyinə həsr olunmuş təntənəli yubiley gecəsində "Koroğlu" operasının yaradıcılarının sıralanması bir daha Heydər Əliyev şəxsiyyətinin böyüklüyünü, milli opera sənətimizə Heydər Əliyev sevgisini auditoriyaya çatdırır: "Şübhəsiz ki, biz bu gün "Koroğlu" operası haqqında danışarkən əsərin librettosunu ***Üzeyir Hacıbəyovla*** birlikdə yazan böyük yazıçımız ***Məmməd Səid Ordubadini,*** alim ***Heydər***

***İsmayılovu***, “Koroğlu” operasının ilk rejissoru, böyük rejissor ***İsmayıl Hidayətzadəni*** və böyük rəssam ***Rüstəm Mustafayevi*** də minnətdarlıq hissi ilə xatırlamalıyıq” [XIIIc.s.303].

Heydər Əliyev antroponimik sıralanmalarla üzünü gənclərə tutur, onları keçmişimizi öyrənməyə sövq edir, keçmişimizə hörmət etməyi hər bir gənc yazarın vəzifə borcu hesab edir: “Siz gənclər bunu bilirsiniz, amma daha dərindən bilməlisiniz ki, ən qədim dövrlərdən bizə gəlib çatmış, indi fəxr etdiyimiz ədəbiyyat əsərlərinin – ***Nizaminin, Nəsiminin, Füzulinin, Vaqifin, Mirzə Fətəli Axundovun,*** yaxud digərlərinin əsərlərinin heç birisi asanlıqla yaranmayıb. Heç də hamı bilmir ki, bu əsərlərin yaranması üçün onlar nə qədər zəhmət, əziyyət çəkiblər, nə qədər fədakarlıq göstəriblər” [XIIIc.s.82].

Antroponimik sıralanmalarla Heydər Əliyev Azərbaycan musiqi tarixini auditoriyalara izah edir. Bu zaman Üzeyir Hacıbəyovun xidmətlərini öndə saxlayır:

“Azərbaycanın musiqisi, xüsusən professional musiqisi böyük tarixə malikdir. Üzeyir Hacıbəyovun Azərbaycanda yaratdığı musiqi məktəbi elə bir məktəb olub ki, ondan sonra xalqımız dünyaya bir çox görkəmli bəstəkarlar, musiqiçilər, mədəniyyət xadimləri verib. ***Qara Qarayev, Fikrət Əmirov, Niyazi, Cövdət Hacıyev, Əfrasiyab Bədəlbəyli,*** başqaları və bu məktəbin yetişdirməsi olan görkəmli sənətkar ***Arif Məlikov***” [IIIc.s.160].

Heydər Əliyev öz məişət üslublu nitqlərində belə antroponimik sıralanmalarla Azərbaycana aid olan, müstəqilliyə aid olan hər bir məqamı auditoriyalara çatdırır: “1973-cü ildə mən belə qərara gəldim ki, onları bazar günü Zuğulbada dəniz kənarındakı dövlət bağına dəvət edim, bir gün onlarla birlikdə olum. Dəvət etdim. Rəhmətlik ***Qara Qarayev, Fikrət Əmirov, Niyazi, Əfrasiyab Bədəlbəyli, Cahangir Cahangirov, Soltan Hacıbəyov*** xanımları ilə gəlmişdilər. ***Tofiq Quliyev, Arif Məlikov*** və başqaları da orada idilər. Biz bütün günü söhbət

etdik, musiqidən danışdıq. Xatirimdədir, Tofiq Quliyevlə Niyazi pianoda çox gözəl çaldılar. Biz xeyli söhbət etdik. Hesab edirəm ki, bu, çox böyük bir görüş oldu. Bundan sonra münasibətlər xeyli düzəldi. Yaxşı əsərlər də meydana gəldi" [IIIc.s.162]. Antroponimik sıralanmalarla bəzənən bu məişət üslublu nitq xalqı bir olmağa, xalqın ziyalılarını bir olmağa səsləyir.

Qətiyyətli dövlət başçısı kimi Heydər Əliyev öz göstərişlərini antroponimik sıralanmalarla vəzifəli şəxslərə ünvanlayır. Hüseyn Cavidin məqbərəsinin yaradılamsı ilə bağlı keçirilən müşavirədəki kimi:

"Ona görə də mən ***Ramiz Mehdiyevə, Elçin Əfəndiyevə, Fatma Abdullazadəyə*** tapşırıram ki, müzakirələr aparsınlar, bu layihələr qonşu salona qoyulsun, gəlib-gedənlər də baxsın" [IVc.s.13].

Antroponimik sıralanmalar Heydər Əliyevin nitqini gündəlik dövlət işlərini həyata keçirəndə də tərk etmir. Heydər Əliyev Prezident sarayındakı müşavirələrdə məmurları sıralayır, bu zaman onları tutduqları vəzifələri ilə birgə sıralayır:

"Buna görə də tələb edirəm ki, bütün bu nöqsanlar, qüsurlar, bu cinayət halları aradan götürülsün və kənd təsərrüfatının bütün sahələrində, xüsusən pambığın yığılması ilə əlaqədar ciddi iş aparılsın. Məsuliyyət kənd təsərrüfatı naziri ***İrşad Əliyevin***, baş nazir ***Fuad Quliyevin***, baş nazirin birinci müavini ***Abbas Abbasovun***, yerli icra hakimiyyəti başçılarının və yerli orqanların üzərinə düşür" [IVc.s.213].

Azərbaycan teatrını gənc yaşlarından sevən böyük natiq səhnə ustalarını antroponimik sıralarla xalqımıza tanıdır: "Mən Azərbaycan teatrını gənc yaşlarımdan sevmişəm, ***Abbas Mirzə Şərifzadəni, Ülvi Rəcəbi, Mərziyə Davudovanı, Fatma Qədrini, Ələsgər Ələkbərovu, Mirzağa Əliyevi, Sidqi Ruhullanı, Sona Hacıyevanı*** və bir çox başqalarını səhnədə görmüşəm. Onların yaratdığı obrazları sevmişəm. Səhnəmizdə bö-

yük ad-san qazanmış sənətkarlarımızın da yaratdığı rollara tamaşa etmişəm” [IVc.s.84].

Heydər Əliyevin antroponimik sıralanmaları hərbçilər auditoriyasında tez-tez eşidilir. Bu çıxışlarda Azərbaycan hərb sənətini inkişaf etdirən sərkərdələr, generallar, zabitlər sıralanır. Bu çıxışlarda hərb sahəsindəki qəhrəmanlar sıralanır. 26 iyun 2000-ci ildə Azərbaycan Silahlı Qüvvələri gününə həsr edilmiş təntənəli mərasimdə söylənilən nitq bu qəbildəndir: “O dövrdə az da olsa azərbaycanlı zabitlər müxtəlif ordu hissələrində xidmət etmiş, ikinci dünya müharibəsində Azərbaycan övladlarının böyük bir hissəsi misilsiz qəhrəmanlıqlar göstərmiş və ən yüksək mükafatlara layiq olmuş, Sovet İttifaqı Qəhrəmanı kimi yüksək ad almışlar. Həmin illər azərbaycanlı zabitlər öz şücaətlərinə, qəhrəmanlıqlarına görə rütbəcə də ucalmışlar, yüksək zabit rütbələri almışlar, general rütbəsinə çatmışlar: ***general Həzi Aslanov, general Əbilov, general Akim Abbasov*** və digər generallar... Onlar Azərbaycan oğlunun nəyə qadir olduğunu göstərmişlər” [XXVIIIc.s.324].

Heydər Əliyevin nitqində antroponimik sıralanmalar dövlətçiliyimiz tarixində görkəmli rolları olan tarixi şəxsiyyətlərin auditoriyalara tanıdılması rolunu oynayır. Azərbaycan xalqının qədim dövlətçilik ənənələrinə malik olması şüurlara çatdırılır: “***Məhəmməd Cahan Pəhləvanın, Qızıl Arslanın, Uzun Həsənin, Şah İsmayıl Xətainin*** və başqa dövlət xadimlərimizin həyat və fəaliyyəti xalqın vətən sevgisi və dövlətçilik hissini daha da inkişaf etdirmiş, onu həyatın ən vacib, ən ümdə məqsədinə çevirmişdir” [XXXIc.s.290].

Antroponimik sıralanmaların poetik bir dillə xalqa çatdırılması yenə də Heydər Əliyev nitqinə xasdır: “Xalqımızın dünya elminə bəxş etdiyi töhfələrlə fəxr etməyə haqqı var. ***Nəsirəddin Tusinin, Əbülhəsən Bəhmənyarın, Şihabəddin Sührəvərdinin*** və digər mütəfəkkirlərin adları dünya elm aləminə yaxşı tanışdır. Şərqdə, o cümlədən Azərbaycanda təşək-

kül tapmış intibah dünya mədəniyyəti tarixinin ən parlaq səhifələrindən biridir” [XXXIc.s.290].

Heydər Əliyev nitqində antroponimik sıralanmalarla dünya mədəniyyəti xəzinəsinə incilər bəxş edən Azərbaycan elm adamları xatırlanır: “***Səfiəddin Urməvinin, Əcəmi Naxçıvaninin, Sultan Məhəmməd Təbrizinin*** dünya mədəniyyəti xəzinəsinə verdikləri incilər sənətsevərləri indi də heyran qoyur” [XXXIc.s.290].

Antroponimik sıralanmaların köməyi ilə Heydər Əliyev Azərbaycan elminin, mədəniyyətinin təşəkkül tapmasında əvəzsiz xidmətləri olan “korifeyləri” bir daha xalqın yaddaşında canlandırır: “Dastanlarımız kimi möhtəşəm sənət abidələri, dünya sivilizasiya tarixində silinməz izlər qoymuş ***Qətran Təbrizi, İmadəddin Nəsimi, Məhəmməd Füzuli*** kimi korifeylərin yaradıcılığı ümümbəşəri ideyaların tərənnümünə, haqqın, ədalətin, humanist ideyaların bərqərar olunmasına xidmət etmişdir” [XXXIc.s.290].

Heydər Əliyevin Yeni 2001-ci il, Yeni əsr və üçüncü minillik münasibətilə Azərbaycan xalqına təbriki, Azərbaycan xalqına etdiyi müraciət antroponimik sıralanmalarla zənginliyi ilə seçilir. Üçüncü minilliyin astanası hesab edilən XX əsrdə Azərbaycanın dünyaya bəxş etdiyi korifeylərin adlarını sıralayır. O bu korifeyləri sənətlərinə görə təsnif edir. Öncə şair və yazıçıları yaşadıqları müxtəlif illərə görə sıralayır: “Bu gün hər bir azərbaycanlı ikinci minilliyin bəxş etdiyi böyük korifeylər ilə ***– Mirzə Ələkbər Sabir, Cəlil Məmmədquluzadə, Nəcəf bəy Vəzirov, Məhəmməd Hadi, Abdulla Şaiq, Əlibəy Hüseynzadə, Hüseyn Cavid, Əhməd Cavad, Cəfər Cabbarlı, Əliağa Vahid, Səməd Vurğun, Məhəmmədhüseyn Şəhriyar, Süleyman Rüstəm, Rəsul Rza, Mirzə İbrahimov, Mehdi Hüseyn, Süleyman Rəhimov*** kimi şair və yazıçıları” [XXXIc.s.356]

Sonrakı sıralanmada: ***Üzeyir Hacıbəyov, Müslüm Maqomayev, Qara Qarayev, Fikrət Əmirov, Niyazi, Tofiq Quliyev, Gahangir Gahangirov, Süleyman Ələsgərov kimi bəstəkarları, Cabbar Qaryağdı, Bülbül, Şövkət Məmmədova, Xan Şuşinski, Seyid Şuşinski, Zülfü Adıgözəlov, Rəşid Behbudov, Şövkət Ələkbərova*** kimi müğənniləri" [XXXIc.s.356] korifeylər adlandırır.

Daha sonra böyük sənət ustaları, eləcə də fırça və tişə ustalarının adları gəlir: "***Abbas Mirzə Şərifzadə, Mirzağa Əliyev, Ülvi Rəcəb, Mərziyyə Davudova, Sidqi Ruhulla, Ələsgər Ələkbərov, Möhsün Sənani, Mustafa Mərdanov, Hokümə Qurbanova, Leyla Bədirbəyli*** kimi səhnə ustaları, ***Əzim Əzimzadə, Bəhruz Kəngərli, Səttar Bəhlulzadə, Qəzənfər Xalıqov, Fuad Əbdürrəhmanov, Elmira Şahtaxtinskaya*** kimi fırça və tişə ustaları ilə haqlı olaraq fəxr edir" [XXXIc.s.358].

Həmin müraciətdə XX əsr Azərbaycan alimlərinin adları da qədirbilənliklə, böyük sevgi ilə, fəxrlə çəkilir:

"Görkəmli alimlərimiz ***Mirəsədulla Mirqasımov, Yusif Məmmədəliyev, Heydər Hüseynov, Həsən Əliyev, Mustafa bəy Topçubaşov, Əziz Şərif, Murtuza Nağıyev, Zahid Xəlilov, Musa Əliyev, Həsən Abdullayev, Abdulla Qarayev, Cəfər Xəndan, Əbdüləzəl Dəmirçizadə, Məmmədcəfər Cəfərov, Ziya Bünyadov, Fəraməz Maqsudov*** və başqaları Azərbaycan elminin inkişafında böyük xidmətlər göstərərək ona dünya şöhrəti gətirmişlər" [XXXIc.s.358].

Antroponimik sıralanmalar böyük natiqin dilində Azərbaycan tarixinin, mədəniyyətinin, mətbuatının bir sözlə Azərbaycana xidmət edən insanların, böyük şəxsiyyətlərin xalqa tanıdılması məqsədini güdür: "XX əsrdə isə Azərbaycan dilində çıxan ilk qəzet Məmmədağa Şahtaxtinskinin 1903-cü ildə Tiflisdə buraxdığı ictimai-siyasi, iqtisadi, elmi, ədəbi "Şərqi-rus" qəzeti olmuşdur. Qəzetin Azərbaycanda ictimai fikir tarixinin inkişafında xüsusi yeri olmuşdur. Qəzetdə dünyəvi elm-

lər, ana dili, qadın azadlığı ilə bağlı mütərəqqi fikirlər öz əksini tapırdı. "Şərqi-rus" qəzeti ***Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Abbas Səhhət, Ömər Faiq Nemanzadə, Hüseyn Cavid, Məmməd Səid Ordubadi, Əliqulu Qəmküsar, Əli Nəzmi*** kimi böyük maarifçiləri öz ətrafında birləşdirə bilmişdi" [XXVIc.s.89].

Azərbaycan xalqında müstəqillik ideyalarının təşəkkülündə rolu olan ziyalı şəxsiyyətlər Heydər Əliyev nitqində həmişə səslənir: "***Üzeyir Hacıbəyov, Cəlil Məmmədquluzadə, Əhməd bəy Ağayev, Əlibəy Hüseynzadə, Firudin bəy Köçərli, Nəriman Nərimanov, Məmməd Səid Ordubadi*** və bir çox belə şəxsiyyətlər əsrin əvvəlində Azərbaycan xalqında azadlıq, milli ruh əhval-ruhiyyəsinin inkişaf etməsində xidmətlər göstərmişlər" [XXVIIc.s.369].

Müstəqillik qazanandan sonrakı illərdə Heydər Əliyevin dilində keçmiş tariximizin xalqdan gizli qalmış məqamlarına aydınlıq gətirilir:

"Azərbaycanın dəyərli oğulları ***Mirzə Fətəli Axundov, Mirzə Şəfi Vazeh, Fətəli xan Xoyski*** dünyalarını dəyişəndən sonra da məhz Tbilisidə – Gürcüstan torpağında əbədiyyətə qovuşmuşlar" [Vc.s.423].

Xalq öz qəhrəmanlarını, öz keçmişini öz rəhbərinin dilindən eşidir. Tarix fəlsəfəsini həmişə öndə saxlayan böyük natiq "tarixi qaralamaq olmaz", "tariximizə hörmət qoymalıyıq" prinsiplərindən istifadə edərək Sovetlər İttifaqının tərkibində olarkən faşizmə qarşı mübarizədə o dövrün ən yüksək mükafatını – Sovet İttifaqı Qəhrəmanı adı alanları sıralayır, bizləri qəhrəmanlarımıza sevgiyə səsləyir: "Sovet İttifaqı Qəhrəmanlarımız olubdur, o cümlədən ***Mehdi Hüseynzadə, Qafur Məmmədov, İsrafil Məmmədov*** kimi Sovet İttifaqı Qəhrəmanları tarixə düşmüşdür. Bu gün bizim sıralarımızda, bizimlə bərabər yaşayan ***Ziya Bünyadov, Məlik Məhərrəmov, Abbas Quliyev*** Sovet İttifaqı Qəhrəmanlarıdır" [Vc.s.315].

XX əsrin 60-70-ci illərində Azərbaycan ədəbiyyatına öz qələmləri ilə qədəm basan istedadlı gəncləri XX əsrin 90-cı illərində Heydər Əliyev sıralayır. Sıralanan şəxslərin müstəqillik kimi qiymətli bir nemətin əldə olunmasındakı xidmətlərini auditoriya üçün açıqlayır. 19 dekabr 1995-ci ildə yazıçı Yusif Səmədoğlunun 60 illiyinə həsr olunmuş təntənəli mərasimdəki çıxış məişət üslubuna söykənərək auditoriyaya yol açır:

"Doğrudan da o illərdə 60-70-ci illərdə ədəbiyyata, mədəniyyətə gəlmiş gözəl bir nəsil indi artıq ədəbiyyatımızın, mədəniyyətimizin aparıcı qüvvələridir: ***Yusif də, Anar da, Maqsud da, Elçin də,*** başqaları da. Ona görə də bir daha deyirəm, o illəri xatırlamağa və onun qiymətini unutmamağa əsas var. Ancaq nə qədər ağır olsa da bugünkü günümüz də bizim üçün çox qiymətlidir.

Bu günlər indiyədək yaşadığımız dövrlərin bəlkə də hamısından qiymətlidir. Çünki biz indi milli azadlığa çıxmışıq, dövlət müstəqilliyini əldə etmişik, müstəqil dövlət kimi yaşayırıq" [Vc.s.201].

Heydər Əliyev Azərbaycan tarixində xüsusi xidmətləri olan insanları sadalamazdan öncə həmin şəxsiyyətlərin yaşadığı dövrü bir tarixçi kimi araşdırır. İqtisadi inkişaf, mənəvi tərəqqi, şəxsiyyət anlayışları vəhdətdə verilir. Auditoriya XX əsrin əvvəllərində görkəmli Azərbaycan maarifçilərinin böyük natiqin dilindən sıralanmasının şahidi olur: "XIX əsrin sonu – XX əsrin əvvəlləri dünyada yeni münasibətlərin bərqərar olduğu bir dövr kimi, Azərbaycan xalqının həyatının bütün sahələrində də öz təsirini göstərmişdir. Bu dövrün ictimai prosesləri iri sənaye şəhərinə çevrilmiş Bakını bütün Qafqazın iqtisadi mərkəzi etmişdir. İqtisadi inkişafla əlaqədar olaraq bu dövrdə təhsil, elm, incəsənət və ədəbiyyat sahələrində böyük canlanma başlandı. Bakı, Gəncə, Naxçıvan, Şuşa, Şəki, Salyan və sair şəhərlərdə yeni tipli şəhər və qəza məktəbləri açıldı. Qori müəllimlər seminariyasının məzunlarından olan ***Cəlil Məm-***

***mədquluzadə, Süleyman Sani Axundov, Üzeyir bəy Hacıbəyov, Həbib bəy Mahmudbəyov, Rəşid bəy Əfəndiyev, Firudin bəy Köçərli*** kimi görkəmli maarifçilər təhsildə gedən islahatlara güclü təkan verirdilər” [XXXIc.s.292].

Antroponimik sıralanmalarda Heydər Əliyev insan adlarını onların fəaliyyət göstərdikləri məkanlarla birgə səsləndirməklə nitqini daha da əlvan, daha da cazibədar edir: “Artıq yeni üsullu təhsilin metodunun mütərəqqiliyini başa düşənlər “Üsuli-cədid” məktəblərini açmağa çalışırdılar. ***Şamaxıda Seyid Əzim Şirvani, Şuşada Mir Möhsün Nəvvab, Lənkəranda Mirzə İsmayıl Qasir, İrəvanda Mirzə Kazım Əskərzadə*** ənənəvi təlim və tədrisdən əl çəkərək, yeni üsulla dərs verirdilər” [XXXIc.s.292].

Bir qisim hallarda isə antroponimik sıralanmaların köməyi ilə müəyyən tarixi şəxsiyyətlər fəaliyyət göstərdikləri məkanlarla birgə auditoriyalara açıqlanır: “Diqqətəlayiq cəhətdir ki, teatr tamaşalarının verilməsində Qori müəllimlər seminariyasının məzunları fəal rol oynamışlar. 1879-cu ildə Şəkidə ***Rəşid bəy Əfəndiyev***, 1882-ci ildə Şuşada ***Yusif bəy Məlikhaqnəzərov,*** 1883-cü ildə Naxçıvanda ***Məmmədtağı Sidqi*** teatr həvəskarlarının köməyi ilə Axundovun komediyalarından tamaşalar vermişlər” [XXXIc.s.293].

Xarici ölkələrin elm adamlarını sıralayan böyük natiq ölkə alimlərinin onlarla əlaqəsini auditoriyaya açıqlayır. Elmi auditoriya Heydər Əliyevin antroponimik sıralarla zəngin nitqinin sehrinə düşür: “Bu gün biz söhbət edib ***akademik Boqolyubovu, akademik Petrovu xatırladıq, akademik Millionsikovu, akademik Kotelnikovu*** xatırladıq. Onların çoxu Azərbaycanla olduqca sıx əlaqə saxlamış, Azərbaycanda olmuş, bizim alimlərə kömək etmişlər. Görkəmli alimimiz, Elmlər Akademiyasının Prezidenti, məşhur kimyaçı Yusif Məmmədəliyev ***akademik Zelinskinin*** yetişdirməsi olmuşdur” [Xc.s.110].

Xalq şairi Səməd Vurğunun 90 illik yubileyinə həsr edilmiş gecədəki nitq antroponimik sıralarla zəngindir. Heydər Əliyev nitqlərinin bir xüsusiyyəti də haqqında danışdığı şəxsi zamana, məkana, yaratdıqlarına, çiyin-çiyinə çalışdığı insanlara münasibətdə götürür. Səməd Vurğun haqqında danışanda da bunu əsas götürür. Həm Səməd Vurğunun əsərlərini, həm də o dövr sənət dostlarını sıralayır:

"Səməd Vurğunun digər dram əsərləri də yüksək qiymətə layiqdir. "Fərhad və Şirin"də, "Xanlar" da, "İnsan" da Azərbaycan ədəbiyyatına, şeirinə, teatrına böyük töhfədir. Səməd Vurğun Azərbaycan Elmlər Akademiyasının yaradılmasının təşəbbüsçülərindən biridir. O sadəcə akademik seçilmiş bir adam deyil. Səməd Vurğun və məhz onun kimi ***Üzeyir Hacıbəyov, Heydər Hüseynov, Yusif Məmmədəliyev, Mustafa bəy Topçubaşov, Mirzə İbrahimov*** və başqa belə insanların təşəbbüsü nəticəsində 1945-ci ildə Azərbaycan Elmlər Akademiyası yaranıbdır [Xc.s.18]. Səməd Vurğun Üzeyir Hacıbəyovla, Cəfər Cabbarlı ilə çiyin-çiyinə gedibdir. Onlar – ***Səməd Vurğun da, Üzeyir Hacıbəyov da, Cəfər Cabbarlı*** da Azərbaycanı azad, müstəqil, sərbəst görmək istəyiblər" [Xc.s.19].

Heydər Əliyev nitqində antroponimik sıralanmalar fəlsəfədə inkar qanununa xidmət edir. Bu sıralanmalarda irsi-genetik amillərin itməməsi inamı auditoriyalara aşılanır. Dəyərli keçmişə malik xalqımızın gələcəyinin də dəyərli olması fəlsəfəsi ortaya qoyulur: "Əgər keçmiş Sovetlər İttifaqına nəzər salsaq, başqa respublikalarda mən buna rast gəlməmişəm. Məsələn Səməd Vurğun-oğulları Yusif, Vaqif yazıçılar, şairlərdir. ***Rəsul Rza, Nigar Rəfibəyli** – **oğlu Anar***. ***İlyas Əfəndiyev** – **oğlu Elçin***. Bu barədə daha da çox faktlar gətirmək olar. Yaxud da ki ***Bülbül oğlu Polad Bülbüloğlu***... Bunlar ata-oğuldurlar. Amma iki qardaşın ikisinin də ədəbiyyat, mədəniyyət, kino sənətinə eyni səviyyədə böyük fəaliyyət göstərməsi – bunlar Azərbaycan üçün yenidir. Bəlkə heç kəs buna

fikir verməyibdir, amma mən bir az keçmişimizə baxanda bunu xüsusi qeyd edirəm. ***Maqsud, Rüstəm*** – paralel olaraq ikisi də çox uğurlu yol keçib” [XIXc.s.130].

Antroponimik sıralanmalarla Heydər Əliyev XX əsrin 30-cu illərində Azərbaycan elminin, mədəniyyətinin böyük zərbələrə məruz qalan görkəmli şəxsiyyətlərini xalqa çatdırır: “Repressiya illərində 50 mindən artıq adam güllələnmiş, 100 mindən çox insan Sibir və Qazaxıstana sürgün edilmişdi. ***Hüseyn Cavid, Mikayıl Müşfiq, Tağı Şahbazi, Salman Mümtaz*** kimi böyük şəxsiyyətlər məhv edilmişdi” [XXXIc.s.297].

“Mili özünüdərk, milli oyanış, dirçəliş prosesi xalqımıza birinci növbədə ədəbiyyatdan keçir” fikrinin arxasınca kimlərin əsərlərindən bu ideyaların keçməsini sıralayır: “Bu, bizim şairlərimizin, yazıçılarımızın əsərlərinin hamısından keçibdir. Klassik adlandırdığımız Səməd Vurğunun əsərlərindən də, ***Rəsul Rzanın əsərlərindən də, Süleyman Rüstəmin əsərlərindən də, Məmməd Rahimin əsərlərindən də, Osman Sarıvəllinin əsərlərindən də, Süleyman Rəhimovun, Mehdi Hüseynin, Əbülhəsənin, Əli Vəliyevin, Mir Cəlalın, İlyas Əfəndiyevin, Mirvarid Dilbazinin*** əsərlərindən də keçibdir” [XIIIc.s.125].

“Filmfest-96” Festivallar Festivalının açılış mərasimində nitq: “Bizdə yaxşı tarixi filmlər yaradılmışdır. Rəhmətlik ***Həsən Seyidbəyli*** “Nəsimi” kimi əla gözəl bir film çəkmişdir. ***Eldar Quliyev*** “Babək” kimi əla film çəkmişdir. Bizdə “Dədə-Qorqud” kimi yüksək səviyyəli tarixi film yaradılmışdır. Bizdə yaxşı müasir filmlər, məsələn ***Rüstəm İbrahimbəyovla Rasim Ocaqovun*** “Ad günü” filmi var. Bu film çox xoşuma gəlir” [VIIc.s.?].

Bəzən bu sıralanmalarda böyük natiq övladlarını düzlüyə, həqiqətə, elin-obanın qiymətini bilməyə çağıran bir ata təkin sıralayır. Səmimiyyətlə dolu belə bir sıralama ən azı həmin şəxslərdə oğulluq borcunu, vətəndaşlıq borcunu bir daha yada salır, məsuliyyət yükünün ciddiliyini anladır: ” Doğrudan da o

illərdə 60-70-ci illərdə ədəbiyyata, mədəniyyətə gəlmiş gözəl bir nəsil indi artıq ədəbiyyatımızın, mədəniyyətimizin aparıcı qüvvələridir: ***Yusif də, Anar da, Maqsud da, Elçin də,*** başqaları da” [Vc.s.200-201].

Aşağıda antroponimik sıralanmaların göstərildiyi nitq parçaları verilmişdir: 10 avqust 1998-ci ildə Yaltadan Qayıdarkən Ukraynaya səfərin yekunları barədə təyyarədə jurnalistlərə müsahibə: “Moskvanın ətrafında Siyasi Büro üzvləri hökumət başçılarının yaşaması üçün çox gözəl, yaxşı şəraiti olan malikanələr, yaylaq evləri var idi. Qarbaçov da vaxtilə Siyasi Büro üzvü kimi belə evlərdən birində yaşayırdı. ***Brejnev də, Andropov da, Çernenko da, Tixonov da, Qarbaçov da*** beləsində yaşayırdı. Ancaq o, Mərkəzi Komitənin Baş Katibi olan kimi bunları bəyənmədi” [XVIIc.s.110].

Azərbaycan Qadınları Qurultayında: Dahi ***Nizami*** öz “Xəmsə”sində Şirin və Məhinbanu, Fitnə və Nüşabə kimi ölməz qadın obrazları yaratmışdır. Həmin dövrdə ***Əcəmi Naxçıvani*** tərəfindən ucaldılmış Möminə Xatun türbəsi əzəmətli memarlıq abidəsi olmaqla yanaşı həm də xalqımızın qadına göstərdiyi hörmət-izzətin parlaq təcəssümüdür” [XVIIc.s.301].

Azərbaycan müəllimləri qurultayında: “Azərbaycanın dünya şöhrəti qazanmış dahi mütəfəkkirləri ***Əbülhəsən Bəhmənyar, Nizami Gəncəvi, İmadəddin Nəsimi, Nəsirəddin Tusi, Məhəmməd Füzuli, Şah İsmayıl Xətai*** və başqalarının yetişməsində mədrəsə təhsilinin müstəsna rolu olmuşdur” [XVIIc.s.342].

“Azərbaycan Rusiyanın tərkibinə daxil edilməsinə bu prosesləri daha da sürətləndirmiş və beləliklə, uzun əsrlər boyu fəaliyyət göstərmiş mədrəsələr öz yerini müasir tələblərə cavab verən tədris ocaqlarına verməyə başlamışdır. Bu tədris müəssisələrinin yaranması və inkişafında görkəmli maarifçilər ***Seyid Əzim Şirvaninin, Abbasqulu ağa Bakı-***

***xanovun, Mirzə Fətəli Axundovun*** və başqalarının xidmətləri əvəzsizdir” [XVIIc.s.342].

“Hələ 1893-cü ildə Nuxa qəza müəllimlərinin qurultayı, Cavanşir, Şuşa, Cəbrayıl qəzalarında çağırılmış sahə qurultayları 1906-cı ildə Bakıda Azərbaycan müəllimlərinin birinci qurultayının çağırılmasına zəmin yaratmışdır. ***Həsən bəy Zərdabi, Nəriman Nərimanov, Süleyman Sani Axundov, Abdulla Şaiq, Üzeyir Hacıbəyov*** və başqa görkəmli maarifçilərin fəal iştirakı ilə keçirilən həmin qurultay Azərbaycanın ictimai-pedoqoji fikir tarixində mühüm hadisə olmuşdur” [XVIIc.s.344].

Antroponimik sıralanmalar böyük natiqin dilində Azərbaycan elmini və onu yaradanları gənc nəslə çatdırmağa xidmət edir:

“Ədəbiyyatımızda ***Səməd Vurğun, Rəsul Rza Süleyman Rüstəm Süleyman Rəhimov*** kimi böyük şəxsiyyətlər yetişmişdir. Alimlərimiz – ***Mirəsədulla Mirqasımov, Mustafa bəy Topçubaşov, Heydər Hüseynov, Yusif Məmmədəliyev, Mirzə İbrahimov*** bir çox başqa alimlər 1945-ci ildə ilk dəfə Azərbaycanın böyük elmini bir yerə yığıb Elmlər Akademiyası yaratmışlar” [VIc.s.160].

Azərbaycanın milli bayramı – Respublika günü münasibətilə təntənəli yığıncaqdakı nitqində vətəndən kənarda dəfn olunan Cümhuriyyət yaradıcılarını elə dəfn olunduqları ölkələrlə birgə sıralayır: “Bu günlər – bu bayram günləri Azərbaycanın Türkiyədə, Fransada, Gürcüstanda olan səfirlikləri bizim göstərişimizlə ***Məmmədəmin Rəsulzadənin, Əlimərdan bəy Topçubaşovun, Fətəlixan Xoyskinin*** qəbirlərini ziyarət edirlər və onların xatirəsinə Azərbaycan xalqının, dövlətinin hörmət və ehtiramını ifadə edirlər” [Xc.s.8].

Müxtəlif auditoriyalarda müxtəlif antroponimik sıralanmalar işə düşür. 26 iyun 1998-ci ildə Azərbaycan Milli Ordusunun yaradılmasının 80 illiyinə həsr olunmuş təntənəli yubiley mərasimindəki nitqində Cümhuriyyət dövrünün hərbi na-

zirlik əməkdaşları xalqa tanıdılır: Azərbaycanın ilk hərbi naziri – Baş nazir ***Fətəli xan Xoyski*** olmuşdur. Ancaq az bir müddətdən sonra ***Səməd bəy Mehmandarov*** hərbi nazir, ***Əliağa Şıxlınski*** hərbi nazirin müavini təyin edilmişlər. Baş qərargahın rəisi isə polyak millətiindən olan Sulkeviç olmuşdur" [XVIc.s.84].

Heydər Əliyev antroponimik sıralanmalarla müstəqilliyimizin əldə edilməsində tarixi şəxsiyyətlərimizə olan hörmət və ehtiramını bildirir: "Biz Azərbaycan Demokratik Cümhuriyyətinin yaranmasında böyük işlər görmüş, xidmətlər göstərmiş ***Məmmədəmin Rəsulzadəni, Əlimərdan bəy Topçubaşovu, Fətəli xan Xoyskini, Nəsib bəy Yusifbəyovu*** və digər dövlət xadimlərini bu gün böyük minnətdarlıq hissi ilə xatırlayırıq və onların xidmətlərinə, Azərbaycan xalqının həyatında, tarixində oynadıqları böyük rola öz hörmət və ehtiramımızı bildiririk" [VIc.s.308-309].

Beləliklə, Heydər Əliyevin nitq və çıxışlarındakı antroponimik sıralanmaların hərtərəfli araşdırılmasına gələcəkdə daha da çox ehtiyac duyulur. Bu nitq elementinin ulu öndərin çıxışlarında tədqiqini dərinləşdirərək onun Azərbaycan dilinin inkişafındakı rolunu üzə çıxarmaq vacibdir. Heydər Əliyev nitqində antroponimik sıralanmaların tədqiqi bu nitq vahidinin dilçilik, diplomatiya, siyasi natiqlik və digər sahələrdə geniş istifadəsini zəruri edir. Antroponimik sıralanmaların böyük natiqin nitqlərində tədqiqi aşağıdakı yekun nəticələrə gəlməyə əsas verir:

Antroponimik sıralanmalarla Heydər Əliyev bir tarixçi alim kimi auditoriyani keçmiş tarixmizə apararaq onun şanli səhifələrini açır;

– Antroponimik sıralanmalar böyük natiqin dilində Azərbaycana xidmət etmiş böyük şəxsiyyətlərin xalqa tanıdılması məqsədini daşıyır;

– Heydər Əliyevin nitqində antroponimik sıralanmalarla dünya mədəniyyəti xəzinəsinə incilər bəxş edən Azərbaycanın elm adamları xatırlanır;

– Antroponimik sıralanmalar əsasən Azərbaycan tarixində görkəmli yer tutan şəxsiyyətlərin gənc nəslə çatdırılması yolunda mühüm nitq elementidir;

– Antroponimik sıralanmalar Heydər Əliyevin nitqlərində Azərbaycan tarixinin öyrənilməsi yolunda mühüm vasitədir;

– Heydər Əliyevin nitqlərində antroponimik sıralanmalar diplomatik sahədə, xarici dövlətlərlə əlaqə yaratmaq yolunda mühüm əhəmiyyət kəsb edir;

– Heydər Əliyevin nitqlərində antroponimik sıralanmalarla ən çox ədəbiyyat və incəsənət xadimləri xalqa tanıdılır.

# XI FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ MÜQAYİSƏLƏR

Təsadüfi deyil ki, son illər ölkəmizdə nitq mədəniyyətimizin inkişafı ilə bağlı qlobal işlər görülür. Nitq mədəniyyəti ilə əlaqədar bir sıra dərsliklər, monoqrafiyalar oxucuların ixtiyarına verilmişdir. "Nitqin inkişafı" fənni – ixtisas yönümündən asılı olaraq bu fənnə 224-264 saat dərs yükü verilir. Fənn kimi yenidir, 2010-2011-ci ildən tədris planına daxil edilmişdir[1].

Heydər Əliyev nitqlərinin araşdırılması tədqiqatçılar qarşısında geniş üfüqlər açır. Bu üfüqlərdən biri də böyük natiqin çıxışlarındakı müqayisələr, paralellərdir. Müqayisələr yolu ilə real vəziyyət auditoriyalara aydınlaşdırılır. Müqayisələr əqli mühakimələrə gəlmək yolunda mühüm nitq vasitəsinə çevrilir. Müxtəlif auditoriyalarda müqayisələrlə nitq qurmaq böyük natiqə həmişə müyəssər olur. Təsadüfi deyil ki, Amerika natiqlik məktəbinin yaradıcılarından Deyl Kornegi məsələlərə aydınlıq gətirmək üçün müqayisələrdən istifadəni mühüm hesab edirdi.[2] Ənənəyə sadiq qalaraq araşdırmamızı Heydər Əliyevin çıxışları əsasında qururuq. Prezident sarayında respublikanın ali və orta ixtisas məktəblərinə qəbulla əlaqədar keçirilən müşavirədəki nitq müqayisələrlə zəngindir. Bu zaman "nisbətən" qoşmasından müvəffəqiyyətlə istifadə olunur: "Şübhəsiz ki, bu üsulun tətbiqində səhvlər də, çatışmazlıqlar da olub. Bunlara baxmayaraq, 1992-ci və 1993-cü illərdə test üsulu ilə qəbul əvvəlki bütün illərdəkinə ***nisbətən*** daha keyfiyyətli, daha ədalətli olmuşdur və ali məktəblərin müəllimləri və rəhbərləri barəsində bir çox hallarda tamamilə əssasız olan

[1] Mustafayeva S.Ş. Nitqin inkişafı. Dərs vəsaiti, Bakı, 2011. 269 səh.

[2] Карнеги Дейл. "Как завоевывать друзей и оказывать влияние на людей". Перевод А.А.Позднякова, 2009. 594 стр.

narazılıq və söz-söhbətlər qurtarmasa da, xeyli azalmışdır" [IIc.s.104].

Elə həmin müşavirədə illər üzrə prokurorluq orqanlarına daxil olan şikayətlərin sayı əvvəlki illərlə müqayisə olunur: "Elə baş prokurorun müavini də burada bir neçə rəqəm gətirdi. 1991-ci, 1992-ci ildə nə qədər şikayət gəldiyi yadıma düşdü. 1993-cü ildə isə daha az, ***təxminən*** 130 şikayət alınmışdı" [IIc.s.104].

Bütün yuxarıdakı müqayisələrdən sonra "deməli" yekunlaşdırıcı modal sözlə əsas məqsəd dinləyicilərin nəzərinə çatdırılır: "***Deməli***, test üsulu indiki dövrdə bizim üçün yəqin ki, ən əlverişli üsuldur. Odur ki, biz bunu müdafiə etməli, tətbiq etməli və daha da səmərəli şəklə salmalıyıq" [IIc.s.105].

Böyük natiqin nitqlərində müqayisə dialektik qanun olan əksliklərin vəhdəti və ziddiyyəti qanununa uyğun həyata keçirilir: "Bu 70 ilin ***mənfi cəhətləri*** də var. Amma ***nailiyyətləri*** də var. Azərbaycan xalqı 70 il ərzində təhsillənib, elmlənib, biliklənib. Bax, görürsünüz, onların bir çoxu burada oturub, – bizim şairlərdir, alimlərdir. Bunlar hamısı 70 il ərzində yetişən adamlardır. Dahi Füzulini yaşadan bu adamlardır. Azərbaycanda Füzuli haqqında nə qədər əsərlər yazılıb. Mən cəsarətlə deyə bilərəm ki, ***heç bir ölkədə*** Füzulinin yaradıcılığı, onun dünya mədəniyyətinə verdiyi töhfələr Azərbaycandakı kimi təhlil olunmayıb. Bunlar hamısı Azərbaycanda həyata keçib" [IIc.s.469-470].

"Mənfi cəhətlər" və "nailiyyətlər" kimi əksliklər "amma" qarşılaşdırma bağlayıcısının köməyi ilə həyata keçirilir. Sonrakı nitq mərhələsində Füzuli yaradıcılığına münasibətdə Azərbaycan alimləri digər ölkələrin alimləri ilə müqayisə edilir. "Heç bir ölkədə Füzulinin yaradıcılığı Azərbaycandakı kimi təhlil olunmayıb" müqayisəsi auditoriyanın yaddaşına həkk olunur.

Heydər Əliyevin nitqində müqayisələr elə "müqayisə etsək" ifadəsi ilə aparılır: "Əgər 70-ci illərdə, 80-cı illərin birinci yarısında kənd təsərrüfatında olan iqtisadi göstəricilərimizi yada salsaq və aqrar sahədə bugünkü göstəricilərimizi yada salsaq və aqrar sahədə bugünkü göstəricilərimizi onlarla ***müqayisə etsək***, son 5-6 ilin dağıdıcı proseslərinin iqtisadiyyatımızi, o cümlədən xüsusən aqrar sahəni nə qədər ağır vəziyyətə saldığını görərik" [IIIc.s.55].

Heydər Əliyevin nitqlərinin mühüm gücü məntiqi təfəkkürə söykənməklə auditoriyaları inandırmaqdır ki, bu inandırma böyük natiqin nitqlərində müxtəlif vasitələrlə edilir. Sadə xalq dilində çatdırılan müqayisələr sonda əqli mühakimələrə gətirib çıxarır: "Mənim, xatirimdədir, 60-cı illərdə kəndlərə gedirdik, orada palçıqdan tikilmiş evlərə baxanda, ağır vəziyyəti görəndə adamın ürəyi ağrıyırdı. Elə Cəlilabad rayonunun özündə – nümayəndəsi burada çıxış etdi, mən orada 50-ci illərdə də olmuşam – orada vəziyyət belə idi. İndi Cəlilabad rayonunda bir kənd tapmazsınız ki, orada palçıqdan evlər olsun. Rayonda dəmirlə, şiferlə üstü örtülmüş, eyvanı, bağçası olan müasir evlər həmin dövrlərin nəticəsidir" [IIIc.s.60].

Heydər Əliyevin auditoriyalarda apardığı müqayisələr "say" nitq hissəsinin imkanlarına söykənir ki, bu zaman çoxsaylı rəqəmlərin şifahi şəkildə səslənməsi nitqin gücünü qat-qat yüksəldir. Müqayisəli nitqə xüsusən elmi üslubda daha çox yer ayrılır. Çünki elmi üslubda öncə rəqəmlər dili ilə müqayisəyə, sonda isə gələcəyə hesablanan proqnostik fikirlərə istinad edilir: "Bu imkanların yüksək səviyyədə olduğunu sübut etmək üçün bir neçə rəqəm gətirmək istərdim. 70-ci illərin axırlarında – 80-ci illərin əvvəllərində Azərbaycan Respublikası kənd təsərrüfatı sahəsində ən yüksək iqtisadi göstəricilərə nail olmuşdu. O illərə Azərbaycanda hər il orta hesabla 1,5 milyon ton buğda, 800 min ton pambıq, 1,5 milyon ton üzüm, 650-700 min ton tərəvəz məhsulları, 300 min ton meyvə, 25

min ton çay yarpağı, 55-60 min ton tütün, təxminən 5 min ton barama, 130-140 min ton buğda, ət və digər kənd təssərrüfatı məhsulları istehsal edilirdi. 1993-cü ili götürsək 1 milyon 100 min ton buğda, habelə təxminən 200 min ton üzüm, 285 min ton pambıq istehsal edilib. Başqa məhsulların istehsalı da o qədər aşağı düşüb ki, onları heç dilə gətirmək istəmirəm. Mən bu rəqəmləri gətirməklə Azərbaycan Respublikasının kənd təsərrüfatı sahəsində, aqrar sahədə imkanlarını nəzərə çatdırmaq istəyirəm" [IIc.s.585].

Elmi üslub səpgisində söylənilən bu kiçik nitq parçası rəqəmlərin zənginliyi ilə seçilir. Məhz rəqəmlərin müqayisəsi əsasında yekun nəticə çıxarılır. Elə bu rəqəmlərin söylənilməsi həmişəki kimi frazeoloji birləşmələrlə – "dilə gətirməmək", sinonimlərlə – "kənd təsərrüfatı sahəsi, aqrar sahə" – birgə səslənərək müqayisələrlə zəngin nitqin ekspressivliyini artırır.

Heydər Əliyevin müqayisələri auditoriyaların yaddaşına ömürlük həkk olunur. 14 iyul 1969-cu ildə Azərbaycanda Mərkəzi Komitənin birinci katibi vəzifəsinə keçdiyi günü "Bastilyanın alınması" günüylə müqayisə edir: "Yeri gəlmişkən iyulun 14-ü mənim "Bastilyanının alınması" günümdür – Azərbaycana başçılıq etdiyimdən düz 25 il keçir" [IIc.s.59].

Böyük natiq auditoriyaları əminliyə, nikbinliyə çağırmazdan öncə mövcud vəziyyətləri müqayisələrlə tam təfərrüatınadək açıqlayır. Ritorik suallarla auditoriyanı düşünməyə vadar edir. Polemik cümlələrlə düşdüyümüz vəziyyətdən çıxış yolunu sanki auditoriya ilə birgə tapır: "Yaxud başqa bir misal. 1982-ci ilin sonunda mən Azərbaycandan gedəndə respublikada hər il 15 milyon ton neft*, 15* milyard kub metr qaz çıxarılırdı. Amma indi cəmi *6* milyard kubmetr qaz çıxarılır. Biz özümüzü qazla təmin edə bilmir, Türkmənistandan mavi yanacaq alırıq. Bundan ötrü isə valyuta verməliyik. *Bəs onu hardan alaq*? *...Ona görə də* xarici şirkətlərlə birgə işləməliyik. Lakin elə olmalıdır ki, başlıca sərvətimizdən istifadə edilməsinin bu

günü də, gələcəyi də ölkəmizin milli mənafeyinə uyğun olsun. Mən sizi arxayın etmək istəyirəm, rahat ola bilərsiniz, biz bu işdə səhvə yol verməyəcəyik. Əgər bu müqavilələrin bağlanmasına nail olsaq, Azərbaycan neft sənayesinin yeni inkişaf dövrü başlanacaqdır. Mən buna əminəm" [IIc.s.157].

Müqayisələr Heydər Əliyevin dilində auditoriyaları inandırmaq, məntiqi nəticələrə gəlmək məqsədi güdür. İnandırmaq gücünə malik olan rəqəmlər müqayisə olunaraq yekun nəticələrə aparan yolu dinləyicilər üçün asan qavranılan bir nitqə çevirir: "Test üsulu ilə keçirilən builki imtahanlar ötən illərdəkindən daha uğurlu olmuşdur. Test üsulunun tətbiq edildiyi birinci il yerlərin cəmi 30 faizi tutulmuşdu, 70 faizi isə boş qalmışdı. Nəticədə də məsələ uzanmış və dərslər 92-ci ildə deyil, 93-cü ildə fevralın 1-də başlamışdı. 93-cü ildə irəliləyiş olmuş və yerlərin 60 faizi tutulmuşdu. Lakin məsələ yenə də uzanmış dərslər dekabrın 15-də başlamışdı. Bu il isə test üsulunun tətbiqi təkmilləşdirilmişdir. ***Nəticədə*** ali məktəblərə qəbulun 87 faizi təmin edilmişdir. Odur ki, sentyabrın 15-də siz, eləcə də bütün birinci kurs tələbələri təhsil almağa başlayacaqsınız, sizin üçün tədris ili başlayacaqdır.

Bunlar onu göstərir ki**,** test üsulunun tətbiqi, bir tərəfdən hər il müsbət nəticələr verir, digər tərəfdən isə test üsulu ilə məşğul olan orqanlarımızın fəaliyyəti təkmilləşir və biz yaxşı nailiyyətlər əldə edirik".

Heydər Əliyevin nitqlərində müqayisə obyekti üçün keçmiş illər götürülür. Bəzən müqayisəyədək mövcud vəziyyət haqqında məlumat verilir, sonra isə "məsələn" aydınlaşdırma bağlayıcısının köməyi ilə müqayisəyə keçilir. Müqayisənin köməyi ilə öz fikrini auditoriyanın yaddaşında möhkəmlədir: "Müharibə gedən ölkədə kənd təsərrüfatına çox böyük ehtiyac var. Çünki ərzaq məhsullarının əsas mənbəyi kənd təsərrüfatıdır. Ona görə də bu sahəyə xüsusi diqqət verilməlidir. ***Məsələn***, əgər 1941-45-ci illərin təcrübəsini götürsək görərik ki,

sənayenin əsas hissəsi ancaq cəbhə üçün, qələbəni təmin etmək üçün səfərbər olunmuşdur. Ancaq kənd təsərrüfatı çox ciddi nəzarət altında idi. Çünki həm cəbhəni, həm də əhalini ərzaqla və başqa zəruri şeylərlə kənd təsərrüfatı təmin etməli idi. İndi də belədir" [IIc.s.127].

Heydər Əliyevin nitqlərində müqayisə insanların fikir və düşüncələrinə də şamil olunur. Müstəqilliyin ilk illərində fərqli dünyagörüşləri müqayisə edərək real vəziyyətə uyğun mühakimələrini irəli sürür: "Ancaq mən sizə deyə bilərəm ki, Azərbaycanda yaşayan Azərbaycan vətəndaşlarının, azərbaycanlıların tam əksəriyyəti-deyə bilərəm ki, hamısı, çünki ürəyində başqa fikirlərlə yaşayan adamlar da var, tam əksəriyyəti bu müstəqilliyi əldən vermək istəmir. 200 il ərzində böyük bir dövlətin tərkibində olan bir xalqın içində bəzi adamlar var ki, o tərəfə meyl edir, yəni ürəyində o, keçmiş hissləri yaşadır... Yəni bizim qarşımızda belə ağır, çətin yol var" [IIc.s.468-469]. Əqli mühakimə kimi "qarşımızda belə ağır, çətin yol var" ifadəsini işlətmək üçün müstəqilliyə müxtəlif baxışların, müxtəlif dünyagörüşlərin müqayisəsi verilir.

Heydər Əliyevin nitqində müqayisələr poetik bir dillə dinləyicilərə çatdırılır. Bu zaman "mənim xatirimdədir" ifadəsi ilə auditoriyanı keçmişə aparır, bu günlə uğurlu müqayisə edir: "Mənim ***xatirimdədir***, 60-cı illərdə və 70-ci illərin əvvəllərində burada məskunlaşmış, yaşayan insanlar isə bu hisə, bu tullantılara, qara rəngə öyrənmişdilər və öz yaşayışlarını ancaq bu cür qəbul edir, bu cür düşünürdülər. Allaha şükür olsun ki, bunlara son qoyulubdur. Görürsünüz ki, indi burada yaşıllıqlar, ağaclar var. Həmin bax o qara yer təbiətin ən gözəl rəngləri kimi gözümüzün qarşısındadır" [IIc.s.240]. Bu kiçik nitq parçasında böyük natiq "his, tullantı, qara rəng" və "təbiətin ən gözəl rəngləri" kimi antonimlərdən müvvəffəqiyyətlə istifadə edərək məkan müqayisəsi yaradır.

Heydər Əliyevin siyasi məsələlərə həsr olunmuş nitqlərində ictimai-siyasi dövrlər müqayisə olunur, bu dövrlərin fərqli və oxşar cəhətləri tutuşdurulur. Auditoriya bu tutuşdurmalar ilə böyük natiqin tarix fəlsəfəsinə söykənərək hadisələrə filosofcasına yanaşmasının şahidi olur: “Bəzən bu dövrə nəzər salarkən 1918-1920-ci illərdə gedən prosesləri xatırlayır, həmin proseslərin bir-birinə çox bənzədiyini görürsən. O vaxt da bir çox xarici qüvvələr Azərbaycana təzyiq göstərirdi. O zaman da Ermənistan Azərbaycanın torpaqlarını ələ keçirmək üçün təcavüzə başlamışdı, Azərbaycan xalqı öz torpaqlarını erməni qəsbkarlarından müdafiə edirdi. Həmin dövrdə də Azərbaycanı parçalamaq istəyirdilər” [IIc.s.7-8].

XX əsrin 90-cı illəri ilə 1918-1920-ci illərin fərqli cəhətlərini də dinləyicilərə çatdırır: “Ancaq indiki dövrün (90-cı illərin – red.) ən əlamətdar cəhəti ondan ibarətdir ki, Azərbaycan Respublikası müstəqil dövlət kimi dünya dövlətləri tərəfindən tanınmış, Birləşmiş Millətlər Təşkilatına, ATƏM-ə daxil olmuşdur, bir çox digər beynəlxalq təşkilatların üzvüdür. Azərbaycan Respublikası sərbəst fəaliyyət göstərir və müstəqil dövlət dünya birliyində tanınmışdır” [IIc.s.7].

Rəqəmlər dili ilə aparılan müqayisələr nitq hissələri və nitq elementləri ilə bəzənərək sadə xalq dilində dinləyicilərə çatdırılır: “Dediyim kimi, bizim kənd təsərrüfatı çoxsahəlidir. İndi mən aldığım cədvəllərə baxıram inanın ki, onlara baxdıqca ***ürəyim ağrıyır***. ***Məsələn***, respublikamız vaxtilə 700 min ton tərəvəz tədarük edirdi. Amma indi ***vur-tut*** 50 min ton tərəvəz istehsal ounmuşdur. Bu ***adama ağır gəlir***. Bu gün Dilrüba xanım Camalova da qeyd etdi, vaxtilə təkcə Lənkəranda 160-170 min ton tərəvəz istehsal olunurdu. Amma indi ***heç deyiləsi deyil***. ***Müxtəsəri***, bütün bitkiçilik məhsulları istehsalı azalmışdır. ***Təəssüflər olsun ki***, bütün bunlar bizim hamımızın kənd təsərrüfatı sahəsinə laqeyd münasibətimizin nəticəsidir” [IIc.s.135]. “Müxtəsəri” arxaikləşmiş yekunlaşdırıcı mo-

dal sözlə kənd təsərrüfatı məhsullarının istehsalının azaldığını qeyd edən böyük natiq "ürəyi ağrımaq", "adama ağır gəlmək", "heç deyiləsi olmamaq" frazeologizmləri ilə bu azalmanı auditoriyaya çatdırır. "Məsələn" aydınlaşdırma bağlayıcısı vəziyyəti rəqəmlərin köməyi ilə izah edir. Sonda "bizim hamımızın laqeyd münasibətinin nəticəsidir" səmimi ifadəsi ilə "təəssüf" edir.

Keçmiş irsimizi bu günlə müqayisə etmək böyük natiqin nitqlərində tez-tez təsadüf edir: "Siz hələ gəncsiniz. Qarşınızda böyük yaradıcılıq yolu vardır. İstərdim ki, sizdən əvvəlki sənətkarlar Lütfəli Abdullayev kimi, Rəşid Behbudov kimi, Leyla Bədirbəyli kimi və başqaları kimi öz üzərinizdə çalışasınız. Mən onları çox yaxından tanıyırdım, onlarla dost idim. Ona görə də görürüdüm ki, onlar öz üzərlərində necə çalışırlar, necə yeni nailiyyətlər əldə edirlər. Mən bunu sizə də tövsiyə edirəm" [XIIc.s.177]. Əbədiyyətə qovuşan sənətkarlarımızı gənc nəslə nümunə, örnək göstərən böyük natiqin müqayisələri tariximizi yaddaşlara həkk etmək baxımından da əhəmiyyətlidir.

Heydər Əliyevin nitqlərində siyasi lider, ictimai-siyasi xadim müqayisələri həmişə ön plandadır. 15 oktyabr 1997-ci ildə Azərbaycan Respublikası Hərbi Təyyarəçilər Məktəbinin ilk buraxılışına həsr olunmuş təntənəli mərasimdə keçmiş Sovetlər dönəmi müstəqillik dövrü ilə müqayisə olunur, bu dövrlərə Heydər Əliyev məntiqi əsasında qiymət verilir: "Mən o, keçmiş dövrləri xatırlatdım. Bilirsiniz, bunu etmək nə qədər çətin idi. Çünki bir tərəfdən biz özümüz də bu işə həvəs göstərən kadrlar tapa bilmirdik, ikinci tərəfdən bunu da qeyd etmək lazımdır ki, bizim tapdığımız kadrlar da gedib Sovetlər İttifaqının, xüsusən Rusiyanın ayrı-ayrı aviasiya məktəblərində rəqabətə bəzən dözə bilmirdilər, bəzən də onların ayrı-ayrı çatışmazlığını orada olan bəzi komandirlər şişirdib gənclərimizi məktəbdən xaric edirdilər.

Amma indi biz müstəqil dövlət olduğumuz üçün öz taleyimizin sahibi olduğumuza görə, özümüz hər bir məsələni həll etdiyimizə görə öz imkanlarımızla bu mütəxəssisləri hazırlaya bilmişik. Mən şübhə etmirəm ki, bir neçə ildən sonra bu kadrlar qat-qat artacaqdır, bizim öz milli kadrlarımızdan yaxşı müəllimlərimiz olacaqdır, yaxşı təlimatçılarımız olacaqdır, bizim yaxşı məktəbimiz yaranacaqdır və müstəqil Azərbaycan bu sahədə də öz ordusuna tam arxayın ola biləcəkdir" [XIIc.s.335].

Heydər Əliyevin araşdırılan nitqlərinin əsasən müstəqillik dövrünə düşdüynün fərqinə varsaq müqayisələrin müstəqillikdən öncə və sonrakı illər arasında aparılmasının şahidi oluruq. Və bu müqayisələrdən çıxan yekun nəticə müstəqilliyin Azərbaycan xalqı üçün həyati vacib məsələ olmasıdır: "Amma biz sizinlə həmin adamlarıq ki, 1970-ci illərdə çox firavan yaşayırdıq. Siz də, biz də, hamımız o adamlarıq. Bu problemlərin heç birisi yox idi. Burada çıxış edənlər həmin o illəri yada saldılar. Şübhəsiz ki, o illəri unutmamalıyıq, ancaq eyni zamanda bir şeyi üstün tutmalıyıq ki, indi biz xalqımız üçün ən böyük nailiyyət olan müstəqillik əldə etmişik və bu dövlət müstəqilliyinin naminə, milli azadlığımızın naminə bütün çətinliklərə dözürük və dözməliyik" [VIIc.s.184].

Müqayisəli çıxışlarında da böyük natiqi milli təəssübkeşlik hissi tərk etmir. Azərbaycanın böyük sənətkarlarını dünyanının görkəmli sənət adamları ilə müqayisə edərək onları dünyaya tanıdır: "Əgər Avropa Pikasso ***kimi*** böyük rəssamı ilə fəxr edirsə, biz də, şübhəsiz ki, Pikassonu böyük rəssam kimi tanıyırıq, onun əsərlərinə dərin hörmət edərək, eyni zamanda iftixar hissi ilə deyə bilərik ki, Azərbaycanın da Pikassoya bərabər Səttar Bəhlulzadə ***kimi*** rəssamı var və Azərbaycan da onunla fəxr edə bilər" [IIIc.s.47].

Heydər Əliyev dünyagörüşləri, zövqləri, duyumları müqayisə edir. Bu müqayisələrdə auditoriyalar zaman və dünyagö-

rüşü arasındakı fəlsəfi əlaqənin şahidi olur: "O vaxtlar 50-ci və 60-cı illərdə, yəni Səttar Bəhlulzadənin ilk əsərləri yaranan zaman bəziləri onu anlamırdılar, bəziləri qəbul etmirdilər. Bəziləri isə bu əsərlərin nə qədər qiymətli olduğunu bilmirdilər. Ona görə də bəzən klassik üslubda çəkilən əsərlərə üstünlük verilirdi, Səttar Bəhlulzadənin əsərləri kənarda qalırdı. Ancaq zaman keçdi və Səttar Bəhlulzadə çox inadla öz yaratdığı üslubu, öz məktəbini davam etdirdi və yeni bir rəssamın yaranmasını ***nəinki*** Azərbaycana, həm də ***bütün*** dünyaya nümayiş etdirdi" [IIIc.s.47].

Heydər Əliyevin nitqlərində əksər təsadüflərdə müqayisələr, paralellər aparılır, sonda yekun nəticəyə gəlinir. Bir qisim hallarda isə yekun nəticə auditoriyaya açıqlanır, açıqlamadan sonra müqayisələrə keçilir: "Bilirsiniz, respublikamızda son illər sərbəstlik üçün yaradılan şərait ***çox yaxşı nəticələr verir***: Yadınıza salın, 70-80-ci illər həqiqətən çox yüksək nailiyyətlər dövrü olub. Bəli, o illərdə mənim rəhbərliyim altında çox işlər görülübdür. Ancaq onu da deyək ki, 70-ci illərin sonunda, 80-ci illərin əvvəlində, məsələn şəhərdə ət qıt idi, ət tapmaq mümkün deyildi. Çünki respublikamızda heyvandarlıq məhdud idi, ən çox pambıq və ya digər məhsullar istehsal edilirdi. Amma indi respublikamızın bütün bazarlarında ət boldur. Çünki biz insanlara sərbəstlik verdik, mal-qaranın əksəriyyətini camaata, yəni kənddə işləyənlərə satdıq" [VIIc.s.215].

Keçmiş SSRİ-yə daxil olan respublikalar müstəqilliyə gedən yolda müqayisə olunur: "Keçmişdə SSRİ-yə daxil olan respublikalar 1991-ci ilin sonunda Sovetlər İttifaqının dağılması ilə əlaqədar dövlət müstəqilliyi əldə etdilər. Lakin Sovetlər İttifaqı respublikalarında, – onların sayı 15 idi-ictimai-siyasi proseslər eyni deyildi və tamamilə müxtəlif şəkildə baş verirdi" [VIIIc.s.246].

Heydər Əliyevin nitqində müqayisələr müxtəlif məsələləri əhatə edir. Bu müqayisələr Şərq-Qərb fəlsəfəsinin əsasını təş-

kil edən Şərq-Qərb mədəniyyətinə də şamil olunur: “Bu baxımdan Şərq mədəniyyətinin, Şərq ədəbiyyatının nə qədər zəngin olduğunu bu gün bir daha qeyd edərək eyni zamanda XIX-XX əsrlərdə xalqlarımızın mədəniyyətinin, ədəbiyyatının Avropa mədəniyyəti, Rusiya mədəniyyəti ilə yaranmış əlaqələrdən istifadə edib çox böyük nailiyyətlər qazanmasını xüsusi qeyd etmək lazımdır. Bu, yeni bir şey deyildir, təbiidir. Keçmişdə də böyük, dahi şairlərimiz, yazıçılarımız, tarixçilərimiz qədim yunan, Roma ədəbiyyatından, qədim Avropa ədəbiyyatından istifadə etmişlər. Eyni zamanda Qərb də həmişə Şərqin və xüsusən türkdilli xalqların, müsəlman Şərqinin yaratdığı böyük tarixi əsərlərdən istifadə etmişdir” [VIIIc.s.7].

Hər şeyin müqayisə ilə ölçüldüyünü milyonlara çatdıran böyük natiq yekun nəticələrə gəlməyin yolunun müqayisədən keçdiyini göstərir: “Məsələn əgər, keçmiş vaxtlarda sənaye istehsalı 20-25 faiz aşağı düşürdüsə, indi onun aşağıdüşmə sürəti azalıb. Verilən məlumatlara əsasən sənaye istehsalı 10 ayın yekunlarına görə 8 faiz aşağı düşübdür. Əlbəttə, aşağıdüşməni müsbət hal kimi qeyd etmək olmaz. Ancaq ***hər şey müqayisə ilə ölçülür***. Təəssüf ki, ***müqayisəyə görə*** bu, belədir” [VIIIc.s.80].

Heydər Əliyevin müqayisələrində auditoriya bütünlüklə iştirak edir. Müqayisələr yolu ilə auditoriyanı polemikaya cəlb edən böyük natiq “siz təsəvvür edin”, “xatırlayın” ifadələrindən, ritorik suallardan istifadə edir: “Təəssüflər olsun ki, o vaxt bizim sərhəd dəstələri bəzi yaramaz adamların, cinayətkar ünsürlərin əlinə keçdiyinə görə onların özləri guya sərhədçi olaraq, sərhədi qoruyaraq, eyni zamanda bu sərhədlərdə cürbəcür cinayətkar niyyətlərini həyata keçirirdilər, qaçaqmalçılıqla, başqa-təxribat işləri ilə məşğul olurdular. Allaha şükürlər olsun ki, bunlar tədricən aradan götürülüb. Siz ***təsəvvür*** edin, 1992-1993-cü illərdə sərhədlərin vəziyyəti ilə bu günkü vəziyyəti ***müqayisə edin***. ***Xatırlayın***, o vaxt vəziyyət nə cür

idi? O vaxt sərhəd yox dərəcəsində idi, kim hardan istəyirdi, ordan da keçirdi. İndi bu sahədə vəziyyət xeyli yaxşılaşıbdır, nizam-intizam yaranıbdır" [VIIIc.s.195].

Heydər Əliyevin apardığı müqayisələr səmimiyyətə söykəndiyi üçün nitq yaddaqalan olur: "Çünki bir tərəfdən Azərbaycanda yaranmış ictimai-siyasi sabitlik, digər tərəfdən isə iqtisadi islahatların həyata keçirilməsi bazar iqtisadiyyatının inkişafına, Azərbaycana xarici sərmayələr qoyulmasının həvəsləndirilməsinə yönəlmiş bir sıra tədbirlər şübhəsiz ki, Azərbaycanda sosial-iqtisadi şəraitə birbaşa və çox müsbət təsir edibdir. Bu, özünü bir çox sahədə göstərir. İlk növbədə insanlar, deyə bilmərəm ki, yaxşı yaşayırlar, ***lakin əvvəlkindən*** yaxşı yaşamağa başlamışlar. Biz müasir maliyyə sistemi yarada bilmişik, öz milli valyutamız var. O, 1993-1994-cü illərdə inflyasiyaya məruz qalırdı. 1994-cü ildə inflyasiya təqribən 1700 faizə qalxmışdı. Keçən il aylıq inflyasiya bir faizdən az, ümumən il ərzində beş faizdən aşağı olubdur. Zənnimcə, bu, MDB-yə daxil olan ölkələr arasında ən yaxşı göstəricidir" [VIIIc.s.280]. "Deyə bilmərəm ki, yaxşı yaşayırlar" səmimi ifadəsinin ardınca müqayisəli ifadə "lakin əvvəlkindən yaxşı yaşamağa başlamışlar" gəlir.

Müqayisələr, xüsusilə iqtisadiyyatla, maliyyə-bank və idxal-ixrac məsələləri ilə bağlı məsələlərdə aparılan müqayisələr rəqəmlər əsasında aparılır. Rəqəmlər arasında canlı əlaqələrin yaradılması gerçəkliyə münasibəti əks etdirən modal sözlər və bağlayıcılar vasitəsilə həyata keçirilir: "Burada rəqəmlər gətirildi. ***Həqiqətən*** bu rəqəmlər çox maraqlıdır. ***Çünki*** əgər 1994-cü ildə Azərbaycanda idxal-ixrac 1 milyard 140 milyon Amerika dolları həcmində olubsa və gömrük xidmətindən gələn rüsum cəmisi 16 ya 17 milyard manat olubsa, 1995-ci ildə idxal-ixrac təxminən o qədər bəlkə bir az da ondan az olub, ancaq gömrük xidmətindən dövlət büdcəsinə gələn vergi 65 milyard manat olubsa, 1996-cı ildə idxal-ixrac

artıb, – bunun özü də müsbət göstəricidir, – 1 milyard 600 milyon, yaxud 1 milyard 700 milyon dollar səviyyəsinə gəlib çatıbdır. ***Ancaq*** bu rüsum, gömrük vergisi 272 yaxud 273 milyard manata gəlib çatıbdır, 1995-ci ilə nisbətən 4 dəfə artıbdır. Əgər 1995-ci ilə nisbətən1996-cı ildə idxal-ixrac bir dəfə yarım artıbsa, gömrük xidmətindən büdcəyə gələn gəlir 4 dəfə artıbdır. ***Şübhəsiz ki***, bu təqdirəlayiqdir" [VIIIc.s.352].

Müqayisə olunan hadisələr ictimai-siyasi dövrlər arasında kəskin fərqləri auditoriyaya çatdırmaq üçün Heydər Əliyev "müqayisə oluna bilməz" ifadələrindən istifadə edir: "***Əgər*** XX əsri götürsək, 1918-ci ildə, 1920-ci ildə Azərbaycan xalqının başına gələn bəlalar, faciələr məlumdur. 1937-1938-ci illərin faciələri də məlumdur. Ancaq 1990-cı ilin yanvarında, əsrimizin sonuna yaxın baş vermiş hadisələr əvvəlki illərin heç biri ilə müqayisə oluna bilməz. ***Çünki*** bu dövr Azərbaycan xalqının artıq milli oyanış, öz mənliyini sübut etmək, milli azadlıq hisslərini aşkara çıxarmaq, büruzə vermək mərhələsi idi" [IIIc.s.125]. Böyük natiq müqayisəyə əksər vaxtlarda "əgər" bağlayıcısı ilə başlayırsa, sonluğu izahla – "çünki" bağlayıcısı ilə yekunlaşdırır.

Heydər Əliyevin nitqlərində müqayisələr sadə xalq dilində poetikcəsinə aparılır. Auditoriya iqtisadiyyatla bağlı elmi üslublu çıxışın ortasında izahedicilik funksiyasını özündə saxlayan məişət üslublu nitqi maraqla dinləyir: "Biz deyirik ki, bazar iqtisadiyyatına gedirik. Şübhəsiz, bazar iqtisadiyyatı elə bir şey deyil ki, bu sahildən o sahilə 5 metr tullanıb o tərəfə düşəsən. Bu belə deyil. Amma eyni zamanda bazar iqtisadiyyatına gedən yol elə bir uzun yol deyil ki, bir adamın ömrü ona çatmasın. Belə şey ola bilməz. Bəziləri ayrı-ayrı ölkələrdə uzunmüddətli özəlləşdirmə prosesinin tarixini misal gətirirlər. Bəli, bu ölkələrdə sosialist sistemi olmayıb, dövlət mülkiyyəti olmayıb. Mülkiyyətin cürbəcür formaları olub, müəyyən müddətdə

onun bir hissəsi dövlət mülkiyyətinə keçib. Amma özəl bölmə həmişə üstün mövqedə, üstün vəziyyətdə olub" [IIIc.s.242].

Bəzən böyük natiqin müqayisələri sonda ağsaqqal öyüdünə, gəncləri vətənpərvərlik hissi ilə tərbiyə edən rəhbər göstərişinə çevrilir: "Bilirsiniz ki, İkinci Dünya Müharibəsi zamanı çox ciddi hərbi rejim var idi. Ordudan, cəbhədən qaçan hər bir adam ən ağır cəzaya məhkum edilirdi. Indi respublikamız da müharibə vəziyyətindədir. Mən gəncləri cəza ilə qorxutmaq istəmirəm, onu demək istəyirəm ki, biz nizami ordu yaradaraq gəncləri ona cəlb etməyə çalışacağıq. Gənclərin isə vəzifəsidir ki, bu orduda xidmət edərək öz vətəndaşlıq borclarını yerinə yetirsinlər. Əgər vətəni, torpağı müdafiə etmək lazım gələrsə bu işdən geri çəkilməsinlər" [Ic.s.177].

Müqayisələr böyük natiqin dilində həyatımızın bütün sahələrini əhatə edir. 1980-ci illərin axırlarında Moskvadakı ermənipərəst şovinist dairələrin türkdilli xalqlara qarşı apardıqları repressiyalar müqayisəli şəkildə auditoriyalara çatdırılır: "Axı nə qədər hallandırmaq olardı, o, elə hey, oturub durub "rəşidovçuluq", "kunayevçilik" deyirdi, mən istefa verdikdən sonra isə hətta bir neçə dəfə "əliyevçilik" demişdi. Bəs niyə başqa "çilik" yox idi, elə təkcə "rəşidovçuluqmu", "kunayevçilikmi", "əliyevçilikmi" vardı? Yoxsa bütün Sovet İttifaqı yalnız bu şəxslərin üzərində qərar tutmuşdu? 1990-cı ilin yanvarında – Azərbaycana iri qoşun kontingenti yeridib, Sovet İttifaqının, Moskvanın da, Azərbaycanın da kommunist rəhbərliyinin ədalətsizliyinə, ədalətsiz qərarlarına qarşı ayağa qalxan xalqı qan içində boğduqları və bir gecədə nə qədər adamı məhv etdikləri günün ertəsi mən Moskvada mitinqdə çıxış edərək həmin hərbi əməliyyata qarşı öz etirazımı bildirəndən təxminən 10 gün sonra "Pravda" qəzetində "Əliyevçilik" adlı böyük bir məqalə dərc edildi" [Xc.s.211].

Müqayisələr üçün böyük natiq statistikaya müraciət edir, statistik göstəriciləri yerli-yerində işlədərək dinləyicilərdə bö-

yük maraq doğura bilir: “Deyirlər ki, statistikaya görə dünyada 20 milyon qaçqın var. Azərbaycanda isə respublikanın 7 milyonluq əhalisinin 1 milyonu qaçqındır. Bu Azərbaycan xalqının, Azərbaycan Respublikasının qarşılaşdığı ağır bəladır. İşğal olunmuş torpaqlarda bu ellərin sakinlərinin, azərbaycanlıların bir çox nəsilləri tərəfindən yaradılmış nə varsa hamısı dağıdılmış, talan edilmişdir. Belə vəhşiliyə hər hansı digər yerdə çətin rast gəlmək olar” [VIc.s.431].

“Dağıdılmış, talan edilmiş” sinonim cərgənin köməyi və “belə vəhşiliyə” müqayisəsi ilə böyük natiq erməni xislətini bütün dünyaya açıb göstərir. Sonrakı mərhələdə bu vəhşiliyi İkinci Dünya Müharibəsi ilə müqayisə edir və bu müqayisə “mən yaxşı bilirəm”lə başlayır: “Mən yaxşı bilirəm, hətta İkinci Dünya Müharibəsi, Böyük Vətən müharibəsi dövründə, faşist qoşunları tərəfindən keçmiş Sovet İttifaqının xeyli hissəsi işğal edildiyi dövrdə belə doğru plan olmamışdır, belə vəhşilik törədilməmişdir. Bu, düşdüyümüz reallıqdır. Bu, elə bir həyəcan harayıdır ki, hamı üçün xəbərdarlıq olmalıdır” [VIc.s.431].

Böyük natiqin nitqində yüzilliklər müqayisə olunur. Müqayisənin səviyyəsini auditoriyaya çatdırmaq baxımından “təsəvvür edin” ifadəsindən tez-tez istifadə olunur. “Təsəvvür edin” ilə müqayisənin səviyyəsi auditoriyanın gözləri qarşısında canlanır: “Keçmişdə, min illər bundan əvvəl ulu babalarımız çadırlarda yaşayıblar. Ərəbistanın səhralarında da, Azərbaycanda da çadırlar çox olubdur. Ancaq dünya da, ölkələrimiz də inkişaf edib, insanlar özlərinə yaşayış evləri, binaları tikiblər, müasir tələblərə uyğun olan şəraitdə, evlərində yaşayırlar və yaşamalıdırlar. Ancaq təsəvvür edin, yerini-yurdunu, varını-yoxunu itirmiş azərbaycanlılar, müsəlmanlar üç-dörd ildir ki, çadırlarda yaşayırlar. Yayda qızmar isti, ağır hava şəraiti, çadırların ərazisində insan üçün zərərli olan cürbəcür həşəratlar, qışda isə qar, çovğun, soyuq, yağış. Təsəvvür edin, azərbaycanlılar nə qədər dözümlü insanlardır” [VIIc.s.409].

Görkəmli ictimai-siyasi xadim kimi XX əsrin 90-cı illərində demokratik dəyərlərin respublikamızda təsbit olunması yolunda Heydər Əliyevin müqayisəli nitqlərinin öyrənilməsi günün vacib məsələlərindəndir. Demokratiyaya gedən yolda illərin və bu illərdə özünə yer alan demokratiya elementlərinin müqayisəsi mühümdür: "Biz bu konstitusiya əsasında 1995-ci ilin noyabrında Azərbaycanın ilk parlamentinə seçkilər keçirdik. Bunadək mövcud olmuş parlament 1990-cı ildə, sovet dövründə yaradılmışdı. Təbii ki, o, həmin tələblərə cavab vermirdi. Parlamentə seçkilər çoxpartiyalı əsasda, həm majoritar sistem üzrə, həm də proporsional sistem üzrə keçirildi. Azərbaycanda 30 partiya qeydə alınıb, zənnimcə, qeydiyyatdan keçməyən partiyalar da 20-yə qədər də olar. 600-dək qəzet, çoxlu jurnal qeydə alınıbdır. Qəzetlərin böyük əksəriyyəti özəl təşkilatlara, partiyalara, qruplara mənsubdur. Respublikamızda cəmi iki qəzet hökümət qəzetidir. Qalan bütün qəzetlər müxtəlif siyasi qruplara, siyasi partiyalara, ictimai təşkilatlara, ayrı-ayrı şəxslərə mənsubdur" [Xc.s.98].

Böyük natiqin nitqlərində ictimai-sosial fərd kimi insanın keçdiyi həyat yolları da müqayisə olunur: "İndi tale elə gətirib ki, respublikaya o vaxt rəhbərlik edən də, bu gün rəhbərlik edən də Heydər Əliyevdir. O vaxta nisbətən Heydər Əliyev də çox mərhələlərdən, çox çətinliklərdən keçibdir. Elə təcrübəsi də qat-qat artıbdır. İndi necə olur ki, məsələn, 70-ci illərdə müəllimlərin bu cür problemləri yox idi, məvaciblərini də alırdılar. Ləvazimat da vardı, dəftər-qələm də, dərslik də, nə bilim, mebel də vardı... Sizin də əksəriyyətiniz həmin adamlardır. Azərbaycan da həmin Azərbaycandır, rəhbəriniz də həmin Heydər Əliyevdir. Deməli, bunun başqa səbəbi var. Səbəb də bax, bu son 6-7 ildə gedən proseslərlə bağlıdır" [IIIc.s.181].

Heydər Əliyevin müqayisələri bəzən bütöv bir tarixi əhatə edir. Belə ki, 29 oktyabr 1997-ci ildə Azərbaycan yazıçılarının X qurultayı ərəfəsində gənc nəsildən olan yazıçı və şairlərin

bir qrupu ilə görüşdə XX əsr müqayisəli şəkildə dövrlər üzrə xarakterizə olunur: "Ümumiyyətlə, XX əsr elə başlanğıcından sonunadək çox çətin bir əsr, ağır bir dövr olubdur. Məsələn, bizim nəsil, – mən öz nəslimi deyirəm, – biz 30-cu illərin ağırlıqlarını da görmüşük, 40-cı illərin, müharibə illərinin çətinliklərini də görmüşük, sonrakı illərin çətinliklərini də. Eyni zamanda 1960-1970-1980-ci illərdə yaranmış müsbət şəraiti də görmüşük. 1980-ci illərin sonundan başlayaraq Azərbaycan üçün ağır bir dövr başlanıbdır" [XIIIc.s.83].

Müqayisəli nitq Heydər Əliyevin müxbirlərə verdiyi müsahibələrdə də özünü göstərir. Ulu öndərə ünvanlanan suallar məntiqə söykənərək, müqayisəli təhlillər əsasında cavablandırılır. London şəhərində, 1 dekabr 1995-ci ildə Böyük Britaniyanın "Ekonomist" jurnalının müxbirinə verilən müsahibə yuxarıdakı fikirlərə əyani misaldır: "Sual: Razılaşıram ki, Azərbaycan öz neft ehtiyatlarından səmərəli istifadə edərsə və onu ixrac edərsə, doğrudan da zəngin bir dövlətə çevrilər. Amma bəs bu, indiyədək niyə baş verməyib?

Cavab: Güman edirəm ki, sizin üçün maraqlı olar ki, Azərbaycanda ilk neft fontanı 1848-ci ildə olmuşdur. O vaxt dünyanın heç bir yerində neft çıxmırdı. Amerika Birləşmiş Ştatlarının Pensilvaniya ştatında neft 1858-ci ildə fontan vurubdur... Dənizdə, suyun altında neftin çıxarılması ***ilk dəfə*** Azərbaycanda olmuşdur. 1949-cu ildə Xəzər dənizində ***ilk böyük neft fontanı*** olmuşdur. O vaxt indi Böyük Britaniyanın ətrafında dənizdən neft çıxarılan buruqların heç biri yox idi. Norveçin "Statoyl" şirkəti də indi dənizdən bu qədər ki, neft çıxarır, bunlar da o vaxt yox idi. Ancaq iş burasındadır ki, Azərbaycan SSRİ-nin tərkibində olanda bu neft bütün Sovetlər İttifaqına məxsus idi. ***O vaxt*** Azərbaycan müstəqil dövlət deyildi. ***Ona görə də*** respublikamızda istehsal olunan neft Sovetlət İttifaqıınn ehtiyaclarının ödənilməsinə sərf edilirdi. İndi Azərbaycan müstəqil dövlətdir. Özü öz sərvətlərinin sahibi-

dir” [Vc.s.70-71]. Yuxarıdakı cavabda böyük natiq “heç bir yerdə”, “ilk böyük neft fontanı” ifadələri ilə Azərbaycanın neft sahəsində birinci olduğu müqayisəsini real faktlarla göstərərək, nə üçün zəngin olmamağımızı da “o vaxt”, “ona görə də” ifadələri ilə müxbirə anladaraq sonda “özü öz sərvətinin sahibidir” cümləsi ilə müqayisəyə yekun vurur.

Heydər Əliyevin müqayisələri ilə auditoriya müxtəlif sahələrdəki inkişafımızın şahidi olur, eyni məqsəd, eyni amal uğrunda mübarizə aparan sənət adamlarının müqayisəli xarakterlərini milyonlara açıb göstərir: “Səməd Vurğun Azərbaycan şeirinə çox böyük yeniliklər gətiribdir. Ancaq mən bir məqama toxunmaq istəyirəm. Böyük şairimiz Molla Pənah Vaqif XVIII əsrdə şeir dilini xalq dilinə daha da yaxınlaşdırdı. Onun yazdığı şeirləri xalqın bütün təbəqələri həm anlaya, həm qavraya bildi, həm də sevdi. Beləliklə, o, Azərbaycan şeirində yeni bir yol açdı. Səməd Vurğun Azərbaycan klassiklərinin ənənələrini davam etdirərək, bizim dövrümüzdə – məhz 20-ci, 30-cu, 40-cı illərdə Azərbaycan şeirini daha da yüksək səviyələrə qaldırdı” [IXc.s.17]. Elə bu müqayisənin köməyi ilə dinləyicilər xalq dili – şeir dili vəhdətinin sehrinə düşür, böyük natiqin dilində XVIII və XX əsrlərin Azərbaycan şeiri harmoniyasının şahidi olur.

Müqayisələri yaddaşlara daha da güclü həkk etmək üçün böyük natiq yazıçı və şairlərin əsərlərindən misallar gətirir. Belə misallar auditoriya üçün yaddaqalan olur ki, bu zaman “xatirimdədir” modal sözündən geniş istifadə olunur: “***Xatirimdədir***, rus yazıçısı Maksim Qorkinin də, Mayakovskinin də belə ifadələri var idi ki, “Əsrin əvvəllərində Bakıda cəmisi iki-üç ağac görmüşdüm”. Amma indi, XX əsrin sonunda Bakı bağ-bağça, yaşıllıq şəhəri olubdur” [IXc.s.434].

Heydər Əliyevin nitqlərində görkəmli sənət adamlarının müqayisəli öyrənilməsinə, onların Azərbaycan və Dünya auditoriyalarına tanıdılmasına xüsusi diqqət yetirilir. Milli təəs-

sübkeşçilik hissi ümumbəşəriliklə harmoniyada verilir: “Mən Moskvada işləyərkən bunu yüksək səviyyələrdə də demişəm, bir də qeyd etmək istəyirəm ki, Qara Qarayev müasir dünyanın ən dahi bəstəkarlarından biri idi. Mənim aləmimdə o zaman Sovetlər İttifaqında Dimitri Şostakoviçdən sonra ikinci yerdə Qara Qarayev idi. Qara Qarayev Şostakoviçin tələbəsi idi. Yenə də deyirəm, bu, bizim üçün böyük iftixar mənbəyi idi” [IIIc.s.160].

Başqa bir nitqdə yenə də Azərbaycan və onun görkəmli övladları Dünya ilə, Şərq aləmi ilə müqayisədə auditoriyalara təqdim edilir: “Şübhəsiz ki, hərə öz janrında musiqi yazır. Arifin müsiqisi professional musiqidir, klassik musiqidir. Azərbaycan klassik professional musiqisi – bəstəkarlarımızın yaratdığı bu əsərlər Şərq aləmində demək olar ki, ilk professional klassik musiqi nümunələridir və burada Azərbaycan birinci yerdədir. Bu məktəbin baniləri Üzeyir Hacıbəyov və Müslüm Maqomayevdir” [IIIc.s.161].

Heydər Əliyev ictimai-siyasi hadisələrdən tutmuş Azərbaycanın görkəmli şəxslərinədək, iqtisadiyyat göstəricilərindən başlamış ənənəvi problemlərimizədək müxtəlif məzmunlu və diapozonlu müqayisələr edir. XX əsrdə Azərbaycana rəhbərlik etmiş şəxsləri müqayisə edir, acılı-şirinli bu xalqın taleyinə yazılan insanları oxşadır, tutuşdurur: “Belə bir dövrdə 1920-ci ildə Nəriman Nərimanov kimi bir şəxsiyyət meydana çıxmış və Azərbaycan Respublikası Xalq Komissarları Sovetinin sədri olmuşdur. O, Moskvada iki il SSRİ Mərkəzi İcraiyyə Komitəsinin sədrlərindən biri olub, 1925-ci ildə qəflətən dünyasını dəyişmişdir. Sonrakı dövr tariximizi götürək. 1934-cü ildən 1953-cü ilə qədər Mircəfər Bağırov, ondan sonra 10 il Vəli Axundov respublikaya rəhbərlik etmişlər” [VIc.s.450]. Elə bu müqayisəli nitqdə antroponimik sıralanmadan yerindəcə istifadə olunur. Auditoriya müqayisəli antroponimik sıra-

lanmanın köməyi ilə XX əsrdə Azərbaycan rəhbərlərini böyük natiqin dilindən eşidir.

"Əgər biz tariximizə və görkəmli şəxsiyyətlərimizə belə münasibət göstərsək, onda elə çıxacaq ki, nə tariximiz, nə kökümüz, nə əsl-nəcabətimiz, nə də keçmişimiz var, heç bir şeyimiz yoxdur" [VIc.s.449] – deyən Heydər Əliyev Azərbaycanın həyatında müxtəlif dövrlərdə fəaliyyət göstərən ictimai-siyasi xadimləri müqayisə edir: "Fətəli Xan Xoyski 1918-ci ildə yaranmış Azərbaycan Demokratik Respublikasının qısa zamanda baş naziri olubdur. Nəriman Nərimanov isə 1920-ci ildə Azərbaycan Sovet Sosialist Respublikasının Xalq Komissarları Sovetinin sədri, yəni baş nazir olmuşdur. Tutduqları vəzifələrə görə yox, şəxsiyyətlərinə və ictimai-siyasi fəaliyyətlərinə görə onların ikisi də çox dəyərli insanlar olubdur" [VIc.s.448].

Heydər Əliyevin nitqlərindəki müqayisələri audtoriya "nisbətən" bağlayıcısının, bir qisim hallarda isə "fərqlidir", "böyük bir fərq nümayiş etdirir", "müqayisəyə ehtiyac yoxdur" ifadələrinin köməyi ilə qəbul edir: "1921-ci ildə birinci konstitusiya, 1937-ci ildə ikinci konstitusiya, 1978-ci ildə üçüncü konstitusiya qəbul edilib və nəhayət, bu il, 1995-ci il noyabrın 12-də ümumxalq səsverməsi- referendum nəticəsində dördüncü konstitusiya qəbul olunubdur. Ancaq bu konstitusiya keçmiş konstitusiyadan tamamilə fərqli konstitusiyadır, yeni konstitusiyadır, Müstəqil Azərbaycan Respublikasının konstitusiyasıdır, Azərbaycanın hər bir vətəndaşının doğma konstitusiyasıdır" [Vc.s.5].

Heydər Əliyevin nitqində muqayisə olunan məsələlər arasında fərq böyük olduqca "müqayisəyə ehtiyac yoxdur" ifadəsi tez-tez işlənir: "Güman edirəm, bunu da qeyd etmək yerinə düşərdi ki, o vaxt parlament seçkiləri- o vaxt Ali Sovet deyirdilər – Ali Sovet seçkiləri 1990-cı ilin sentyabrında başladı, amma parlamentin ilk iclası 91-ci ilin fevralın 5-də keçirildi. İndi isə, – bəlkə bu ***müqayisəyə ehtiyac yoxdur***, ancaq

sadəcə olaraq bunu qeyd etmək istəyirəm ki, – parlament seçkiləri noyabrın 12-də başladı, qurtardı və bu gün – noyabrın 24-də, 12 gündən sonra parlament öz işinə başlayır. Bu da keçmişə ***nisbətən*** çox böyük bir fərqi nümayiş etdirir [Vc.s.13-14]. Yuxarıdakı nitq parçasının axırıncı cümləsində "nisbətən" və "fərq" ifadələri birgə işlənərək nitqdə müqayisə elementlərinin rolunun yüksək olduğunu nümayiş etdrir.

Nitq hissələrinin böyük imkanlarından yetərincə istifadə edən böyük natiq müqayisələri cazibədar, yaddaqalan edə bilir: "Azərbaycanda vertolyotla ayrı-ayrı platformalara uçmaq yeni bir şey deyil, biz bunların hamısını etmişik. *Amma* biz dənizin lap uzaq yelərindəki platformalara gedəndə də ***belə*** kostyumlar geyməmişdik. Bu, bizim üçün qeyri-adi bir şey idi. Bəziləri də hesab edirlər ki, onlar artıq kosmonavtlara oxşayırlar. Ona görə də bu, bir az təəccüblü oldu. ***Ancaq*** mən bunu da yüksək qiymətləndirirəm ki, siz neft mədənlərində işləyənlərin qayğısına qalır, onların təhlükəsizliyini təmin etmək üçün çox işlər görürsünüz, çox vəsait sərf edirsiniz. Bu da ölkənizin yüksək mədəniyyətə malik olduğunu, insanpərvərliyini göstərir" [VIc.s.20]. Burada böyük natiq "amma" bağlayıcısı, "belə" ədatı ilə müqayisəni dərinləşdirir. Növbəti mərhələdə "ancaq" bağlayıcısından istifadə etməklə məntiqi nəticəyə gəlir.

Nitqini müqayisələrlə quran böyük natiqin çıxışlarında "müqayisə" ifadəsinin tez-tez şahidi oluruq: "Başqa respublikalarla ***müqayisədə*** Azərbaycanın sənaye potensialı respublikanın müstəqil dövlət kimi inkişaf etməsinə böyük şərait yaradan bir potensialdır" [Ic.s.185].

"Heç bir fərq yoxdur" ifadəsi ilə Heydər Əliyev faktlar və hadisələr arasında yaxınlığın dərəcəsini göstərir: "Türkmən dili ilə Azərbaycan dili arasında heç bir fərq yoxdur. Mən 70-ci illərin əvvəllərində türkmənlərlə Bakıda çox görüşmüşəm. Orada məşhur yazıçı-şair var – Bəndəroğlu, tanıyırsanmı? Ba-

kıya gəlirdi, bir neçə dəfə görüşmüşdüm. İraqdan gəlmişdi, elə bizim kimi Azərbaycan dilində danışırdı. Deyirdim ki, sən buradan getmisən, orada yaşayırsan? Deyirdi, yox, mən türkmənəm. Bu dildə ***heç bir fərq*** yoxdur. Ona görə də sən də, mən də çox böyük sevinc və şövq ilə oxuyuruq ki, "Samovara od salmışam, küçələrə su səpmişəm, yar gələndə toz olmasın, elə gəlsin, elə getsin, aralıqda söz olmasın" [IXc.s.307]. "Heç bir fərq yoxdur" ifadəsini eşidən auditoriya yuxarıdakı misalda Azərbaycan və Türkmən dillərinin çox yaxın olması fikrini ciddi şəkildə qəbul edir.

Heydər Əliyev müqayisələr aparır, aparılan müqayisələrdən sonra "ümidvaram ki" nikbinlik ifadəsi ilə auditoriyanı sabahkı günlərə inama səsləyir: "Əgər 1990-cı ildən başlayaraq Azərbaycanda sənaye istehsalı ilbəil aşağı düşürsə, – burada rəqəmlər gətirildi ki, 1995-ci ildə bu, 21 yaxud 22 faiz, 1996-cı ildə 6 faiz aşağı düşüb, 1997-ci ilin birinci rübündə 0,4 faiz artım varsa, bu artım müsbət meylin sabit və ardıcıl olduğunu göstərir. Ümidvaram ki, ikinci, üçüncü rüblərdə və 1997-ci ilin yekununda biz bu göstəricini daha da artıra bilərik. Başqa iqtisadi göstəricilər də sizə məlumdur. Sevindirici hal budur ki, kapital qoyuluşunda, yüklərin daşınmasında artım vardır. Burada deyildi, sərmayələrin qoyuluşunda ***böyük artım*** vardır. Nəhayət, vergilərin planının yerinə yetirilməsi müsbət haldır" [IXc.s.168]. Müqayisənin dərəcəsi "artım", "böyük artım" ifadələri ilə həyata keçirilir, "müsbət hal", "sevindirici hal" ifadələri isə nitqdə nikbinliyə xidmət edir.

Müsahibələrində verilən suallara müqayisələrə söykənən ritorik suallarla cavab vermək yeni bir nitq fenomenliyidir ki, biz buna Heydər Əliyevin nitqlərində təsadüf edirik: 4 dekabr 1995-ci ildə Parisdə "Mond" qəzetinin müxbirinə verilən müsahibədə olduğu kimi: "Bax, indi ***təsəvvür edin*** seçicilərin 86 faizi səsvermədə iştirak etdi. Onların 91,9 faizi, yəni 92

faizi konstitusiyaya səs verdi. Təqribən 8 faiz konstitusiyaya səs vermədi. İndi deyin görək, ***bu demokratiyadır ya yox?***

...Beləliklə seçkilər keçirildi. Birinci turda 125 nəfərdən 96-sı seçildi. 25 adam partiya siyahısı üzrə keçdi. 100 nəfərdən 71 nəfər majoritar prinsip üzrə keçdi. Deməli, 29 nəfər üçün seçkilər baş tutmadı. ***Bu, məgər demokratiya deyilmi?*** Demokratiyadır" [Xc.s.109-110].

"Təsəvvür edin"lə başlayan müqayisəli nitq Azərbaycan təhsil sisteminin XX əsrdəki inkişafını auditoriyaların gözü qarşısında canlandırır: "Təsəvvür edin, 1919-cu ildə Azərbaycanda ilk dəfə Bakı Dövlət Universiteti yaranıb. Azərbaycan Demokratik Respublikası bu universiteti yaratmaq üçün professorları, müəllimləri Rusiyadan dəvət etmişdi. Bakı Universitetində elmi təhsilin əsasını da bu adamlar qoydular. İndi siz fikir verin, 1920-ci ildən sonrakı dövrdə Azərbaycanda 16 ali məktəb yaranmışdır. Doğrudur, onların çoxu institut idi. İndi onlara universitet, akademiya adı veriblər" [Ic.s.169].

Böyük natiq "görə" qoşmasının köməyilə müqayisələr apara, auditoriyanı bu müqayisələrin cazibəsinə sala bilir: "Deyə bilərəm ki, Vəli Axundov o vaxt onun ətrafında olan rəhbər şəxslərin hamısından həm biliyinə ***görə***, həm insani mədəniyyətinə ***görə***, həm alicənablığına ***görə***, həm də özünün və ailəsinin təvazökarlığına ***görə*** seçilirdi və onların hamısından üstün idi. Mən işləyən vaxt Vəli Axundov bir müddət akademiyada vitse-prezident, sonra isə ömrünün axırına qədər Virusologiya, Mikrobiologiya və Gigiyena İnstitutunun direktoru oldu" [VIc.s.458].

"Təsəvvür edin" ifadəsi ilə auditoriyanı müqayisə etməyə yönəldən Heydər Əliyev illəri və bu illərdə baş verən ictimai-siyasi hadisələri tutuşdurur: "***Təsəvvür edin***, üç il bundan əvvəl (1993-cü il) iyunun 4-də respublikamız, xalqımız çabalayırdı, təhlükə qarşısında, qan içində, vətəndaş müharibəsi içində idi" [VIc.s.209].

Nitq prosesində Heydər Əliyevin apardığı müqayisələr "təsəvvür edin" felin əmr şəkli ilə ifadə olunarsa bu müqayisənin dərinliyinə işarədir: "***Təsəvvür edin***, burada 800-ə qədər su elektrik stansiyası var. Ölkədə istifadə edilən elektirik enerjisi bu stansiyalarda istehsal olunur. Şübhəsiz ki, bizdə bu qədər çaylar və bu qədər su elektrik stansiyası tikmək imkanı yoxdur. Biz Kür üzərində "Yenikənd" Su Elektrik Stansiyası tikmək istəyirik. Norveçin şirkətləri platformanın tikilməsində bizə çox kömək edə bilərlər" [VIc.s.210].

Heydər Əliyevin nitq prosesində apardığı müqayisələr poetik bir dillə auditoriyalara çatdırılır. Belə poetik ruhlu müqayisələr əqli mühakiməyə gətirib çıxarır, auditoriya üçün yaddaqalan olur: "Hörmətli dostlar, siz (Norveç – red.) Yer kürəsinin şimalındasınız, biz Azərbaycan isə cənubundayıq. Ölkələrimiz arasında böyük məsafə var. Lakin XX əsrin sonunda bu məsafə ölkələrimiz arasında sıx əlaqələr saxlamağa heç də mane olmur. İndiki əlaqələrimiz onu göstərir ki, biz bu əlaqələri bundan sonra da inkişaf etdirə bilərik" [VIc.s.170].

"Tamın mövcudluğu onu təşkil edən hissələrin vəhdətindədir" fəlsəfi prinsipi Heydər Əliyevin müqayisələrində özünü həmişə qabarıq büruzə verib: "O vaxt çox mehriban bir kollektivimiz var idi. Nə qədər çətinliklərimiz olsaydı, içimizdə nə qədər nadürüst adamlar olsaydı da bunlarsız deyildi – amma ümumiyyətlə çox mehriban, çox gözəl kollektivimiz var idi. Mən məhz bu kollektivin içərisindən çıxıb Azərbaycanın rəhbəri oldum. Arif Heydərov da məhz bu kollektivin içərisindən çıxıb Azərbaycanın daxili işlər naziri oldu" [VIc.s.490].

"Amma" qarşılaşdırma bağlayıcısı ilə böyük natiq "gözəl kollektivi" "nadürüstlərlə" ziddiyyətdə və vəhdətdə (bunlarsız deyildi) auditoriyaya açıqlayır.

Heydər Əliyevin nitqlərində müqayisələr bir sıra hallarda şərt budaq cümləli tabeli mürəkkəb cümlələrin köməyi ilə

həyata keçirilir. Müqayisədən sonra nəticə çıxarılır ki, burada əksər hallarda "məhz" dəqiqləşdirici ədatından istifadə olunur: "Mütəxəssislər tərəfindən dəfələrlə bəyanatlar verilirdi ki, *əgər* Sovetlər İttifaqı dağılarsa, 15 respublikadan ikisi-biri Rusiya, ikincisi isə Azərbaycan iqtisadi nöqteyi-nəzərdən müstəqil yaşamağa qadirdir. Bu ***məhz***, ona görə idi ki, o illərdə Azərbaycanda çox güclü iqtisadi potensial yaranmışdı, Azərbaycanın sənayesi, xüsusən neft sənayesi inkişaf etmişdi" [Xc.s.12].

Bir sözlə "Heydər Əliyevin nitqində müqayisələr" fəsli nitq mədəniyyətimizin öyrənilməsi yolunda yeni fikirdir desək səhv etmərik. Bu fəsildə Heydər Əliyevin müqayisələrin köməyilə nitqi auditoriyalar üçün cazibədar etmək üsulları öyrənilmişdir. Bu zaman əsas və köməkçi nitq hissələrinin, eləcə də nitqin inandırıcılığını artıran nitq elementləri kompleks şəkildə araşdırılmışdır. Tərəfimizdən öyrənilən "Heydər Əliyevin nitqində müqayisələr" fəsli bir daha ulu öndərin nitqlərinin dərin qatlarına nüfuz etmək imkanlarının tükənməz olduğunu göstərir. Elə bu sətirlər yazılarkən Heydər Əliyevin nitqində psixolinqvistika məsələlərinin [1] öyrənilməsi ideyası özünə yer aldı. Elə bu fəsil özlüyündə Heydər Əliyevin dil siyasətinin uğurla davam etməsinə bir əyani misaldır. Heydər Əliyevin dil siyasəti bugünkü Azərbaycanda davam edən dil

---

[1] Şiriyev F.A. Siyasi diskurs və leksik vahidlər. Bakı Universitetinin Xəbərləri. Humanitar elmlər seriyası, №2, 2011, s.5-9;
Babaxanova Könül. Psixoloji mətnaltı məna yaradan mətnlər // Filologiya məsələləri, №3, 2009. səh. 279;
Hacıyeva Xavər. Dildə ekspressivlik və emosionallıq arasında qarşılıqlı əlaqə // Filologiya məsələləri, №5, 2009. s. 282;
Məmmədova Rəhilə. Monoloji nitqin linqivistik-psixoloji aspektləri. 2007. №6, səh 64;
Ибрагимова Саида. Дискурс модальности в лингвиспеке XX века. AMEA-nın xəbərləri Humanitar elmlər seriyası, 2005, №3, səh. 132-145.

quruculuğu proseslərinin metodoloji əsasında dayanır.[1,2] Və bu araşdırmanın yekun nəticələrini aşağıdakı kimi göstərmək olar:

– Müqayisələr Heydər Əliyevin nitqində real vəziyyəti auditoriyalara aydınlaşdıraraq əqli mühakimələrə gəlmək yolunda mühüm vasitədir;

– Böyük natiqin nitqlərində müqayisələr dialektikanın əksliklərin vəhdəti və ziddiyyəti qanununa uyğun həyata keçirilir;

– Heydər Əliyevin nitqlərinin mühüm gücü məntiqi təfəkkürə söykənməklə auditoriyaları inandırmaqdadır. Bu inandırma böyük natiqin nitqlərində əsasən müqayisələrlə aparılır;

– Heydər Əliyevin auditoriyalarda apardığı müqayisələr “say” nitq hissəsinin imkanlarına söykənir ki, çoxsaylı rəqəmlərin şifahi şəkildə səslənməsi nitqin gücünü qat-qat yüksəldir;

– Heydər Əliyevin siyasi məsələlərə həsr olunmuş nitqlərində ictimai-siyasi dövrlər müqayisə olunur, bu dövrlərin fərqli və aşkar cəhətləri tutuşdurulur. Auditoriya bu tutuşdurmalar ilə böyük natiqin tarix fəlsəfəsinə söykənərək hadisələrə filosofcasına yanaşmanın şahidi olur;

– Keçmiş irsimizi bu günlə müqayisə etmək böyük natiqin nitqlərində tez-tez təsadüf edir;

– Heydər Əliyevin araşdırılan nitqlərinin əsasən müstəqillik dövrünə düşdüyünün fərqinə varsaq müqayisələrin müstəqillikdən öncə və sonrakı illər arasında aparılmasının şahidi oluruq;

---

[1] Əhmədova Salatın. Heydər Əliyevin dil siyasəti. Filologiya üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı, 2010.

[2] Xələfli Əli Rza. Dilimiz-varlığımız. Bakı, “MBM nəşriyyatı”, 2009. 160 səh.

– Müqayisələr üçün böyük natiq statistikaya müraciət edir, statistik göstəriciləri yerli-yerində işlədərək dinləyicilərdə böyük maraq doğura bilər;

– Böyük natiqin nitqlərində ictimai-sosial fərd kimi insanın keçdiyi həyat yolları da müqayisə olunur;

– Heydər Əliyevin nitqlərində görkəmli sənət adamlarının müqayisəli öyrənilməsinə, onların Azərbaycan və Dünya auditoriyalarına tanıdılmasına xüsusi diqqət yetirilir, milli təəssübkeşlik hissi ümumibəşərliklə harmoniyada verilir;

– Heydər Əliyev nitqində müqayisə olunan məsələlər arasında fərq böyük olduqca "müqayisəyə ehtiyac yoxdur" ifadəsi tez-tez işlənir;

– Böyük natiq "görə" qoşmasının köməyilə müqayisələr apara, auditoriyanı bu müqayisələrin cazibəsinə sala bilir;

– Heydər Əliyevin nitqində dünaygörüşlər, zövqlər, duyumlar müqayisə olnur, auditoriyalar bu müqayisələrdə zaman və dünyagörüşü arasındakı fəlsəfi əlaqələrin şahidi olur;

– Heydər Əliyevin nitqlərində əksər təsadüflərdə müqayisələr, paralellər aparılır, sonda yekun nəticəyə gəlinir. Bir qisim hallarda isə yekun nəticə auditoriyaya açıqlanır, açıqlanmadan sonra müqayisələrə keçilir;

– Rəqəmlər əsasında aparılan müqayisələr, xüsusilə iqtisadiyyat, maliyyə-bank və idxal-ixrac məsələlərində daha çox istifadə olunur;

– Müqayisələr yolu ilə auditoriyaları polemikaya cəlb edən böyük natiq "siz təsəvvür edin", "xatırlayın" ifadələrindən, ritorik suallardan istifadə edir.

# İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT

**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". I cild, Bakı, "Azərnəşr", 1997. 608 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". II cild, Bakı, "Azərnəşr", 1997. 604 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". III cild, Bakı, "Azərnəşr", 1997. 488 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". IV cild, Bakı, "Azərnəşr", 1997. 528 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". V cild, Bakı, "Azərnəşr", 1998. 500 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". VI cild, Bakı, "Azərnəşr", 1998. 512 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". VII cild, Bakı, "Azərnəşr", 1998. 520 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". VIII cild, Bakı, "Azərnəşr", 1998. 488 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". IX cild, Bakı, "Azərnəşr", 2000. 466 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". X cild, Bakı, "Azərnəşr", 2002. 472 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". XI cild, Bakı, "Azərnəşr", 2003. 452 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". XII cild, Bakı, "Azərnəşr", 2004. 432 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". XIII cild, Bakı, "Azərnəşr", 2004. 520 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". XIV cild, Bakı, "Azərnəşr", 2005. 520 səh.
**Heydər Əliyev,** "Müstəqilliyimiz əbədidir". XV cild, Bakı, "Azərnəşr", 2005. 528 səh.

**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XVI cild, Bakı, “Azərnəşr”, 2005. 552 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XVII cild, Bakı, “Azərnəşr”, 2006. 528 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XVIII cild, Bakı, “Azərnəşr”, 2006. 552 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XIX cild, Bakı, “Azərnəşr”, 2006. 528 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XX cild, Bakı, “Azərnəşr”, 2007. 536 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXI cild, Bakı, “Azərnəşr”, 2007. 480 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXII cild, Bakı, “Azərnəşr”, 2007. 528 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXIII cild, Bakı, “Azərnəşr”, 2008. 480 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXIV cild, Bakı, “Azərnəşr”, 2008. 504 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXV cild, Bakı, “Azərnəşr”, 2008. 520 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXVI cild, Bakı, “Azərnəşr”, 2009. 512 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXVII cild, Bakı, “Azərnəşr”, 2009. 496 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXVIII cild, Bakı, “Azərnəşr”, 2009. 480 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXIX cild, Bakı, “Azərnəşr”, 2009. 520 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXX cild, Bakı, “Azərnəşr”, 2010. 512 səh.
**Heydər Əliyev,** “Müstəqilliyimiz əbədidir”. XXXI cild, Bakı, “Azərnəşr”, 2010. 512 səh.

### *I kitab üçün*

**Abdullayev A.** "Nitq mədəniyyəti və natiqlik məharəti haqqında". Bakı, 1968. 250 s.

**Abdullayev N., Məmmədov Z.** "Nitq mədəniyyətinin əsasları". Bakı, 2010. 325 s.

**Axundov A.** "Dil və mədəniyyət". Bakı, "Yazıçı", 1992. 192 s.

**Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili.** Bakı, "Elm", 1998. 196 s.

**Həsənova S.** "Nitq mədəniyyəti və üslubiyyat". Bakı, 2005. 192 s.

**Hüseynov S.** "Nitq mədəniyyəti" (Dərslik). Bakı, "Yazıçı", 2010. 238 s.

**Kərimbəyli N.** "Prezidentin nitqinə bir baxış". Bakı, "Sabah", 1996. 28 s.

**Mehdiyev R.** "Elmimizin və dilimizin xilaskarı", "Azərbaycan" qəzeti, 19 sentyabr 1996-cı il.

**Mehdiyev R.Ə.** "Fəlsəfə". Dərs vəsaiti. Bakı, "Şərq-Qərb", 2010. 360 s.

**Məmmədov M.B.** "Ana dili və nitq mədəniyyəti məsələləri". Bakı, "Nurlan", 2004. 322 s.

**Muradov B., Bayramov H.** "Nitq mədəniyyəti". Bakı, 2008. 157 s.

**Nitq mədəniyyəti məsələləri.** II buraxılış. Bakı, "Elm", 1992. 204 s.

**Nitq mədəniyyəti məsələləri.** Bakı, 1981. 111 s.

**Şükürov A.** "Fəlsəfə". Bakı, "Çıraq", 2008. 481 s.

**Yusifov M.** "Dahi şəxsiyyətin nitq fenomenliyi". Bakı, 143 s.

### *II kitab üçün*

**Abdullayev B.** Müasir Azərbaycan dilində leksik sinonimlər (Namizədlik dissertasiyası). Bakı, 1970. səh.66-70

**Abdullayev Ə.Z.** Sintaksisin aktual məsələləri (tabeli mürək-kəb cümlənin tətqiqi). Dərs vəsaiti. Bakı, 1987. 84 səh.

**Ağayeva İ.S.** Bədii və elmi üslub. Bakı, Maarif, 1988. səh. 22-30.

**Aslanov A.** Sinonimlər – Azərbaycan bədii dilinin üslubiy-yatı. Bakı, 1970. səh. 66-70.

**Azərbaycan dili.** Qəbul imtahanlarına hazırlaşanlar, yuxarı sinif şagirdləri və müəllimlər üçün vəsait. Bakı, TQDK, 2013, 640 səh.

**Azərbaycan dilində tabeli mürəkkəb cümlə məsələləri.** prof. Ə.Z.Abdullayevin redaktəsilə. Bakı, 1983.

**Babaxanova Könül.** Psixoloji mətnaltı məna yaradan mətnlər // Filologiya məsələləri, №3, 2009. səh. 279.

**Babayev Adil.** Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, “Elm və təhsil”, 2011. 620 səh.

**Babayev Adil.** Dilçiliyə giriş. Dərslik. B. Maarif, 2004. 504 səh.

**Bağırova Sevinc.** İngilis və Azərbaycan dillərində feli sifətlə-rin müqayisəli xarakteristikası və bəzi qrammatik xüsusiy-yətləri. №2, 2008. s. 121.

**Bayramov H.A.** Azərbaycan dili frazeologiyasının əsasları. Bakı, Maarif, 1978.

**Bəylərova Aytən.** Bədii əsərlərin dilində təkrir. AMEA-nın xəbərləri. Humanitar elmlər seriyası, 2008. №2, səh. 69-76.

**Bürhanəddin Qazi.** Divan. (Tərtib edəni:Ə.Səfərli). Bakı, Azərnəşr, 1998. 656 səh.

**Cahangirov Fikrət.** Modallıq kateqoriyasının məntiqi və qrammatik mahiyyəti // AMEA-nın xəbərləri, Humanitar və ictimai emlər seriyası, 2003, №1-4, səh. 283-293.

**Cəfərov Nizami, Musayev Osman, Osmanlı Dəyanət.** Türk dünyasının yeni lideri. Bakı, “Çaşıoğlu”, 2009. – 760 səh.
**Cəfərov Səlim.** Müasir Azərbaycan dili. II hissə. Leksika. Bakı, “Şərq-Qərb”, 2007. səh. 192.
**Cəfərov S., Abdullayev N.** Müasir Azərbaycan dilinin morfologiyası. Bakı, 2004. 173 səh.
**Cəlilbəyli O.B.** Altay nəzəriyyəsi və yapon dili. 2007. №2, səh. 70.
**Cəlilova Teybə.** Ekspressivlik və onun məna komponentləri haqqında. Filologiya məsələləri, №3, 2008. s.172-183.
**Çobanov Mədət.** Azərbaycan antroponimiyasının əsasları. Ali məktəb tələbələri üçün dərs vəsaiti, Bakı, Maarif, 1998. 332 səh.
**Dəmirçizadə Ə.M.** Azərbaycan dilinin üslubiyyatı, Bakı, Azərtədrisnəşr, 1962. səh.236
**Dil mədəniyyəti.** Bakı, “Elm”, 1972. səh. 40.
**Dil mədəniyyəti.** Nəsimi adına Dilçilik İnstitutu IV buraxılış. Bakı, “Elm”, 1985. səh.168.
**Dil məsələlərinə dair tematik toplu.** №1. Bakı, 1997. səh. 124
**Dil məsələlərinə dair tematik toplu.** №2. Bakı, 1997. səh. 168.
**Əhmədova Salatın.** Heydər Əliyevin dil siyasəti. Filologiya üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunmuş dissertasiyanın avtoreferatı. Bakı, 2008.
**Əhmədova Ülviyyə.** Fel tərkibli frazeoloji birləşmələr, onların semantik və morfoloji xüsusiyyətləri // Filologiya məsələləri, 2008. №9, səh. 320.
**Əliyev Həsən.** Ümumi antroponimika məsələləri. Bakı, ADU, 1985. səh. 126.
**Əliyev Kamil.** Üslubiyyat və üslublar sistemi. Bakı, 1985. 83 s.
**Əliyeva Sitarə.** İşarə əvəzliklərinin üslubi xüsusiyyətləri // AMEA-nın xəbərləri. Humanitar elmlər seriyası, 2006. №2-4, səh.181-186.

**Əliyeva Zahirə.** Azərbaycan dilində sinonim cərgələrin yaranması haqqında // Filologiya məsələləri, №3, 2009. s.261-266
**Əlizadə Afina.** Nəsimi əsərlərində kəmiyyət bildirən söz və ifadələr // AMEA-nın humanitar və ictimai elmlər seriyası, 2002. №1-2, s.117-126.
**Əlizadə Afina.** N.Nərimanov və Azərbaycan dilinin elmi üslubu // AMEA-nın xəbərləri. Humanitar və ictimai elmlər seriyası. 2003. №1-4, səh. 267-272.
**Əlizadə Z.Ə.** Azərbaycan dilində tabeli mürəkkəb cümlə məsələləri. Bakı, 1983. səh. 17-22. (Elmi əsərlərin tematik məcmuəsi)
**Əlizadə Z.Ə.** Müasir Azərbaycan dilində modal sözlər. Bakı, Maarif, 1965. səh 148.
**Ərəbli N.Ş.** İngilis dilində sinonim cərgənin genişlənməsində metaforanın rolu // Bakı Universitetinin xəbərləri, 2010. №3, səh. 18-21.
**Əsədova M.N.** Azərbaycan və İngilis dillərində “kim” və “nə” sual əvəzliklərinin leksik-semantik xüsusiyyətləri // Bakı, Universitetinin xəbərləri, 2012. №3, səh. 16-20.
**Hacıyev T.İ.** Azərbaycan Milli ədəbi dili məsələsinə baxış// Bakı Universitetinin xəbərləri, 2009, №3, səh 21-25.
**Hacıyev Tofiq.** XX əsrin əvvəllərində Azərbaycan dili. Bakı, 1977. səh. 188.
**Hacıyeva Əzizə.** Müxtəlif sistemli dillərdə somatik frazeoloji birləşmələr. Bakı, 2007. “Nurlan” 348 səh.
**Hacıyeva Xavər.** Dildə ekspressivlik və emosionallıq arasında qarşılıqlı əlaqə // Filologiya məsələləri, №5, 2009. s. 282
**Həsənov İ.Q.** Müasir Azərbaycan dilinin leksikası. Ali məktəb üçün dərs vəsaiti, Bakı, 2006. 164 səh.
**Həziyeva Dilarə.** Frazeologiyanın tərcümə üsulları // Filologiya məsələləri, 2007. №2, səh. 218.
**Hüseynova Arifə.** İngilis dilində təfəkkür fellərinin sinonimliyi // Filologiya məsələləri, 2008. №9, səh. 320.

**Hüseynova Aytən.** İngilis dilində idiomatik ifadələr və onların Azərbaycan dilində ifadə üsulları. 2008. №9. səh. 173.
**Hüseynova Kəmalə.** Ədatların ingilis və Azərbaycan dillərində işlənmə xüsusiyyətləri // Filologiya məsələləri. №4, 2009. səh. 154.
**Hüseynova Sevinc.** Ekspressivliyi yaradan vasitələr: emosionallıq və obrazlılıq // Filologiya məsələləri, №5, 2009. s. 277.
**Hüseynzadə Muxtar.** Müasir Azərbaycan dili (morfologiya) Bakı, "Şərq-Qərb", 2007. səh. 280.
**Xasıyeva İlhamə.** İngilis və Azərbaycan dillərində modal tipli sözlərin nitq hissələri sistemində yeri // Filologiya məsələləri, №2, 2008. səh. 131.
**Xələfli Əli Rza.** Dilimiz-varlığımız. Bakı, "MBM nəşriyyatı", 2009. 160 səh.
**Xəlilov Buludxan.** Müasir Azərbaycan dilinin leksikologiyası. Bakı, "Nurlan" nəşriyyatı, 2008. 442 səh.
**Xəlilov R.Y.** Saylar. Bakı, Azərnəşr, 1978. 278 səh.
**İslamzadə Məsudə.** Bədii nəsrdə mürəkkəb konstruksiyaların üslubi-semantik xüsusiyyətləri // AMEA-nın xəbərləri, Humanitar elmlər seriyası, 2007. №2, səh. 81-93.
**Kazımov Q.S.** Azərbaycan dili frazeologiyasının ən qədim qatı (yazıyaqədərki dövr) // Filologiya məsələləri, 2006, №2, səh. 3-53.
**Kazımov Q.Ş.** Müasir Azərbaycan dili, Sintaksis, Bakı, Ünsiyyət, 2000. səh. 496
**Qədimova Məryəm.** Azərbaycan dilində baş sözünün məna yükü. Bakı, Bakı Universiteti nəşriyyatı, 2001. səh.53.
**Qədimova M.Q.** Azərbaycan və rus dilində "baş" (голова) sözünün semantik inkişafı // Humanitar elmlər seriyası, 2006. №1, səh 31-34.
**Qəhrəmanov C.** Nəsimi "Divan"ının leksikası. Bakı, 1970.
**Quliyev H.** Qoşma və köməkçi adlar. – Müasir Azərbaycan dili, II hissə, AEA-nın nəşri, Bakı, 1981. 510 səh.

**Quliyev İlkin.** Qazi Bürhanəddinin dilində şərt budaq cümləli tabeli mürəkkəb cümlələr // Filologiya məsələləri, 2007. №2, səh. 91
**Qurbanov Afat.** Azərbaycan dilinin onomalogiyası. Bakı, Maarif, 1965. 148 səh.
**Qurbanov Afat.** Dil və nitq. Bakı, APU, 1991. 74 səh.
**Qurbanov Afat.** Dil və üslub. Bakı, 1992. 46 səh.
**Qurbanova M.Ə.** Azərbaycan dilində bəzi bədən üzvləri adlarının polisemantikliyinə dair // Bakı Universitetinin xəbərləri, №2, 2009. səh. 5-12.
**Mahmudova Dilbər.** Ümumi dilçilikdə modallıq kateqoriyasının tədqiqi // Filologiya məsələləri, №3, 2009, səh.127
**Mehdiyeva Sevil.** Nəsimi "Divan"ında köməkçi nitq hissələri və köməkçi adlar. AMEA Humanitar və ictimai elmlər seriyası, 2002. №1-2, səh. 127.
**Məhərrəmova T.** Filologiya məsələləri, №1, 2007, səh.131-134
**Məmmədov İsmayıl.** Azərbaycan dilində qrammatik sinonimlik (fel formaları əsasında). Dərs vəsaiti. Bakı 1983. səh. 88
**Məmmədov M.Ə.** "Əkinçi" qəzetində dil məsələləri // Bakı, Universitetinin xəbərləri, 2013. №1, səh. 5-11
**Məmmədov Nadir.** Müasir Azərbaycan dilində fellərin leksik sinonimliyi. Bakı, "Maarif" nəşiyyatı, 1991. səh. 112
**Məmmədova X.İ., Cavadova Ə.H.** Tabeli mürəkkəb cümlələrin semantik-qrammatik xüsusiyyətləri. Bakı, Mütərcim, 2000. səh. 76.
**Məmmədova Rəhilə.** Monoloji nitqin linqivistik-psixoloji aspektləri. 2007. №6, səh. 64.
**Məmmədova Sevinc.** Mikayıl Müşfiq yaradıcılığında sinonimlərin üslubi xüsusiyyətləri haqqında. Filologiya məsələləri, №, 2011. səh. 128-135.
**Məmmədova T.R.** Frazeoloji birləşmələr və onların növləri // Filologiya məsələləri, 2007. №1, s.50

**Mirzəzadə H.** Azərbaycan dilinin tarixi qrammatikası. Bakı, Azərbaycan Universiteti nəşriyyatı, 1990

**Muradova Zülfiyyə.** İngilis dilinin frazeologiyasında atalar sözləri və onların semantik xüsusiyyətləri // Filologiya məsələləri, №4, 2008, s.205

**Musayeva Gülşən.** Müasir Azərbaycan dilində feli sinonimlərin üslubi xüsusiyyətləri // Filologiya məsələləri, 2008, №6, səh. 100.

**Mustafayeva Səidə.** Nitqin inkişafı, Bakı, 2011. səh. 268.

**Mürsəlova Məlahət.** Kommuninativ frazeoloji vahidlərin struktur-semantik təhlili. Bakı, 2006. №2, səh. 73.

**Mustafayeva Ofeliya.** Alman və Azərbaycan dillərində somatik frazeologizmlərin ekvivalentliyi ("əl" və "ayaq" sözləri əsasında). Filologiya məsələləri, №4, 2008. s. 37.

**Nəbiyev Bəkir.** Heydər Əliyev və Azərbaycan ədəbiyyatı. Bakı, 1998. (Monoqrafiya-müəlliflər kollektivi).

**Nəcəfova Leyla.** İngilis dilində idiomatik ifadələr və onların Azərbaycan dilində ekvivalentləri // Filologiya məsələləri, №2, 2008. səh. 126.

**Nəsimi.** Seçilmiş əsərləri. Bakı, 1973. I, II, III cild

**Paşa Aydın.** Azərbaycan antroponimiyasının leksik problemləri. Bakı, 1997. 252 səh.

**Rəcəbli Ə.** Qədim türk yazılı abidələrinin dili. I cild, Bakı, Nurlan, 2006

**Rəhimov Q.A.** Frazeoloji vahidlərin araşdırılması probleminə dair// Bakı Universitetinin xəbərləri, 2013. №1, s.12-14.

**Seyidəliyev Nəriman.** Folklor frazeologiyasının bədii ədəbiyyatda işlədilməsi // Filologiya məsələləri, 2008. №9, səh. 46.

**Seyidəliyev Nəriman.** Şifahi xalq ədəbiyyatında frazeoloji vahidlərin rolu // Filologiya məsələləri №6, 2007. s.45

**Seyidəliyev Nəriman.** Təsdiq və inkarda işlənən frazeoloji birləşmələr // AMEA-nın xəbərləri. Humanitar və ictimai elmlərin seriyası, 2003. №1,4. səh. 277

**Seyidov Yusif.** Azərbaycan ədəbi dilində əlavə sözlər və əlavə cümlələr. Bakı, 2000. səh.170

**Seyidov Yusif.** Azərbaycan ədəbi dilində söz birləşmələri, Bakı, 1966.

**Səmədova Jalə.** İngilis dilində modallığın sintaktik ifadə vasitələri // Filologiya məsələləri, №4, 2008. səh. 82.

**Şahbazova Z.Ə.** Şəxs əvəzliklərinin söz birləşməsi və sadə cümləəri vəzifələri. Bakı Universitetinin xəbərləri. 2006, №2 səh 91-101.

**Şirinova G.N.** "Koroğlu" dastanındakı frazeologizmlərində inversiya // Bakı Universitetinin xəbərləri, Bakı, 2011. №1, s.39-44

**Şiriyev F.A.** Siyasi diskurs və leksik vahidlər. Bakı Universitetinin Xəbərləri. Humanitar elmlər seriyası, №2, 2011, s.5-9;

**Tağıyeva E.İ.** Müasir Azərbaycan dilində frazeologizmlərin formalaşmasında "bir" sayının rolu və mövqeyi// Bakı Universitetinin Xəbərləri, Bakı, 2011. №3, səh. 28-35.

**Tahirov İlham.** Temporal leksika. Bakı, Nurlan, 2008. 142 səh.

**Tahirov İlham.** Dildə temporallıq sahəsi. F.e.d. alimlik dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı, Bakı, 2008. 45 səh.

**Təhməzov Zamiq.** Müasir Azərbaycan dilində qoşma və köməkçi adlar // AMEA-nın xəbərləri, 2007. №1, səh.81-93.

**Vəliyeva Xatirə.** Ritorik sualların işlənmə özəllikləri // Filologiya məsələləri, №3, 2009. s.156.

**Zeynalova T., Əliyeva Ş.** Некоторые виды фразеологиических единиц со структурой предложения в современном английском языке// Filologiya məsələləri, №1, 2007. s.135.

### *Rus dilində*

**Введенская Л.А., Павлова Л.Т., Кашаева Е.Ю.** "Культура речи государственного служащего". – Ростов н/Д: Феникс, 2011. 473 с.

**Гаврин С.Г.** Изучение фразеологии русского языка в школе. М., 1963.

**Головин В.Н.** "Основы культуры речи". Москва, 1980. 260 с.

**Голуб И.Б., Розентал Д.Э.** "Книга о хорошей речи". Москва, Кулътуро и спорт, юнити, 1997. 268 с.

**Грена М.** О сущности модальности // В кн. Языкознание в Чехословакии М.: Прогресс, 1978, с.277-301.

**Зверева Е.А.** Научная речь и модальность Л.: Наука, 1983.

**Касевич В.Б.** "Семантика, Синтаксис Морфология". Москва, Главная редакция восточной летературы изда-телъства "Наука", 1988. 309 с.

**Копыленко М.М., Попова З.Д.** "Очерки по общей фразеологии". Москва, Книжний дом "Либроком" 2010. 192 с.

**Лайне Светлана.** "Чтобы тебя поняли". Москва, Знание, 1986. 64 с.

**Ибрагимова Саида.** Дискурс модальности в лингвиспеке XX века. AMEA-nın xəbərləri Humanitar elmlər seriyası, 2005, №3, səh. 132-145.

**Ибрагимова Саида.** Коцепция модальности академика В.В.Виноградова // AMEA, Xəbərlər Humanitar elmlər seriyası, 2005, №4, səh. 87-96.

**Исмаилова Лариса.** Основные проблемы культуры речи в СМИ// Filologiya məsələləri, №7, 2007. səh. 101.

**Тенишев Э.Р.** Имя числителное // Сравнительно-историческая грамматика тюркских языков. Морфология. М.: 1988, с.75-81.

**Разинкина Н.М.** Стилистика английской научной речи. “Язык научной литературы” М., 1975, с.29

**Мамедов И.** Грамматическая синонимия в азербайджанском языке. АКД, Баку, 1970.

**Казим-Бек М.А.** Общая грамматика турецко-татарского языков. СПб., 1948, 457 стр.

**Карнеги Дейл.** “Как завоевывать друзей и оказывать влияние на людей”. Перевод А.А.Позднякова, 2009. 594 стр.

**Кононов А.Н.** Грамматика современного турецкого литературного языка. М-Л., 1956, 569 стр.

**Курбатов Х.Р.** Татарская лингвистическая стилистика и поэтика. М.: Наука, 1978.

### *İngilis dilində*

**Arnold I.V.** The English Word, M. 1973.

## Müəllifin "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" kitabı ilə bağlı dərc olunmuş elmi məqalələri

**1.**Heydər Əliyevin nitqində neologizmlər // "Azərbaycan" qəzeti, 3 iyun 2011-ci il.
**2.**Heydər Əliyev nitqində ədatlar // "Təhsil" jurnalı №9, 2011-ci il.
**3.**Heydər Əliyev nitqində antroponimik sıralanmalar // "Təhsil" jurnalı, №12, 2011-ci il.
**4.**Heydər Əliyev nitqində elmi üslubun yeri // "Yeni Təfəkkür" qəzeti.
**5.**Heydər Əliyev nitqinin gücü onun səmimiyyətindədir // "Azərbaycan" qəzeti, 1 yanvar 2012-ci il.
**6.**Dilmizin dərin qatlarını zənginləşdirən ulu öndər // "Səs" qəzeti, 2012-ci il.
**7.**Heydər Əliyev nitqində fəlsəfi baxışlar. "Heydər Əliyev və Regionşünaslıq (3-cü Beynəlxalq elmi konfransın materialları)". 2-4 iyul 2012-ci il.
**8.**Heydər Əliyev nitqində qətiyyət // "Təbib" qəzeti, 14 iyun 2012-ci il.
**9.**Heydər Əliyev nitqində məntiqi ardıcıllıq // "Təhsil" jurnalı, №8, 2012-ci il.
**10.**Heydər Əliyev nitqində poetik duyğular // "Təbib"qəzeti 15 may 2012-ci il.
**11.**Heydər Əliyev nitqinin gücü onun xəlqiliyində idi // "Paritet" qəzeti, 4-5 sentyabr 2012-ci il.
**12.**Heydər Əliyev nitqində insan fəlsəfəsi // "Paritet" qəzeti, 13 noyabr 2012-ci il.
**13.**"Heydər Əliyevin nitqində modal sözlər", "Kredo" qəzeti, №7, 22 fevral 2014-cü il, səh. 2.
**14.**"Heydər Əliyevin nitqində girişlər və sonluqlar", "Bakı Qızlar Universitetinin elmi əsərləri", №2, 2014, səh. 3-11.

**15.**“Heydər Əliyevin nitqində ritorik suallar”, “Bakı Qızlar Universitetinin elmi əsərləri”, №2, 2014, səh. 9-15.
**16.**“Heydər Əliyevin nitqində səmimiyyət”, “Azərbaycan Dillər Universitetinin elmi xəbərləri”, №2, 2014, səh.32-37
**17.**“Heydər Əliyevin nitqində ədatların öyrənilməsi”, “Azərbaycan Dillər Universiteti dil və ədəbiyyat buraxılışı”, №2, 2014, səh.12-21
**18.**“Heydər Əliyevin nitqində əlavələr”, “Kredo” qəzeti, №11, 15 mart 2014-cü il, səh. 2.
**19.**“Heydər Əliyevin nitqində sinonimlər”, “Filologiya məsələləri”, №3, 2014, səh. 3-7.
**20.**“Heydər Əliyevin nitqində dövlətçiliklə bağlı işlədilən frazeoloji birləşmələr”, “Kredo” qəzeti, №14, 5 aprel 2014-cü il, səh.2
**21.**“Heydər Əliyevin nitqində frazeoloji birləşmələr”, “Filologiya məsələləri”, №4, 2014, səh. 16-21
**22.**“Ulu öndərin nitqi poeziya qədər şirindir”, (müsahibə) “Kredo” qəzeti, №19, 10 may 2014-cü il, səh. 2.
**23.**“Heydər Əliyevin nitqində ritorik suallar”, “Təhsil” jurnalı, №5, 2014, səh. 35-37.
**24.**“Heydər Əliyevin nitqində dini üslubun yeri”, “Filologiya məsələləri”, №5, 2014, səh.102-108
**25.**“Ulu öndər Heydər Əliyevin nitqi Azərbaycan dilinin dərin qatlarına söykənir”. (müsahibə) “Səs” qəzeti, №139, 2 avqust 2014-cü il, səh. 12.
**26.**“Heydər Əliyevin nitqində modal sözlərin semantik xüsusiyyətləri”, “Azərbaycan Pedaqoji Universitetinin xəbərləri”, №2, 2014, səh.284-289
**27.**“Heydər Əliyevin nitqində məntiqi ardıcıllıq”, “Sumayıt Dövlət Universitetinin elmi xəbərləri”, №2, 2014, səh.6-9

## “Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” I kitabına verilmiş mütəxəssis rəyləri

**1.**“Azərbaycan” qəzeti, 9 fevral 2014-cü il. səh.5
“Ulu öndər Azərbaycan dilinin böyük təəssübkeşi idi” – Vidadi Xəlilov, pedaqogika elmləri doktoru, professor, Azərbaycan Respublikasının əməkdar müəllimi.
**2.**“Xalq qəzeti”, 31 oktyabr 2013-cü il. səh.5.
“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti”. Nizaməddin Şəmsizadə, Respublika Dövlət mükafatı laureatı, filologiya elmləri doktoru.
**3.**“Respublika” qəzeti,
“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” – Zemfira Məmmədova, Azərbaycan Tibb Universitetinin xarici dillər kafedrasının müdiri, filologiya elmləri doktoru.
**4.**“Kaspi” qəzeti,
“Dilə münasibət vətən sevgisidir” – Flora Xəlilzadə, əməkdar jurnalist.
**5.**“Respublika gəncləri” qəzeti,
“İstedad çərçivəyə sığmaz” – Adil Babayev, filologiya elmləri doktoru, professor.
**6.**“Yeni təfəkkür” qəzeti,
“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” – Əlihüseyn Şükürov, Azərbaycan Jurnalistlər Birliyinin üzvü.
**7.**“Təhsil” jurnalı, №7-8 səh.23-26.
“Dilimiz haqqında dəyərli monoqrafiya” – İdris Hacızadə, Azərbaycan Jurnalistlər Birliyinin üzvü.
**8.**“Bakı” qəzeti, 26 sentyabr 2013-cü il
“Dilçiliyə dair dəyərli monoqrafiya” – Aylen Məşədiyeva, AMEA Dilçilik İnstitunun dosenti.

**9.**“Kredo” qəzeti, №11, 15 mart 2014-cü il.
Tədqiqatın nəzəri dəyəri və təcrübi əhəmiyyəti. – Ə.Əzizli Azərbaycan Jurnalistlər Birliyinin və Azərbaycan Yazıçılar Birliyinin üzvü.
**10.**“Kredo” qəzeti, 31 yanvar 2014-cü il səh.2.
“Nitq mədəniyyəti monoqrafik tədqiqatda” – İlhamə Hacıyeva, BDU Azərbaycan dilçiliyi kafedrasının professoru, filologiya elmləri doktoru.
**11.**“Bütöv Azərbaycan” qəzeti, 11-16 oktyabr 2013. səh.5.
“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” – Arif Məmmədli, Azərbaycan Jurnalistlər Birliyinin üzvü.
**12.**“Laçın yurdu” jurnalı, №3(14), 2014. səh.41-43.
“Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” – Mütəllim Həsənov, Azərbaycan Jurnalistlər Birliyinin üzvü.

## “Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” kitabının təqdimatları:

**1.**Beynəlxalq Mətbuat Mərkəzi, Aşıq Şəmşir Mədəniyyət Ocağı İctimai Birliyi, 14 iyun 2013-cü il.
**2.**Azərbaycan Milli Elmlər Akademiyası Mərkəzi Elmi Kitabxanası Heydər Əliyev irsinin təbliği şöbəsi, 4 mart 2014-cü il.

# KİTABIN İÇİNDƏKİLƏR

**VII FƏSİL**



**VIII FƏSİL**



**IX FƏSİL**



**X FƏSİL**



**XI FƏSİL**

